**İLYAS ƏFƏNDİYEV**

# SEÇİLMİŞ ƏSƏRLƏRİ

**ÜÇ CİLDDƏ**

**III CİLD**

"AVRASİYA PRESS"
BAKI-2005

*Bu kitab “**İlyas Əfəndiyev**. Seçilmiş əsərləri. Yeddi cilddə. VI cild”
(Bakı, Çinar çap, 2002) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni: **Elçin**

Redaktorlar: **Vaqif Bəhmənli**
**Umud Rəhimoğlu**

**894.3613 - dc 21**
**AZE**
**Əfəndiyev İlyas. Seçilmiş əsərləri**. Üç cilddə. III cild. Bakı, “AVRASİYA PRESS”, 2005, 448 səh.

Azərbaycan xalq yazıçısı, ustad sənətkar İlyas Əfəndiyevin “Seçilmiş əsərləri”nin üçcildliyinin son cildinə ədibin iki qiymətli romanı daxil edilmişdir; “Söyüdlü arx” və “Geriyə baxma, qoca”.

“Söyüdlü arx” yazıçının ilk romanı olmaqla oxucuların böyük sevgisi ilə qarşılanmış, milli nəsrdə lirik-psixoloji təmayülün əsasını qoymuş, tezliklə tərcümə edilərək dünyanın bir çox dillərində geniş yayılmışdır. “Geriyə baxma, qoca” romanında Qarabağ camaatının həyatı, güzəranı, etnoqrafik cizgiləri, maddi və mənəvi azadlıq naminə insanların çəkdiyi iztirablar parlaq və yetkin bir üslubla əks olunur.

**ISBN 9952-421-06-9**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



## SÖYÜDLÜ ARX

Mən Güney qışlaqdan çıxandan bəri həyatımın bu kədərli sərgüzəşti haqqında kimsəyə bir söz deməmişəm. Onu yüz dəfə gözümün qabağına gətirmişəm, yüz dəfə xatırlamışam, lakin heç kəsə heç nə söyləməmişəm. İndi o günlər bütün təfsilatı ilə xəyalımdan gəlib-keçir, hər şeyi o qədər aydın görüb hiss edirəm ki, elə bil, bunlar hamısı dünən, srağagün baş vermişdir.

Mən teatr institutuna girəndən əvvəl də həmişə aktrisa olmaq xəyalı ilə yaşayırdım. İnstituta girəndən sonra isə bu arzu məni büsbütün öz hökmü altına aldı. Biz hər dəfə dram teatrının tamaşalarına gedib, hamının tanıdığı, sevdiyi məşhur aktrisanın oyununa baxanda, o gecə səhərə qədər özümü onun yerinə qoyaraq, min cür həyəcan keçirər, bəzən xəyalən ifa etdiyim rolun iztirabları ilə göz yaşı tökərdim.

Ümumi yataqxanada tək qaldığım zamanlar öz-özümə o qədər Gültəkin, Katerina, Ofelya olmuşdum ki, onların dərdini öz dərdim kimi hiss edirdim. Bəzən mənə elə gəlirdi ki, hansı zamanda isə mən özüm Gültəkin və ya Dezdemona olmuşam.

Buraxılış imtahanlarından bir neçə gün sonra bizi Mədəniyyət Nazirliyinə çağırdılar. Nazir özü bizi qəbul edərək kəndlərimizin incəsənət işçilərinə böyük ehtiyacı olduğunu, bir çox mədəniyyət evlərinin ağzıbağlı qaldığını, hamımızın rayonlara getməli olacağımızı söylədikdə mən: "Əlvida, dram teatrı" deyə qüssə ilə düşündüm. Lakin elə bunun ardınca ürəyimdən başqa bir fikir də keçdi: "Nə olar, kəndə gedərəm. Mən nə zaman taleyimə qəzəblənmişəm ki..."

İnstitutumuzun direktoru nazirə müraciətlə:

– Bəlkə, – dedi, – Nuriyyəni burada saxlayıb, dram teatrına verəsiniz. İstedadlı gəncləri yetişdirmək lazımdır.

– Doğrudur, – deyə nazir təsdiq etdi, – ancaq dram teatrında hələlik yer yoxdur.

Bununla da hər şey qurtardı.

Bir neçə gündən sonra mən Güney qışlaq adlı uzaq bir kəndə, mədəniyyət evinə təyinnamə alıb, şeylərimi yığışdırmaq üçün yataqxanaya gəldim.

Heç bir kəsim olmadığından, yayı da, qışı da institutun yataqxanasında yaşayırdım. Dərslər qurtarandan sonra hamı çıxıb yay istirahətinə gedər, bütün binada bir mən, bir də gözətçi Ələsgər dayı ilə arvadı Güllü xala qalardıq. Ələsgər dayı ilə Güllü xala əslən Kürdüstan dağlarından idilər. 1918-ci ildə iş üçün Bakıya gələrək, o vaxtdan, bizim yataqxanamız yerləşən binanın alt mərtəbəsində balaca bir otaqda yaşayırdılar. Binaya çox idarələr köçmüş, çox adamlar gəlib-getmiş, lakin Ələsgər dayı ilə Güllü xala nə yerlərini dəyişmişdilər, nə də həyat tərzlərini. Hələ indi də "gəlirıx, gedirıx" deyə kürd şivəsi ilə danışırdılar.

Ələsgər dayı özü ilə Kürdüstandan, kim bilir, hansı zamandan qalmış köhnə bir saz gətirmişdi. Hər axşam balaca nimdaş döşəkçənin üstündə oturub sazı dınqıldadar və həmişə də:

"Üzü bəri baxan dağlar,
Mənim sizdə nəyim qaldı?"

sözləri ilə başlanan qədim bir mahnı oxuyardı. Mən də hərdən axşamlar onlara gedib yüz dəfə eşitdiyim bu mahnıya qulaq asmağı xoşlayardım. Mən də onlar kimi uzaq dağ kəndlərindən birində doğulmuşdum. Mənim də uşaqlığım uçurumlar, sıldırımlar arasında keçmişdi. Mən də o yerləri unuda bilmirdim. Görəsən, "üzü bəri baxan dağlar"da bizim nəyimiz qalmışdı...

Mənim də, onlar kimi, qohum-əqrəbam olmadığından, bir-birimizə üns salmışdıq. Onlar mənə öz qızları kimi baxırdılar. Nə bişirsəydilər, payımı saxlayardılar. Mən də onlara hörmət edər, əlimə bilet düşəndə kinoya, teatra aparardım. Daha başqa bir yaxşılığım dəyməzdi. Yeməyim, geyməyim hamısı institutdan aldığım təqaüdə baxırdı.

Ələsgər dayıgil mənim getməyimi biləndə çox kədərləndilər. İkisi də mənimlə vağzala gəldi. Ələsgər dayı gedib yolum üçün iki şüşə limonad aldı. Güllü xala balaca döşəkçə ilə balıncı açıb vaqonda mənə yer düzəltdi. Axırıncı zəng vurulanda, Ələsgər dayı əlimi sıxıb, "salamat ol, bala" dedi. Güllü xala isə, boynumu qucaqlayıb üzümdən öpəndə özünü saxlaya bilməyib ağladı.

– Bizi yaddan çıxarma, – dedi. – Vaxtın olsa, kağızdan-zaddan yaz.

Qatar yola düşdü. Mən heç bir zaman ağlamamışam. Heç bir zaman öz taleyimdən inciməmişəm. Lakin heç bir zaman özümü indiki kimi

yalqız hiss etməmişdim. Heç zaman qəm-qüssə indiki qədər ürəyimi sıxmamışdı. İnstitutda oxuduğum zaman gələcək, yəqin ki, hələ çox uzaq olduğu üçün məni qorxutmurdu. Gəncliyin qəribə xəyalları mənə şirin vədlər verirdi. İndi isə, hər şey çox aydın və sadə idi. Mən bütün arzularıma həmişəlik vida edib, adi bir kənd klubunda işləməyə gedirdim. Arxada qalan bu böyük şəhərə mən vaxtilə necə səssiz-səmirsiz gəlmişdimsə, indi də bu şəhərdən eləcə səssiz-səmirsiz çıxıb gedirdim. Mənim gəlişim kimsəni maraqlandırmadığı kimi, gedişim də qoca Ələsgər dayı ilə Güllü xaladan başqa heç kəsi mükəddər etmədi.

Mənim düşdüyüm stansiya balaca bir yer idi. Orada-burada tək-tək elektrik çırağı yanırdı. Avqustun ortaları olduğundan hava çox isti idi. Stansiya binasının qabağında bir avtobus dayanmışdı. Yaxınlaşıb içindəki adamlardan, onun haraya gedəcəyini soruşdum.

– Sovxoza, – deyə pəncərənin qabağında oturmuş bir qadın cavab verdi.

Sonra soruşdu:

– Siz hara gedəcəksiniz?

– Güney qışlağa!..

– Bu avtobus elə Güney qışlağın böyründən keçir. Gedin tez bilet alın.

Tələsik stansiya binasına girib kassanın qabağına getdim. Lakin redikülümü açanda yerimdə donub qaldım. Bütün var-yoxum – üç yüz manat yox olmuşdu. "Bəlkə səhv eləyib çamadana qoymuşam" deyə tələsik çamadanı açıb, paltarlarımın arasını axtardım. Yox idi. Demək, ya Bakıda bilet alanda, ya da haradasa yaylıq çıxaranda salıb itirmişdim. Kassanın qabağında dayanmış üç kişi və bir qadın mənə baxırdı.

– Nə olub? Nə itirmisən, bacı? – deyə kişilərdən biri soruşdu.

Mən lap uşaqlıqdan öz zəiflik və ya kədərimi başqalarının bilməsini xoşlamıram. Ona görə də:

– Heç bir şey olmayıb, – deyə soyuqqanlılıqla cavab verdim. – Bir məktub vardı, deyəsən, evdə qoyub gəlmişəm.

Çamadanla bağlamanı götürüb tez bayıra çıxdım.

Hara getdiyimi bilmədən irəliləyir və "nə olub?" deyə öz-özümü məzəmmət edirdim: "Heç o boyda ümidini itirdin, ağlamadın, indi puldan ötrü ağlayacaqsan?" İçərimdən gələn başqa bir səs bu yad yerdə pulsuz-pənahsız bir qız olduğumu amansız sərtliklə mənə xatırladır, "indi nə edəcəksən? Kəndə necə gedib çıxacaqsan? Maaşını alana

qədər kimdən çörək pulu istəyəcəksən?” deyə dalbadal soruşurdu. Avtobus siqnal verərək yanımdan keçdi. Ay işığında ağaran şoseni tutub, yoluma davam etdim.

Buradan Güney qışlağa neçə kilometr olduğunu bilmirdim. Lakin bütün gücümü, cəsarətimi toplayıb gedirdim. İndi çöldə xəfif meh əsdiyi üçün hava bayaqkı qədər bürkü deyildi. Göz işlədikcə, uzaqlarda yüngül göyümtül dumana bürünmüş kimi görünən dağların yamaclarında topa-topa işıqlar sayrışırdı. Xoş sükut içində yalnız cırcıramaların aramsız, yeknəsəq səsi eşidilirdi.

Mən, bir əlimdə çamadan, bir əlimdə balaca bağlama irəliləyirdim. Bu aydınlıq çöllərin mehriban sükunəti, mavi üfüqlərdə itən genişliyi indi mənə anlaşılmaz bir təsəlli, məchul bir ümid təlqin edirdi.

Ara-sıra dayanıb nəfəsimi dərib yenə də yoluma davam edirdim. Çamadanda kitab-dəftər çox olduğundan, qolum ağrıyırdı.

Kilometrləri göstərən on dördüncü ağacı sayanda, daha ayaqlarımın sözümə baxmadığını hiss edərək, yolun kənarına çəkildim. Əlimdəkiləri yerə qoyub, çamadanın üstündə oturdum. Elə bu anda yanımdakı iri böyürtkən kolundan bir tülkü çıxaraq düzlərə sarı götürüldü. Bərk qorxmağıma baxmayaraq, heyvanın bu mavi nur dənizi içində necə qeyb olduğuna heyranlıqla tamaşa edirdim. Birdən bu kiçik hadisə nə üçünsə xəyalımı çəkib insanların hələ Yer üzündə yaşamadığı zamanlara apardı. Bu geniş çöllər, bu nəhayətsiz sükut, bu munis aydınlıq onda da var idi, indi də var. Biz insanlar dünyaya nə üçün gəldik? Təbiətin bu əbədi ahənginə nə əlavə etdik? İndi mənim çəkdiyim bu əziyyət, bu iztirab nə üçündür? Əgər, mən olmasaydım, bu gözəl gecə nə itirərdi?

Əsəbləri pozulmuş adamlar qorxulu yuxular görən kimi, bu bədbin fikirlərin də mənim düşdüyüm çətin vəziyyətdən doğduğunu bilirdim. Lakin, bununla belə, onların axınına uymaqdan anlaşılmaz bir zövq, bir rahatlıq duyurdum. Hətta, bu anda ölümün özü də mənə şirin yuxu kimi görünürdü. Mənə elə gəlirdi ki, dünyada zaman, məkan deyilən şey yoxdur, bizim ağlımızın dərk edə bilməyəcəyi əbədi bir boşluq, bir intəhasızlıq var. Uzaqdan gələn motor səsi eşitdim. Öz həmcinsim olan insan məni yenidən həqiqi həyata səslədi. Ay işığına qarşı əlimi gözümün üstünə qoyaraq diqqətlə baxanda gümüşü toran içindən bir motosiklin çıxdığını gördüm. Onun üstündəki adam, məni görəndə, maşını saxlayıb, yerə düşdü və bir əli rulda olduğu halda:

– Niyə burada oturmusunuz, bacı? – deyə təəccüblə soruşdu.

Mən onun səsini eşidib, Ay işığında şəvə kimi parlayan iri, qara gözlərini görərkən diksindim: "Ax, leytenant... Mənim cavan leytenantım, sən haradan gəlib çıxdın? Yoxsa, bu, yuxudur?"

O, motosiklin dayağını salıb, mənə bir az da yaxın gəldi:

– Niyə dinmirsiniz? Yoxsa, sizə bir şey olub?

"Ax, leytenant, böyürtkən kolu üzümə kölgə saldığı üçünmü məni tanıya bilmirsən? Yoxsa, mən o qədər dəyişilmişəm, o qədər xarab olmuşam ki..."

– Mənə heç bir şey olmayıb. Dincimi alıram, – deyə, nəhayət, dilləndim.

– Hara gedirsiniz?

– Güney qışlağa...

– Bəs, piyada nə üçün?..

– Avtobusa çata bilmədim.

"Nə üçün sənə yalan deyirəm? Nə üçün həqiqəti söyləmirəm?"

– Nahaq yerə piyada gəlmisiniz, – dedi. – Stansiyadan Güney qışlağa otuz kilometrdir. Tərkimdə otura bilərsiniz?

O, papiros çıxartdı, kibritin sarımtıl alovu onun üzündə titrədi.

"Gərək ki, sən onda papiros çəkmirdin. O zaman sənin bu nazik qara bığların da yox idi. Çöhrən də indiki qədər arıq, solğun deyildi."

– Tərkimdə otura bilərsinizmi? – deyə o, sualını təkrar etdi.

– Otura bilərəm. Ancaq qorxuram sizə əziyyət ola.

– Nə əziyyət... Gecə vaxtı bu çölün ortasında qalmayacaqsınız ki. Şeylərinizi verin bura.

Mən yalnız indi ayağa durmaq lazım olduğunu dərk etdim, qalxıb motosiklə yanaşdım. O, papirosunu tullayıb toqqasını açdı, çamadanla bağlamanı bir-birinə çal-keçir edərək, cəld hərəkətlə götürüb motosiklin üstünə aşırdı. Sonra motosiklə minib üzünü mənə tutdu:

– Gəlin əyləşin!

"Sən o zaman belə sərt, belə amiranə danışmazdın."

Mən qalxıb onun tərkində oturdum.

– Bərk tutun, maşın çuxura-zada düşəndə qorxmayın.

– Qorxmaram.

Yola düşdük. Mən onun nazik belindən bərk-bərk yapışmışdım. Ay işığında onun qara qıvrım saçlarını küləyin necə oynatdığına tamaşa edirdim.

O, daim qabağa baxaraq sürürdü. Mən ona olan bu yaxınlığımın səadəti ilə sərməst idim. Bir dəfə maşın nəyin isə üzərindən tullanaraq bizi bərk silkələdikdə, dodaqlarım onun kürəyinə toxundu...

Mən istərdim ki, bu yol uzansın, uzansın. Biz əbədi olaraq elə beləcə gedək...

Lakin, biz, tezliklə Ay işığında gümüşü rəngə çalan söyüdlərin altı ilə səssiz-səmirsiz axaraq, sanki qurbağaların hay-küyünü dinləyən arxa çatıb körpünü keçdik. Burdan o yana kənd başlayırdı. O, motosiklin sürətini azaldaraq, geriyə çevrilmədən soruşdu:

– Kimin evinə gedəcəksiniz?

– Bilmirəm, – deyə təqsirkar ifadə ilə cavab verdim. – Mən bura birinci dəfə gəlirəm.

O, elektrik fənərləri ilə işıqlanmış küçənin ortasında motosikli saxladı və biz düşəndən sonra:

– Görünür, – dedi, – siz bura iş üçün gəlmisiniz?

Mən anlaşılmaz qorxu içində onun baxışlarından qaçaraq:

– Bəli, mədəniyyət evində işləməyə gəlmişəm, – deyə cavab verdim.

Lakin, onun mənə çox diqqətlə nəzər saldığını hiss edərək, qeyri-ixtiyari başımı qaldırdıqda:

– Siz Nuriyyə deyilsiniz? – deyə heyrətlə soruşdu.

– Deyəsən, özüdür.

– Bəs, niyə bayaqdan tanışlıq vermirdiniz?

Dinmədim. Ağlayacağımdan qorxduğum üçün dinmədim. O mənim buza dönmüş soyuq əlimdən tutub:

– Bu nə qəribə təsadüfdür, Nuriyyə, – deyə pıçıldadı. – Siz hara, bura hara?

Mən onun Ay işığında qara kölgə ilə haşiyələnmiş gözlərinə baxaraq, əlimi iri, cod və gözəl əlindən çəkmədən susurdum.

– Siz məni yolda görəndə tanıdınız?

"Bəli" mənasında başımı tərpətdim. O, dərindən nəfəs alaraq, əlimi buraxdı.

– Yaxşı, indi siz dincəlməlisiniz, – dedi. – Gedək.

Biz yavaş addımlarla irəliləyib, qalın bağla əhatə olunmuş bir evin darvazasında dayandıq.

– Bura kolxoz sədrinin evidir, – deyə o, astadan izah etdi. – Özü də, arvadı da çox yaxşı adamlardır. Hələlik ev-zad düzəldənəcən burada qalarsınız.

O, darvazanı döydü. Evdən kişi səsi soruşdu:

– Kimdir?

– Mənəm, Nəriman əmi.

Çox çəkmədi ki, ayaq səsləri eşidildi. Sonra darvazanın balaca qapısı cırıltı ilə açıldı. Nəriman əmi qəddini əyərək papaqsız, qırxıq başını uzadıb bizə baxdı və məni görcək dərhal bayıra çıxaraq:

– Xoş gəlmisiniz, – deyə əl verdi.

Darvazanın baş tərəfinə vurulmuş elektrik çırağı onun üzünü işıqlandırmışdı. Bu, ucaboylu, yoğun bir kişi idi. Ucları altdan yuxarı burulmuş qumral bığları onun tərtəmiz təraş edilmiş qırmızı yanaqlı çöhrəsinə gümrah və cəsur görkəm verirdi. Sonradan öyrəndiyimə görə, yaşı altmışı ötmüşdü, lakin ona əllidən artıq yaş vermək olmazdı. Ayaqlarında uzunboğaz çəkmə, əynində sürməyi yun parçadan köynək-şalvar var idi. Belini enli qayışla qıs-qıvraq bağlamışdı.

Məni başdan-ayağa süzərək:

– Buyurun içəri, – dedi və çamadanımı oğlandan aldı.

Biz motosikli bayırda qoyub, bağçaya girdik və ağacların arası ilə gedib böyük kürsülü evin eyvanına çıxdıq.

Əynində güllü xalat, başında ağ haşiyəli bənövüş kəlağayı, qırx beş-qırx altı yaşlarında balacaboy, yumru bir qadın qabağımıza yeriyərək mənə "xoşgəldin" elədi. Sonra qolumdan tutub, çəhrayı abajurlu elektrik çırağının altına qoyulmuş ağ örtüklü stola tərəf çəkdi:

– Gəlin əyləşin.

– Murad, bacıqızı hansı qohumlardandır? – deyə Nəriman əmi soruşdu.

– Nuriyyə xanım mədəniyyət evində işləməyə gəlib.

– Yoxsa, bacıqızı artistdir?

Murad, Nəriman əmiyə cavab verməyərək, mənə baxdı.

– Bəli, artistəm, – dedim və Muradın baxışlarındakı təəccübü hiss edərək, daha ciddi görkəm aldım.

– Ay, bir də xoş gəlmisən, – deyə Nəriman əmi nəşə ilə səsləndi. – Neçə dəfə zəng eləyib nazirə demişdim. Əşi, o boyda mədəniyyət sarayı tikdirmişik, qalıb ağzı bağlı... Hə, deməli, artistsən. Çox gözəl, çox gözəl...

Murad zarafatyana onu məzəmmət elədi:

– Nazirə zəng vurub artist istəyirsən, amma artistin qabağına bir maşın da göndərmirsən. Nuriyyə xanım stansiyadan pay-piyada gəlir-

di. (Nə üçün o mənə xanım deyirdi? Nə üçün sadəcə adımı söyləmirdi.)

– Təqsir özündə olub, bir teleqramdan-zaddan vursaydı, nəinki stansiyaya, lap Bakıya maşın göndərərdim.

– Sağ olun, elə göndərmişkən varsınız, – dedim.

– Bakıda hansı teatrda işləyirdin?

– İşləmirdim, oxuyurdum. Bu il teatr institutunu qurtarmışam.

Nəriman əmi birdən qəddini elə gümrahlıqla düzəltdi ki, elə bil fərağat komandasında duracaqdı:

– Əşi, Güney qışlaq hara, institut qurtarmış artist hara?! Qərənfil, niyə durmusan, tez ol, gör nə qayırırsan.

– Bu saat, bu saat, – Qərənfil bacı quş kimi səkərək, eyvanın aşağı başına, kürəyə tərəf getdi.

Murad Nəriman əmiyə baxıb gülümsündü:

– Yaxşı da, görək bu institut qurtarmış artist üçün necə şərait düzəldəcəksən.

"...Sənin mənə göstərdiyin qayğıda hiss etdiyim bu yadlıq haradandır? Elə bil, mənə acıyırsan."

Nəriman əmi ovurdlarını şişirdərək, əlini bığına çəkib, məzəmmətlə Murada baxdı:

– Bilirsən ki, Nəriman düzəldər!

Qərənfil bacı stəkan-nəlbəki, qənd, mürəbbə gətirib stolun üstünə düzərək:

– Ay Murad, – dedi, – bizim kişinin yanını yerə qoymaqla işi yoxdur. Sən niyə ayaq üstündə durmusan? Otursana.

– Yox, gedirəm.

Murad qaşlarını çatdı, üzü birdən-birə tutqunlaşdı. Gözləri kədərli bir ifadə aldı:

– Nuriyyə xanım, – dedi – buranı öz eviniz hesab eləyin. Hər nə sözünüz olsa, Nəriman əmiyə, Qərənfil bacıya deyin, çəkinməyin.

O bu sözləri elə deyirdi ki, elə bil, əziz bir adamını qoyub uzaq səfərə gedirdi.

– Otur, bir stəkan çaydan-zaddan iç, – deyə Nəriman əmi ona təklif etdi. – Qorxma, bizdə olmağına arvad bir söz deməz.

Mən bu axırıncı sözləri eşidərkən diksindim. Sonra özümdə qəribə halsızlıq hiss elədim. Elə bil, bütün gücüm bir anda məni tərk edib getdi.

Murad, Nəriman əminin zarafatına cavab vermədi, tutqun və sərt ifadə ilə:

– Xudahafiz, – deyib tələsik eyvandan düşdü.

Darvazadan çıxıncaya qədər gözlərimi ondan çəkmədim. Mənə elə gəldi ki, onu təkrar itirdim. Elə bil ki, bu bir saatın içində yenidən qayıdan ümid və arzularım, səadətim, motosiklin səsi ilə birlikdə gecənin sükutuna qarışaraq, yox olub getdi.

Mən gülümsəyərək Nəriman əmi ilə Qərənfil bacıya baxdım. Görünür, mənim bu təbəssümümdə, nə isə, qeyri-adi bir hal var idi. Qərənfil bacı bilmirdi ki, mənim daha gülümsəməkdən başqa ayrı çarəm qalmamışdır.

Qərənfil bacı bilmirdi ki, mənim qəlbim heç zaman mənə şikayət etməmişdir. Ata-anamın vəfatından sonra səkkiz yaşında ikən əmimin öhdəsində qaldım. İnsafsız, avam bir adam olan əmim arvadı iri mis səhəngi çiynimə verib, səhərdən axşama qədər mənə ayaqyalın, başıaçıq su daşıtdırırdı. Lakin mənim balaca qəlbim səssiz, lal nəğmələr oxuyaraq, məchul bir ümidlə yaşadı; səhər günəşin doğmasını, bahar çiçəklərinin açılmasını, isti yay axşamı dağlardan əsən sərin yelləri sevinc və heyranlıqla qarşıladı. Sonra kənd məktəbində bizə dərs deyən qoca müəllimimiz əmim arvadının mənə nə divan tutduğunu bilərək, qəzetə yazdığı üçün, məni onlardan alıb uşaq evinə verdilər. Neçə vaxt orada heç bir yaxın adam və qohum üzü görmədən yaşadım. Həmişə məktəb müsamirələrində güldürücü rollar oynayardım.

İnstitutda oxuduğum zaman rəfiqələrim gündə təzə paltar geydikləri halda, mən bütün ili bir donla başa vurdum, lakin qəlbim sıxılmadı. O, yəni, qəlbim yalnız iki dəfə bərk məyus olaraq, sarsılaraq mənə əzab vermişdir. Bunun birisi, beş il qabaq, Gəncədə orta məktəbin son sinfində oxuduğum zaman olmuşdu. Bizim məhəllədə kiçik bir klub var idi. Biz, onuncu sinif şagirdləri, istirahət günlərində ora rəqs etməyə gedərdik. Bizdən başqa həmin kluba tələbələr, gənc zabitlər də gələrdilər. Bir istirahət günü dörd-beş qız dayanıb rəqsə dəvət olunmağımızı gözləyirdik. Birdən oğlanların arasında iyirmi iki-iyirmi üç yaşlarında ucaboy, qaragöz, məğrur duruşlu bir oğlan görüb diksindim. Mənə elə gəldi ki, bu gənc leytenantı haradansa tanıyıram. Haradasa görmüşəm. O, özü kimi gənc bir leytenantla danışdığından, mənim baxışlarımdan xəbəri yox idi. Onun duruşunda, danışığında qayğısız, şən bir hal var idi. Saçları da gözləri kimi qapqara idi.

Nəhayət, onlar söhbətlərini kəsib bizə sarı döndükdə nəzərlərimiz qarşılaşdı. (Nə üçün onun gözləri birinci olaraq məhz mənim baxışla-

rıma rast gəldi?..) Ürəyim şiddətlə çırpındı. Ani bir qorxu içində hər şeyi – özümü, bütün ətrafımdakıları unutdum. Elə bil ki, onun iri qara gözləri bir sehrlə bütün varlığıma hakim oldu. Yanaqlarım od tutub yandı. Xoş bir yarıbayğınlıq içində gözlərim dumanlandı.

O gülümsəyirdi... Sanki mən, on yeddi illik ömrümdə gənc qız olduğumu ilk dəfə hiss edirdim.

(Nə üçün bizim taleyimizdə səadət bəzən bir meteor kimi parlayıb qeyb olur...)

Mən onun dəvətini qeyri-şüuri bir itaətkarlıqla qəbul etdim. Rəqs zamanı aramızda, sanki çalınan musiqinin ahənginə uyğun, belə bir söhbət oldu:

– Adınız nədir?

–...

– Nə üçün gülümsəyirsiniz?

– Adım Nuriyyədir. Bəs, sizin adınız nədir?

– Murad. Yadınızdan çıxmaz ki?

Mən başımı buladım.

– Eviniz hansı küçədədir?

– Evimiz yoxdur.

– Bəs, harada olursunuz?

– Uşaq evində.

Mən gözlərimi yarıqapayaraq gülümsəyirdim. Mən onun keçmişlərə toxunmasını istəmirdim. O daha heç nə soruşmadı. Rəqsdən sonra:

– Bəlkə bir az havaya çıxaq, – deyə o təklif etdi, – bura çox istidir.

Etiraz etmədim.

Küçə ilə gedərkən mənə elə gəlirdi ki, hamı nəyə isə sevinir, nə isə fərəhli bir iş üçün tələsir.

Mən hərdən göz qapaqlarımı qaldırıb ona baxır, yavaş və həyəcanlı səslə onun suallarına cavab verirdim.

– Siz buralısınız? – deyə, nəhayət, mən də ondan soruşdum.

– Xeyr, – dedi, – uzaq bir kənddənəm...

Elə bu zaman qabaqdan gələn ortayaşlı bir polkovnik Murada baxıb xəfifcə gülümsədi və əlini gözünün üstünə qaldıraraq, oğlanın salamına cavab verib keçdi. Gənc leytenantın polkovniki görərkən qızarıb özünü yığışdırması mənə həm gülməli, həm də olduqca xoş təsir bağışladı. Bəlkə də, bu kiçik təsadüf ucundan mən ondan kəndlərinin adını soruşmağı unutdum...

Mən onun varlığından, onun baxışından, danışığından başqa heç nə hiss etmirdim. Duyğuların, yaz seli kimi, birdən başlamış axını fikrimin bir nöqtədə qərar tapmasına imkan verməyərək, məni hey irəliyə, hər anı mənim üçün bihuşedici dərəcədə gözəl və yeni olan bir aləmə sövq edirdi. Mən, təzəcə qanad bağlayaraq, pərvaz etməkdən sevinib özünü unutmuş quş balası kimiydim.

Biz qırıq-qırıq, rabitəsiz sözlər danışa-danışa şəhərdən çıxmışdıq. Yanımızdan tez-tez yük və minik maşınları gəlib keçirdi. Yoldan burulub sakit çölə düşdük. İl yağıntılı keçdiyindən, mayın qurtarmasına baxmayaraq, düzlər yamyaşıl idi. Orada-burada ağ, çəhrayı, sarı çiçəklər görünürdü. Qaramtıl bir bulud parçası qüruba əyilən günəşin qabağını tutduğu üçün çölün biz olan hissəsinə kölgə düşmüşdü, qalan yerlər isə, qızılı ziya içindəydi.

– Bilirsiniz, bu səhər yuxudan duranda özümü elə şad hiss edirdim ki, elə bil, mənə nə isə böyük bir xoşbəxtlik üz vermişdi. Sən demə, doğrudan da...

O, cümləsini bitirməyərək susdu. Mən onun qoluna girmək üçün özümdə şiddətli bir arzu hiss etdim. Elə bil ki, bu ona əyan oldu və icazə almadan qolumdan tutdu.

Hər tərəf geniş, hər tərəf sakit... Çölün gün düşən yerlərindəki çiçəklərin rəngi daha parlaq görünürdü. Gecikmiş balaca, sava lalələr yaqut kimi şəfəq saçırdı.

O, başını azca mənə tərəf əyərək:

– Nuriyyə, – dedi, – biz heç vaxt bir-birimizdən ayrılmayacağıq... Elə deyilmi?

“Vaxta ki, sən deyirsən, demək, elədir. Mən sənin səsində elə bir mərdlik hiss edirəm ki...”

– Siz onilliyi bitirərsiniz... Sonra...

– Sonra nə?!

Bu zaman başımız üzərindən həyəcanlı səslər çıxara-çıxara bir dəstə quş uçurdu...

– Ancaq... Siz niyə danışmırsınız?

Mən əlimi onun əlinin üstünə qoyaraq heç bir söz demədim. Mən ata-ana, bacı-qardaş ünsiyyəti görməmiş bir qız idim... İndisə, budur, dünyada mənim üçün ən əziz, ən qiymətli olan adamı tapmışdım. Mən ondan heç nə soruşmurdum. Biz bir-birimizə bu qədər yaxın, bu qədər doğma ikən mən ondan nə soruşa bilərdim?! Mən onun sözünə necə təəccüb edə bilərdim?!

“Mənim əzizim, cavan leytenant, sən də məndən heç nə soruşma, heç nə. Sən hər şeyi bilirsən... Sən hiss etməyə bilməzsən. Doğrudur, biz bir-birimizi cəmi iki-üç saatdır ki, tanıyırıq. Ancaq mənim üçün zaman öz hökmünü vermişdir. Mənə elə gəlir ki, səni tanıdığım, sənə bağlandığım, sənin boy-buxununla, mərdanə görkəminlə fəxr etdiyim tam bir əsrdir. Bir əbədiyyətdir. Elə bil, min ildir ki, mən sənin səsindəki nəcibliyə arxalanıram!”

– Siz Nizaminin məzarını görmüsünüz? – deyə əlimi xeyli aralıdakı tənha türbəyə uzatdım.

– Bir neçə dəfə yanından keçib getmişəm.

– İçərisinə baxmamısınız?

– Xeyr, necə məgər?

– Elə-belə soruşuram. İstəyirsiniz birlikdə gedək.

– Gedək.

Yol uzunu mən çoxlu çiçək dərdim. Murad yerdən, boy atmış uzun bir qatırdırnağı üzdü və çiçəkləri məndən alıb dəstə bağlayaraq, “uşaqlıqda quzuqulağı-zad yığanda belə edərdik” deyə yenə də özümə qaytardı.

Biz Nizaminin türbəsinə çatarkən, yuxarı dağların zirvəsindən qapqara bir bulud parçası qopub, günəşin qabağını tutan buludla birləşdi...

...Neçə gün bundan əvvəl kim tərəfindənsə şairin məzarı üstünə qoyulmuş qızılgüllər quruyub xəzəl olmuşdu. Mən də gətirdiyim təzə çöl çiçəklərini onların yanına qoydum: “On dörd yaşımdan başlayaraq, hər il, anadan olan günümdə iki-üç qız yoldaşımı dilə tutaraq sənin türbənə gələrdim. Lakin heç kəs mənim bura gəlişimin əsl səbəbini bilməzdi. Heç kəs bilməzdi ki, mən məhz anadan olduğum gün bura gəlirəm. Çünki o gün mənim ürəyim çox dolu olurdu... Mən bu barədə kimsəyə bir söz demirdim... İndisə mən tək deyiləm. Mən sənin türbənə həyatımın ən xoşbəxt günündə gəlmişəm. Mən sənin tərənnüm etdiyin böyük məhəbbətin qüdrətini duyaraq gəlmişəm...”

Türbənin içi getdikcə qaranlıqlaşdığından, mənim gətirdiyim təzə çiçəklər yavaş-yavaş öz rəngini itirib, əvvəlki qurumuş güllərdən seçilmirdi.

Başımı qaldırıb Murada baxdım, elə bu zaman bayırda şiddətlə göy guruldadı, şimşək parladı.

Mən uşaqlıqda həmişə göy gurultusundan qorxardım.

– Gedək, Murad.
– Gedək.
Lakin biz bayıra çıxana qədər göy bir də eyni şiddətlə gurladı. Dalbadal şimşək çaxdı və sonra yağış şırıldadı. Biz qalxıb türbənin üstündəki taxtapuşlu meydançada dayandıq. Birdən göy elə qəzəblə şaqqıldadı ki, elə bil yuxarıda, başımız üzərində bizə məlum olmayan hansı bir aləmsə dağılıb tar-mar oldu. Eyni anda ildırım çaxıb sel-su axan çölü gündüz kimi işıqlandırdı. Sonra hər şey boz bir qaranlıq içində itib-batdı. Mən qeyri-şüuri bir hərəkətlə Muradın böyrünə qısıldım. O, qolunu kürəyimdən gətirib çiynimdən tutaraq:
– Yoxsa, qorxursan! – dedi.
Mən dinmirdim. Mən üşüyürdüm. Mən gözlərimi qapayaraq, onun gənc bədəninin hərarətini duya-duya tufanın qorxulu səsini dinləyirdim.
Mən tək deyildim!
– Yağış bu saat kəsəcək... yuxarı ayazıyır.
Mən gözlərimi açdım. Guruldayan qaranlıq yağış tufanı arasından göyün işıqlı bir hissəsi görünürdü.
– Hələ ertə imiş ki... Mən də elə bilirəm gecə düşüb... – deyə ruh yüksəkliyi ilə dikəlib saçlarımı düzəltdim. Sonra özüm Muradın qoluna girdim.
Yağış kəsdi. Göyün qara səthi bir neçə yerdən parçalandı. Buludlar tələsirlərmiş kimi aşağılara – üfüqə doğru sürətlə uzaqlaşdı. Onlardan qırılıb qalan tünd-bənövşəyi bulud parçası günəşin son şüaları ilə işıqlanmışdı.
Biz islanmış otları ayaqlaya-ayaqlaya düzənlikdən keçib asfalt yola çıxdıq.
– Deyirlər, sabah yaxşı film göstəriləcək... Bəlkə gedək...
– Yox, Murad, birisi gün riyaziyyatdan imtahan verəcəyik. Bir az hazırlaşmaq lazımdır.
– Görürsənmi... İmtahanların başlandığı heç ağlıma gəlməyib... Qorxmursan ki?
– Qorxmuram. Ancaq riyaziyyat müəllimimiz yaman sərt adamdır.
– İmtahan birisi gün saat neçədədir?
– Səhər saat doqquzda.
– Demək, axşamçağı görüşə bilərik...
Mən "bəli" mənasında başımı tərpətdim.

– Bir az tez görüşək. Mən nigaran olacağam.
– Saat altının yarısında.
– Düz altının yarısında kitabxanada gözləyəcəyəm.
O, susub sonra zarafatyana əlavə etdi:
– Amma yaxşı hazırlaş ha... Yoxsa, bir il geri düşərik!
– Oy, Allah eləməsin, – deyə mən düşünmədən səsləndim.

Lakin dərhal zarafatın mənasını başa düşərək ürkmüş halda Murada baxdım.

O, gülümsəyərək, əlimdən tutub, yavaşca sıxdı.

Riyaziyyatdan pis oxumadığıma baxmayaraq, iki gecə səhərə qədər gözümü yummayıb hazırlaşdım. Keçdiyimiz bütün riyaziyyat düsturlarını, qaydalarını bir də təkrar etdim. Ən çətin məsələ-misalları seçib həll elədim. Yoldaşlarıma dedim ki, mənə çoxlu suallar versinlər.

Nəhayət, o gün gəlib çatdı, səhər doqquzda riyaziyyatdan yazılı imtahan başlandı. Bütün səyimə baxmayaraq, çox həyəcanlandığımdan, misallardan birinin həllində səhvə yol vermişdim. Buna görə də, "beş" xəyalında ikən, "dörd" aldım.

Nə etmək olardı... Hər halda, "üç" deyildi.

Axşam düz altının yarısında kitabxanada oldum. Bayaq dediyim kimi, məktəbimizin klubunda mən komik rollar oynayıb, yoldaşlarımı, müəllimlərimi gözləri yaşarıncaya qədər güldürərdim. İndi "beş" əvəzinə "dörd" aldığımı Murada necə məzəli bir kədərlə, necə məhzun baxışlarla xəbər verəcəyimi yol uzunu düşünüb öz-özümə gülümsəyirdim.

Lakin o gəlməmişdi.

"Bəlkə bir işi olub, gecikib..." deyə səkkizə qədər gözlədim, gəlmədi. Dərs öyrənmək bəhanəsi ilə dörd-beş gün hər axşam kitabxanaya getdim. O gəlmədi...

Saatlarca yataqxananın pəncərəsi qabağında oturub gözümü küçəyə dikdim... Onu görmədim.

Günlər, aylar gəlib keçdi...

Nəhayət, mən ondan əlimi üzərək, uşaq evinin köməyi ilə Leninqrada gedib dağ-mədən institutuna girdim. Bu sənət, məktəbdə oxuyarkən, Gəncədən çox da uzaqda olmayan Dəstəfur dağlarına, Daşkəsən mədənlərinə elədiyimiz səyahət zamanı romantik bir aləm kimi məni cəzb etmişdi...

İnstitutda işlərim əvvəlcə çox yaxşı gedirdi. Adamlara tez isinişməyi bacardığımdan, yoldaşlarım da, müəllimlərimiz də xətrimi istəyirdilər. Lakin beş-altı aydan sonra tez-tez xəstələnməyə başladım. Qollarımda, qıçlarımda bərk ağrılar əmələ gəlmişdi. Elə olurdu ki, birdən yeddi-səkkiz gün yataqdan qalxa bilmirdim. İnstitutun həkimləri uzun və diqqətli müayinədən sonra bu qərara gəldilər ki, Leninqradın havası rütubətli olduğundan, bir çox cənublular kimi, mənə də düşmür.

Son kursda oxuyan Ayna adlı bakılı bir qızla dost olmuşduq. O məni məşhur professorlardan birinin yanına apardı. Professor da həkimlərin dediyini təsdiq edib, mənə məsləhət gördü ki, tezliklə Azərbaycana qayıdım.

Mən elə sarsılmışdım ki, yolu güclə gedirdim.

Heç bir kəsim olmadığını bildiyi üçün mənim vəziyyətim Aynaya da çox təsir etmişdi. O, qoluma girərək:

– Darıxma, Nuriyyə, – dedi, – dünya qurumayıb ki, mən diplom işi yazmaq üçün bir neçə günə gedəcəyəm Bakıya. Sən də mənimlə gedib qalarsan bizdə. Yayda da girərsən institutlardan birinə.

Qız bu sözləri o qədər səmimi, o qədər açıq ürəklə dedi ki, etiraz etmədim. Biz mayın əvvəlində Bakıya gəldik.

Aynanın atası neft mühəndisi idi, günün çox hissəsini mədəndə keçirirdi. Hətta, bəzən gecə də orada qalırdı. Anası isə, çoxdan rəhmətə getmişdi. Kişiyə qoca bir rus qadını xidmət edirdi. Aynadan beş-altı yaş böyük olan qardaşı tibb institutunda dosent idi. Özü də evlənib ayrı yaşayırdı.

Cənub günəşi tezliklə öz təsirini göstərdi. Ağrılarım getdikcə azalıb, nəhayət, tamam kəsildi, yavaş-yavaş dirçəlməyə başladım. Ətəqana gəlim deyə, Ayna məni zorla yedirirdi.

Bir gün hava bərk isti olduğundan, biz qonaq otağının şimala açılan pəncərəsi qabağında oturub sərinləyirdik. Ayna diplom işini yazır, mən də qəzetə baxırdım. Birdən o, qələmi yerə qoyaraq, dəftərlə üzünü yellədi:

– Bürküdən işləmək olmur... İnstitutlara hələ qəbul yoxdur ki?

– Var.

– Hansına?

– Teatr institutuna.

– Yoxsa, teatr institutuna girmək istəyirsən? – deyə o bu dəfə zarafatla soruşdu.

– İstəyirəm, – deyə ciddi cavab verdim.

– Doğrudan?

– Doğrudan.

– Hansı şöbəsinə?

– Aktyorluq.

Mənim cavabım elə qəti idi ki, o daha bir söz soruşmadı. Bir neçə saniyə diqqətlə üzümə baxaraq:

– Nə olar, – dedi, – əgər, ürəyin istəyirsə...

Aynanın təəccüb etməyə də haqqı var idi. Çünki dağ-mədən mühəndisliyi hara, aktyorluq hara! Ancaq nə etməli... Həyatda belə ziddiyyətlər azmı olur... Mən orta məktəbdə oxuyarkən gələcəkdə hansı sənətin ardınca gedəcəyim haqqında nə qədər fikir-xəyala dalmışdım! Ürəyimdən nə arzular gəlib-keçmişdi...

İndisə artist olmaq istəyirdim... Mütləq artist!

Mən imtahan verib, teatr institutunun aktyorluq şöbəsinə daxil oldum.

Mən yuxarıda iki dəfə məyus olduğumu demişdim. Birincinin tarixini söylədim. İkincini də indicə gördünüz: Nəriman əmi onun arvadı haqqında danışırdı. Deməli, o, evlidir. Deməli, mən onu yenidən itirdim. Bəlkə o, subay olsaydı da, bu dəfə heç mənimlə maraqlanmayacaqdı. Bununla belə, onun evli olduğunu eşitdikdə, sanki ürəyimi pencər kimi sıxdılar. Səhərdən bəri ac olduğuma baxmayaraq, Qərənfil bacının gətirib qoyduğu yeməkdən bir-iki tikə götürüb ev sahiblərinə təşəkkür etdim. Tez yatmaq, daş kimi ağır yuxuya getmək istəyirdim. Hava mənə azlıq edirdi. Qərənfil bacı məni pəncərələri qərbə baxan baş otağa apardı. Çarpayıya təzə döşəkağı çəkdi. Nazik adyal gətirib qoydu.

Mən isə, pəncərə qabağında dayanıb bayıra tamaşa edirdim. Ay batmışdı. Güney qışlağın elektrik lampaları qurtaran yerdən o yana hər şey qaranlıq içində itib-batırdı. Yalnız uzaqda güclə seçilən zəif işıqlar görünürdü.

– O işıq gələn yer haradır? – deyə Qərənfil bacıdan soruşdum.

– Muradgilin kəndidir – Quzey qışlaq.

Nə üçünsə ürəyimə dammışdı ki, ora Muradgilin kəndidir.

– Deyəsən, onlarınkı elektrik işığı deyil.

– Eh, elektrikləri nə gəzir?!

– Murad nə işdədir?

– Kolxoz sədridir.

O, nə isə soruşmaq istədi. Lakin fikrindən vaz keçərək:

– Yat, yorğunsan. Səhər açılsın, xeyir gəlsin, – deyib getdi.

Mən çırağı söndürüb, Quzey qışlağın qaranlıqda uzaq ulduzlar kimi güclə seçilən işıqlarına baxırdım. Heç nə düşünmürdüm. Bu bir-iki saatın içində mənim xoşbəxt arzu və ümidlərim yenə də bir meteor kimi parlayıb qeyb oldu. Ürəyimdə bir köz qalıb, məni için-için yandırırdı.

Mən beş ildə o gənc leytenantı, bir gün də olsa, unutmamışdım. "Bəlkə odur" deyə qarşıma çıxan hər cavan hərbiyyəyə diqqət yetirmişdim, "bəlkə bir gün rast gəldik" deyə onun xəyalı ilə yaşamışdım.

İndi kimsəsiz bir qızın bu yad otaqda ən əziz arzusundan əbədi olaraq ayrılmaq məcburiyyətində qaldığını hiss etməsi çox kədərlidir. Qoy bu, heç bir qızın başına gəlməsin. Gecən xeyrə qalsın, Murad. Sən qismətinə çıxan qadınla xoşbəxt olasan. Həyatınız, səadətiniz zaval görməsin.

Qaranlıqda uzaq ulduzlar kimi güclə seçilən işıqlardan gözümü çəkib yavaş-yavaş soyundum. Sonra yerimə girərək həyata, taleyimə qarşı heç bir iddiam, heç bir tələbim olmadan, göz yaşı tökmədən, sakit-sakit ağrıyan qəlblə yuxuya getdim.

Səhər oyandığım zaman bağça hələ sərin kölgə içindəydi, yenicə doğan günəş ağacların baş tərəfini işıqlandırmışdı. Pəncərəyə doğru əyilmiş budağa bir sağsağan qonub, şən nəzərlərlə mənə baxa-baxa dalbadal səslənirdi. Uşaqlıqda, həmişə sağsağan oxuyanda rəhmətlik qoca nənəm "xeyirxəbər sağsağan, – deyərdi, – oğluyun oğlu olub, qızıyın da oğlu olacaq!" O vaxtdan bu quş haqqında məndə xoş bir təəssürat qalıb. İndi də onun düz mənə baxıb sevinclə səslənməsindən xoşlanaraq, ürəyimdə "xeyirxəbər sağsağan", – deyə gülümsədim, – "oğluyun oğlu olub, qızıyın da oğlu olacaq!" Lakin nə üçün məhz oğlu? Görünür, rəhmətlik nənələrimiz bilirlərmiş ki, bu dünyada qızların dərdi oğlanlarınkından çox olur.

Mən fikrimin ardını davam etdirməyərək qərbə, axşam Quzey qışlağın işıqları gələn tərəfə baxdım. Səhərin parlaq işığı içində yalnız bir-iki binanın ağardığını seçmək olurdu. Geyinib eyvana çıxdım. Qərənfil bacı həyətdə camış sağırdı. Ondan bir qədər aralıda Nəriman əmi, qoltuğunda qəhvəyi portfel olan cavan, balacaboy bir oğlanla bərkdən danışırdı. Oğlan çox səliqə ilə geyinmişdi. Boynunda alabəzək qalstuk, başında günlüyü uzun kepka vardı. Çəkmələrinin bağını

bant kimi bağlamışdı. Məni görərkən iti addımlarla qabağıma yeridi, bir qədər çıxıq, balaca, qara gözlərini şən təbəssümlə üzümə dikərək:

– Xoş gəlmisiniz, Nuriyyə xanım, – dedi, – bağışlayın, gecə bilməmişəm.

Sonra əlini mənə uzatdı:

– Qulu Kəhrizli!

Ayağında təzə uzunboğaz çəkmə, köynəkcək və başıaçıq dayanmış Nəriman əmi ona işarə edərək dedi:

– Bizim maliyyə nazirimizdir.

Görünür, sədrin sözləri Qulu Kəhrizliyə ləzzət vermişdi, o, çiyinlərini qısıb güldü:

– Hi... hi... hi...

– Özü də köhnə artistdir. Yaxşı Məşədi İbad oynamağı var.

– Hi... hi... əşi, belə sənətkarların qabağında biz nəyik! Bunlar qayda-qanun bilirlər, mizan bilirlər!

– Nə bilirlər? – deyə sədr təəccüblə soruşdu.

Qulu şəhadət barmağını yuxarı qaldırdı:

– Mizan, yəni, səhnə ölçüsü!

– Qulu, özündən söz çıxarma, səhnə ölçüsü nədir?

– Bəli, bəli! Soruş Nuriyyə xanımdan.

Nəriman əmi mənim gülümsədiyimi görüb əllərini bir-birinə vuraraq, bərkdən şaqqıldadı:

– Qulu, camaatı özünə güldürmə! Ölçünün teatra nə dəxli var?

– Ay-hay!..

Qulu əlini havada oynadıb üzünü mənə tutdu:

– Di gəl başa sal də...

– Qulu, biz anlamaz deyilik...

Sədrin səsində məzəmmət duyan “maliyyə naziri” bir an özünü itirən kimi oldu. Balaca qara bəbəklərini ildırım sürəti ilə hərəkət etdirərək gah mənə, gah da sədrə baxdı. Sonra birdən özünü dartaraq, şəhadət barmağını yuxarı qaldırıb qəti səslə təkrar etdi:

– Mizan! Səhnəninki mizandır!

Bu zaman Qərənfil bacı camışı sağıb qurtardı, köpüklənmiş südlə dolu sərnici götürüb ayağa qalxdı. Nəriman əmi cəld irəliləyib körpə balağı anasının qıçlarından açaraq altına ötürdü. Balaq dizlərini yerə dirəyərək tələsik-tələsik əmir, hərdən anasının yelininə baş vuraraq sanki “çox süd ver” deyirdi.

Qərənfil bacı südü ağ qalaylı mis qazana boşaldaraq, həyətdə qaladığı ocağın üstünə qoydu. Mən bağa gedib çoxdan görmədiyim alma, armud, heyva ağaclarına, kiçik hovuzun dövrəsində salınmış qızılgül kollarına tamaşa etməyə başladım.

Günəş işığında zümrüd kimi parlayan yarpaqlar arasında hələ yetişməmiş göy meyvələr görünürdü. Bağda rütubət qarışıq iydə ətri duyulurdu. Nə üçünsə uşaqlıqda da iydə ətri həmişə məndə kədərli hisslər oyadırdı. Eyni halı indi də hiss edirdim. Lakin ruhən axşamkı qədər əzgin deyildim. Özümdə xəstəlikdən yeni duran adamlar kimi yaşamağa, təbiətə qarşı yeni bir meyl duyurdum, elə bil, bədənimdəki həyat qüvvələri yenidən baş qaldırmışdı. Elə bil ki, ölməyib sağ qalmağım məni sevindirirdi. Elə bil ki, təbiət bizim, ən böyük kədərə düçar olduqda belə, əzəli və əbədi borcumuzun yaşamaq olduğu haqqındakı qanununu mənim şəxsimdə yerinə yetirməyə başlayırdı və mən müqavimətsiz olaraq özümü onun hökmünə verirdim.

Biz eyvanda, alma ağacının sərin kölgəsində oturub çay içdiyimiz zaman iki oğlan gəldi. Onların əsl adlarını mən sonralar da bilmədim. Lakin Qulu Kəhrizli balaca çıxıq gözlərini gizli bir təbəssümlə oynadaraq, birini İmi, digərini isə Cimi deyə mənə təqdim etdi. İkisi də bir yaşda idi (iyirmi dörd-iyirmi beş yaşlarında). İkisi də ortaboylu idi. İkisinin də əynində bənövüş trikodan kostyum, ayaqlarında ağ çəkmə var idi. İkisi də narıncı köynəyin üstündən mavi zanbağa bənzər qalstuk bağlamışdı. İkisinin də başı açıq, saçları səliqə ilə yana daranmışdı. Lakin İminin saçları geriyə doğru xeyli azaldığından, alnı daha geniş görünürdü. İkisinin də üzü tərtəmiz taraş edilmişdi. Ciminin kömür kimi qara, qəşəng bığı var idi. İmi isə, bığsız idi. İkisinin də sifəti, bədən quruluşu mütənasib və yaraşıqlı idi.

İmi kimsəyə baxmadan ağır və təmkinli hərəkətlə papiros çəkir, Cimi isə, qəribə bir narahatlıqla tez-tez onun-bunun üzünə baxırdı.

– Belə erkən xeyir ola? – deyə Nəriman əmi Cimidən soruşdu.

– İmi yaxşı bir təşəbbüs qaldırıb, – Cimi əllərini ovuşdurdu. – İstəyirik...

Qərənfil bacı, birdən özündən çıxaraq, oğlanın sözünü ağzında qoydu.

– Təşəbbüs, təşəbbüs! Gündə bir təşəbbüs qaldırırsınız, içindən də bir qara qəpiklik şey çıxmır.

İmi yerində qurcalanaraq, papirosuna dərin bir qullab vurdu və kimsənin üzünə baxmadan kirpiklərini tez-tez qırpmağa başladı.

– Qərənfil xala, – deyə Cimi nəyə isə acıyırmış kimi üz-gözünü qəribə bir mərhəmət ifadəsi ilə bürüşdürdü. – Əvvəlcə qulaq asın, sonra acıqlanın.

– Qulaq asın!

– Qərənfil, bəsdir. Qərənfil, qoy görək nə deyirlər, – deyə Nəriman əmi bu dəfə nazik səslə dilləndi.

– İmi yaxşı bir təşəbbüs qaldırıb, Nəriman əmi. İstəyirik sovxoza gedən şosedən ayrılıb kəndə girən yolu sizin qapıya qədər asfalt eləyək.

Nəriman əmi təəccüblə soruşdu:

– Bizim qapıya qədər?

– Hələlik sizin qapıya qədər. Sonra imkanımız olanda...

İmi göz qapaqlarını qaldırıb sədrə baxdı. Ahəstə və inandırıcı bir səslə:

– Bilirsən, Nəriman əmi, – dedi, – biz Cimi ilə fikirləşdik ki, Hümmət də ispalkom olub. Tez-tez kəndə gedib-gələcək. Buranın da ki, torpağını bilirsən. Göydən bir damcı düşdü – palçıqdan tərpənmək olmur. Bizim üçün ayıb olar ki, ispalkomun maşını kəndin ortasında lehməyə batıb qalsın.

Qərənfil bacı gəlib onun qabağında durdu:

– Bura bax görüm, Hümmətdən qabaq ispalkom yox idi? Bir də, düz adamsınız, niyə raykomu demirsiniz, Hümməti deyirsiniz?

Ciminin üzü yenə də mərhəmətlə bürüşdü və Qərənfil bacıya acıyırmış kimi riqqətlə dedi:

– Əvvəla, raykom katibi kəndə ayda-ildə bir dəfə gəlir. Amma bura Hümmətin evidir. O biri tərəfdən, sədrin özünü də nəzərə almaq lazımdır. Təzə maşın alıb, heyf deyil o gözəllikdə maşını palçığa, zığa batırasan.

Qərənfil bacı başını buladı:

– Yamanca canıyanan çıxmısınız. İnişil təşəbbüs qaldırdınız ki, hamam tikək, hələ hörgüsü bir arşın qalxmayıb. Keçən il təşəbbüs qaldırdınız ki, təzə körpələr evi tikək, düzün ortasına bir-iki araba əhəngdən-qumdan tökdünüz, qaldı yağışın altında. İndi də başlamısınız Hümmətə canıyananlıq eləməyə. Mənim baldızım oğlu haçandan belə bəy olub?

– Canım, bəy-zad nədir?

İmi ağayana əda ilə gülümsədi:

– Hörmət lazımdır, ya yox?

Məzəli adamın üzü ciddi ifadə alanda çox qəribə görünür. Qərənfil bacı danışdıqca, Qulunun balaca qara bəbəkləri tez-tez o yan-bu yana qaçaraq, gah İmi ilə Ciminin, gah da Nəriman əminin üzünə zillənirdi.

– Gedin özünüzə iş axtarın. Sədrin sizin bu canfəşanlığınıza ehtiyacı yoxdur, – deyə Qərənfil bacı sözü İminin üzünə çırpdıqda, Qulunun da daxilindəki gərginlik son nöqtəyə çatdı:

– Düzdür, – deyə o, əlini havada tovladı. – Özünüzə iş tapın! Yekə adamsınız, belə şey olmaz. Bax, sədrin yanında deyirəm: nə qədər təşəbbüs qaldırırsınız qaldırın, bundan sonra sizə bir çet də əməkgünü yazmayacağam. Bitdi havayı gəzmək!

Qulu axırıncı sözləri deyərkən, özünü çəkərək, qürurla mənə baxdı.

İmi çox ləyaqətlə gülümsəyərək:

– Ay Qulu, – dedi, – sədr olan yerdə sən yuyulmamış çömçə kimi nahaq özünü ortalığa atırsan.

Mühasib ayağının birini irəli, birini geri qoyub, sinəsini qabartdı:

– Özümü ortalığa atacağam! Bəli, atacağam! Bəsdir yağ yeyib, yaxada gəzdiyiniz!..

– Qulu dayan!

– Qulu dayanmayacaq, Nəriman əmi, Qulu deyəcək! Qulu müftəxorları ifşa edəcək! Qulu heç vaxt havayı söz danışmamışdır! Qulu realistdir!

– Qulu nədir? – deyə Nəriman əmi təəccüblə soruşdu:

– Realistdir!

O, təşəxxüslə mənə baxdı:

Qulu hər gün çotka vurub, haqq-hesab edir ki, görsün bu gün kim özündən başqa, kolxoza neçə manatlıq xeyir verib. Manatlıq!

O, şəhadət barmağını qaldırıb şax tutaraq gah sədrə, gah da mənə baxdı:

– Nəticədə məlum olur ki, İmi ilə Cimi nəinki camaata xeyir veriblər, əksinə, özləri xırıd qurdu kimi daraşıblar kolxozun böyrünə.

İmi nəzakətlə gülümsədi:

– Qulu, biz səni tanıyırıq. Ancaq burada yad qonaq var.

Mühasibi od götürdü:

– Əvvəla, Qulunun nəyini tanıyırsınız? İkincisi, xeyr, hələ tanımırsınız!

Sədr yenə də astadan:

– Qulu, bəsdir!

Lakin Qulu yaman qızışmışdı:

– Siz Qulunu hələ bundan sonra tanıyacaqsınız! And olsun vicdanıma, budur deyirəm: mən necə ki, realist, gördüyünüz işi öz əlimlə yoxlamasam, sizə, bayaq dedim, bir çet də əməkgünü yazmayacağam. Lap istəyir nazir özü desin, yazmayacağam. Bitdi avara gəzmək.

Həmin bu gərgin dəqiqələrdə Ciminin çöhrəsi sədrin hər hərəkətini təəccüblü bir həssaslıqla əks etdirirdi. Elə bil, bu saat bütün xarici aləm yalnız sədrdən asılı idi. İmi isə, ləyaqətlə susaraq, kimsənin üzünə baxmırdı, lakin sədr acıqlanıb üz-gözünü turşutduqda, İmi də yerində qımıldanır, ya burnunu çəkir, ya papiros çıxarıb yandırırdı.

Sədr, Quluya heyranlıqla baxır, sanki onun bəlağətindən vəcdə gəlirdi. Nəhayət, o, ayağa qalxaraq, heç bir şey olmamış kimi, mülayim səslə dedi:

– Qulu, mən çölə gedirəm, sən bacıqızını apar mədəniyyət sarayına.

O mənə müraciətlə əlavə etdi:

– Get bax. Hər nə lazım olsa, kömək edərik. Təki sən bircə oranı işə sal. Hər dəfə qapısını bağlı görəndə, düzü, dilxor oluram.

O, İmi-Cimiyə tərəf döndü:

– Siz də yol məsələsini qatlayın qoyun bir qırağa. Kənd yolunun hamısını asfalt eləmək lazımdır, təkcə mənim qapıma gələn hissəsini yox!

Qərənfil bacı qalxıb, əsəbi addımlarla eyvanın aşağı tərəfinə getdi. Sədr onun ardınca baxaraq, cüssəsinə uymayan nazik və mehriban bir ifadə ilə:

– Asta yeri, Qərənfil! – dedi.

Sonra qaşqabağını tökərək, üzünü İmi-Cimiyə çevirdi:

– Axı, siz bilirsiniz ki, arvadın ürəyi xəstədir...

İmi gözlərini qırparaq gülümsədi:

– Məndə yaxşı ürək dərmanı var.

Nəriman əmi dərhal yumşaldı:

– İmi, İmi, amanın bir günüdür, sən Allah, ondan bir az Qərənfil üçün gətir.

İmi təmkinlə cavab verdi:

– Onu elə Qərənfil xala üçün gətirmişik. Bakıda bir dostum var, o göndərib.

– Təşəkkürlər, – deyə sədr başını azca əydi.

Cimi üz-gözünü mərhəmətlə bürüşdürdü:

– Əşi, vallah, bu kənddə İmidən çox sizin dərdinizi çəkən yoxdur, – dedi.

– Sədrin üzü ciddiləşdi:

– Bəh-bəh, axşamacan İmi Cimini tərifləyir, Cimi də İmini. Hər şeyi qoyun bir tərəfə. Hamamı tikin qurtarın...

İmi heç bir söz demədən əlini gözünün üstünə qoydu.

Cimi isə ilhamla dedi:

– Söz veririk ki, iki aydan sonra sədr öz xüsusi nömrəsində çimsin.

Nəriman əminin üzündə mülayim təbəssüm göründü:

– Kultliçnost yaratmayın, ə, qoyun oturaq yerimizdə, – dedi. – Hamamı təkcə mənim üçün tikmirsiniz (sonradan öyrəndiyimə görə, Nəriman əmi Nikolay vaxtı rus-tatar məktəbində oxuyubmuş).

Qulu ilə mən kəndin ortasından keçən geniş küçə ilə mədəniyyət evinə tərəf yönələrkən, o hələ də tutqun idi.

– Bu İmi ilə Cimi harada işləyirlər? – deyə mən maraqla soruşdum.

– Guya, İmi təftiş komissiyonunun sədridir, Cimi də tikinti briqadiri... Di gəl ki, zalım uşağı arı yeyib, namusu da atıblar dallarına...

– Sədriniz işgüzar adama oxşayır, nə əcəb onlara bir söz demir?

– Sədrin azarı var.

– Nə cür?

– Nə cürü budur ki, iki daşın arasında, bir də görürsən Cimini oturdub böyründə, "Segah" oxudur. Yaman musiqibazdır.

– Bəyəm, Cimi elə oxuyandır?

– Oxuyan olmağına oxuyandır, düzü, elə mənim özümün də onun səsinə xoşum var. Di gəl ki, zalım oğlu, bu tikinti briqadirliyində heç bir iş görmür. Deyirəm, Cimi, vicdanın olsun, elə elə ki, mən də sənə əməkgünü yazanda, utanıb tər tökmüyüm. Camaatın üzünə şax baxım.

– Savadı nədir?

– Doqquzuncudan çıxıb. Qaldı İmi. O da ki, əsər yazır.

– Əsər yazır?!

Qulu başını tərpədərək pıqqıldadı:

– Amma qırx ildir yazır, heç qurtarmır.

– Axı, nə yazır?

– Guya, Güney qışlaq kəndinin tarixini. Əsərinin qəhrəmanı da bizim sədrdir. Nə bilim, əvvəllər Güney qışlaqda yaşıl ağac tapılmaz-

dı. Evlərin hamısı yerin altında tikilmiş qara damlardan ibarət idi. Sonra necə oldu ki, kolxoz quruldu. Nəriman əmi qolçomaqlarla necə mübarizə apardı. Yelli gədikdə qaçaq Əsədullayla necə atışdı. Sonra Söyüdlü arxı necə çəkdirdi. Qərəz, bir dastan. İndi sədr inanıb ki, doğrudan da, İmi bunları yazıb bir yana çıxaracaq.

– İminin indiyə qədər mətbuatda-zadda bir yazısı çıxıb?

– Qabaq, kənddə maliyyə işçisi olanda, hərdən qəzetdə xırda məqalələri çıxırdı. Ona görə də, Nəriman əmi elə bilir ki, bu, böyük yazıçıdır.

Qulu yenə də pıqqıldayıb güldü:

– Nuriyyə xanım, canınız üçün uzun dəsgahdır. Bir də görürsən Nəriman əmi ilə İmi evə girib, qapı-bacanı da bərk-bərk basdırıblar. Nə var? İmi sədrə əsər oxuyur.

Mədəniyyət evinə çatdıq.

– Bəs, deyirsiniz tikinti briqadiri işləmir? Bu cür gözəl bina tikiblər.

– İnsafla desək, gecə-gündüz bunun üstündə durub tikdirən sədrin özü olub...

Sonra o, üzünü yaxındakı evə sarı tutdu:

– Ay Nazxanım xala, ay Nazxanım xala!

Qapıya cavan bir gəlin çıxdı:

– Nə var, ay Qulu dayı! – dedi.

– Əşi, o açarları bir bəri gətir.

Nazxanım mənə baxıb, tez içəri getdi. Qulu çiyinlərini qısıb xısın-xısın gülərək dedi:

– Buranın xidmətçisidir. Xala deyəndə dəli olur.

Nazxanım açarları gətirdi. Mənə əl verib:

– Xoş gəlmisiniz, bacı, – dedi.

Bu, iyirmi altı-iyirmi yeddi yaşlarında qırmızı güllü ağ çitdən qırçınlı tuman, qoluqısa kofta geyib, qara saçlarına sığal verərək tən ortadan ayırmış, dikdaban çəkməli, ətli-canlı, “gəl məni gör, dərdimdən öl” bir gəlin idi. Rəhmətlik nənəm demişkən, tərpənib yeriyəndə elə bilərdin o yandan bəri bir ağ maya gəlir.

Mədəniyyət evi kəndin cənub qurtaracağında tikilmişdi. Qabaq tərəfdən Güney qışlağın bağ-bağat içində olan evləri görünürdü. Arxa tərəfdən ucsuz-bucaqsız geniş düzənlik uzanıb gedirdi. Bina böyük tamaşa zalı ilə bir neçə otaqdan ibarət idi. Zala şəhərdən gətirilmiş yumşaq stullar düzülmüşdü. Səhnəyə təzə bir piano qoyulmuşdu. Bu məni çox sevindirdi. Biz bütün otaqları gəzəndən sonra:

– Demək, hələlik, bir mədəniyyət evidi, bir də Nazxanım bacıyla mən, – deyə zarafat elədim.

Və bir qədər fikirləşəndən sonra soruşdum:

– Kənddə kitabxana varmı?

– Var, ancaq gələn-zad olmadığından, həftələrlə ağzıbağlı qalır.

– Gedib baxmaq olarmı?

– Niyə olmur, gedək.

Biz, yerdən tikilmiş böyük kolxoz anbarının bir gözündə yerləşən kitabxanaya çatdıq. Qulu qapının açıq olub-olmadığını yoxlamadan iri söyüd ağacının kölgəsində oynayan uşaqlardan birini səslədi:

– Ə, Popuş! Popuş, yüyür, o Səriyyəni çağır, deynən adam gəlib.

Kök, qırmızıyanaq Popuş, yanlarında qatıq quruyub qalmış ağzını açıb, əvvəlcə mənə baxdı, sonra:

– Qulu dayı, – dedi, – mən Səriyyəni haradan tapım?

– Ə, yüyür...

Qulu sözünün dalını yəqin ki, mənə görə kəsib, məzəli bir hərəkətlə uşağa sarı cumanda, Popuş götürüldü.

Bir azdan on yeddi yaşlı, xurmayısaçlı, incəbel, yaraşıqlı bir qız olan Səriyyə, əlində açar, tələsik addımlarla gəlib çıxdı. Əvvəlcə məni mərkəzdən gəlmiş təhkimçi hesab etdi. Tanış olandan sonra, gülümsəyib, kitabxananın ağzına vurulmuş iri, qara qıfılı açdı. Otaqdan bizi boğuq rütubət və kif qoxusu vurdu. Mən irəliləyib kitabxananın yeganə pəncərəsini açmaq istədim.

– Mismarlıdır, – deyə Səriyyə səsləndi.

Gözüm otağın yarıqaranlığına alışandan sonra adi taxtalardan düzəlmiş rəflərdəki kitabları gözdən keçirdim. Burada müasir Azərbaycan və rus yazıçılarının, Balzakın, Defonun, Mayn Ridin, Jül Vernin və başqalarının əsərləri, kənd təsərrüfatına, siyasi məsələlərə aid çoxlu kitabça var idi. Lakin hiss olunurdu ki, heç birinin qatı açılmamışdır. Stolların üstünə yığılmış qəzet və jurnallar rütubətdən saralmışdı. Yazı stolundakı mürəkkəbqabları qupquru idi.

– Kitab götürüb oxuyan olurmu? – deyə mehriban səslə Səriyyədən soruşdum.

– Kitab oxuyan kimdir? Gəlib oturursan, oturursan, bir adam da qapını açmır. Düzü, mən də havayı yerə maaş alıram. Neçə dəfə ərizə vermişəm, azad eləmirlər.

Üçümüz də sükut içində dayanıb rəflərə baxırdıq. Qulu darıxdığı üçün tez-tez ayağının birini götürüb, o birini qoyurdu. Birdən məni

qüssə bürüdü. Rütubətdən saralmış bu köhnə qəzetlər, toz basmış kitablar, mürəkkəbi qurumuş qara şüşələr mənə dözülməz dərəcədə cansıxıcı göründü. Çevrilib ağır addımlarla otaqdan çıxdım. İndi xeyli qalxmış günəş od tökürdü. Cırcıramalar eyni yeknəsəq ahənglə səslənirdi. Güney qışlağın bağlarından o yana, düzənlikdə hava ilğım çalır, Quzey qışlağın səhər ağaran evləri daha görünmürdü. Hər şey dəniz kimi bərq vuran bir sərab içində itib gedirdi. Bir an mənə elə gəldi ki, dünən tərk edib gəldiyim Bakı çox uzaqlarda qalmışdır və mən oradan min ildir ki, ayrılmışam. Qəlbimdə baş qaldıran qərib hisslər məni sıxır, toz basmış kitablar, rütubətdən saralmış qəzet və jurnallar gözümün qabağından getmirdi. Kəndin qurtaracağında, gur günəş işığı içində sükuta dalmış mədəniyyət evi sanki mükəddər, canlı bir məxluq kimi mənə baxırdı. Dünən səhər məni yola salan Ələsgər dayının "get, qızım, işin avand olsun" sözləri çox uzaq bir səda kimi qulağımda səslənirdi. Birdən, istidən zəbanə çəkən kəndi sərin kölgə ilə dolanan Söyüdlü arxda qurbağalar ağız-ağıza verib nəşə ilə səsləndilər. O tay-bu tay arx boyu düzülmüş cavan söyüdlərin zərif yarpaqları xəfif mehdən titrəşdi. Mən ruhi yüngüllüklə:

– Kitabxananı mədəniyyət evinə köçürmək olmazmı? – deyə içəridən çıxıb yanıma gələn Qulu ilə Səriyyəyə müraciət etdim.

Qulu gözlərini oynadaraq üzümə baxdı:

– Olar, niyə olmur?!

– Siz necə, etiraz eləmirsiniz ki, Səriyyə?

– Etiraz eləmirəm. Ancaq, gələn olacaqmı?

– Hər halda, ora köçürməyimiz yaxşıdır, – dedim, – ancaq kitabları yığmaq üçün, hələlik, heç olmasa, üç şkaf lazımdır.

– Asandır, taparıq, – deyə Qulu cavab verdi.

Sonra şəhadət barmağını alnına qoyaraq əlavə etdi:

– Birini kənd sovetliyindən, birini kolxoz idarəsindən, birini də... hə, tapdım, birini də məktəbdən.

– Nə vaxt köçürə bilərik?

– Siz nə vaxt istəsəniz.

– Lap bu saat!

– Oldu! Lap bu saat! Siz dayanın, mən gedim maşın gətirim.

O, portfelini qoltuğuna vurub yel kimi getdi. Gün düz adamın təpəsindən şaxıdığından, biz qayıdıb otağa girdik. Yazı stolunun üstündə balaca köhnə bir radioqəbuledici var idi. Mən bekarçılıqdan onu

qurdalayıb açdım. Kim isə oxuyurdu. Lakin aparat xarab olduğundan, səsini aydın seçmək olmurdu.

Səriyyə balaca qol saatına baxdı:

– İndi Bakıdan yaxşı konsert verilir, – dedi. – İstəyirsiniz gedək bizdə qulaq asaq, yaxşı radiomuz var.

– Qulu gələr, bizi tapmaz, – dedim.

Sonra əlavə etdim:

– Görünür, musiqi ilə aranız sazdır...

– Yəni, musiqidən xoşu gəlməyən olar?! Ağlım kəsmir...

O, başını aşağı saldı, üzündə utancaq bir ifadə yarandı:

– Mən özüm də bir az oxuya bilirəm...

– Doğrudanmı?! Nə oxuyursunuz? Muğamat, yoxsa...

– Meylimə nə düşdü. Müəllim yox, məktəb yox. Bildiklərimi də radiodan-zaddan götürmüşəm.

– Bir şey oxuyun görüm, – deyə maraqla xahiş etdim.

Əvvəlcə gözlərini yerə dikib dinmədi. Sonra qalxıb pəncərəyə yanaşdı:

– Görüm gəlib-eləyən yoxdur ki...

– Gələn olsa, nə olar ki? Məgər, oxumaq ayıb işdir?

– Ayıb iş deyil. Ancaq şəhərə ağlınız getməsin. Burada qız xeylağının oxumağını söz elərlər.

Mənim təkidimi gözləmədən nəzərlərini balaca pəncərədən görünən Söyüdlü arxa dikərək, "Qarabağ maralı"nı oxudu. O zaman dəbdə olan bu mahnını mən çox xanəndələrdən eşitmişdim. Lakin onların heç biri mənə bu qədər təsir etməmişdi. Bəlkə bu mənim indiki vəziyyətim, indiki əhvali-ruhiyyəmlə əlaqədar idi. Bilmirəm. Onun səsində, nə isə, qəlbin dərinliklərinə işləyən təzə, bakirə bir şey var idi. Elə bil, mən günəşin altında zəbanə çəkən qumlu səhrada qəflətən qarşıma çıxan göz yaşı kimi dumduru, sərin bir bulağın incə şırıltısını eşidirdim və sanki bu şırıltının təranəsi altında körpə otlar göyərib qalxır, bənövşələr çiçək açırdı.

Gedək Qırxqız bulağına,
Çıxaq Şuşa yaylağına...

Qız bu sözləri deyərkən, güclə seçilən bir təbəssümlə gözlərini yarı yumur, qaşlarını çatır, başını xəfifcə tərpədir və elə bayğın bir gö-

rünüşlə oxuyurdu ki, elə bil, bütün ruhu, bütün varlığı o mahnı ilə qanadlanıb uçurdu. Elə bil, o, indi tamam başqa bir aləmdə idi.

Mahnını bitirdikdə ürkək ifadə ilə üzümə baxdı. Mən onu özümə tərəf çəkib qolumu boynuna doladım və birdən isti göz yaşlarının əlimə töküldüyünü hiss edərək əyilib üzünə baxdım. O gülümsünərək:

– Eh, – dedi, – ürəyim birtəhər oldu.

Sonrakı söhbətimizdən məlum oldu ki, Səriyyə dəyirmançı Kərim dayının qızıdır. Keçən il onilliyi bitirmiş, indi də universitetə qiyabi girməyə hazırlaşır. Nişanlısı Çingiz əsgərlikdədir. Vaxtının qurtarmağına bir il qalıb.

Səriyyə Azərbaycanın məşhur qadın xanəndələrinin, opera və operetta artistlərinin həyatına dair mənə cürbəcür suallar verir, keçən yaz anası ilə Bakıya getmələrindən, Çingizin onu opera teatrına, filarmoniyaya aparmasından şirin-şirin danışırdı...

Maşın səsi eşidildi.

Qulu bizə kömək etmək üçün özüylə iki cavan oğlan da gətirmişdi. Kitab və jurnalların hamısını yığıb mədəniyyət evinə apardıq. Pəncərələri eyvana açılan böyük otağı kitabxana elədik. Qulunun gətirdiyi şkafları təmizləyib səliqə ilə qoyduq. Balaca bir kataloq düzəltmək üçün kitabları yenidən siyahıya aldım. Səriyyə ilə Nazxanım da canidildən mənə kömək eləyirdilər.

Üçümüz də yorulub əldən düşəndə Nazxanım:

– Gedək, – dedi, – bir stəkan çaydan-zaddan içək, sonra gələrik.

Ürəyim bərk yandığından etiraz eləmədim. Mən aclığa davamlıyam, susuzluğa yox.

Nazxanım bacının evi yerdən tikilmiş iki balaca qəşəng otaqdan ibarət idi. Evin qabağında əkilmiş cavan gilənar, şaftalı, ərik və tut ağacları baş-başa verərək günün qabağını çətir kimi tutur, yaşıl otların, tər yoncanın üzərinə sərin kölgə salırdı. Bağçanın ortasından keçən balaca arxın qırağında yarpız və yabanı qızılgül kolları bitmişdi.

Mən arxın duru suyu ilə üzümü yuyub sərinlədim. Nazxanıma dedim:

– Nə gözəl bağçan var!

Onun əvəzinə Səriyyə cavab verdi:

– Hamısını özü əkib-becərib.

Səhərdən bəri birinci dəfə olaraq Nazxanımın sifəti tutuldu. O, qabarıq, sağlam köksü dolusu nəfəs aldı.

– Neyləyim, – dedi, – mənimki də bunlardır. Adam tək olanda mehrini bir şeyə salır...

Sonra çevrilib iti addımlarla evə gedərək, balaca ağ samovarı dəhlizə çıxartdı.

Mən Səriyyədən soruşdum.

– Məgər, Nazxanım bacı tək yaşayır?

– Bəli, – deyə qız astadan cavab verdi.

Və bir gözü samovara od salan Nazxanımda, əlavə etdi:

– Elə deyib-gülməyinə baxmayın, yazığın dərdi çoxdur. Uşağı olmadığından, əri qoyub gedib, ayrı arvad alıb.

Samovarın dudkeşindən gur alov qalxanda, Nazxanım bizə yanaşdı.

– Çöl istidir, durun gedək içəri.

Onun torpaq döşəməli balaca otağı elə səliqəli, təmiz və sərin idi ki, mən çəkmələrimi çıxarıb, qırmızı güllü döşəkcənin üstündə oturanda, bütün vücudumda xoş bir rahatlıq hiss etdim. Nazxanım qotazlı mütəkkə və ağ balış gətirib dirsəyimin altına qoydu:

– Sən Allah, söykən, – dedi, – yorğunsan.

Özü isə, qab-qacaq çıxarıb bayıra apardı. Səriyyə də dəhlizdə ona kömək eləyirdi. Mən tək qalanda üzüqoylu balışa yıxılıb gözlərimi yumdum. Fiziki işə lap körpəlikdən adət etdiyim üçün hələm-hələm yorulmazdım. Lakin indi yorğun idim. Ürəyim yorğun idi. Mən əbədi olaraq beləcə, heç nə duyub-düşünmədən qalmaq istərdim.

Bayırda Nazxanımla Səriyyə nə haqda isə xısın-xısın danışıb-gülürdülər. Birdən çırtıq və oxumaq səsləri eşidildi. Başımı qaldırıb pəncərədən dəhlizə baxdım. Nazxanım qollarını yuxarı qaldıraraq, çırtıq vura-vura oynayıb oxuyurdu:

İrəvanda xal qalmadı,
O xal nə xaldır üzə düzdürmüsən,
De görüm, nə xaldır, ora düzdürmüsən.

Səriyyə isə, onun qabağında dayanıb gülməkdən uğunurdu. Nazxanım qəfil oxumağını məzəli bir danışıqla əvəz edərək, əllərini ölçə-ölçə dedi:

Xal mənim, yar mənim,
Xalqa nə borcdur niyə düzdürmüşəm,
Yarım deyibdir, qoşa düzdürmüşəm.

Sonra bərkdən şaqqıldayıb gülərək əlini şappıltı ilə qızın sinəsinə vurdu.

– Yanmayasan, ay Səriyyə.

Mənim baxmağımdan xəbəri olmayan Səriyyə:

– Oy! – dedi. – Sən Allah, belə zarafatlarını burax!

Nazxanım onun inciməyinə əhəmiyyət vermədi:

– Sən stəkanları gətir, – deyib özü cəld və yüngül hərəkətlə başında güllü çaynik buğlanan samovarı götürüb içəri gətirdi.

Sonra dedi:

– İndi qonaq deyəcək bu nə dəli gəlindir.

– Nə üçün? Mən ki, artistəm.

– Sən Allah, doğru deyirsən?

– Niyə təəccüb eləyirsiniz?

– Axı, heç...

Yəqin ki, "oxşamırsınız" demək istəyirdi. Lakin sözünü dəyişərək soruşdu:

– Yaxşı, bəs, təkbaşına necə artistlik eləyəcəksiniz?

– Tək niyə oluram? Bəs siz nəsiniz?

O, başını dala atıb, bərkdən güldü:

– Elə bir dəfə Qulu canı yanmış məni dilə tuturdu ki, gəl səni səhnəyə çıxardım. Teatr verək. Dedim get öz arvadını çıxart.

– Nə üçün razı olmurdunuz?

– Nə üçün razı olaydım?

Bu zaman bayırdan çağırdılar:

– Ay Nazxanım! Ay Nazxanım!

Nazxanım qapının ağzına gedib, əllərini belinə vurdu və özünü qəsdən yırğalayaraq, səsini əzdirə-əzdirə soruşdu:

– Nə var?

– Adamı niyə ələ salırsan, a-az? O şəhərdən gələn artisti axtarıram.

– Neynəyirsən onu?

– Neyləyəcəyəm? Qərənfil mama deyir ki, gəlsin çörəkdən-zaddan yesin. Səhərdən çıxıb.

– Qərənfil mamana de ki, bura dəyirman deyil.

– Acığın niyə tutur, a-az! Xalq qonağını itirib-axtarmasın?

– O hamımızın qonağıdır, Almurad bəy.

Nazxanım bu sözləri elə qəribə tərzdə dedi ki, mən özümü saxlaya bilməyib güldüm.

– Belə dvijeni göstərməkdə, yoxsa, sən də artist olmaq istəyirsən, a-az?

– Artist necədir?

Səriyyə ilə mən də qalxıb qapıya yaxınlaşdıq. Çəpərin o tayında cavan, ucaboy, göyçək bir oğlan dayanmışdı. Əlindəki çubuğu oynada-oynada Nazxanıma baxırdı. Mən onun acıqlanmış olduğunu güman etmişdim, lakin gözlərində oğrun bir təbəssüm var idi. Baxışları alov saçırdı. Məni görəndə, utanaraq nəzərlərini Nazxanımdan çəkdi.

– Qərənfil bacıya deyin ki, sağ olsun, işimiz çox idi, nahara gələ bilmədim.

– Baş üstə, – deyə oğlan ədəblə cavab verdi.

Birdən Nazxanım gözlərindən gülə-gülə, çırtıq vurub oxudu:

Almurad bəyin nəyi var?
Heyvası yox, narı yox...

Oğlan yanıb tökülə-tökülə bir mənə baxdı, bir Nazxanıma, lakin heç bir söz demədən dönüb getdi. Nazxanım bərkdən gülərək oğlanın ardınca qışqırdı:

– Sən Allah, incimə.

– Nə üçün yazıq oğlanı pərt elədiniz?

– Yaman da yazıqdır!..

– Ancaq çox gözəl oğlandır.

– Boy-buxununa baxmayın. Dünənin uşağıdır.

Səriyyə ona mənalı bir təbəssümlə baxaraq:

– Uşaq niyə olur, – dedi. – O da səndən bir-iki yaş kiçikdir.

Yeməkdən sonra bir az dincəlib, yenə mədəniyyət evinə qayıtdıq, axşama qədər işlədik. Nazxanım gah söhbət edir, gah da qaravəlli çıxararaq, bizi güldürürdü.

Səriyyə yaman güləyənmiş. Nazxanım bəzən onu çimdikləyib küsdürürdü, lakin məzəli bir söz dedimi, qız yenə də uğunub gedirdi.

Birdən motosikl səsi eşidildi. Həyatımda qorxub diksindiyim anlar olubdur, lakin onların heç birində indiki vəziyyətə düşməmişdim. Motosiklin səsini eşidəndə elə bil ürəyimi qırıb saldılar yerə. Bütün bədənim buz kimi oldu. “Bəlkə heç o deyil” deyə öz-özümə təkrar edirdim.

Lakin o idi. Motosikli pəncərənin qabağında saxlayıb düşdü. Bir əli ilə ruldan tutaraq, “işiniz irəli” deyib gülümsədi. İndi onun təbəssümündə, nə isə, ciddi, mərdanə və məğrur bir ifadə vardı. Mən axşa-

mın alatoranlığı içində onun iri qara gözlərinin şəfəqi ilə işıqlanmış arıq, solğun çöhrəsinə baxır və susurdum, Nazxanım:

– Xoş gördük, Murad qağa, – dedi. – Sən hara, bura hara?

– Yataqlardan gəlirdim, dedim, görüm Nuriyyə xanımın işləri necə gedir.

Mən mümkün qədər toxtaqlıqla cavab verməyə çalışaraq:

– Hələlik pis getmir, – deyə onun nişastalanıb ütülənmiş, yaxası açıq ağ köynəyinə baxdım.

Sevib arvadı olacağım adamın paltarını bu cür çiçək kimi yuyub ütüləmək, onun üçün öz zövqümə uyğun qalstuklar, dəsmallar almaq vaxtilə mənim də əziz, gizli arzularımdan idi.

– Qəribsəmirsiniz ki?

– Hələ ki, xeyr, – dedim.

Sonra gülümsəyib əlavə etdim:

– Başqa yerdə kimim var ki... Bir Ələsgər dayıgildir, onlara da bu axşam məktub yazacağam.

– Dayınız Bakıda yaşayır?

– Mənim dayım yoxdur. Ələsgər dayı ilə arvadı Güllü xala bizim yataqxananın xidmətçiləridirlər.

Onun üzü tutqunlaşdı. Bir neçə saniyəlik sükutdan sonra:

– Sizə yer-yurd veriblərmi? – deyə soruşdu.

Bir adamın sənin qayğına qaldığını hiss eləmək çox təsirli haldır.

Mən ona təşəkkür dolu mehriban bir nəzər salaraq:

– Hələ ki, o barədə danışmamışıq, – dedim.

O, ciddi və bir qədər də sərt ifadə ilə:

– Xahiş edirəm, hər nə lazım olsa, mənə sifariş edəsiniz.

– Nə olub, ay Murad qağa, dərya bidadlığa-zada gəlməyib ki?

Murad Nazxanımın sözlərini eşitmirmiş kimi:

– Yaxşı, hələlik – deyib motosiklə əyləşdi.

Motosiklin səsi eşidilməz olduqda, nəzərlərimi qaralan çöllərdən çəkib, Nazxanımla Səriyyəyə baxdım. Mən istəyirdim ki, onlar danışsınlar. Mən yalqızlığı sevmirəm. Mən təklikdən qorxuram.

– Nə üçün işıqları yandırmırsınız? – deyə darıxmış halda soruşdum.

– İşıqları hələ düzəltməyiblər.

“Həmişə deyib-gülən Nazxanım niyə belə qəmgin cavab verdi? Səriyyənin gözləri nə üçün yol çəkir?”

– Eybi yoxdur, – dedim, – sabah usta çağırıb işıqları düzəltdirərik. Piano sazdırmı? Gedək, gedək sizin üçün bir şey çalım.

Mən onların qoluna girərək arakəsməyə doğru dartdım.

Qaranlıq səhnəyə çıxdıq. Mən stul çəkib oturaraq, pianonun qapağını qaldırdım.

Nazxanım dedi:

– Qoyun, gedim çıraq gətirim.

– Yox, lazım deyil. Görmürsünüz Ay üfüqdən necə gözəl qalxır! Ancaq pəncərəni açın. Buranın havası nə ağırdır! Adamın ürəyi birtəhər olur.

Səriyyə pəncərəni açdı. Mən pianonu yoxlamadan dərhal coşğun və həyəcanlı bir vals çaldım. Mən yalqızlığı sevmirəm! Mən təklikdən qorxuram! Əbədi təklik dəhşətdir. Mən daha coşğun akkordlar vurmağa çalışırdım. Mən dünyanı coşğun, şən səslərlə doldurmaq istəyirdim. Mən təkliyi sevmirdim, sevmirdim.

Ah, bu nədir? Mən o gecəki valsı çalıram. Mən o gecə gənc leytenantla baş gicəllədən coşğun hərəkətlər edirdim... Lakin leytenant getdi, bir daha gəlmədi. Gəlmədi...

Son akkordu vuraraq, gözlərimi pianonun dillərinə zilləyib bir an hərəkətsiz qaldım. Mən, yalqızlıq kimi, ağlamağı da sevmirəm. Lakin mən qəlbimin səsini dinləmək istəyirəm. O səs mənim üçün əzizdir. Çünki mənim qəlbim heç bir zaman mənə şikayət etməmişdir. Mən onun səsini dinləmək istəyirəm.

Bəstəkar Ağabacının Puşkinin sözlərinə yazdığı məşhur romansı çalıb ahəstə oxumağa başladım:

Oxuma gözəl, Gürcüstanın qəmli nəğmələrini...

Lakin mənə elə gəlirdi ki, oxuduğum bu qəmli nəğməni, pianodan qalxan bu səsləri özümdən başqa kimsə eşitmir, kimsə duymur. Mən isə təkliyi sevmirəm.

Oxuma gözəl, Gürcüstanın qəmli nəğmələrini...

Mən mahnını bitirib ayağa qalxdıqda, Nazxanım təəccüblə səsləndi:

– Ay başına dönüm, sən ki, belə sənətin sahibisən, necə olub gəlib buralara çıxmısan?

Səriyyənin Ay işığında parlayan gözləri məhəbbətlə mənə dikilmişdi.

“Görünür, ilk konsertim pis keçmədi” deyə mən ürəyimdə özümlə zarafat elədim.

Biz qabaq eyvana çıxdığımız zaman, biri uzun, o biri qısaboylu iki adamın bərkdən danışa-danışa mədəniyyət evinə tərəf gəldiyini gördük. Qulu altdan yuxarı sədrə nə isə deyir, şəhadət barmağını qaldırıb havada silkələyirdi. Qoltuğundan düşməyən portfelinin dəmiri Ay işığını əks etdirərək parıldayırdı. Sədr başını azca yana əyib, yuxarıdan aşağı ona baxırdı. Hər ikisi eyvana qalxdı. Qulu söhbətini kəsib bizi salamladı:

– Axşamınız xeyir.

– Hə, bacıqızı, nə var, nə yox? – deyə sədr mənə müraciət elədi, – eşitdim kitabxananı bura köçürmüsünüz? Lap yaxşı eləmisiniz. Bu heç bizim ağlımıza gəlmirdi. Ancaq bilmirəm, nə cür eləyək ki, bu Güney qışlaq camaatı da əlinə kitab, qəzet alsın. Oxumurlar. Kitabxanaya gələndə də qəzetləri cırıb tənbəki bükürlər. Bu Kərimin qızı, – o, Səriyyəni göstərdi, – yazıq da gəlib şikayət eləməkdən yorulub. Fikir elədikcə, yanıb-tökülürsən, heç birinin yeməkdən, içməkdən korluğu yox, inişilin buğdası bu ilə qalır. Ancaq di gəl ki, oxumurlar. Birisi əlinə qəzet götürmür ki, görsün dünyada nə var, nə yox. Bax, bu Kərimin qızı bilir, tapşırmışam, rayona nə kitab gəlsə, əvvəlcə bura göndərirlər. Ancaq nə olsun? Deyirəm, ay zalım uşağı, nə vaxtacan dünyadan bixəbər olub qalacağıq? Oxuyun da!

Nazxanım başını tərpətdi:

– Düzdür, əşi...

– Düzdür, düzdür deyirsən, amma bir dəfə görməmişəm ki, əlinə bir kitabdan-zaddan alasan. Heç bilirsən yerin peyki nə deməkdir?

– Niyə bilmirəm? Sağ olsun hökumətimiz. Düşmənlərin acığına ulduz qayırıb buraxıb göyə.

– “Düşmənlərin acığına, düşmənlərin acığına...” Avamsınız, vəssalam.

Əlini havada çırparaq mənə tərəf döndü:

– Yaxşı, indi kitabxananı bura köçürməkdə məqsədin nədir?

– Gərək çalışaq adamlarımızı kitaba, qəzetə alışdıraq.

– Ay sağ ol.

– Mədəniyyət lazımdır, mədəniyyət! Bu saat Güney qışlağın əsas dərdi mədəniyyətsizlikdir, – deyə Qulu Ay işığında civə kimi parlayan bəbəklərini altdan yuxarı sədrə zillədi.

Sədr də yuxarıdan aşağı hesabdara baxaraq başı ilə təsdiq etdi:

– Mədəniyyətsizlik!

Nazxanım etiraz elədi:

– Mədəniyyətimizə nə gəlib, əşi? Biri mən özüm, çəngəl-bıçaq deyirsən, varımdır, stol-kürsü deyirsən, varımdır. Baramanın pulunu alan kimi şəhərdən radioqəbuledici də gətirdəcəyəm. Bizə nə olub, Allaha şükür.

Sədr əlini alnına vurdu:

– Lənət sənə, şeytan. Mədəniyyət gərək burada olsun, bildin?

Qulu şəhadət barmağını ildırım sürətilə yuxarı qaldırıb şax tutdu:

– Ay sağ ol, bax, söz budur.

– Qulu, deməli, bizim başımızdakı samandır? – deyə Nazxanım təhdidlə səsləndi.

– Samandan danışmırıq, a-az.

Sədr əlini havada yellətdi:

– Qulu, fikir vermə, Nazxanım bildiyini babasına verən dsyil.

Sonra mənə müraciət etdi:

– Gəl gedək, qızım, gecdir. Qərənfil də səhərdən səni gözləyir.

Nazxanım çəkinə-çəkinə:

– Əşi, qoysana Nuriyyə bacı bizdə qalsın, – dedi, – bir də buradan...

Sədr onun sözünü kəsdi:

– Nazxanım, Qərənfil gözləyir!

Biz Nəriman əmigilin elektriklə işıqlanmış geniş eyvanına çıxanda, Qərənfil bacı gülə-gülə qabağıma yeriyib, əllərimdən tutdu və dedi:

– Səhərdən bəri haradasan? Bayaq kişiyə də deyirəm, necə şeydirsə, sənə yaman qanım qaynayır.

Bir dəfə Güllü nənə mənə demişdi ki, qızım, sənin bu dünyada bir xoşbəxtliyin var ki, ürəyəyatansan.

Qərənfil bacının əynində indi yaşıl parçadan şəhərsayağı tikilmiş tuman-kofta, ayaqlarında ipək corabla yüngül məst var idi. Başı açıq idi. Hətta, Qulunu görəndə də yaylıq örtmədi.

– Sən Allah, bax, buranı öz evin hesab elə.

O, dönüb eyvanın aşağı başına getdi. Mən də dünən gecə yatdığım otağa keçib çəkmələrimi çıxartdım. Sonra açıq pəncərə qabağında dayanıb saçlarımı daradım. Güney qışlağın elektrik çıraqlarından o yanda, yarıqaranlıq içində Quzey qışlağın işıqları güclə seçilirdi.

Biz eyvanda oturub çay içdiyimiz vaxt maşın səsi eşidildi. Hamıdan qabaq Qulu ayağa qalxaraq, küçəyə sarı boylandı.

– Hümmətdir.

Darvazanın balaca qapısı cırıltı ilə açıldı. Yeni gələn adam həyətə girib darvazanın böyük qapılarını taybatay açdı. Maşın içəri girəndən sonra təkrar qapıları bağladı, ağacların kölgəsi ilə irəliləyib eyvana çıxdı. Əvvəlcə mənə iti bir nəzər salaraq, kimsənin təqdim etməsini gözləmədən əl verdi:

– Xoş gəlmisiniz.

Sonra "ya Allah, yoldaş Kəhrizli" – deyə nəşə ilə gülümsəyərək hesabdarla görüşdü.

Sonra Qərənfil bacının qabağına yeridi. O, bir əli ilə qadının əlindən yapışıb, o biri əlini onun çiyninə qoydu:

– Bəh-bəh... Yenə "Ağ yasəmənin" ətri dünyanı bürüyüb. Vallah, səni belə durna kimi qəşəng görəndə, şer yazmaq istəyirəm.

– Ona görə ispalkom olandan bəri Aya-günə dönmüsən, – deyə Qərənfil bacı gileyləndi. – Neçə gündür zəng də eləmirsən.

– Eh, elə şeylərə fikir vermə. Zəng elədim-eləmədim, həmişə buradasan. O, əlini ürəyinin üstünə qoydu.

Sonra üzünü sədrə çevirdi:

– Dayı, nə var, nə yox? Səni indidən təbrik etmək olar, hə? Eşitdim ki, bu il buğdanı on ikidən böləcəksən?

– On iki yarımdan! Qulu şəhadət barmağını yuxarı qaldırdı.

– Qulu, bəsdir. Qulu, indidən dünyaya küy vurma! – deyə sədr onu məzəmmət elədi.

Mühasib sürətlə gah Nəriman əmiyə, gah da Hümmətə baxıb, təqsirkar halda susdu.

Hümmət, Quluya müraciətlə:

– Dayım istəyir ki, hamını birdən təəccübə salsın, – dedi.

Sonra göz vuraraq, əlavə etdi:

– Ancaq, deyəsən, bəhmənlilər on üçdən böləcəklər...

Sədr özündən çıxdı:

– Kim deyir onu? Doqquzdan bölsələr, sevinərsiniz.

(Mən sonradan bildim ki, Güney qışlaq kolxozu ilə Bəhmənli kolxozu arasında yarış müqaviləsi vardır.)

Bu zaman qaraqaş, qarabığ şofer də eyvana çıxıb salam verdi.

Nəriman əmi onun salamını alıb:

– Gəl otur, Kərim, – deyə ehtiramla yer göstərdi.

Qərənfil bacı Hümmətdən soruşdu:

– Yaxşı, əvvəl çörək yeyəcəksiniz, yoxsa çay içəcəksiniz?

– Muradgildə çörək yemişik. Ancaq çay içərik.

O hələ də əlində tutduğu yumşaq günlüklü boz kepkasını təkyənin üstünə qoyaraq, eyvanın aşağı tərəfindəki əlüzyuyana yanaşdı.

Bu, təxminən iyirmi beş yaşında, ortaboylu, möhkəm bədənli, enlikürək bir oğlan idi. Ağ parusin köynəyini, nazik boz parçadan son dəb ilə tikilmiş, aşağısı dar şalvarının içinə salmışdı. Saçları, qaş-gözü qonur idi. Üzünün cizgiləri düzgün və yaraşıqlı idi. Gülərkən ağ, sağlam dişləri görünürdü.

O, rayon icraiyyə komitəsi sədrindən çox, kəndə tətilə gəlmiş tələbəyə oxşayırdı. Əl-üzünü yuyub qurulayandan sonra gəlib şofer Kərimlə yanaşı oturaraq mənə dedi:

– Siz də əyləşin. Nə üçün ayaq üstündə durmusunuz?

Mən səbəbini özüm də bilmədiyim bir fərəhlə keçib əyləşdim. Onun baxışında, səsində təravətli, mehriban bir ifadə var idi. O indicə Muradgildə çörək yemişdi! Yəqin ki, dost idilər. Mən bunu onun “Murad” adını necə söyləməsindən, necə tələffüz eləməsindən duydum, gözlərindəki ani ifadədən hiss etdim.

“Bütün bunların sənə nə dəxli var?” deyə soruşa bilərsiniz. Lakin həyatımızda belə kədərli, ümidsiz sevinclər azmı olur?

– Quzey qışlağa niyə getmişdin? deyə Nəriman əmi onun üzünə baxmadan soruşdu.

– Alxanlı sovetliyindəydim, qayıdanbaş elə-belə döndüm Muradgilə.

O, çayından bir-iki qurtum aldı:

– Ancaq, dayı, quzeylilərin vəziyyəti yaxşı deyil. Bu il heç üç kilo da bölə bilməyəcəklər.

Qulunun balaca qara bəbəkləri ildırım sürətilə o yan-bu yana qaçaraq, gah dayının, gah da bacıoğlunun üzündə dayanırdı.

Nəriman əmi başını aşağı salıb dinmədi. Rayon icraiyyə komitəsinin sədri soruşdu:

– Sən nə cür düşünürsən, onlara nə cür kömək eləyə bilərik?

Sədr dərindən nəfəs alaraq, başını qaldırıb bacısı oğluna uzun və yoxlayıcı bir nəzər saldı:

– İsfahan bir şəhərdir, hər kəs öz vəkili. Şükür Allaha, quzeylilərin sədri məndən cavan, məndən yüz dəfə savadlı, niyə onun özündən soruşmursan?

– Dünyagörmüş kişisən.

– Hər şey zəhmətin başındadır.

– Sən bilirsən ki, quzeylilər daşdan çörək çıxaran adamlardır.

– Tutaq ki, bilirəm. Bundan onlara nə isti-soyuq?

– Su dərdindən qalıblar belə, iş görə bilmirlər. Böyük kanallardan da heç birinə əlləri çatmır.

– İyirmi il qabaq biz də əlimizi qoynumuza qoyub aylarla yağış gözləyirdik.

– Bizim kəndin coğrafi vəziyyəti elədir ki, o vaxt siz Köndələnçaydan bura arx çıxara bildiniz. Ancaq Quzey qışlağın yeri...

– İndi dediyin nədir? – sədr bacısı oğlunun sözünü yarımçıq kəsdi.

Lakin Hümmət öz halını pozmadan eyni sakit və mülayim ifadə ilə davam etdi:

– Dediyim odur ki, bəlkə fikirləşək, onlara bir kömək eləyək...

– İnişil taxıl istədilər, verdik. Hələ indi də yarısını borcludurlar. Keçən il qar qapını alanda, alaf istədilər, verdik. Daha mənim əlimdən ayrı bir şey gəlməz, bildin?

Sədr əsəbi halda stəkanını qabağına çəkdi. Hümmət, dayısına işarə ilə Quluya göz vurdu. Lakin Qulunun zarafatlıq halı yox idi. Alt dodağı sallanmış, civə kimi daim hərəkətdə olan bəbəkləri indi sanki yerində mıxlanıb qalmış, üzü yazıq, acınacaqlı bir hal almışdı. Hümmət özünü saxlaya bilməyib bərkdən güldü:

– Bütün təqsirlər Quludadır. Öz kəndi kasıb olduğu üçün buraxıb, gəlib oturub dövlətlilərin içində.

Mühasib sanki diksindi. Bəbəkləri tərpənib sürətlə o yan-bu yana qaçdı.

Mən soruşdum:

– Məgər, Qulu Quzey qışlaqlıdır?

– Bəli, ancaq quzeylilər daha bunu özlərindən hesab eləmirlər.

Lakin, görünür, Hümmətin sözləri zarafat da olsa, Quluya təsir etmişdi. "Ah" çəkərək gümüş kimi parıldayan papiros qutusunu çıxarıb açdı. Bir papiros götürüb gilizini tez-tez qutunun qapağına döyərək, ağzına qoydu. Sonra kibrit qutusunu çıxararaq, papirosunu yandırıb dalbadal çəkməyə başladı.

Hümmətin üzü birdən-birə ciddi ifadə aldı. Nəzərlərini mühasibdən çəkib bağçaya baxdı. Bu an onun ağıllı qonur gözləri mənə təəccüblü dərəcədə qayğılı göründü.

Hümmətin quzeylilərə kömək etmək haqqındakı sözlərindən Nəriman əminin bu cür əsəbiləşməsinin səbəbi o gecə mənim üçün anlaşılmaz qalmışdı. Bununla belə, mən ona sarı baxmaq istəmirdim. Mənə elə gəlirdi ki, kişinin üzü həddindən artıq qızarıb pörtmüş, xoşa gəlməyən bir ifadə almışdır. Qərənfil bacı da tutqun idi.

Rayon icraiyyə komitəsinin sədri gözlərini bağdan çəkib mənə tərəf döndü:

– Nuriyyə xanım, bizim mədəniyyət evimiz xoşunuza gəlirmi?

– Kənd üçün çox yaxşıdır.

– Ağlınız nə kəsir, camaata bir xeyri dəyəcək?

– Çalışarıq dəysin.

– Mənim sualım qəribə görünə bilər. Ancaq rayonlarımızın, kəndlərimizin çoxunda bu mədəniyyət evlərini ancaq görk üçün tikirlər. Desinlər filan kolxozun mədəniyyət evi var.

– Hər halda, biz "malades" almaq üçün tikməmişik, – deyə hələ də acıqlı olan Nəriman əmi dilləndi.

Qərənfil bacı məzəmmətlə ərinə baxdı:

– Bu gecə sənə nə olub, Nəriman?

Hümmət gülümsəyərək:

– Səni nəzərdə tutmuram, dayı, – dedi. Mən bilirəm ki, sən camaata xeyir verməyən işə qol qoymazsan.

Nəriman əminin sifəti dərhal açıldı, qəddini düzəldərək:

– Qərənfil, – deyə mehribanlıqla səsləndi, – niyə yemişdən-zaddan gətirib kəsmirsən?

– Bıy, gör heç yadıma düşürmü, – Nəriman əmiyə görə Qərənfil bacının da kefi açıldı, ayağa qalxıb eyvanın aşağı başına getdi.

– Məgər, yemiş çıxıb?! – Hümmət təəccüblə soruşdu.

– Az qala, on gündür yeyilir. İki dəfə yığıb camaata paylamışıq. – Sədrin səsində gizli bir təşəxxüs duyulurdu.

O, ayağa qalxdı. Qərənfil bacının ardınca gedərək, təxminən səkkiz kiloqram ağırlığında bir yemiş gətirib Hümmətə uzatdı:

– Ətrinə fikir verirsən?

Hümmət yemişi alıb burnuna tutaraq yerə qoydu:

– Bizim yerdə bu boyda yemiş?

Sədr iftixarla cavab verdi:

– Hamısı becərməkdən asılıdır.

– Şirin olurmu?

– Bal kimi, – deyə Qulu birdən-birə canlanaraq, çoxağızlı cib bıçağını çıxarıb açdı və yemişi səliqə ilə dilimləyərək, Qərənfil bacının gətirdiyi boşqablara düzdü.

Elə bu zaman İmi ilə Cimi, lap göydən düşmüş kimi, eyni geyimdə, eyni görünüşdə eyvana çıxdılar.

– Hümmət qağa, xoş gəlmisən, – Cimi özünü icraiyyə komitəsi sədrinin üstünə salaraq, onun əlini iki əli ilə bərk-bərk sıxdı.

– Xoş gəlmisən, – deyə İmi xəfifcə baş əydi.

Sonra irəliləyib nəzakət qaydalarından başı çıxan adam ləyaqəti ilə əl tutuşdu və yalnız bu zaman göz qapaqlarını qaldırıb Hümmətə baxaraq gülümsədi. Sonra Cimiyə ciddi və mənalı bir nəzər saldı. Sanki bu baxışla demək istəyirdi: "Gördünmü rayon icraiyyə komitəsinin sədri ilə necə görüşmək lazımdır".

Lalın dilini anası bilər. Cimi yoldaşının məzəmmətini başa düşüb özünü itirdi. Gah əzilib-büzüldü, gah gülümsədi, gah məlul-məlul onun-bunun üzünə baxdı, gah da ciddi görünüş aldı. Doğrusu, mənim ona yazığım gəldi. "Bu nədir? Bütün əzası təndürüst olan, zövqlə geyinməyi bacaran bu yaraşıqlı, sağlam oğlanı kim belə iyrənc hala salmışdır? O birisinin üzündəki bu mənfur saxta ciddiyyət niqabı haradandır? Bunları kim şikəst etmişdir? Axı, deyirlər, xasiyyət insanla birlikdə doğulmur."

Mən əsl həyata yenicə qədəm qoyduğum üçün bu ürəksıxan suallara cavab tapa bilmirdim. Ona görə də, qeyri-ixtiyari olaraq, rayon icraiyyə komitəsi sədrinin üzünə baxdım. Lakin o, gözlərini yerə dikərək fikrə getmişdi, üzü nə üçünsə qüssəliydi. Qərənfil bacı sap əyirirdi. Qulu şofer Kərimə tərəf əyilərək hərarətlə nə isə deyirdi. Nəriman əmi radioqəbuledicini qurdalayırdı. Yalnız İmi ilə Ciminin gözləri rayon icraiyyə komitəsinin sədrində idi. Elə bil, onlar bizim orada olduğumuzu belə unutmuşdular. Elə bil, rayon icraiyyə komitəsi

sədrinin sükutu onların ürəyini əzirdi. Elə bil, onlar bu sükutun səbəbini öyrənmək üçün hər şeyə hazır idilər.

Hümmət başını qaldıraraq:

– İmi, – dedi, – nə var, nə yox? Əsər nə haldadır?

İmi nəvazişlə gülümsədi, bir dəfə burnunu çəkdi, sonra kirpiklərini tez-tez qırparaq:

– İşləyirik, – deyə təvazökarlıqla cavab verdi. – Ancaq, doğrusu, yenilik o qədərdir ki, birini yazıb qurtarmamış, görürsən, təzəsi meydana çıxdı. Amma çox gözəl əsər olacaq, Hümmət qağa. Biz mətbuatda təşəbbüs qaldırmaq istəyirik ki, respublikamızda olan hər bir qabaqcıl kolxozun bu cür tarixi yazılsın. Zarafat deyil, xalq bu qədər iş görür, fədakarlıq göstərir.

Qərənfil bacı gözünü əlindəki iydən çəkib hirsli-hirsli Cimiyə baxdı:

– Xalq iş görür. Siz isə, təşəbbüs qaldırırsınız...

Cimi özünü onda qoymadı.

– Necə təşəbbüsdür, yoldaş Hümmət?

– Yaxşı təşəbbüsdür. Ancaq, axı, qabaqcıl kolxozların hamısında İmi kimi yazan tapmaq çətindir.

İmi gözlərini tez-tez qırparaq ciddi əda ilə dedi:

– Tapmaq olar...

Lakin mənə elə gəldi ki, o, Hümmətin sözlərindəki istehzanı hiss elədi, ancaq üzə vurmadı. Mən sonralar anladım ki, İmi-Cimi kimi adamlar həyatda heç bir zaman nəinki hücum, hətta, açıq müdafiə mövqeyi də tutmurlar. Çünki bunların hər birisində iki cəhət ola bilər: ya qalibiyyət, ya da məğlubiyyət. İmi ilə Cimi üçün isə, bu cür cəsarət göstərmək heç bir vəchlə əlverişli deyildir. Ona görə də, belə adamlar kərtənkələ kimi mühitin rənginə uyğunlaşaraq, gizlənməyi hər cür qabaqlaşmaya, açıq mübarizəyə tərcih edirlər.

Görünür, İmi söhbəti dəyişməyi lazım bildi:

– Bizim bu Cimidə qəribə bir hiss var. Gündüz mənə deyirdi, İmi, ürəyimə damıb ki, bu gün Hümmət qağa kəndə gələcək.

Cimi riqqətlə irişdi:

– İmi də dedi ki, gəlsəydi nə yaxşı olardı, çoxdan görüşmürük.

Qərənfil bacı:

– Pah-pah, – deyə hövsələdən çıxdı. – Gün axşamacan İmi Cimidən deyəcək, Cimi də İmidən.

Cimi daha mehriban bir əda ilə:

– Ay Qərənfil xala, – dedi, – vallah, neyləsən, pərt olmuyacağıq.

Qərənfil bacı iyi yerə qoydu, qab-qacağı götürərək, əsəbi addımlarla uzaqlaşdı. Nəriman əmi:

– Asta yeri, Qərənfil, – deyə onun ardınca səsləndi.

Hümmət gülümsəyərək yenə də dayısına işarə ilə Quluya göz vurdu. Sonra məndən Bakıdakı son teatr tamaşaları haqqında soruşdu. Lap uşaqlıqdan mən həyatın əzab və məşəqqətləri içində daha canlı, daha ləyaqətli görünən qəhrəmanları sevərdim. Mən istəyərdim oxuduğum əsərin qəhrəmanı sehrkar bir cazibədarlıqla məni çəkib ardınca aparsın. Qorxulu uçurumlardan, alovlardan keçirsin. Mənə yalnız gül ləçəklərinin naxışlarındakı heyrətli ahəngi deyil, eyni zamanda, həyatın boz üzünü göstərsin, amansız sitəmlərini hiss etdirsin. Mən yalqızlığı sevmirəm. Mən həyatda da bütün düymələri öz yerində olan, plakat kimi cansıxıcı adamlara nifrət edirəm. Bu nöqteyi-nəzərdən mən o zaman mətbuat tərəfindən təriflənən bir pyesi tənqid etdikdə, icraiyyə komitəsi sədri sakit və ağıllı gözlərini bağçaya dikərək xeyli susdu. Sonra dərindən nəfəs aldı.

– Təəssüf ki, – dedi, – indiki əsərlərdə siz deyən plakatlara tez-tez rast gəlmək olur. Bunları haradan uydururlar? Doğrudur, bizdə evinə şüarlar yazıb yapışdıran tiplər var. Lakin, axı, hamı belə deyil.

O yenə də gözlərini bağçaya zilləyərək susdu. Ay doğub, ağacların baş tərəfini işıqlandırmışdı. Hava sərin idi. İydənin ətri indi daha kəskin duyulurdu. Hümmət təkrar mənə sarı dönərək:

– Bilirsinizmi, Nuriyyə xanım, – dedi, – məncə həqiqi sənətkarın fırçasından heç bir zaman quru müqəvva çıxmaz. Həqiqi istedad, daşa, torpağa da ruh vermək kimi ecazkar bir qüvvəyə malikdir. Taxta kimi quru, hissiz, zövqsüz qəhrəmanları bizim ədəbiyyatımıza ideyalılıq pərdəsi altında gizlənən istedadsız demaqoqlar gətirir. Mən dövlətin yerində olsaydım, belələrinə yazmağı qadağan edərdim! Bəsdir, deyərdim, bu protokollara roman adı qoyub dünyanı doldurdunuz. Siz hissiz, duyğusuz, buz kimi soyuq qəlbinizi yazırsınız. Mərhum Qoqol demişkən, siz özünüzə gülürsünüz. Qələmi qoyun, çıxın gedin işinizə, ola bilər ki, başqa sahələrdə siz cəmiyyət üçün, özünüz üçün daha xeyirli adamlar olarsınız.

Bütün bu müddətdə Cimi "düzdür, düzdür" deyə dalbadal təsdiq edir, İmi isə, kimsənin üzünə baxmadan tez-tez kirpiklərini qırpırdı.

Qulu qızıla oxşayan sarı dəmir bilərzikli saatına baxdı:

– Bu gecə yaxşı konsert var, icazə versəydiniz radionu açardıq.

Hümmət:

– Niyə açmırsan, – dedi, – aç qulaq asaq.

Qulu darıxmış kimi cəld qalxıb radioqəbuledicini qurdu. "Rast"ın sədaları ətrafa yayılaraq, sanki bir anda bütün aləmi dəyişdi. Qərənfil bacı eyvanın aşağı başında işini yarımçıq qoyaraq gəlib bizim yanımızda oturdu; Nəriman əmi gözlərini bir nöqtəyə zilləyib, sağ əli ilə bığının ucunu oynatmağa başladı. Qulu gah əlini altdan yuxarı saçına çəkir, gah iti hərəkətlə onun-bunun üzünə baxır, gah ovurdlarını şişirdərək "ah" çəkirdi. Hümmət bağa baxırdı. İmi ilə Cimi isə, başlarını aşağı salıb sanki fikrə getmişdilər.

Xanəndə oxuyurdu:

Yad eylədikcə vəslini, ey mahi-tələtim,
Ağlar gözümdə qanə dönər əşk-həsrətim.

Ay işığına qərq olmuş bağçada bir budaq da tərpənmirdi. Elə bil, bizimlə bərabər hər şey sükuta dalaraq musiqini dinləyirdi. Nəriman əmi daha bığını oynatmırdı. İndi onun üzündəki dərin qırışlar uzaq bir kədər, mehribanlıq ifadə edirdi. Elə bil, qoca (o həqiqətən də indi qoca görünürdü) kimə isə acıyır, kimi isə əfv edirdi. Biz beşikdə ana laylasıyla uyumuşduq. Bəlkə buna görə də, heç bir qüvvə bizim qəlbimizə musiqi qədər hakim ola bilmirdi. Heç bir qüvvə bizdə bu qədər peşman mərhəmət hissləri oyatmırdı.

Xanəndə oxuyurdu:

Dün gecə mən röyada edirkən ah-zar,
Sən vermədinmi bir əbədi vəsl üçün qərar.

Nəriman əmi kimsənin üzünə baxmadan başını ağır-ağır tərpədərək:

– Xandır, – dedi.

Və bir qədər də dinlədikdən sonra kədərlə əlavə etdi:

– Keçəçi oğlundan, Ələsgərdən, Cabbardan bir bu yadigar qalıb. Bundan sonra kim bilir bir də bu cür muğamat oxuyan gələcəkmi? Səsə fikir verirsiniz? Elə bil bulaq qaynayır.

Hümmət:

– Nə qədər Azərbaycan xalqı var, muğamat da olacaq, onun ifaçısı da, – dedi. – Yeni nəsil “Segah”ı, “Rast”ı simfonik əsərlərdən az sevmir.

– Elədir, – deyə mən təsdiq etdim. – Çünki muğamatda bizim ruhumuz yaşayır.

“Rast” oxunub qurtardığı zaman diktor heç birimizin gözləmədiyi qəribə bir elan verdi: “Məşhur pambıq ustası Gülsənəm Moskvada kənd təsərrüfatı sərgisində tanış olduğu adlı-sanlı baramaçı Qərənfil Tağı qızına “Ağ çiçəklər” mahnısı ilə salam yetirməyimizi bizdən xahiş etmişdir”.

Qərənfil bacı diksindi. Nəriman əmi dərhal qəddini düzəltdi. Qulunun balaca qara bəbəkləri sürətlə adamların üzündə gəzdi. Cimi, Qərənfil bacıya baxaraq, riqqətlə irişdi. İmi ləyaqətlə papiros çıxarıb yandırdı.

Mən Qərənfil bacıdan soruşdum:

– Sizi deyir?

– Bəli, – deyə Nəriman əmi təntənə ilə cavab verdi və gözlərini radioqəbulediciyə elə zillədi ki, sanki bu dəqiqə orada, nə isə, fövqəladə bir hadisə baş verəcəkdi.

Mən, Qərənfil bacının belə tanınmış adam olduğunu indiyə qədər bilmədiyim üçün xəcalət çəkirdim.

Mahnı oxunduqca, Nəriman əminin sifəti daha aydın və mehriban olur, kişi gözlərini radiodan ayırmırdı.

Qulu isə, mənim təəccübümdən ləzzət alaraq gülümsəyir, aramsız olaraq, gah Qərənfil bacıya, gah da mənə baxırdı. Mahnı qurtaran kimi o, tez dilləndi:

– Qərənfil bacının baraması keçən il kənd təsərrüfatı sərgisində birinci yeri tutdu.

Qərənfil bacı elə bil utandı:

– Eh, ay Qulu, sən Allah, az təriflə...

Qulu xısın-xısın güldü və mənə müraciətlə sözünə davam etdi:

– Qərənfil bacının təcrübəsini öyrənmək üçün bu il akademiyadan iki elmi işçi gəlmişdi. Deyirdilər, kitab yazacaqlar.

Nəriman əmi, özünü tox tutaraq, arvadının təriflənməsinə gizli məmnuniyyətlə qulaq asırdı. Hümmətin düşüncəli baxışları hərdənbir mənim üzümdə dayanırdı və hər dəfə bizim nəzərlərimiz qarşılaşanda mən bilaixtiyar onun dostunu, Muradı xatırlayırdım. Elə bil, bu ani baxışları mənə o göndərirdi.

Bir qədər söhbətdən sonra İmi ilə Cimi xudahafizləşib getdilər.

Kişilərə eyvanda yer salındığından, Qərənfil bacı o gecə mənimlə bir otaqda yatdı. Biz yerin içində xeyli söhbət elədik. Qərənfil bacı Hümmətin həyatından danışırdı. Onun atası Xasan gölündə, Fin davasında böyük qəhrəmanlıqlar göstərmiş igid bir zabitmiş. Böyük Vətən müharibəsində podpolkovnik rütbəsində alaya komanda etdiyi zaman həlak olmuşdu. Hümmətin bütün mahalda birinci gözəl sayılan anası Sayad isə, ərinin vəfatından altı ay keçməmiş səkkiz yaşlı Hümməti əmisinin üstünə ataraq, ərə getmişdi. Hazırda qonşu rayonda yaşayır. Bu da Nəriman əmiyə ağır təsir etmişdir. Yerli adətə görə, gəlin öz igid ərinin ölümündən sonra, heç olmasa, iki-üç il evdə oturmalıdır. Digər tərəfdən, Hümmətin atası, Nəriman əminin şəxsən dostuymuş. Buna görə də, bacısı ikinci ərə gedəndən sonra Nəriman əmi, bir dəfə də olsun, onu dindirməmişdir. Hümməti isə, onsuz da, külfəti ağır olan əmisindən alıb özü saxlamışdır. Oğlan Nəriman əmi ilə Qərənfil bacıya doğma ata-anası kimi üns bağlamışdır.

Qərənfil bacı, çöldə yatanlar eşitməsin deyə, pıçıltıyla nağıl edirdi:

– Heç bir ata onun üçün Nəriman olmazdı. Ayağını quru yerə dəyməyə qoymayıb. Könlündən nə keçibsə, hazır olub. Gəncədə Kənd Təsərrüfatı İnstitutunda oxuyan zaman ildə üç-dörd dəfə yanına gedərdik. Kişi harada bir yaxşı şey görsəydi, onun üçün alardı. Payızda yoldaşlarını da yığıb kəndə qonaq gətirərdi. Kişi gedib onlara ceyran vurardı. Onu da deyim ki, kişinin əməyini itirmədi. Cavanlığına baxma, lap institutun özündə də başına and içərdilər. Dərsini qurtarandan sonra MTS-də aqronom işləyirdi. Beş-altı aydan sonra raykom da, camaat da tutdular ki, gərək ispalkom olasan. İndi, maşallah, bir rayondur, bir də Hümmət. Kəndlərdə bir sözünü iki eləməzlər.

Qərənfil bacı xeyli susduqdan sonra dedi:

– Ancaq evlənməklə işi yoxdur. Deyirəm, ay bala, vaxt keçir, yaşın iyirmi beşdən ötüb, nəyi gözləyirsən? Zarafata salıb deyir, nişanlım hələ gəlməyib, gələndə evlənəcəyəm. Nə isə. Sağlıq olsun, hər şey düzələr, daha yat. Gecdir.

– Gecəniz xeyrə qalsın, – deyə mehribanlıqla pıçıldadım.

Qərənfil bacı:

– Xeyrə qarşı, – dedi.

Otağın qaranlığı ürəyimi daş kimi sıxırdı. Ona görə də, arxası üstə çevrilərək, gözlərimi açıq pəncərədən aydınlıq bağçaya dikdim. Ya-

xındakı Söyüdlü arxdan qurbağaların qurultusu eşidilirdi. Yarpaqlar sanki mavi bir tül içində mürgüyə dalmışdı. Bəzən küçədən sürətlə gəlib-keçən bir yük maşını gecənin bu yuxulu sükutunu pozurdu. Bəzən, haradasa, it bir-iki ağız hürüb yenə də susurdu. Daha sonra tək-tək xoruz banlamağa başladı. Yadımdadır: uşaqlıqda heç bir şey məni gecə yarısı eşitdiyim xoruz banı qədər qüssələndirməzdi. Mənə elə gələrdi ki, hamı, bütün kənd məni çoxdan, lap çoxdan unudaraq, sonsuz zülmət içində dərin, ağır bir yuxuya getmişdir. Mən yalqız, tək-tənha qalmışam. O kədərli uşaqlıq günlərindən bəri çox sular-sellər axıb getmişdir. Lakin, gecə yarısı eşitdiyim xoruz banları yenə də ürəyimi qüssə ilə doldurur. Yenə də mənə elə gəlir ki, hamı məni çoxdan unudaraq yuxuya getmişdir. Həyəcanla – ağır, ümidsiz bir həyəcanla qalxıb otururam. Uzaqlarda uzaq ulduzlar kimi seçilən o işıqlar sönmüşdür. Hamı yatmışdır, hamı məni çoxdan unudaraq yatmışdır.

Qərənfil bacının sakit mışıltısı sanki başqa bir aləmdən gəlir; axşam Hümmətin hərdən çevrilib məndə qalan nəzərləri, İmi ilə Ciminin "təşəbbüsləri", Nəriman əminin öz arvadı üçün çalınan havaya qulaq asması – bütün bunlar indi nə qədər uzaq, nə qədər qəmli xatirələr olmuşdur.

Birdən Ay işığında pəncərədən sallanan kiçik bir şey nəzərimi cəlb edir. Əyilib baxıram. Hörümçəkdir. Sapını uzada-uzada üzüaşağı enir.

Qurbağalar susmuşdur. Xoruzlar daha banlamır. Kənd yuxudadır. Hörümçək isə, yavaş-yavaş üzüaşağı sallanır. Hörümçək oyaqdır...

Səhər oyandığım zaman Hümmətlə Nəriman əminin eyvanda bərk mübahisə etdiklərini eşitdim. Nəriman əmi göy kimi guruldayırdı:

– Bu sözü bir dedin, bir də demə! Dünya dağılsa da, elə şey olmaz!

– Nə üçün olmur? – deyə rayon icraiyyə komitəsinin sədri yavaş və toxtaq səslə soruşdu.

– Güney qışlaq camaatı ona görə ilan kimi qabıq qoyub, arx çəkməyib ki, quzeylilər gəlib hazırına yiyələnsinlər.

– Əgər, biz Söyüdlü arxı Quzey qışlağa qədər uzatsaq, bundan Güney qışlağa nə zərər dəyə bilər?

– Çox zərər dəyər!

– Məsələn?

– Məsələn... Məsələsi odur ki, biz Söyüdlü arxın altında o boyda HES tikmişik.

– HES-i söküb böyüdərik. Həm sizə işıq verər, həm də Quzey qışlağa.

– Necə? Biz öz HES-imizi söküb dağıdacağıq?

– Siz təzə HES-i elə güclü tikə bilərsiniz ki, maşınlarınıza da xidmət eləsin. Məsələn, bu saat Quba kolxozlarının çoxunda kənd təsərrüfatı maşınlarını elektriklə təmir edirlər.

– HES-i böyüdərik-böyütmərik, özümüz bilərik. Qoy Çıraq oğlu Murad Söyüdlü arxdan gözünü çəksin. Sən də dünən şeş, bu gün beş atlanıb öz kəndini çapma.

Rayon icraiyyə komitəsinin sədri isə, eyni sakitliklə, sözünə davam edirdi:

– Quzeylilər yayın bu isti günlərində mal-qaralarına quyudan şor su çəkib verirlər. Bir dəstə göyərtiyə həsrət qalıblar.

– İndi mən nə təhər eləyim? Dünyada nə çox Quzey qışlaq kimisi. Bunun hamısının dərdini Güney qışlaq çəkə bilməz ki.

– Əgər, çəkə bilərsə, çəkməlidir. Bəs, qonşu qonşunun nə günündə lazımdır?

Mən onun üzünü görmürdüm, lakin sözlərinin Nəriman əmiyə təsirini hiss edirdim.

– Ay kişi, – deyə Qərənfil bacı mübahisəyə qarışdı. – Vallah, Hümmət yaxşı söz deyir.

Nəriman əmi qışqırdı:

– Çıraq oğlu Murad nə vaxtdan sizin əziz-xələfiniz olub, Qərənfil?

– Ay Nəriman, sənin də acığın tutanda üzünü görmə. Burada Muradlıq nə var? Hümmət camaatdan danışır.

– Arx güneylilərindir. Birdəfəlik bunu bilin!

– Yaxşı, dayı, indi ki, belədir, icazə ver, yığışıb bir camaatla məsləhətləşək.

Bu dəfə sədri yaman od götürdü:

– Yəni, özünə o qədər arxayınsan? Neynək, sözüm yoxdur, yığılaq danışaq. Doğru deyirsən, danışaq...

Nəriman əminin ayaqlarını döşəməyə bərkdən vuraraq, taxtaları cırıldada-cırıldada aşağı düşdüyünü eşidəndə, mən yavaş və cəsarətsiz addımlarla eyvana çıxdım. Elə bil, indicə eşitdiyim qızğın mübahisə mənim haqqımdaydı. Elə bil, Nəriman əmi mənə böyük bir pislik etmək istəyir, Hümmət isə, mənə acıyır, məni müdafiə edirdi.

Qərənfil bacı eyvanın aşağı başında çay dəmləyirdi. Qulu yox idi. Hümmət isə, sütuna söykənərək susurdu. Məni görərkən şən və açıq bir təbəssümlə:

– Sabahınız xeyir, Nuriyyə xanım, – dedi. – Yəqin ki, bizim səs-küyümüz sizi səhərin şirin yuxusundan elədi.

– Xeyr, – dedim, – mən özüm də tezdən durmağa adət etmişəm.

Bu zaman Nəriman əmi qaşqa ürgəni tövlədən çıxarıb, ağaca bağladı. Lap körpəlikdən mən gözəl atları dəlicəsinə sevərdim. Yadımdadır, mərhum atamın hündür boz atı var idi. Mən onun boynunu, üzünü o qədər tumarlayıb oxşamışdım ki, yanına gedən kimi başını aşağı əyib mənə tərəf uzadar, üz-gözümü qoxlardı.

İndi də tünd-şabalıdı rəngdə olan qaşqa ürgənin ceyran ayağı kimi incə ayaqları, uzun durna boynu, şahanə məğrur duruşu, sağrısının qəşəng mərbutluğu məni valeh etmişdi. Bunu Hümmət də hiss etdiyi üçündür ki, ata işarə ilə:

– Xalis Qarabağ cinsidir, – dedi, – dayım bunu özündən çox istəyir.

Nəriman əmi yəhəri atın belinə qoyarkən, Hümmət aşağı düşüb ona yaxınlaşdı:

– Sən dayan, dayı, mən yəhərləyərəm.

– Lazım deyil, lazım deyil. Böyük adamsan, görüb elərlər, sonra yaxşı düşməz...

Hümmət:

– Mən ölüm, sən dayan! – deyib yəhərdən yapışdı.

Nəriman əmi acıqlı halda geri çəkildi. Hümmət bir dəqiqənin içində qaşqa ürgəni yəhərləyib, tapqarlarının möhkəm olub-olmadığını yoxladı.

Qərənfil bacı eyvanın təkyəsinə yaxınlaşaraq:

– Əşi, heç olmasa, bir stəkan çay içəydin.

– İstəmirəm, Qərənfil...

Sədr cilovu ağacdan açıb atın üstünə çevirdi və ayağını üzəngiyə qoyub yaşına uymayan bir cəldliklə atın belinə qalxanda Hümmət digər üzəngidən yapışdı. Azərbaycan kəndlərində bir adamın atının üzəngisini basmaq ən böyük hörmət əlamətidir. Nəriman əmi atın üstündə oturandan sonra üzünü eyvana tutub birdən-birə dəyişilən mülayim səslə:

– Qərənfil, qayıdıb çay içərəm, – deyərək ayaqlarını yavaşca tərpətdi.

Qaşqa ürgə başını dik tutaraq, ağacların kölgəsində addım-addım gedib darvazadan çıxan kimi, gözəl yorğası ilə yola düzəldi. Nəriman əminin gedişi ilə mən özümü, nə isə, ağır bir şeyin təzyiqindən qurtarmış kimi hiss etdim. Halbuki indicə əyləşib onun çörəyini yeyəcəkdim.

Mən stolun üstünə ağ süfrə salan Qərənfil bacıya və qayıdıb eyvana çıxan Hümmətə baxdım. İndi onlar mənə təəccüblü dərəcədə yaxın, doğma və əziz görünürdülər. Elə bil, mənim aydın dərk etmədiyim duyğular çoxdan bizi qəlbən bir-birimizlə bağlamışdı. Mən tamam qeyri-şüuri olaraq dönüb bir qədər aralıdan keçən Söyüdlü arxa baxdım. Mənə elə gəldi ki, söyüdlərin kölgəsi ilə səssizcə axan suyun incə şırıltısını eşidirəm. Elə bil, sərin səhər mehi ilə titrəşən narın yarpaqlar uzaqdan mənə mehriban sözlər söyləyirdi.

Qərənfil bacını zorla kənar edib, başında çaynik olan iri ağ samovarı yüngül hərəkətlə götürərək stolun üstünə qoydum. Stəkanları bir dəqiqənin içində yuyub tərtəmiz sildim. Qırmızı təndir çörəyini doğrayıb nimçəyə yığdım. Bütün bu müddətdə mən Hümmətin nəzərlərini tez-tez öz üzərimdə hiss edərək fövqəladə bir fərəh duyurdum. Belə anların birində qəflətən başımı qaldırıb düz onun gözlərinə baxdım. Özünü azca itirən kimi oldu, halbuki mənim məqsədim onu pərt etmək deyildi. Təqsirkar bir təbəssümlə soruşdum:

– Çayınıza süd tökümmü?

– Çox sağ olun. Mən süd içmirəm.

Yanında gümüş qaşıq olan stəkanda ona çay süzdüm.

– Özüm rəngli xoşlayıram deyə sizinkini də tünd elədim.

– Yaxşı elədiniz. Mən də tünd içirəm.

Sonra həyətdə maşını silib-təmizləməklə məşğul olan şoferi səsləyib, üzünü Qərənfil bacıya tutdu:

– Ay dayıdostu, elə hey durna kimi o yan-bu yana süzürsən, gəlib otursana.

Mənə elə gəldi ki, o daha mənimlə tək qalmamaq, mənim nəzərlərimlə rastlaşmamaq üçün belə edir. O, çayına baxaraq susurdu. Lakin mən istəyirdim ki, o danışsın.

Söyüdlü arxın qırağında bitmiş yaşıl yarpızlar sərin küləkdə sevinclə yırğalanırdı.

Mən istəyirdim ki, icraiyyə komitəsinin sədri danışsın. Söyüdlü arxdan danışsın.

Şofer Kərim süfrəyə yaxınlaşanda motosikl səsi eşidildi. Çay əlimdə elə titrədi ki, dərhal stəkanı yerə qoyub, qorxmuş halda, Hümmətlə Kərimə baxdım. Yaxşı ki, onlar yaxınlaşmaqda olan motosiklə tərəf baxırdılar. Darvaza açıldı. Qıçlarım sözümə baxmırdı. Çevrilib tələsik addımlarla içəri girdim. Çarpayının üstündə oturub dərindən nəfəs aldım. Qız ürəyi necə zəif olurmuş. Yoxsa, mənimki belə idi?

– Vallah, bura gəlməkdə qurd ürəyi yemisən, – deyə Hümmət zarafatyana səsləndi.

Pilləkənin taxtaları cırıldadı. Mən məhz həmin bu anda onun üzünü görmək üçün pəncərəyə yaxınlaşıb, pərdənin yanından baxdım. Onun iri qara gözləri narahat halda eyvanı dolandı, mən geri çəkilərək, taqətsiz halda divara söykəndim. Mən zəifliyimə qalib gələ bilmədiyim üçün özümü məzəmmət edirdim. Mənə elə gəlirdi ki, ürəyim yerindən qoparaq, nəhayətsiz boşluq içində hey aşağı düşməkdədir.

Bu dünyada hər halın bir sonu vardır.

Nəhayət, divardan aralanaraq, saçlarımı səliqəyə saldım, üzümə mümkün qədər şən və qayğısız bir ifadə verməyə çalışaraq, bayıra çıxdım:

– Xoş gəlmisiniz, Murad.

Mən onun üzünün bir an necə işıqlandığını, gözlərinin necə həyəcanla üzümə dikildiyini duyaraq, onun nə cavab verdiyini eşitmədim, sehrə tutulmuş kimi, dönüb eyvanın aşağı başında səhər yeməyi hazırlayan Qərənfil bacının yanına getdim.

Hümmət Murada nə isə danışırdı.

– Mən sənə dedim ki, dünyasında razı olmaz, – deyə Murad bərkdən cavab verib, Söyüdlü arxa baxdı.

Söyüdlərin salxım-salxım sallanan yarpaqları heç bir zaman mənə bu qədər biganə və uzaq görünməmişdi.

Qərənfil bacının çəkdiyi yeməyi gətirib stolun üstünə qoyarkən, o, nəzərlərini Hümmətdən çəkib, təkrar mənə baxdı. Mənim baxışlarımsa onun gözlərinin qara şəfəqi içində itib getdi. O gülümsədi:

– Nuriyyə xanım, – dedi, – siz lap ev sahibi olmusunuz. Xahiş edirəm mənə bir stəkan çay verəsiniz. Yeməyə meylim yoxdur.

– Yaxşı, – deyə mən, fərəh və xoşbəxtliklə pıçıldadım.

Qərənfil bacı ona yaxınlaşıb:

– Bura bax, Murad, – dedi, – elə bilmə ki, kürdük, qanmırıq, neçə dəfədir bu evə gəlirsən, bir tikə kəsmirsən.

Murad mənim uzatdığım stəkanı qabağına qoyaraq, zarafatla cavab verdi:

– Susuz adam necə çörək yesin? Ərin yezid kimi bizi susuzluqdan qırır.

Arvad bir neçə saniyəlik sükutdan sonra yenidən dilləndi:

– Vallah, doğru deyirsən. O gün oğlunu görmüşəm. Maşallah, adam baxdıqca, baxmaq istəyir. Kök, qəşəng... Babası Çıraq kimi şaqqalı olacaq... Ay Səadət, dedim, sən Allah, bunun qoluna bir gözmuncuğundan-zaddan bağla.

Hümmət bərkdən güldü:

– Ay arvad, sən də elə şeylərə inanırsan?

– İnanıram. Mən bədnəzərdə gördüyümü görmüşəm.

– Balaca oğlanın adı nədir? – deyə mən soruşdum.

– Əlimərdandır.

Qərənfil bacı uşağı sevirmiş kimi təkrar etdi:

– Əlimərdan kişi.

– Nə böyük adı var, – deyə Murada baxaraq gülümsədim.

– Çıraq kişi atasının adını qoyub.

Murad kimsənin üzünə baxmadan papiros çıxarıb yandırdı.

– Səadətin kefi necədir? – deyə Qərənfil bacı soruşanda, o, başını aşağı salıb, yavaş və mülayim səslə “yaxşıdır” – dedi.

Mən onun üzünə baxaraq, nəyi isə anlamaq istədim. Lakin bu, yalnız bir an çəkdi. Şoferin boşalmış stəkanına çay töküb qabağına qoyaraq, yatdığım otağa girdim. İşə getmək lazım idi. Çəkmələrimi geyib, redikülümü götürdüm. Sonra eyvana çıxıb:

– Hələlik, sağ olun, – dedim.

Qərənfil bacı:

– Bax, nahara gəlməsən, inciyəcəyəm, – dedi, – bu da dünənki deyil.

Nazxanımla Səriyyə mədəniyyət evinin kölgəsində oturub, məni gözləyirdilər. Biz köhnə dostlar kimi sevinclə görüşdük. Bütün günü kitabxananı səliqəyə salmaqla məşğul olduq. Arada məndən piano çalmağı xahiş etdilər. Həvəsim olmadığından çalmadım. Mən işləmək, yorulub əldən düşüncəyə qədər işləmək, heç bir şey barədə fikirləşməmək istəyirdim. Nazxanım isə, ağzında çalıb-oxuyur, məzəli əhvalatlar danışaraq, Səriyyəni gözləri yaşarıncaya qədər güldürürdü. Mən də onların kefini pozmamaq üçün hərdən gülümsəyir və işimə davam

edirdim. Mən heç nə düşünmək istəmirdim. Lakin, elə bil, uzaqlardan əks-səda kimi məchul bir səs tez-tez mənə Söyüdlü arxı xatırladırdı. Mən tez-tez anlaşılmaz bir ümidlə başımı qaldırıb, pəncərədən görünən Söyüdlü arxa baxırdım. Su kənarında bitən yaşıl yarpızlar söyüdlərin sərin kölgəsində nəşə ilə titrəşirdi.

Günortadan bir az keçmiş kitabxananı düzəldib qurtardıq. Nazxanımla Səriyyə su gətirib, döşəməni yumaqla məşğul oldular. Mən də, içəri çox isti olduğundan, eyvana çıxdım.

Mədəniyyət evinin qabağındakı qurumuş otlar qızmar günəş işığında qızıl kimi parıldayırdı. Cırcıramalar biaram səslənirdilər. Nazxanımın toyuqları, üzərinə balqabaq tağları qalxmış alçaq çəpərin kölgəsində dayanıb ağızlarını açmışdılar. Hamı işdə olduğundan, kənd sükut içindəydi. Yaxın həyətlərdə hərdən qoca qadınlar və uşaqlar görünürdülər. Günün bu isti vaxtında Söyüdlü arx cazibədar bir sərinlik və təravət vəd edirdi. Mən eyvandan düşüb, onun qırağına getdim və kölgədə bitmiş cavan çayırların üstündə oturaraq, ayaqlarımı suya saldım. Söyüdlü arxın təması ipək kəlağayı kimi xəfif və yumşaq idi. Baş-başa vermiş söyüdlərin altı ilə sakit-sakit axan suyun üzərində təyyarəyəbənzər bənövüş böcəklər uçuşur, yaşıl yarpızlara qonurdular. Yarpızlar onların ağırlığına davam gətirməyərək əyilib suya dəyir və aramsız titrəşirdi. Orada, Quzey qışlaqda, deyirlər su yoxdur...

Bir minik maşını toz qopara-qopara gəlib mədəniyyət evinin qabağında dayandı. Hesabdar düşüb, qoltuğunda portfel, tələsik addımlarla eyvana çıxarkən, mən onu səslədim:

– Qulu!

O, ayaq saxlayıb ətrafa döyükdü. Məni görcək enib yanıma gəldi.

Almurad maşını sürüb yaxında saxladı. Qulu:

– Sizin dalınızca gəlmişəm, – dedi.

– Nə var, xeyir ola?

– Bizə gedəcəyik.

– Nə üçün?

Ayağının birini irəli, digərini geri qoyub, təəccüblə üzümə baxdı:

– Qəribə sual verirsiniz. Mən sizi qonaq çağıra bilmərəm?

– Ah... Qonaq... Bu nə zəhmətdir...

– Zəhməti-zadı yoxdur. Ağabəyim deyib, gərək nə cür olsa, onu bizə gətirəsən.

– Ağabəyim bacı məni nə tanıyır?

– Eşidib. Mən demişəm.
– Axı, Qərənfil bacı...
– Qərənfil bacıya da demişəm, sədrə də.
– İstəyirsiniz, Nazxanımı da götürək.
– Nazxanımı? Nə olar...

Qulunun üzü elə qəribə bir qorxu və tərəddüd ifadə edirdi ki, şofer Almurad özünü saxlaya bilməyib bərkdən güldü.

Mən heç bir şey başa düşmədim.

– Yoxsa, aparmaq istəmirsiniz? – deyə soruşdum.
– İstəməyinə istəyirəm. Ancaq...
– Almurad yenə güldü:
– Ancaq Ağabəyimdən qorxur. Ə, Qulu, mus-mus deyincə, birdəfəlik Mustafa de, dayna.

Bu zaman işlərini qurtarmış Nazxanımla Səriyyə eyvandan düşüb yanımıza gəldilər.

Nazxanım bir əlində vedrə tutmuşdu. Qulunu görəndə, o biri əlini belinə vurub, özünü yırğalaya-yırğalaya:

– Qu-lu... – deyə səsini uzatdı. – Xoş gördük, çəkmələrin də mübarəkdir.

Mən hesabdarın təzə, sarı çəkmələrini indi gördüm. O, özünü eşitməməzliyə vuraraq, sağ əlini yuxarı qaldırdı:

– Nuriyyə xanım, buyurun, əyləşin, – deyə məni təntənə ilə maşına dəvət etdi.

– Nə yaman forslanmısan, ay Qulu!

Şofer Almurad gözünü Nazxanımın ağ biləklərindən çəkərək, yana-yana gileyləndi:

– Sən ölməyəsən, Nazxanım yetənə yetir, yetməyənə bir daş atır.

Nazxanım boş əli ilə çırtıq çalıb oxudu:

Almurad bəyin nəyi var?
Heyvası yox, narı yox.

Səriyyə uğunub getdi. Şofer isə, gözlərini, gəlinin oxuduğu havanın ahənginə uyğun tərzdə yırğalanan dolu bədəninə zilləyərək, deməyə söz tapmadı. Birdən, dilxor halda, maşına minib rulun arxasında oturdu. Nazxanım şaqqıldayıb güldü.

Nəhayət, mən qızlarla xudahafizləşib maşına əyləşdim.

Söyüdlü arxın körpüsünü keçib cənuba buralduq. Yol uzunu yam-yaşıl, gümrah pambıq tarlaları, yemiş-qarpız bostanları, taxılı biçilib yığılmış kövşənlər tez-tez bir-birini əvəz edirdi.

Mən soruşdum:

– Bunlar Güney qışlağındır, yoxsa...

Şoferin yanında oturmuş Qulu qayğı ilə cavab verdi:

– Güneylilərindir. Quzeylilərin belə dövləti olsaydı nə vardı...

Bir qədər susduqdan sonra əlavə etdi:

– Hamısı Söyüdlü arxın bərəkətindəndir.

Mən, yaşıl həmail kimi Güney qışlağın ətrafına dolanan Söyüdlü arxa acı bir həsrətlə baxırdım. Bu çox qəribə hiss idi. Bu hissin təsiri ilə hər şey mənə tutqun və qəmli görünürdü.

Maşın Quzey qışlağa yaxınlaşmaqda idi. Ürəyim şiddətlə döyünürdü. Güney qışlaq hara, bura hara! Çiy kərpicdən tikilmiş balaca, üstü küləş evlər pərakəndə halda ora-bura səpələnmişdi.

Cəmi dörd-beş evin taxtapuşuna şifer vurulmuşdu. Bağ-bağatdan əsər-əlamət yox idi. Yalnız kəndin girəcəyində qoca bir dağdağan ağacı var idi. Həyətlərdən birində arxasına körpə uşaq şəllənmiş cavan bir gəlin qədim çarxla quyudan su çəkirdi. Qabağına köhnə araba təkərləri, paslı dəmir-dümür atılıb qalan, böyrü üstə əyilmiş balaca dəmirçi dükanının kölgəsində üç-dörd yaşlı kişi oturub bizə baxırdı. Lakin bu kənddə gördüklərimin heç biri mənə cansıxıcı gəlmirdi. Adam yaxın tanış və dostun dövlətli evindən öz kasıbca komasına gələrkən necə bir hiss duyursa, mən də indi elə olmuşdum. Elə bil, buradakı hər şey mənə çox tanış və yaxın idi.

Maşın nisbətən səliqə ilə tikilmiş ikimərtəbə, üstü şiferli evin yanında dayandı. Qulu cəld düşüb maşının qapısını açaraq mənə:

– Buyurun – dedi.

Sonra üzünü şofer Almurada tutdu:

– Düş, sən də bir stəkan çaydan-zaddan iç.

– Qulunun başı üçün, heç nə ilə işim yoxdur, – deyə Almurad cavab verdi. – Bacının dalınca nə vaxt gəlim?

– Sabah səhər.

Mən Quluya etiraz etmədim. Maşın qayıdıb getdi. Biz həyətə girib eyvana çıxdıq. Ərindən hündür, kök, qırmızıyanaq Ağabəyim bacı məni çox hörmətlə qarşıladı:

– Xoş gəldin, ay bacı. Elə Quluya deyirdim bircə onu gətir bizə.

O məni diqqətlə nəzərdən keçirib, sözləri uzada-uzada danışırdı:

– Sən Allah, keç içəri. Bura istidir.

Otaq sərin və ürəyəyatan idi. Ortada yemək stolu qoyulmuşdu. Baş tərəfdəki stolun üstünə rəngbərəng şüşə qablar, güzgü, daraq, əlvan kağızlardan qayrılmış gül dəstələri düzülmüşdü. Divara bir neçə məşhur artistin portreti, Qulunun yüz cür çəkilmiş fotoşəkilləri vurulmuşdu. Şəkillərin birində Ağabəyim stulda əyləşmiş, Qulu təşəxxüslə onun yanında dayanmışdı.

Yuxarı tərəfdəki bir portretə gözüm sataşarkən diksindim. Bir an hər şey gözlərimdə sanki boz dumana büründü. Qorxmuş halda dönüb Quluya, sonra yenə şəkilə baxdım. Oradan gənc leytenant iri, qara gözlərini ciddi bir ifadə ilə üzümə zilləmişdi.

Qulu radioqəbuledicidə tutduğu ərəb mahnısına qulaq asırdı. Ağabəyim bacı içəri girdi:

– Ay Qulu, bəs, niyə durub Muradgili çağırmırsan?

Mən qayğısız bir görünüş alaraq, qarşı divara vurulmuş xalıya baxdım.

– Səhər demişəm ki, nahara bizə qonaqsınız.

– Dur get yenə de!

Qulu dərhal qapıdan çıxdı.

– Səadət yadından çıxmasın, – deyə Ağabəyim bacı onun ardınca qışqırdı.

Sonra mənə sarı dönərək mənalı bir əda ilə:

– Gərək ki, – dedi, – sən Muradı tanıyırsan.

– Bəli, bir az tanıyıram.

– Arvadını necə?

– Xeyr, onu görməmişəm.

– Gələr, görərsən.

Ağabəyim bacı son sözləri deyəndə, nə üçünsə, köksünü ötürdü. Stolun üstünə çəngəl-bıçaq düzərkən dedi:

– Sənin yerinə olsam, o Nazxanımı qulluqdan çıxarıb qovaram.

– Nə üçün?

– Lotunun biridir. Axşamacan peşəsi çırtıq vurub oynamaqdır.

– Nə olar, zarafatcıl gəlindir.

O mənə soyuq və diqqətli bir nəzər saldı:

– Şəhər yerinə ağlın getməsin, buralarda arvad arvaddır, kişi kişi.

Lakin mən daha mübahisəni davam etdirmək iqtidarında deyildim. İndi gözlərim Ağabəyim bacıya baxsa da, bütün diqqətim, fikrim bayırda idi. Nəhayət, Qulu qayıdaraq:

– Bu saat gəlirlər, – dedi.

Ağabəyim bacı yenə də xüsusi ifadə ilə soruşdu:

– Bildilərmi qonağımız kimdir?

– Yox, demədim.

Qulu tez-tez gah mənə, gah da Ağabəyim bacıya baxdı. Sonra məndən oğrun arvadına nə isə him elədi. Ağabəyim bacı demək istədiyi sözü udaraq bayıra çıxdı.

Qulu mənə müraciətlə: .

– Bilirsinizmi, – dedi, – Murad mənim dostumdur. Bir-birimizin söhbətinə xoşumuz var. Özümüz də qonşuyuq.

Ayrı vaxt olsaydı, bu izahat mənə qəribə görünməzdi, lakin indi ürəyimə toxundu. Əvvəlcə Murad özü gəldi. Məni görərkən bir an duruxdu. Sonra zarafatyana:

– Salam, Nuriyyə xanım, – dedi. – Siz də bizim kəndə gəlib çıxarmışsınız?! Mən bilirdim ki, Güney qışlaqda sizin birinci dostunuz Qulu Kəhrizli olacaq...

Qulu fərəhlə əlini altdan yuxarı saçına çəkərək:

– Eh, – dedi, – zər qədrini zərgər bilər.

– Elədir, – deyə Murad eyni şən əda ilə stul çəkib oturdu.

Nəhayət, mən də özümü ələ aldım:

– Zərgərə söz yoxdur, ancaq zər...

Qulu təntənəli bir görünüş alaraq, şəhadət barmağını yuxarı qaldırdı:

– Zər zərdir, Nuriyyə xanım! İncəsənət xadimi istər böyük olsun, istər kiçik, ona hörmət borcumuzdur. Hər gün kəndə o qədər təlimatçı gəlib-gedir ki, axırda özümüz də dönüb oluruq təlimatçı. Onun üçün də sizin kimi bir incəsənət ustadını görəndə ürəyimiz təzələnir. Əşi, adam nə qədər protokol yazar, nə qədər akt yazar, nə qədər nitq deyər...

Murad təbəssümlə mənə baxdı.

– Eşitdiniz ki?

Ağabəyim bacı, əlində göy-göyərti, salat boşqabları, içəri girərək:

– Bəs, Səadət hanı? – deyə Muraddan soruşdu.

O, başını aşağı salıb astadan cavab verdi:

– Gəlmədi.
– Qulu, biz burada deyək-gülək, o da tək otursun evdə?
– İndi deyirsən neyləyim, Ağabəyim?
– Neyləyəcəksən? Get özün götür gəl.
– Bu saat, – deyə Qulu Kəhrizli dərhal ayağa qalxdı və qapıdan yel kimi çıxdı.
Murad hələ də qarşısına baxaraq susurdu. Mən gümrah bir ifadə ilə:
– Yəqin ki, Əlimərdan kişi də gələcək?
Başını qaldırıb üzümə baxdı:
– Adı nə yaxşı yadınızda qalıb.
Mən qəsdən söhbəti dəyişdim:
– Deyəsən, bu səhər Hümmət yoldaş Söyüdlü arxı bura qədər uzatmaq barədə danışırdı. Elə olsa, işiniz yaxşı keçər.
Onun gözləri yenə də ciddi və sərt ifadə aldı:
– Elə olsa, uzağı iki-üç ildən sonra bu kəndi tamam ayrı cür görərsiniz. Bizim camaat zirəkdir.
Aralığa gərgin sükut çökdü. Birdən o, azca mənə tərəf əyilərək:
– Nuriyyə, – dedi, (birinci dəfə idi ki, o mənə "Nuriyyə" deyə xitab edirdi), – söz verin ki, bir köməyə-zada ehtiyacınız olsa, mənə deyəcəksiniz. Yaxşımı?
– Yaxşı, – pıçıldadım.
Lakin bu səadətin ömrü yalnız bir an oldu. Mən sonralar da ona heç nə demədim. Mən nankor deyiləm. Lap uşaqlıqdan həmişə qismətimə düşən kiçik bir səadət qığılcımı da məni fərəhləndirib, xoşbəxt etmişdir. Hətta, bəzən mənə elə gəlmişdir ki, bu dünyada əsl səadət şimşəktək parlayıb qeyb olan anlardan ibarətdir.
O mənə nə isə demək istəyirdi. Lakin bu vaxt, əvvəlcə danışıq və ayaq səsləri eşidildi. Sonra balaca Əlimərdanın əlindən tutmuş Səadətlə Qulu içəri girdilər. Biz ikimiz də ayağa qalxdıq. Qulu: "Nuriyyə xanım, tanış olun" dedikdə, gənc qadın gözəl ala gözləri ilə mənə soyuq bir nəzər salıb, istər-istəməz, əlini uzatdı.
Mən onun əlini hərarətlə sıxdım:
– Tanış olduğumuza çox şadam, Səadət xanım, – deyə bir anda qəlbimin hansı guşəsindənsə qalxıb gələn riqqətlə gülümsədim.
Lakin o mənə cavab verməyərək, keçib ərinin yanında oturdu.
– Murad, sən evdən çıxan kimi Hümmət zəng elədi, dedi axşam mənimlə danışsın.

– Harada olacaq? – deyə Murad onun üzünə baxmadan mülayim səslə soruşdu.

– Dedi ya evdə, ya da idarədə olacağam.

Gənc ər-arvadın rəftarında qəribə bir hal var idi. Elə bil, onlar öz danışıqları ilə bir-birini incidəcəklərindən qorxurdular. Lakin bunun mənə nə dəxli vardı? Ailə həyatında min cür söz-söhbət ola bilər. Mən onlara baxmamağa cəhd edərək, çiçək kimi təmiz, qəşəng yay paltarı geyindirilmiş Əlimərdanı qucağıma aldım. Təbiətin qəribə qanunları var! Necə olur ki, bəzən uşaq öz ata-anasına bu qədər çox bənzəyir? Əlimərdanın nəinki iri qara gözləri, geniş ağ alnı, balaca qulaqları, hətta, xırdaca barmaqlarının uzunsov çəhrayı dırnaqları da eyni ilə atasınınkı idi. Ağzı da atasınınkıtək böyük idi. Mən balaca, qəşəng uşaqları çox sevirəm. Əlimərdanı sinəmə sıxıb o üzündən, bu üzündən bərk-bərk öpdüm və bu zaman bir sövq-təbii ilə gözucu Səadətə baxdım. Onun gözəl ala gözləri elə bir qəzəblə mənə zillənmişdi ki, sanki bu dəqiqə qışqırıb “uşağı burax!” deyə əmr edəcəkdi. Mən balaca Əlimərdanı yavaşca yerə qoydum.

Bu gözəl gəlinin mənə qarşı bu qədər acıqlı və kinli olmasının səbəbi nə idi? Mən ki, ona bir pislik eləməmişdim.

Əlimərdan hər dəfə mənə yaxınlaşmaq istəyəndə, o, dərhal bir bəhanə ilə uşağı geri çağırırdı. Mən isə, onun bu hərəkətlərini görməməzliyə vururdum. Mən təbiətən kinli adam deyiləm. Mən bu dəniz kimi dərin gözlərin sahibində, bu cür gözəl oğlu, əri olan ananın qəlbində özümə qarşı hər an duyub-hiss etdiyim anlaşılmaz nifrətə çətinliklə dözürdüm. Lakin, bununla belə, mən onu sancmaq fikrinə düşmürdüm. Mən belə xoşbəxt, gözəl bir qadının nifrətinə səbəb olduğum üçün özümü alçalmış hiss edirdim.

Murad isə, aramsız danışıb-gülür, Qulu və Ağabəyim bacı ilə zarafat edir, tez-tez məni söhbətə tuturdu. Belə dəqiqələrdə gözəl ala gözlər qəzəb qığılcımları saçdığından, mən çox pis vəziyyətdə qalırdım. Hər dəfə Murad mənə müraciət edəndə biganə görünüş almağa çalışırdım. Lakin hiss edirdim ki, bu çox süni və gülməli çıxır (görünür, o qədər də yaxşı artist ola bilməyəcəyəm). Murad mənə baxan kimi hər şey – Səadətin qəzəb və nifrəti də, mənim öz sevgimə həmişəlik vida etdiyim də dərhal yadımdan çıxır və mən sonsuz bir xoşbəxtlik içində gülümsəyirdim.

Sonra nəzərlərim gənc qadının kinli baxışları ilə qarşılaşır və mən dərin bir peşmançılıq içində gözlərimi yerə dikirdim.

Qulu bizim üçün kabab bişirib gətirir və arabir də macal tapıb Muradla çəhrayı "Novruzlu" şərabı içirdi. Lakin mən onların içməsini istəmirdim. Çünki içdikcə Muradın şənliyi yox olub gedir, üzü tutqunlaşırdı. Qulu isə, əksinə, çox şən və xoşbəxt idi. Ağabəyim bacı ayaq üstə hərlənir, tez-tez bir qədər gülməli görünən oğrun nəzərlərlə mənə və Səadətə baxırdı.

Birdən Qulu vəcdə gələrək əlini üzünə qoyub rast oxumağa başladı. Səsi olmasa da, avazı ürəyəyatan idi. Yeri gəlmişkən deyim ki, bu yerlərdə hamıda musiqiyə dərin maraq vardı. Mənim təsadüf etdiyim kişilərin əksəriyyəti muğamata bələd idi. Qulu oxumağa başlayan kimi Ağabəyim bacı gəlib stulda oturaraq gözlərini yerə dikdi. Mən çox tutqun idim. Lakin Ağabəyim bacının kök, qırmızı çöhrəsi indi elə məzəli bir yazıqlıq ifadə edirdi ki, bilaixtiyar gülümsəyərək Səadətə baxdım. Doğrudanmı, Qulunun oxuduğu "Rast"ı bu qədər təsirli idi? Gözəl ala gözlər indi fırtınası sovuşmuş dəniz kimi sakit və mehriban görünürdü.

Yeməkdən sonra çıxıb eyvanda oturduq. Qulu özü bizim üçün çay dəmlədi. Görünür, belə incə şeyləri Ağabəyim bacıya etibar eləmirdi. Səadət çaya qalmayaraq, Əlimərdanı da götürüb getdi və gedərkən mənimlə xudahafizləşmədi. Murad əsəbi hərəkətlə papiros çıxarıb yandırdı. Lakin mən Səadətdən inciməmişdim. Güman edirdim ki, burada, nə isə, bir anlaşılmazlıq var. Aşağılar hələ gün idi, lakin Quzey qışlağın üzərinə xoş bir sərinlik enmişdi. Yaxın evlərin həyətlərində işdən qayıtmış arvadlardan kimi sac asıb çörək bişirir, kimi hisdən qaralmış mis qazanın böyründə oturub soğan doğrayır, kimi də samovara od salırdı. Naxırdan qayıdan inəklər ağır yerişlə kəndə girir, bəzən küçədə dayanıb boyunlarını uzadaraq, çoxdan qurumuş çəpərlərin dibini qoxlayırdılar. Görünür, kövşəndən o qədər də tox qayıtmamışdılar.

– Bunlar xüsusi heyvanlardır? – deyə kolxoz sədrindən soruşdum.

– Bəli. Fermanın heyvanları yaylaqdadır.

– Yəqin ki, onlar belə arıq olmazlar.

– Hamısı birdir. Yaylaqdan qayıdandan sonra yenə arıqlayıb belə olacaqlar. Suyumuz yoxdur. Ona görə də, yem düzəldə bilmirik. Həmişə yaz əkinçi, qış dilənçi oluruq.

Murad papirosundan dərin bir qullab vurub nə isə demək istədi, lakin bu zaman balaca bir qız gəlib, onu evdə çağırdıqlarını söylədi. Murad çağıranın kim olduğunu soruşmadı və qıza cavab verməyərək:

– Nuriyyə xanım, – dedi, – sizin kitabxanada Miçurinin külliyyatı yoxdur?

– Xeyr, yoxdur. Oxumaq istəyirdiniz?

– Bəli. Buraxılış imtahanlarına hazırlaşmalıyam.

– Məgər, siz bir yerdə oxuyursunuz?

– Kişi bu il Kənd Təsərrüfatı İnstitutunu bitirir, – deyə Qulu onun əvəzindən cavab verdi.

Sonra da təəssüflə başını bulayaraq əlavə etdi:

– O zaman mən də Muradla birlikdə qiyabiyə girmək istəyirdim. Ancaq iş elə gətirdi ki...

– Nə olub, ay Qulu, – deyə Ağabəyim bacı sözləri uzada-uzada ərinə təsəlli verdi. – Bir tikə çörəyin var, yeyirsən.

– Eh, sən də... Bu saat çörək dərdi çəkən kimdir...

Qulu birdən şəhadət barmağını yuxarı qaldırıb şax tutdu:

– Elm lazımdır, Ağabəyim, elm!

– Qulu, özünü niyə ucuz tutursan? Bura bax görüm, əgər, elmin yoxdursa, bəs, o boyda kolxozun haqq-hesabını nə cür saxlayırsan?

– Eh, yaxşı deyiblər ki, uşaq atasından güclü adam bilməz.

– Qulu, uşaq nə oldu? – deyə Ağabəyim bacı bir qədər sərt səslə soruşdu.

Qulu ehtiyat eləyən kimi oldu:

– Heç nə, sözdür danışırıq də.

Murad xəfifcə gülümsəyib, Quluya işarə ilə mənə göz vurdu və papiros qutusunu götürüb cibinə qoyaraq ayağa qalxdı. Qaşlarını çatıb hələ işıq olan uzaq üfüqlərə baxdı. Sonra mənə ani və mükəddər bir nəzər salaraq:

– Hələlik, sağ olun, – deyib pilləkəni düşdü.

Həyət qapısından çıxana qədər gözlərimi onun enli kürəyindən çəkmədim. Bu dünyada hər səadətin, hər xoş dəqiqənin bir sonu vardır. Bayaq aləmi gur işığa qərq edən günəş artıq batmamışdırmı?

Mən mühasibə tərəf çöndüm:

– Ay Qulu qardaş, siz əməllicə oxuyurmuşsunuz.

Ağabəyim etiraz elədi:

– Sən Allah, tərifləmə. Sonra Qulunun qabağında durmaq olmaz.

Qulu güldü:

– Nuriyyə xanım, musiqi ruhun qidasıdır.

Ağabəyim bacı başını yana əyib məzəmmətlə ərinə baxdı:

– Qulu, yenə başladın? Elə danış, camaat başa düşsün nə deyirsən!
– Yəni, deyirəm bu dünya musiqisiz nəyə lazımdır? Ağabəyim, sən mənim canım, belədir, ya yox?
Ağabəyim bacı "ah" çəkərək başı ilə təsdiq etdi.
Gecə Qulu "mən bir Murada dəyim" deyib getdi. Mən, Ağabəyim bacıyla tək qaldıqda, söhbəti hərləyib Səadətin üstünə gətirərək, onun gözəlliyini ürəkdən təriflədim. Ağabəyim bacı əvvəl dinmədi. Sonra:
– Bilirsən, bacı, – deyə sözləri uzada-uzada cavab verdi. – Gözəl olmağına gözəldir. Ancaq di gəl ki, yazıq oğlanın gününü göy əsgiyə düyüb.
– Niyə axı?
O, başını irəli uzadaraq pıçıldadı:
– Qəlbiqaradır.
– Necə bəyəm?
– Necəsi yoxdur ki. Kişinin ayağı dəyən yerdən də qısqanır. Bir dəqiqə gözündən uzaq qoymaq istəmir. Deyirəm, ay bacı, neçə il elm oxumusan, Bakıda ali məktəb qurtarmısan. Uşaqlara ingilis dərsi deyirsən. Niyə kişini qoymursan işini-gücünü görsün?
– Ağabəyim bir neçə saniyə susub, nə isə, tərəddüd etdi. Sonra səsini alçaldaraq soruşdu:
– Bayaq onun hərəkətlərinə fikir verdin?
– Deyəsən, indi nəyə görə isə bir az acıqlı idi.
– Sənə bir söz deyəcəyəm, ancaq sən əzizləriyin canı burada qalsın.
– Arxayın ola bilərsən.
– Sənin əlindən zəncir çeynəyir. Bilsəydi bizdəsən, nə özü gələrdi, nə də Muradı qoyardı gəlsin.
– Axı, mən ona neyləmişəm?
– Heç nə. O İmi ilə Cimi belləri qırılmış, bunu rayonda görüb, xəbər veriblər ki, Murad səni gecə motosikllə kəndə gətirib. İndi odu-budu halı özüylə deyil. Deyirəm, ay evi tikilmişin qızı, bəs, o necə kişi olardı ki, gecə vaxtı zənən xeylağını düzün ortasında qoyub gedəydi?
– Bəs, nə cavab verir? – deyə mən maraqla soruşdum.
– Cavabı o olur ki, "düz deyirsən, Ağabəyim". Ancaq beş dəqiqədən sonra yenə həmən sudur, həmən dibək. Neçə dəfə Qulu yazıq, bax, bu evdə and içib, aman eyləyib ki, ay Səadət, o, sən düşünən adamlardan deyil. Ancaq kimə deyirsən? Onun hərəkətlərinə Muraddır ki, dözür. Yoxsa, ayrı adam bir gün də tab gətirməzdi.

Mən daha Ağabəyim bacını dinləmirdim. Mən öz halıma da yanmırdım. Vaxt gələr, Səadət şübhələrinin əbəs olduğunu anlar. Məni düşündürən Muradın həyatı idi. O həyat mənim üçün bu dünyada hər şeydən əziz idi. Mən o həyatın səadəti üçün özümü qurban verirdim. Buna görə də, onu indi xoşbəxt görməməyim məni yandırırdı. Mən Güney qışlağa gələn gündən Muradın, nə isə, gizli bir dərdi olduğunu hiss eləmişdim. Halbuki o ən böyük səadətə layiq idi. O mənə heç bir pislik etməmişdi. Məgər, bu dünyada hamı öz arzusuna çatır?

"Doğrudanmı, o xoşbəxt deyil?" deyə mən yüz dəfə fikrimdən keçirirdim. Eyni zamanda, hiss edirdim ki, onun mənə qarşı bu qədər haqsız kin bəsləyən gözəl xanımı ilə xoşbəxt olmaması qəlbimin uzaq dərinliklərində məni sevindirir, mənə ümid verir. Lakin bu nə dəhşətli hissdir? Bu nə dəhşətli ümiddir? Birdən sanki mən pis, biabırçı bir yuxudan diksinib oyandım. Öz-özümdən utanaraq, əllərimlə üzümü qapadım. Ağabəyim dedi:.

– Bacı, bacı, sən Allah, ürəyinə salma. Biz çörəyi burnumuza-qulağımıza yemirik ha. Görmürük sən nə cür adamsan? Düzü, heç Səadət özü də pis gəlin deyil. Ancaq di gəl ki, o xasiyyət yazığı bədbəxt eləyib qoyub ora.

O gecə mən Nazxanımdan yüz manat borc alıb geri qayıtmaq haqqında düşündüm. Lakin hara qayıdacaqdım? Geriyə yol yox idi. Yoxsa, əzablardan qorxurdum? Mən qorxaqlara nifrət edirəm. Mən heç bir zaman öz taleyimdən şikayət etməmişdim. Qorxaqlıq isə, bədbəxtlikdir.

Səhər tezdən Almurad gəlib Qulu ilə məni apardı. Biz həyətdən çıxarkən, bir qədər aralıda qırmızı taxtapuşlu ikimərtəbəli evin pəncərəsi qarşısında ucaboy, başıaçıq bir adamın dayanıb papiros çəkdiyini görəndə, dərhal gözümü çəkdim. Maşın sürətini artırıb tezliklə Quzey qışlaqdan çıxdı.

Nazxanım məni toy-bayramla qarşıladı:

– Həmişə gəzməkdə, qonaqlıqda!.. Ağabəyimin kefi necədir? Düzünü de, məndən qeybət elədi?

– Nə üçün qeybət eləsin ki?

– Məni görməyə gözü yoxdur, elə bilir Quluya aşiq olmuşam.

Başını dala ataraq, şaqqıldayıb güldü. Sonra biləklərini çirməyib, tamaşa zalını yuyub çiçək kimi tərtəmiz elədi. Stulların tozunu sildi. Axırda da qollarını qaldırıb səhnədə süzə-süzə oxudu:

Qulu, Qulu, ay Qulu,
Başına bir daş, Qulu.
Sən mənimsən, mən sənin,
Neynirsən pulu-mulu.

– Yaxşı, – dedim, – kitabxananı düzəltdik. Səhnəni rahatladıq. "Arşın mal alan"dakı Əsgər demişkən, bundan nə çıxsın? Nə vaxtacan özümüz çalıb, özümüz oxuyacağıq?

– Yəni, deyirsən neyləyək?

– Deyirəm bir camaatın da qabağına çıxaq.

– Nə cür çıxaq?

– Yaxşı bir konsert düzəldək.

– Biz ha?

– Bəli, biz.

– Yəni, nə cür düzəldək?

– Mən piano çalaram, Səriyyə oxuyar.

– Bəs, mən neyləyərəm?

– Sən də elə indicə göstərdiklərini təkrar edərsən.

O şaqqıldayıb gülərək:

– Onda gərək, – dedi, – mənə kişi də tapasan. Səhnədə bir sevgilim olsun, ya yox?

– Sevgilin – Qulu!

– Oy, necə ürəyimdən xəbər verdin, – deyə o, qaşlarını yuxarı dartıb, gözlərini yarı qapayaraq, qəşəng, dolu bədənini əsdirdi.

– Canınacan, Nazxanım, – deyə Səriyyə güldü. – Nabələd adam deyər, bəs, doğrudan da, Qulunun dərdindən ölür.

O günü axşam Nəriman əmigildə Quludan xahiş elədim ki, sabah vaxtı olsa, zəhmət çəkib mədəniyyət evinə gəlsin. Onunla məsləhətləşmək istəyirəm. Ciddi bir görkəmlə əlini altdan yuxarı saçına çəkib:

– Nə zəhməti var, – dedi, – mədəniyyətə xidmət borcumuzdur. Düz on ikidə sizin qulluğunuzdayam.

O, düz vaxtında gəldi. Mən konsert barədəki fikrimi ona dedim. Balaca qara bəbəkləri gah mənim, gah da Nazxanımla Səriyyənin üzündə gəzib, nəhayət, bir nöqtədə qərar tapdıqda o, qəfil şəhadət barmağını yuxarı qaldırdı:

– Lap əla fikirdir!

– Ancaq gərək sən özün də iştirak edəsən. (Mən qeyri-şüuri olaraq, artıq ona "sən" deyə xitab edirdim.)

– Məsələn, nə cür?

– Məsələn. “Məşədi İbad”dan kiçik bir səhnə göstərəcəksən. Deyirlər, oynamısan.

– Rayon mərkəzində işləyəndə, həvəskarlarla birlikdə bir-iki dəfə oynamışam, – deyə Qulu cavab verib narahat bir ifadə ilə Nazxanıma baxdı.

Nazxanım şaqqıldayıb güldü. Elə bil, onun bu gülüşü ilə Quluya bir qətiyyət gəldi. Şəhadət barmağını yuxarı qaldıraraq:

– Oldu! – deyə təntənə ilə cavab verdi.

– Mən də pianoda sizi müşayiət edərəm, – deyə gülümsədim.

O, eyni ciddiyyətlə təkrar etdi:

– Oldu!

– Qulu, Qulu, saqqal da qoyacaqsan? – deyə Nazxanım ona sataşdı.

Lakin mən işi ciddi axına salmaq üçün işgüzar bir ifadə ilə:

– Hələlik saqqalsız da olar, – dedim.

Sonra Quluya müraciətlə soruşdum:

– Olmazmı ki, biz konsertimizdə Cimidən də istifadə eləyək? Axı, sən deyirdin onun yaxşı muğamat oxumağı var.

– Cimi? – Qulu sanki diksinərək təəccüblə üzümə baxdı.

Sonra nəzərlərini məndən çəkib məchul bir nöqtəyə dikərək bir neçə dəfə təkrar etdi:

– Cimi... İmi ilə Cimi.

Birdən qəti qərarla başını qaldıraraq cavab verdi:

– Oldu! İmi ilə Cimidən istifadə etmək mümkündür.

– İmidən də?

– Bəs, İmisiz Cimi olar? Cimi oxuyanda, gərək İmi də çalsın.

– Doğrudan? İmi bir şey çalır?

– Yaxşı tar çalır, – deyə Səriyyə cavab verdi.

Mən sevinclə səsləndim:

– Bu lap qiyamət oldu! Sizin gözəl yeriniz var! Hamı çalıb-oxumaq bilir.

Qulu qürurla əlini altdan yuxarı saçına çəkdi:

– Bəs, siz Qarabağı nə bilmisiniz! Hər kolun dibindən bir Məcnun çıxar. Bu saat mən İmi ilə Cimini tapdırım.

Heç vaxt qoltuğundan düşməyən portfelini böyrünə qısıb qapıdan çıxdı... Və iyirmi-iyirmi beş dəqiqədən sonra İmi və Cimi ilə birlikdə geri qayıtdı. Havanın isti olmasına baxmayaraq, onların hər ikisi bənö-

vüş rəngli yun kostyum geymiş, eyni rəngdə qalstuk bağlamışdı. Qulu onlara:

– Yaxşı bir təşəbbüs var, – dedi, – ancaq heyf ki, bu dəfə sizinki deyil.

İmi özünü tox tutaraq:

– Qulu, – dedi, – xahiş edirik, bu kinayələri bir kənara qoyasan.

Mən mümkün qədər xoş və mülayim bir ahənglə birbaş mətləbə keçdim:

– Biz istəyirik ki, sizinlə birlikdə balaca bir konsert düzəldək.

Cimi İminin üzünə baxdı, İmi Ciminin. Nəhayət, Cimi hər ikisinin fikrini ifadə etdi:

– Nə olar, biz sizin qulluğunuzda hazır.

Mən onların nəyi yaxşı çalıb-oxuduqlarını dolayı yollarla öyrənəndən sonra hamımız birlikdə oturub konsert üçün proqram düzəltdik:

1. "Segah" – tarda çalacaq İmi, oxuyacaq Cimi.
2. "Don-Kixot"dan balaca bir parça – danışacaq Nuriyyə xanım.
3. "Məşədi İbad" musiqili komediyasından kiçik səhnə – ifa edəcək Qulu Kəhrizli.
4. "Qarabağ maralı" – oxuyacaq Səriyyə, pianoda müşayiət edəcək Nuriyyə xanım.
5. "Oxuma, gözəl" – pianoda çalıb-oxuyacaq Nuriyyə xanım.
6. "Arazbarı" – çalacaq İmi, oxuyacaq Cimi.
7. "Kərəmi" – çalacaq İmi, oxuyacaq Cimi.

Hamımız çox həvəslə işə girişdiyimizdən, elə həmin gün axşamçağı yenə də mədəniyyət evinə yığışıb məşqə başladıq.

İmi, çəhrayı atlaz örtüyü açıb başdan-başa sədəfə tutulmuş tarını ehtiyatla çıxartdı. Ciminin də qavalının dövrəsinə sədəf düzülmüş, gümüşdən incə naxışlar vurulmuşdu.

İmi tarını kökləyib qurtarandan sonra özünü tox tutub "Segah" oxumağa başladı.

Bir neçə bənddən sonra sanki onun üzündəki saxta ciddiyyət niqabını çıxarıb atdılar. Sanki onun əsl siması indi zahir olub, təbii, səmimi duyğular ifadə etdi. O indi hər şeyi unutmuşdu. O indi canlı bir insan idi. Eyni qəribə təbəddülatı Ciminin də çöhrəsində görmək olardı. O, qavalına söykənərək, başını aşağı salıb dinləyirdi və dinlədikcə üzündəki daimi gərginlik yox olub gedir, baxışları bir az mükəddər və sa-

kit olurdu. Mənim haqqımda pis niyyətlə Səadətə xəbərçilik etmələrinə baxmayaraq, indi onlara qarşı özümdə bir ünsiyyət duyur, həmişə belə təbii görünmədiklərinə təəssüf edirdim.

Nəhayət, Cimi qavalı qulağına tutaraq, tələsmədən, təmkinlə oxumağa başladı. Səsi güclü və təravətli idi. Mən bu qədər təbii, bu qədər ürəkdən çalıb-oxuya bilən iki gənc oğlanın ora-bura qaçaraq, yalançı təşəbbüslərlə özlərini gözə dürtməyə çalışdıqlarına, söz gəzdirməklə məşğul olduqlarına təəccüb edirdim. İndi, hətta, Qulu özü də onlara mülayim nəzərlərlə baxırdı.

Biz iki gün məşq elədik. Bütün bu müddətdə Nazxanım qəribə bir əhvali-ruhiyyə keçirirdi. Gah ona yaraşmayan bir ciddiyyətlə oturub bizə qulaq asır, gah da böhranlı bir şənliklə qəhqəhə çəkib gülürdü. Səriyyə isə qayğılı görünürdü. İmi ilə Cimi konsertin hazırlığına candildən girişmişdilər, bütün günü mədəniyyət evindən getmirdilər. Qulu iki dəfə döşünü qabardıb, idarə heyəti adından (o, idarə heyətinin üzvü idi) onlara irad tutdu:

– Mədəniyyət evində işləyirsiniz, çox sağ olun. Amma, bu o demək deyil ki, kolxozun işini gərək yaddan çıxarasınız.

Bu zaman Ciminin üzü narahat ifadə alır, İmi isə, burnunun bir tərəfini çəkərək, kirpiklərini tez-tez qırpmağa başlayırdı. Mən açıq hiss edirdim ki, onların təsərrüfat işinə qətiyyən həvəsləri yoxdur. Məşq zamanlarında onlar dönüb tamam ayrı adam olurdular. Cimi, qastrola gəlmiş məşhur bir xanəndənin tarlada, iş üstündə oxuyarkən, “boğazının yumşalması” üçün kəndlilər baxa-baxa üç çiy yumurtanı necə bir əda ilə içdiyini, sonra yağışa düşüb, səsinin batacağından qorxaraq necə təlaş keçirdiyini, dağlara qalxmaq üçün at minərkən, qorxusundan cilovu buraxıb yəhərin qaşından necə yapışdığını, at balaca arxdan sıçrayarkən, xanəndənin necə əcaib səs çıxardığını və buna bənzər başqa əhvalatlar nağıl edərək, bizi o ki var, güldürürdü. Sən demə, İmi özü də yaman zarafatcıl oğlanmış (suyun lal axanı, adamın yerə baxanı). Tənəffüs zamanlarında ədəb dairəsindən çıxmayan (bu barədə o, həqiqətən ləyaqətli bir adam idi) çoxlu qaravəlli deyirdi.

Nəhayət, biz məşqi qurtarandan sonra İmi böyük bir afişa yazdı. Qulu təklif etdi ki, konsertin, teatr institutunu bitirmiş Nuriyyə xanımın rəhbərliyi altında düzəldildiyi afişada qeyd olunsun. Əlbəttə, mən bu yüksək hörmətə etiraz etmədim. İmi ilə Cimi afişanı aparıb mağazanın qabağına vurdular.

Səhər Səriyyə xəbər gətirdi ki, kəndə yaman küy düşüb. İşə gedən, işdən qayıdan adamlar dəstə-dəstə dayanıb, bizim afişanı oxuyurlar.

– Ancaq, – deyə Səriyyə sözünə davam etdi, – mən konsertdə iştirak edə bilməyəcəyəm.

– Nə üçün, yoxsa, anan izn vermir?

– Anam bir söz deməz.

– Bəs, onda nə mane olur?

O, başını aşağı salaraq, yavaş səslə cavab verdi:

– Çingizin anası razı deyil.

Axşamüstü mən bu əhvalatı Quluya söylədim. Biz bir qədər fikirləşəndən sonra Səriyyənin gələcək qayınanasının yanına getməyi qət etdik. Bu, ucaboylu, gözləri yaranışından sürməli bir qadın idi. Bizi hörmətlə qarşıladı. Eyvana xalça və döşək saldı.

Biz əyləşəndən sonra Qulu əvvəlcə onun oğlu Çingizi, ferma ilə yaylağa getmiş ərini soruşdu. Qadın hamısına "yaxşıdır, kağızı gəlir" – deyə qısa və ciddi cavablar verirdi. Nəhayət, mühasib əsl mətləbə keçərək, mənim böyük sənətkar olmağım, incəsənətin cəmiyyət üçün xeyri, səhnənin mədəniyyət aləmində birinci rol oynamağı barədə uzun və həyəcanlı bir nitq söylədikdən sonra Səriyyənin məsələsinə toxundu.

– Yox, Qulu! – deyə arvad amiranə ifadə ilə onun sözünü kəsdi. – Bizim uşağımız gedib artist ola bilməz.

– Əvvəla, artist olmayacaq. İkincisi, olanda nə olar?

– Elə şeyə Ağabəyim yaxşıdır.

Qulunu gülmək tutdu:

– Hi... hi... hi... Vicdansızdır yalan deyən, əgər, Ağabəyimin əlindən gəlsə, lap zorla sürüyüb salaram səhnəyə. Bəli, lap zorla! Ancaq neyləyim ki, istedadı yoxdur.

– Nəyi yoxdur?

– İstedad! Səhnə üçün istedad lazımdır, istedad! – Qulu coşaraq şəhadət barmağını yuxarı qaldırdı.

Arvad yenə də bir şey başa düşmədi.

– Uzun sözün qısası, Qulu, özünə zəhmət vermə, dedim, qurtardı.

Lakin, görünür, Qulu asanlıqla təslim olanlardan deyildi. O, dizi üstə qalxıb:

– Əşi, Nabat xala, – dedi, – heç bilirsənmi ki, səhnəyə pis baxmaq burjuaziya qalığıdır? Heç bilirsənmi ki, biz süni peyk qayırıb göyə buraxmışıq? Heç bilirsənmi ki, musiqi ruhun qidası, qəlbin nidasıdır? Heç bilirsənmi ki...

Nabat xala güclə sezilən bir təbəssümlə soruşdu:

– Qulu, evdə Ağabəyimlə də bu dildə danışırsan?

Qulu arvadın qaşqabağının açılmasından vəcdə gələrək davam etdi:

– Nabat xala. Sən ölmə, Qulu ölsün, bu dünyada incəsənətdən gözəl şey yoxdur. Əşi, bu saat şəhərlərdə çörəyi də musiqiylə yeyirlər. Sən də başlamısan belə-filan. Əgər, Çingiz, Səriyyənin konsertdə oxuduğunu eşidəndə sevinməsə, mənə nə deyirsən de, cavabdehəm! Bilirəm ki, Çnngiz heç bir söz deməz, Çingiz əsgərdir, əsgər!

Qulu şəhadət barmağını yuxarı qaldırdı. Onun bu son sözlərinin arvada sehrli təsiri oldu. Birdən-birə dəyişilən mehriban ifadə ilə:

– Ay Qulu, – dedi, – bilirəm ki, Çingiz heç nə deməz. Ancaq, düzü, qorxuram söz-həkət ola. Bir də görəcəksən İmi ilə Cimi kəndə küy vurublar ki, nişanlısı əsgərlikdə, özü durub “Segah” oxuyur.

– Bu ölsün, – deyə Qulu əlini şappıltı ilə üzünə vurdu, – heç kəs elə qələt eləməz. Bəyəm, əsgərlikdə olanın nişanlısı gərək oxumasın?

Arvad bir qədər fikirləşəndən sonra sürməli gözlərini yerə dikərək, dərindən nəfəs aldı:

– Yaxşı, ta gəlmisiniz, nə deyim...

Qulu təntənə ilə mənə baxaraq, əlini altdan yuxarı saçına çəkdi.

...Konsert axşamı mədəniyyət evinin qapısına bizim gözlədiyimizdən çox adam yığışmışdı. Burada sarı, qırmızı, çəhrayı parçadan əlvan paltar geymiş qız-gəlindən tutmuş demi çəkən yaşlı kişilərə qədər hamı var idi. Cavan oğlanlar xüsusilə yaraşıqlı idilər. Əksəriyyəti nazik xromdan uzunboğaz çəkmə geyib, belinə enli toqqa çəkmişdi. Bəzilərinin beli o qədər nazik idi ki, üzükdən keçərdi. Nazxanım daha bu sözdən deyildi. Qırmızı qanovuz koftası adamların içində lalətək qızarır, ağ tuman qamətinə yaraşırdı. Tellərinə sığal verib ətir saça-saça tovuz kimi gah orada, gah burada görünür, qaşlarını dartıb oğlanlara təşəxxüs satırdı.

Mən də qolları dirsəkdən yuxarıya qədər açıq, nazik qara paltarımı geyib, saçlarımı son dəbdə darayıb düzəltmişdim.

– Nuriyyə bacı, bu paltar sizə elə yaraşır ki, – deyə Səriyyə məni qucaqlayıb öpdü.

Biz artistlər (biz özümüzü artist kimi hiss edirdik) zarafatla qrim otağı adlandırdığımız balaca otağa yığışıb, düz səkkizdə zəngi vurduq.

Camaat gurultu ilə zala dolub bərkdən danışa-danışa, bir-biri ilə zarafat eləyə-eləyə əyləşdi.

Üçüncü zəngdən sonra Nazxanım pərdəni açdı. Mən cəld və gümrah addımlarla səhnəyə çıxdım, lap qabağa yeriyib:

– Axşamınız xeyir! – deyə gülümsədim.

– Axşamın xeyir, aqibətin xeyir, – deyə oradan-buradan səsləndilər.

Hamı sakit olandan sonra sözə başlayıb, əvvəlcə mədəniyyət evindəki kitabxanadan danışdım. Bundan sonra hər cür qəzet və jurnallar alacağımızı, kitabxananın hər gün səhər saat doqquzdan on ikiyə, axşamlar da beşdən doqquza qədər açıq olacağını bildirdim.

– "Kirpi" də alacaqsınızmı?

– Aldılar nə olsun, ha eləyib bura gəlib çıxanacan az qalır dəvənin quyruğu yerə dəysin.

– Pirverdi şəhərə qənd-çay almağa gedəndə poçt yadına düşür, – deyə qabaq cərgədə oturmuş bir cavan oğlan söz atdı.

Zalda gülüşmə qopdu. Arxa tərəfdən qısaboy, enlikürək bir kişi ayağa qalxaraq:

– Ə, Kərəm, – deyə qabaqda oturmuş oğlana müraciət etdi. – Sən havaxtacan cüvəllağı olacaqsan? Bildiyini də deyirsən, bilmədiyini də. Pirverdi hər gün durub pay-piyada qırx kilometr yolu rayona ayaq döysün?

– Ə, heç olmasa, üç-dörd gündən birə sözün nədir?

– Evin tikilsin, Pirverdi.

– Sən ölməyəsən, gödək bizi biləyinə doluyub.

– Müftə gün almağa öyrənib.

Səslər bir-birinə qarışdıqda lap qabaqda, Qərənfil bacı ilə yanaşı oturmuş Nəriman əmi ayağa qalxıb, üzünü gənclər oturan tərəfə tutdu:

– Ə, adam uşağısınız, mədəniyyətiniz olsun! Nə qarğalı bazar salmısınız?

– Əşi, düz deyirlər, dayna, – yan tərəfdən bir cavan oğlan dilləndi.

– Sakit! – Sədr komandir kimi əmr etdi və acıqlı nəzərlərlə bir neçə saniyə zalı süzdü.

Sonra poçtalyona tərəf döndü:

– Ə, Pirverdi, sənə bir motosklet alıb vermək mənim boynuma. Əgər, fərasətin var, sürməyi öyrən.

– Niyə öyrənmirəm, onu sürməyə nə var...
– İşi düzəlib deyin, bığı gülür.
– Sən ölməyəsən, gödəyin bəxti var.
Nəriman əmi üzünü mənə tutaraq:
– Sən bunlara fikir vermə, – dedi, – sözünü danış.
Mən qətiyyən pərt olmamışdım, özümü tanış-bilişlərim arasında hiss edirdim. Bütün bu zarafatlar, bu atmacalar mənə yaxın və səmimi görünürdü.
– Biz istəyirik, – deyə sözümə davam etdim, – siz hər gün, boş vaxtlarınızda mədəniyyət evinə gələsiniz...
Poçtalyon Pirverdi ayağa qalxdı:
– Gəlməyinə gələrik, ancaq bizim bir balaca var, tar istəyib, almışam. Di gəl ki, öyrədən yoxdur. Özünün də həvəsi bu sözdən deyil...
– Bir eləsi də bizdə var, – bayaq poçtalyona sataşan Kərəm adlı oğlan yerindən dilləndi. – Evə gələn kimi, tarı götürüb kəsdirir radionun böyrünü.
Mən cavab verməkdə çətinlik çəkirdim. Çünki mədəniyyət evinin nə tar müəllimi var idi, nə də onu dəvət etmək üçün vəsaiti.
– Elə axtarsan, kənd uşağının hamısı çalğıya həvəslidir. Ancaq...
– Biz bu barədə məsləhətləşib öz fikrimizi artelin idarə heyətinə söyləyərik, – dedim. – İndi isə, icazənizlə konsertimizə başlayaq. Necə deyərlər, yolçu yolda gərək. “Segah”, oxuyacaq Cimi, çalacaq İmi.
Zalda bir tərpəniş əmələ gəldi. Bizim ilk artistlərimiz səhnəyə çıxdılar, camaata baş əyib, yanaşı stullarda əyləşdilər. Cavanların cərgəsindən kim isə nəsə pıqqıldadı. Bir başqası ona acıqlandı:
– Ə, adamsan, qoy görək nə deyirlər.
Nəhayət, Cimi tarın müşayiətilə oxumağa başladı.
Mən səhnənin arxasında divara söykənib qulaq asırdım. Gəncliyimin lap ilk çağlarından məndə “Segah”a anlaşılmaz bir bağlılıq var idi. Mənə elə gəlirdi ki, bu muğam, nə isə, qəmli bir hekayə nəql edir. Lakin əvvəllər mən bu hekayətin nədən ibarət olduğunu, “Segah”ın nə söylədiyini anlaya bilməzdim. Mən yalnız axşam qəribliyinə və ya nəyin isə iztirabları ilə pərişan olan bir qızın kədərinə bənzər duyğular hiss edərdim. Lakin o gənc leytenant görüş vəd edib gəlməyəndən sonra hər dəfə “Segah”ı dinləyərkən, qəlbimdə tamamilə yeni bir aləm yaranırdı və mən bu aləmdə yalnız müztərib insan məhəbbətinin böyük taleyini görürdüm. Sanki Leyli bu “Segah”ın dili ilə İbn Salam-

dan xahiş edirdi ki, ona arvad olmaq üçün Məcnunun eşqini unudana qədər möhlət versin.

İndi mən də yalnız o xoşbəxt gecədə mənə görüş vəd edərək gedən, bir də qayıtmayan o gənc leytenant haqqında düşünürdüm.

Mən ilk məhəbbətinin səadətini itirmiş, dərdini kimsə bilməmiş gənc bir qız idim.

– Sağ ol, ə, Cimi!

– Ölmüyəsən, ədə!

Zaldan eşidilən səslər mənə yuxu kimi gəlirdi.

Daha sonra Səadətin mənə qarşı olan haqsız qəzəbi haqqında düşünürdüm. Haqsızlıq həmişə adamı yandırır. Haqsızlıq yamandır... Lakin "Segah" itirilmiş ilk məhəbbətin ələm və hicranından danışırdı... Kama yetməyən ehtirasın üsyanı isə, bu kədərin qarşısında gücsüz idi.

Birdən zalda gurlayan alqış səslərindən diksindim, özümü toplayıb səhnəyə yüyürdüm. İmi ilə Cimi əsl estrada artistləri kimi baş əyib getdilər.

– Sən ölmüyəsən, Ciminin ömründə belə oxuduğu olmamışdı.

– İnsafən, yaxşı oxudu.

– Axırını qiyamət götürdü.

Nəhayət, aralıq sakit olanda, mən gülümsədim (rəfiqələrim deyirdilər ki, mənim təbəssümlərim həmişə şən və cazibədar olur. Bunun isə, səhnə üçün çox əhəmiyyəti var), sözə başlayıb "Don Kixot" haqqında qısaca məlumat verdim. Sonra Sanço Pansanın hakim təyin olunduğu səhnəni ixtisarla nağıl etməyə başladım. Həkimlərin Sançonun başına necə kələk açıb, onu ac qoyduqlarını təsvir etdikdə, zaldakılar gözləri yaşarıncaya qədər güldülər. Biz azərbaycanlılarda yumora güclü meyl vardır. Qarabağlılarda isə, bu meyl xüsusilə güclüdür. Onların heç bir məclisi qaravəllisiz, gülüşsüz, zarafatsız keçməz.

Mən hekayəni qurtarandan sonra həmin Kərəm adlı oğlan ayağa qalxıb soruşdu:

– Bağışlayın, dediniz o kitabın adı nədir?

– "Don Kixot"dur. Əgər oxumaq istəsəniz, kitabxanamızda var.

– Sən ölmüyəsən, gərək alıb oxuyam, ləzzətli şeydir, – deyə Kərəm gülə-gülə yanındakı yoldaşına müraciət etdi.

– Evin yıxılmasın, Sanço – deyə qabaq cərgədə Nəriman əmi ilə yanaşı oturmuş şofer Almurad geri qanrıldı. – Yamanca padşah olmuşdu.

Mən davam etdim:

– İndisə kəndimizin gənc qızlarından Səriyyə "Qarabağ maralı" oxuyacaq.

Zala dərhal sükut çökdü. Üzlər ciddi ifadə aldı. Mən geri qayıdıb, səhnənin arxasında dayanmış qızın qolundan tutaraq qabağa gətirdim. Özüm isə, pianonun arxasına keçdim.

Qız əvvəlcə tutulurdu. Sonra mahnının ahənginə uyaraq sanki səhnəni unutdu.

Mən tez-tez başımı qaldırıb ona baxırdım. Gözlərini zalın üzərindən məchul bir nöqtəyə zilləyib oxuyurdu. İndi, elə bil, qız tərənnüm etdiyi o gözəl Qarabağ yaylaqlarında gəzib-dolaşır, yosunlu qayalardan çıxaraq gömgöy yarpızların arası ilə axan Qırxqız bulağının gün işığını brilyant kimi əks etdirdiyini görüb-duyurdu.

Qəlbim fərəh və riqqət içindəykən, iki adamın səssizcə zala daxil olub arxa cərgədə əyləşdiyini gördüm. Mən onların üzünü aydın seçməsəm də, kim olduqlarını tanıdım. Ürəyim şiddətlə döyündü, nəfəsimi dərmək üçün bir an əl saxladım. Lakin həyatda bizim birinci borcumuz öz vəzifəmizi yerinə yetirməkdir.

Səriyyəni hərarətlə alqışladılar. Qız utanaraq çevrilib qaçdı. Mən təbəssümlə zala baxır və tamaşaçılarla birlikdə əl vururdum. Lakin Səriyyə bir daha səhnəyə çıxmadı. Mən Qulu Kəhrizlinin "Məşədi İbad" musiqili komediyasından bir səhnə göstərəcəyini elan edərək, təkrar pianonun arxasına keçdim. Bayaqkı iki nəfərin gəlişi məndə səbəbini dərk etmədiyim ruh yüksəkliyi doğurmuşdu. Bu, əslində insana vicdan əzabı verən bir sevinc idi. Məgər, onlar burada yox ikən, iki yüzdən artıq adam bizə tamaşa etmirdimi?

Qabaqcadan sözləşdiyimiz kimi, mən çalmağa başlayanda, Qulu əynində qədim arxalıq-çuxa, ayaqlarında başmaq, başında qara dəri papaq, belində enli qurşaq, bir əlində uzun demi olduğu halda, "Mən nə qədər, nə qədər qoca olsam da, dəyərəm min cavana" deyə-deyə, çırtıq vura-vura səhnəyə girdi.

Zalda gülüşmə qopdu.

– Sən ölmüyəsən, rəhmətlik babası çərçi Xanəlinin paltarıdır geyib.

– Ə, bu lap yekə artistmiş.

Lakin Qulu bu atmacaların heç birinə fikir vermədən belini azca əyərək elə məzəli oynayırdı ki, hamı gülməkdən qəşş edirdi. Hərəkətləri duzlu və təbii idi. Ahəngində xoş və canlı yumor var idi.

Nazxanım səhnənin yanına qısılaraq, dərin maraqla tamaşa edirdi (zaldakılar onu görmürdülər). Birdən vəziyyət elə gətirdi ki, Məşədi İbad "gəl, xanım, gəl yanıma... Mən ölüm, mən ölüm, gəl yanıma" sözlərini ona müraciətlə oxudu. Elə bil, Qulu bunu qəsdən edirdi. Nazxanım "bıy, başın batmasın..." deyərək uğunub getdi.

"Məşədi İbad" böyük müvəffəqiyyət qazandı. Ümumi səs-küyün içində Qulu ədəb-ərkanla baş əyib çıxdı. "Bir də, bir də" deyə cavanlar yerbəyerdən qışqırmağa başladılar. Şofer Almurad ayağa qalxıb, üzünü səhnənin arxasına tərəf tutaraq çığırdı:

– Ə, Qulu, özünü nə mazamata qoyursan?

"Məşədi İbad" təkrar səhnəyə qayıdıb bu dəfə ayrı bir parçanı ifa etdi. Nəhayət, qurtarıb gedəndən sonra:

– Yorulmamısınız ki? – deyə tamaşaçılardan soruşdum.

– Yox, yox, – deyə onlar yüz yerdən səsləndilər. Mən məzəli bir tərzdə qulaqlarımı əllərimlə bərk-bərk tutub, gözlərimi yumdum və dedim:

– Azərbaycan bəstəkarı Ağabacı Rzayevanın "Oxuma, gözəl" mahnısı. Oxuyacaq Nuriyyə, pianoda müşayiət edəcək Nuriyyə.

Əvvəllər dediyim kimi, mənim səsim o qədər güclü olmasa da, təsirli idi. Çalmağım da pis deyildi.

"Oxuma, gözəl, Gürcüstanın qəmli nəğmələrindən..."

Mən kimsədən çəkinmədən, tamamilə azad oxuyurdum. Çünki, indi nəsibi qəmli mahnılar olan o qızdan başqa kimsə haqqında düşünmürdüm. İndi hər şey, hər kəs məndən bir əbədiyyət qədər uzaq idi. Mən özüm üçün oxuyurdum. O qız mənim qəlbimdə idi. O qız mən özüm idim. Mən kimsədən şikayət etmədən, öz taleyimdən narazı olmadan oxuyurdum. Mən demək istəyirdim ki, həyatın əzəli və əbədi gözəllikləri, fərəh və səadəti içində pərişan bir qızın qəmli mahnısı eşidilirsə, bundan inciməyin. Çünki o, hamının və sizin xoşbəxtliyinizi istəyir.

Mən son akkordu vurub, ayağa qalxdıqda, gənclər qızğınlıqla əl vurur, yaşlı adamlarsa hörmətlə susurdular. Doğrusu, mən öz müvəffəqiyyətimdən ziyadə, yeni üslubda yazılmış bir mahnının belə xoşa gəldiyinə sevinirdim. Çünki bizim kənd camaatı, əsasən, aşıq havalarını və muğamatı sevir. Mən alqış sədaları altında gülümsəyir və baş

əyirdim. Mən yalnız bayaqkı iki nəfərin oturduğu tərəfə baxa bilmirdim...

Konsertdən sonra biz artistlər qrim otağına yığışıb bir-birimizi sevinclə təbrik edir, öz müvəffəqiyyətlərimizdən danışırdıq. Nazxanım "canınacan, Qulu" deyə-deyə tez-tez təkrar edirdi. Bu zaman Hümmət, Murad, Nəriman əmi və Qərənfil bacı içəri girdilər.

Rayon icraiyyə komitəsinin sədri:

– Hamınız qiyamət elədiniz. Çox sağ olun, – dedi.

Sonra mənim əlimi sıxaraq əlavə etdi:

– Nuriyyə xanım, bu sizin ilk, böyük müvəffəqiyyətinizdir. Elə bil, filarmoniyanın konserti idi. Siz özünüz nə yaxşı çalıb-oxuyurmuşsunuz!

Nəriman əmi də Ciminin bu dəfə "Segah"ı lap İslam kimi yanıqlı oxuduğunu söyləyirdi. Təkcə Murad susurdu. Bu ümumi şənlik içində mən onun nə cür nəfəs aldığını belə eşidirdim və ya mənə elə gəlirdi. Mən onun susmağından incimirdim. Əksinə, bu sükut üçün ürəyimdə ona təşəkkür edirdim. Mənə elə gəlirdi ki, o, bu dəqiqələrdə dinibdanışsa, mənə tərifli bir söz desə, dünyanın ən zalım, ən xudpəsənd adamı olardı. Bu sükut üçün, gözlərindəki bu lal kədər üçün mən ona min dəfə təşəkkür edirdim. Mən onun qarşısında sevincli göz yaşları tökmək, öz sonsuz minnətdarlığımı bildirmək istəyirdim.

Lakin mən heç nə etmirdim. Heç nə büruzə vermirdim. Mən rayon icraiyyə komitəsinin sədrinə xitabən ciddi, işgüzar ifadə ilə:

– Bizə bəzi vacib şeylər lazımdır, – deyirdim, – ancaq bilmirəm kolxoza müraciət edək, yoxsa, rayon təşkilatlarına?

– Məsələn, nə kimi şeylər lazımdır?

– Səhnə üçün bəzi kostyumlar, qrimlər, pariklər.

Hümmət güldü:

– Siz, deyəsən, işləri böyütmək fikrindəsiniz. Arteliniz dövlətlidir. Elə şeyləri özünüz də düzəldə bilərsiniz.

– Mən səndən incidim, bacıqızı, – deyə Nəriman əmi məzəmmətlə mənə baxdı. – Güney qışlaq kolxozuna nə olub ki, elə şeylər üçün başqalarına ağız açırsan? (Başqalarına sözünü xüsusi vurğu ilə dedi.)

– Eybi yoxdur, eybi yoxdur, – deyə Qulu dərhal söhbətə qarışdı. Nuriyyə xanım işə nabələddir. O, Güney qışlaq kolxozunu hələ yaxşı tanımır.

Nəriman əmi məğrur bir görkəm aldı:

– Hər nə lazımdır, siyahısını tut ver, qoyaq heyətə.

– Baş üstə, ancaq bizim ayrı dərdimiz də var. Bayaq zalda gileylənirlər ki, uşaqlarımız tar çalmağı öyrənmək istəyir, öyrədən tapmırıq.

Rayon icraiyyə komitəsinin sədri:

– Bu çox çətin məsələdir, Nuriyyə xanım, – dedi, – iki ildir çalışırlar, rayon mərkəzinə bir piano müəlliməsi gətirə bilmirlər. Musiqi məktəbini qurtaranlar şəhərdən kənara çıxmırlar.

– Heç olmasa, yerli qüvvələrdən istifadə etmək lazımdır, – dedim. – Məsələn, bizim İmi. Məncə, onun həvəsi olsa, uşaqlara tar öyrədə bilər.

Qulu tələsik təsdiq etdi:

– Özüm ölmüyüm ki, yaxşı sözdür. Onsuz da, səhərdən axşamacan kəndin ortasında Cimiynən boş-bekar hərlənirlər.

Ciminin üzü narahat bir ifadə aldı. İmi kirpiklərini tez-tez qırparaq, etiraz eləmək istədi. Mən zarafatyana:

– Görürəm, – dedim, – Qulu, arteldə bizim İmi və Cimi ilə düz sarımır. Ancaq biz onlarla mədəniyyət evində məmnuniyyətlə işləyərdik. İkisinin də gözəl qabiliyyəti var.

Qulu təəccüblə mənə baxdı:

– Yəni, deyirsiniz tamam keçsinlər mədəniyyət evinə?!

– Bəli.

– Yaxşı fikirdir. Özüm ölmüyüm, neyləyirsən elə, lap istəyirsən şəxsi tənqid olmasın, zor olsun, güc olsun, yenə də İmi ilə Cimidən təsərrüfata xeyir dəyən deyil. Çünki həvəsləri yoxdur. Xəmirləri ayrı cür yoğrulub.

Nəriman əmi Quluya elə təəccüblə baxırdı ki, guya, onu birinci dəfə görürdü.

Qərənfil bacı söhbətə qarışdı:

– Düz sözə nə demək? Həvəsləri yoxdur, işləmirlər.

Nəriman əmi bu dəfə başını aşağı saldı. İmi ilə Cimi haqqında deyilənləri ürəyində təsdiq etdiyi hiss olunurdu. Hümmət üzünü İmi ilə Cimiyə tutdu:

– Yaxşı, siz özünüz bu sözə nə deyirsiniz? Cimi üz-gözünü bürüşdürdü:

– Qulu vicdanla danışmır...

– Qətiyyən! – İmi dərhal dostunun sözünü təsdiq etdi. – Biz çox gözəl təşəbbüslər də qaldırmışıq, işləmişik də. Bunlar bir kənara.

Tutaq ki, keçdik büsbütün mədəniyyət evinin sərəncamına, bəs, bizə çörəyi kim verəcək?

Hümmət bu dəfə ciddiyyətlə dedi:

– Artelin ixtiyarı var ki, mədəniyyət evində işləməyinizə görə, sizə əməkgünü versin.

– Hərəmizə nə qədər?

– O baxır idarə heyətinin qərarına. Elə deyilmi, dayı?

Nəriman əmi kimsənin üzünə baxmadan:

– Bilmirəm, fikirləşərik, – deyə qeyri-müəyyən cavab verdi.

Hümmət bizi ruhlandırmaq istəyirmiş kimi:

– Nuriyyə xanım, – dedi, – siz çox gözəl bir kollektiv düzəltmisiniz. Nəriman dayım da köhnə teatr həvəskarıdır. Sizə kömək edəcək.

Murad bayaqdan bəri birinci dəfə dilləndi:

– Ancaq, Nuriyyə xanım, kasıbları da yaddan çıxarmayın. Biz quzeylilər neçə vaxtdır belə konsertlərə həsrətik.

– Baş üstə. Əgər, bizim çıxışlarımız sizi maraqlandırırsa, tez-tez gələrik.

"Bizim çıxışlarımız sizi maraqlandırırsa!" Bu nə deməkdir?! Mən özümü nəzərdə tuturdum?

Nəriman əmi qapıya sarı yönəldi:

– Yaxşı, gecdir. Gedək.

Bayırda hava ılıq və sakit idi. Göydə ulduz ulduzu çağırırdı. Söyüdlü arxda yenə qurbağalar haray salmışdı. Nəriman əmi, Hümmət, İmi, Cimi və Qulu qabaqda, Muradla mən isə arxada gedirdik. Bu nə cür olmuşdu ki, belə düşmüşdü? Bilmirdim. Lakin onunla yanaşı getmək, qurbağaların Söyüdlü arxdan gələn şən səs-küyünü onunla birlikdə eşitmək...

O, addımlarını yavaşıdırdı. Hiss edirdim ki, mənimlə danışmaq istəyir. Lakin bizim danışacaq nə sözümüz var idi? Mən addımlarımı yeyinləşdirdim. İmi ilə Cimi qabaqda getsələr də, bir qulaqları dalda idi.

– Əlimərdan kişi, Səadət bacı necədirlər? – deyə mən bərkdən soruşdum.

– Yaxşıdırlar, çox sağ olun.

– Keçən gecə səhərə qədər Əlimərdanı yuxuda görmüşəm.

O dinmədi.

– Xeyir olsun, – deyə Qərənfil bacı cavab verdi.

– Mənim yuxum həmişə xeyir olur, – deyə qaranlıqda Murada baxaraq gülümsədim.

Onun iri qara gözləri ulduzların ziyasını şəvə kimi əks edirdi.

– Yoldaş Hümmət, – mən bəhanə ilə irəliləyib qabaqda gedənlərə qoşuldum, – məgər sizin rayonda səyyar kino yoxdur?

– Nə üçün yoxdur, var.

– Heç bura gəlmir.

– Gec-gec gəlir. Kəndlərimiz çoxdur.

Bu, öz-özlüyündə mühüm məsələ idi. Lakin nə gizlədim, bütün fikrim, xəyalım arxada gələn ayaq səslərində idi. Nəhayət, özümü saxlaya bilməyərək, başımı döndərib geri baxdım. Nəzərlərimiz qarşılaşdı. Belə anlarda mənim keçirdiyim halları heç bir qıza arzu etməzdim. Bu, yalnız ümidsiz bir eşqin doğurduğu ruhi iztirab deyildi. Bu, eyni zamanda, fiziki bir əzab idi. Onun gözləri qapqara bir atəş idi. Onun baxışları nəhayətsiz dərəcədə mükəddər idi...

Mən o gecə yata bilmədim. Çarpayıda o üz-bu üzə çevrilir, sürəkli və müztərib baxışlardan xilas olmağa can atırdım. Lakin bu mümkün deyildi. Dərin zülmət içində parlayan bir cüt göz bütün varlığıma hakim olur, bədənim yanırdı.

Nəriman əmigil mənə nə qədər hörmət eləsələr də, özüm üçün balaca bir yuva düzəltməli idim. Ona görə də, səhər çay içdiyimiz zaman (Hümmətlə Murad gecəykən getmişdilər) mədəniyyət evindəki balaca otaqlardan birində olmağa Nəriman əmidən icazə istədim.

– Mədəniyyət evinin ixtiyarı səndədir, – dedi, – ancaq bizdən nə pislik gördün ki, gedirsən?

Qərənfil bacı da söhbətə qarışdı:

– Vallah, bu az vaxtda üz-gözümüz sənə elə öyrənib ki, elə bilirəm doğma balamsan.

Hər ikisi birdən-birə mənə qocalmış kimi göründü. Ürəyim sıxıldı.

– Onsuz da hər gün görüşəcəyik, – dedim, – ancaq mədəniyyət evində olmağım yaxşıdır. Tez-tez məşq eləmək, kitabxana ilə məşğul olmaq lazım gələcək...

Nəriman əmi köksünü ötürdü və dedi:

– Getsən də, qalsan da, bura öz evindir. Vaxta ki, orada qalmağın məsləhətdir, sözüm yoxdur. Quluya tapşıraram bu gün maşın verər. Otağın üçün də nə lazımsa, Qərənfil göndərər.

Redikülündə bir qəpiyi olmayan, kimsəsiz bir qız üçün bu qayğının nə demək olduğunu yəqin ki, hiss edirsiniz.

Mədəniyyət evinin çölə baxan tərəfində təkpəncərəli balaca bir otaq var idi. Oranı Nazxanımla bir də yuyub-təmizlədik (mənim qon-

şu gəlməyim Nazxanımı o qədər sevindirmişdi ki, uçmağa qanadı yox idi).

Mədəniyyət evinin artıq stol-kürsüsündən bir neçəsini müvəqqəti istifadə üçün ayırdıq. Elə bu zaman Almurad da yük maşınında bir çarpayı, iki balaca xalça, bir dəst yorğan-döşək (mənim yatacağımın bir balınc, kiçik döşəkçə və adyaldan ibarət olduğunu Qərənfil bacı görmüşdü), xırda-xuruş ev şeyləri gətirdi.

Xalçalardan birini yerə saldıq. O birini çarpayının yanına vurduq. Qərənfil bacının göndərdiyi qəşəng süfrəni yemək stolunun üstünə saldıq. Balaca stollardan birini küncə qoyub, üstünə qəzet çəkdim.

– Bu da bizim tualet stolumuz, – dedim.

– Qəzet niyə salırsan, yəni, Allahın bir çitini də tapmırıq!

Bir neçə dəqiqə çəkmədi ki, Nazxanım evə qaçıb təzə, çəhrayı bir örtük gətirdi.

– Hərə bir tük versə, kosa da saqqallı olar, – deyə zarafat elədim.

Həmin gün Qulu özü mənim min iki yüz manatdan ibarət olan aylıq maaşımı gətirib verdi. Ömrümdə bu qədər pul görməmişdim. Şadlığımdan bilmirdim nə edim. Tez Ələsgər dayıgil üçün üç yüz manat ayırdım, oturub özlərinə də belə bir məktub yazdım:

"*Əzizlərim Güllü nənə və Ələsgər dayı!*

Bu məktubu sizə Güney qışlaq kəndindən yazıram. İşləri yavaş-yavaş yoluna qoyuram. Dünən ilk dəfə konsert verdik. Camaatın yaman xoşuna gəldi. Burada sizin kimi yaxşı adamlarla tanış olmuşam. Hamı xətrimi istəyir. Məndən nigaran olmayın. Mədəniyyət evinin özündə balaca bir otağım var.

Ələsgər dayı və Güllü nənə! Sizə göndərdiyim bu azca pul mənim ilk maaşımdandır. Xahiş edirəm məni öz qızınız hesab eləyib, onu götürəsiniz. Sizdən başqa bir kəsim olmadığını bilirsiniz.

Ələsgər dayı, zəhmət olmazsa, bu kitabı alıb poçta salın. Vacib lazımdır.

İkinizi də qucaqlayıb öpürəm.

*Qızınız Nuriyyə".*

Sonra aydın xətlə Miçurinin seçilmiş əsərlərinin adını, hansı mağazalarda tapıla biləcəyini yazıb, Ələsgər dayıgilə göndərdiyim pula əlli manat da əlavə etdim.

...Axşamçağı Kərəm başqa bir oğlanla gəlib kitabxanamızdan "Don Kixot"u götürdü. Yanındakı oğlan da çəkinə-çəkinə "oxumalı bir şey" istədi.

– Nə ilə maraqlanırsınız?

– Nə istəyirsiniz verin, ancaq gülməli olsun.

Cəlil Məmmədquluzadənin hekayələr kitabını tapıb ona verməsini Səriyyədən xahiş etdim.

Sonra İmi, Cimi və Qulu da gəlib çıxdılar. Onlar üçü də indi köhnə dost kimi gülüb-zarafatlaşırdılar. Hətta, deyəsən, özünü tox tutmaq da İminin yadından çıxmışdı.

– Nuriyyə xanım, axır ki, bu işgüzar işsizlərin məsələsini həll etdik. Bundan sonra oldular sizin işçiləriniz.

– Demək istəyirsiniz ki, İmi ilə Cimi bundan sonra mədəniyyət evində işləyəcəklər?

– Elədir ki var.

– Mən buna çox şadam. Ancaq işgüzar işsiz nə deməkdir, Qulu?

Sual mənim ağzımdan səhvən çıxdı. Lakin İmi ilə Cimi incimədilər. Qulu başını çiyinlərinə qısıb güldü:

– İşgüzar işsiz, yəni, təşəbbüsləri, türkün sözü, bir-birinin ardınca düzüb, əslində heç bir iş görməyən adam.

İmi qaşlarını çatdı:

– Qulu!

Mühasib şəhadət barmağını yuxarı qaldırıb, pafosla cavab verdi:

– Bitdi boş təşəbbüslər, başlandı həqiqi işlər!

Sonra mənə müraciətlə:

– Nuriyyə xanım, – dedi – artelin idarə heyəti qərara alıb ki, bizə, hər nə lazımsa, kömək eləsin. Hələlik beş tar, beş də qaval alacağıq. Qrim, paltar üçün də pul buraxacaqlar. Varlığa nə darlıq?!

Tar dərnəyinə yazılmaq üçün otuza qədər uşaq gəlmişdi. Lakin biz onları yoxlayıb ən istedadlılarını qəbul etdik. Üç gündən sonra səkkiz nəfər tarçalan və beş nəfər qaval vurandan ibarət yaxşı bir dərnəyimiz var idi. Gündüzlər isti olduğundan, dərnəyin məşğələsini axşamçağına salmışdıq. Hər gün mədəniyyət evindən tar-qaval səsləri yüksəlirdi. Gənc tarzən və xanəndələrimizin qabiliyyəti məni heyran edirdi. İmi ilə Cimi bir havanı ikicə dəfə təkrar edən kimi onlar öyrənirdilər. İşə o qədər alışmışdıq ki, günün nə vaxt çıxıb, nə vaxt batdığından xəbərimiz olmurdu. Səhər saat doqquzdan on ikiyə qədər Səriyyə ilə mən kitabxanada işləyirdik. Saat on ikidən birə qədər tənəffüs edirdik,

birdən dördə qədər müxtəlif mahnı və oyun havalarının məşqini keçirirdik. Saat altıdan səkkizə qədər biz yenə də kitabxanada, İmi ilə Cimi isə, öz dərnəklərində məşğul olurdular.

Qulu məşqlərdə müntəzəm iştirak edirdi. Qalan vaxtlarda da, heç olmasa, bir-iki dəfə bizə baş çəkməyi unutmurdu. Onda görürdün ki, portfel qoltuğunda yel kimi böyürdən çıxdı. Onu ən çox maraqlandıran İmi ilə Cimi idi. Bir dəfə onlara işarə ilə mənə göz vurub, xısın-xısın güldü və qulağıma tərəf əyilərək pıçıltı ilə dedi:

– Heç bilirsiniz kənddə söz-həkət necə azalıb?

– Nəyə görə?

– Bunlara görə. Səhərdən axşamacan qalırdılar bekar, başlayırdılar bundan ona deməyə, ondan buna. Bu gecə kim arvadı ilə dalaşıb, kim kimə aşiq olub, filankəsin Bakıda oxuyan qızı kiminlə alışıb-verişib. Gərək hər şeyi İmi ilə Cimi o saat kəndə car çəkəydi.

Onların mənim haqqımda Səadətə elədikləri xəbərçiliyi xatırlayıb:

– Bəs indi? – deyə soruşdum.

– İndi yox. Çünki niyə? Başları qarışıb...

– Bu, qaydadır, iradələri o qədər də güclü olmayan adamlar ürəkləri istəyən işi tapmayanda, ora-bura əl atırlar, əsl insanlıqlarını itirməyə başlayırlar.

Qulu bir mütəfəkkir görkəmi alaraq:

– Düzdür, – deyə təsdiq etdi. – İncəsənətə xoşları var deyə, görürsünüz necə canı-dildən işləyirlər?

Sonra başını ağır-ağır tərpədərək “ah” çəkdi:

– Həyat, həyat!

Mən gülümsəyərək:

– Yaxşı, dostum Qulu, – dedim, – sən də, mən də ədalət tərəfdarı olduğumuz halda, necə ola bilər ki, dövlətlilərə, güclülərə xidmət eləyək, amma onların lap qonşuluğunda yaşayan kasıbları unudaq?

O, şəhadət barmağını qaldırdı:

– Dayanın, mən deyim siz kimləri nəzərdə tutursunuz. Siz bizim quzeylilər haqqında danışırsınız...

– Əqidəli adamlara eşq olsun!

– Davam edin!

– Mən istəyirəm biz işlərimizi yoluna qoyandan sonra Quzey qışlağı da mədəni şefliyə götürək.

O, birdən-birə filosofluğu buraxıb, adi adam oldu:

– Vallah, Nuriyyə xanım, əgər, kişi olsaydınız, sizi qucaqlayıb öpərdim.

– Amanın günüdür, elə xəyallara düşməyəsən.

– Hi-hi-hi... Vallah, yaxşı qızsınız.

Onun üzü ciddiləşdi:

– O axşam biz konsert verəndə, öz-özümə deyirdim: heç bu da insafdandırmı ki, biz burada musiqiyə qulaq asaq, şənlik eləyək, amma quzeylilər axşamdan başlarını atıb yatsınlar, dünyanın zövq-səfasından binəsib olsunlar.

– Biz onları şefliyə götürsək, Nəriman əmi bir söz deməz ki?..

– Deyər, etiraz edərik. Biz də bir kişiyik, ya yox?!

Qulu döşünü qabardaraq təhdidedici bir görünüş aldı.

Daha sonra biz gələcək tamaşalarımız haqqında düşünüb danışmağa başladıq. Elə bu zaman Almurad gəlib dedi ki, Nəriman əmi xahiş edir bu gecə mədəniyyət evinin böyük zalında iclas keçirilməsinə icazə verim.

– Mədəniyyət evi həmişə artelin ixtiyarındadır, – dedim.

– Sədrin eləliyinə baxmayın. Çox mərifətli adamdır. Başqaları kimi qolçomaq deyil. Sizi inandırıram, icazə verməsəniz, bir söz deməz. Çünki mədəniyyət evinin müdiri sizsiniz.

– İclas nə barədədir? – deyə Almurad gedəndən sonra Quludan soruşdum.

– Bu gecə quzeylilərin taleyi həll olunur. Söyüdlü arxın məsələsini camaatın ümumi yığıncağına keçirmişik.

– Demək, Nəriman əmi razılıq vermir?

– Xeyr, əşi... Dünən Hümmətlə aralarında əməlli-başlı inciklik oldu.

– Səncə, Söyüdlü arxın Quzey qışlağa qədər çəkilməsinə güneylilər razı olarlar?

– Görək...

– Nəriman əminin kənddə nüfuzu çox güclüdür?

– Güclü olmağına güclüdür. Ancaq... nə bilim... Görək, – deyə Qulu fikirli halda təkrar etdi.

Nazxanımı çağırıb zalı iclas üçün hazırlamağı tapşırdım.

Bilirdim ki, bugecəki yığıncaqda mütləq o da olacaq. Ona görə də, bütün günü həyəcan keçirir, bir yerdə dayana bilmirdim. Özüm özümü məzəmmət edirdim. Öz zəifliyimi lağa qoyub gülürdüm. Nazxanımla, Səriyyə ilə, hətta İmi və Cimi ilə mənasız zarafatlar edirdim. Lakin

onun bu gecə gələcəyini xatırlayanda, ürəyim qırılıb ayağımın altına düşür, ixtiyarım özümdə olmurdu.

Bu gecə o, ya qalib gələcək, ya məğlub olacaqdı. Mən qarşıma çıxan güneylilərin üzünə qorxu və diqqətlə baxaraq, onların nə fikirdə olduqlarını duymaq istəyirdim.

Axşamçağı kəndlilər bərkdən söhbət eləyə-eləyə axışıb gəldilər. Onlar mədəniyyət evinin qabağında, eyvanında topa-topa dayanıb quzeylilərdən, Söyüdlü arxdan söhbət edirdilər. Görünür, bugecəki yığıncağın nə üçün çağırıldığını bilirdilər.

Mən onların nə danışdıqlarını bilmək üçün diqqətlə qulaq asır, lakin heç nə dərk etmirdim. Mən qorxu və narahatlıq içindəydim. Nəhayət, hər iki artelin sədrləri, Hümmət və Qulu da gəlib çıxdılar. Nəriman əmi bütün ordenlərini taxmışdı. Üzünü tərtəmiz təraş etdirərək, həsir şlyapa qoymuşdu. Görünüşü ciddi və təntənəli idi. Kimsənin üzünə baxmırdı.

Mən öz qəhrəmanımı, keçmiş romantik qızlar demişkən, “döyüş” qabağı təmkinli və məğrur görəcəyimi zənn etmişdim. Lakin o, adamlarla görüşür, gülür, zarafat edir, həmişəkindən şən görünürdü. O, iri qara gözlərini dolandırıb kimi isə axtarırdı. Biz qızlar nə yaman xudpəsəndik... Ürəyim fərəh və səadət içində döyündü, biz bir-birimizə xəfifcə baş əyərək sözsüz salamlaşdıq.

Hümmət onun qoluna girib mənə yaxınlaşdı:

– Nuriyyə xanım, xahiş edirəm, nə vaxt konsertiniz olsa, zəng edib mənə xəbər verəsiniz.

– Nə üçün?

– Necə nə üçün? Yoxsa, mənim tamaşa eləməyimi istəmirsiniz?

– Niyə istəmirik? Artistlər həmişə arzu edərlər ki, tamaşaçıları çox olsun, – deyə zarafatyana cavab verdim.

Onun məhz bu axşam Güney qışlaq camaatının gözü qabağında Muradın qoluna girməyi o qədər xoşuma gəlmişdi ki, uçmağa qanadım yox idi.

Odur ki, dedim:

– Biz hətta, quzeyliləri də şefliyə götürmək istəyirik.

– Görürsən ki, – deyə o, dostuna müraciət etdi.

– Nuriyyə xanım da sizi yaddan çıxartmayıb.

Bu son sözləri deyərkən onun səsi yavaşıdı, üzü ciddi ifadə aldı.

Nəriman əmi, Hümmət və Murad səhnəyə qoyulmuş yaşıl örtüklü stolun arxasında oturmuşdular. Adamlar əyləşəndən sonra Hümmət ayağa qalxdı, sakit və ciddi ifadə ilə sözə başladı:

– Çox mühüm bir məsələ barədə sizin rəyinizi bilmək istəyirik...

Zalda bir tərpəniş əmələ gəldi. Nəriman əmi qəddini düz tutaraq gözlərini adamların üstündən elə bir nöqtəyə elə zilləmişdi ki, elə bil, bu dəqiqə həmin nöqtəyə atılacaq gülləni gözləyirdi.

Hümmət sözünə davam etdi:

– Özünüz bilirsiniz ki, biz ata-babalarımızın yadına gələn zamandan bəri aranda, yaylaqda həmişə quzeylilərlə qonşu olmuşuq. Bərkdə-boşda həmişə bir-birimizə əl tutmuşuq.

Rayon icraiyyə komitəsinin sədri bir an susub, zalı diqqətlə nəzərdən keçirdi:

– Onu da bilirsiniz ki, Quzey qışlaq camaatı daşdan çörək çıxarandır! Ancaq oturaq hala keçəndən bəri həmişə yoxsulluq içindədir. Səbəbi isə, sizə məlumdur: suları yoxdur. Respublikamızda olan böyük suvarma kanallarından heç birinin suyu gəlib buralara çıxmır. Siz vaxtilə çox ağıllı hərəkət eləyib, Köndələnçaydan kəndinizə arx çəkmisiniz. Ancaq quzeylilərin yeri elədir ki, onlar Köndələnçaydan birbaş özlərinə arx apara bilmirlər. Buna görə də, nə qədər fikirləşdik, mühəndislərlə məsləhətləşdiksə, sizin Söyüdlü arxı Güney qışlaqdan Quzey qışlağa qədər uzatmaqdan savayı əlverişli çarə tapa bilmədik.

Zalda yenə tərpəniş əmələ gəldi. Kim isə öskürdü. Rayon icraiyyə komitəsinin sədri tələsik əsl mətləbə keçdi:

– Buna görə də, quzeylilər sizə üz tutub təvəqqe edirlər ki, Söyüdlü arxın Quzey qışlağa qədər uzadılmasına izn verəsiniz. Mən də öz tərəfimdən sizi əmin edirəm ki, əgər, Söyüdlü arx Quzey qışlağa qədər uzadılarsa, bundan sizin təsərrüfatınıza zərrə qədər ziyan dəyməyəcək, əksinə, xeyri olacaq.

– Nə xeyri olacaq? – orta cərgədən bir kişi acıqla soruşdu.

– O barədə biz Muradla söhbət eləmişik. Belə xeyri olacaq ki, iki artel köməkləşib HES-i böyüdərsiniz. Bu da təsərrüfat işlərinin sürətlə elektrikləşməsinə kömək edər.

Aradan qısa bir sükut keçdi. Birdən həmin sualı verən kişi ayağa qalxaraq:

– Qardaş, – dedi, – nə xeyrini istəyirik, nə də şərini. Xahişimiz budur ki, quzeylilər bir də Söyüdlü arxın adını tutmasınlar.

Nəriman əmi təsvibedici, amiranə nəzərlə zala baxdı. Bunu gözləyirmişlər kimi yerbəyerdən səsləndilər:

– Biz ağrımaz başımıza buz bağlaya bilmərik.

– Quzeylilər getsinlər aldatmağa adam tapsınlar.

– Yiyəsi ölmüşdü Söyüdlü arxın.

– Yaxşı kələkdir.

– Nə yoğurdum, nə yapdım, hazırca kökə tapdım.

– Ə, bir macal verin görək, – deyə Kərəm çevrilib zala müraciət etdi.

– Sən yuxa qulağı sulama, – deyə kimsə arxadan ona acıqlandı.

Ortayaşlı bir kişi ayağa qalxıb üzünü Hümmətə tutdu:

– Deyək ki, biz razılıq verdik. Söyüdlü arxı da çəkib uzatdılar Quzey qışlağa. Yayın cırhacırında su üstündə davamız qopanda, bizi kim aralaşdıracaq.

– Deməli, gərək dəyənəyin birini biz götürək, birini də onlar.

– Keçəl suya getməz.

Qorxu və həyəcan içində Hümmətə baxdım. O tamamilə sakit idi. Yalnız gözləri həmişəkindən artıq parıldayırdı.

– Kim danışmaq istəyir? – O, bir-birinin ardınca gələn atmacaları eşitmirmiş kimi zala müraciət etdi.

Heç kəsdən səs çıxmadı.

– Kim danışmaq istəyir?..

Mənə bir il qədər uzun görünən ağır sükut keçdi. Birdən Nəriman əmi başını qaldırıb narahat halda zalı nəzərdən keçirdi. Sonra quş kimi yerindən qalxıb tribunaya yaxınlaşdı, qollarını geniş açaraq, onun hər iki tərəfindən möhkəm yapışdı. Bir neçə saniyəlik fasilədən sonra:

– Güney camaatı! – deyə bərkdən səsləndi. Söyüdlü arx sizindir. Onu sizin əlinizdən heç kəs ala bilməz.

Sədr yenə də susaraq, sözlərinin təsirini yoxlayırmış kimi, diqqətlə zala baxdı:

– O da sizə məlumdur ki, biz heç vaxt əlimizdən gələn köməyi quzeylilərdən əsirgəməmişik. Soruşuram, düzdürmü?

– Düzdür! Düzdür! – deyə yerbəyerdən səsləndilər.

– Qar qapını alanda, ota-alafa gəliblər, vermişik, borc taxıl istəyiblər, yox deməmişik. Düzdürmü?

– Düzdür! Düzdür!

– Canım, indi nə istəyirsiniz? – sədr qabaq cərgədə əyləşmiş quzeyli ağsaqqallara xitabən səsini qaldırdı. – Niyə bizi qoymursunuz oturaq yerimizdə?

Mən Murada tərəf baxmağa cəsarət etmirdim. Mən onun məğlubiyyətini görmək istəmirdim. Onun kəndi haqqında deyilən sözlər mənə xoş gəlmirdi. Neçə vaxt evində çörək yediyim Nəriman əminin yaraşıqlı sifəti isə, indi mənə həddindən artıq kobud görünürdü. Kim isə astadan:

– Nə qədər olsa da, qonşuyuq, – dedi.

Nəriman əminin yumruqları düyünləndi:

– Ə, Sultanoğlu! Yumurtadan dünən çıxmısan, bu gün bizə ağıl öyrədirsən! Qonşuluq yaxşı şeydir? Xəbər alıram: yaxşı şeydir?

– Bəs nədir, əşi, əlbəttə, yaxşı şeydir, – deyə Sultanoğlu ötkəm cavab verdi.

– İndi ki, yaxşı şeydir, bəs, niyə biz Söyüdlü arxı qazanda quzeylilər bir dəfə gəlib demirdilər: “Qonşu, Allah saxlasın. Bəlkə bir şeyzad lazımdır?” İman kişi, düzdür?

– Düzdür, demədilər.

– Alıhüseyn, düzdür?

– Düzdür, əşi, düzdür.

– Camaat, ömründə Nərimanın dilinə yalan gəlib?

– Yox! – deyə bütün zal cavab verdi.

– Onda qulaq asın. Burada yeniyetmələr var, qoy işin nə yerdə olduğunu onlar da bilsinlər. Köndələnçaydan Güney qışlağa arx çəkmək fikri mənim başıma gələndə, düzü, əvvəl qorxdum. Qorxdum ki, tək bizim gücümüz çatmaya. Ona görə də həmin, bax, bu Muradın atası Çırağa, hansı ki, o vaxt sovet sədri idi, dedim, ə, gəlin bu işi sizli-bizli eləyək. Arxı bizim Güney qışlağın üstündən keçirib, ta sizin Quzey qışlağa qədər aparaq. Sonra da dəhnə qoyub ata malı kimi bölək iki yerə! Pis demişəm?

– Yox, lap ata sözü demisən!

– Bəs, Çıraq mənə nə cavab verdi? Ə, Sultanoğlu, soruşuram: bəs, Çıraq mənə nə cavab verdi?

– Nə bilim, əşi, nə cavab verdi.

– Hə, iş də orasındadır ki, bilmirsən. Çünki sən o vaxt küçələrdə tumançaq atılıb-düşürdün.

Kərəm pıqqıldayıb güldü. Bir neçə cavan da ona qoşuldu. Hümmət zəngi səsləndirdi.

– Çırağın mənə cavabı bu oldu ki, “biz köçəri babayıq, heç dörd ay qışlaqda olmuruq, arx nəyimizə lazımdır!” Dedim, biz də köçəriyik, Çıraq. Sonra peşman olarsınız. Atını səyirdib heç mənə cavab da vermədi. İndi, balam, quzeylilər, nə istəyirsiniz? Uzun sözün qısası, biz Söyüdlü arxdan heç yerə bir gilə də su verəsi deyilik. Köndələnçay durduqca, Söyüdlü arx da Güney qışlağa axacaq.

Nəriman əmi gümrah və qəti addımlarla keçib yerində oturdu. Mənə elə gəldi ki, bununla da hər şey qurtardı.

Hümmət ayağa qalxdı:

– Daha kim danışmaq istəyir?

Zaldan səs çıxmadı.

– Kim danışmaq istəyir? – deyə Hümmət təkrar etdi.

Yenə də zal sükut içərisində idi.

– Mən danışmaq istəyirəm, – deyə, nəhayət, quzeylilərin sədri dilləndi.

Ürəyim şiddətlə döyünməyə başladı. Mən onun ayağa qalxıb, tələsmədən tribunaya yaxınlaşdığını, sonra eyni arxayınlıqla dirsəyini taxtaya söykəyib, iri, qara gözlərini zala zillədiyini, çöhrəsinin daha solğun göründüyünü o qədər həyəcanla izləyirdim ki, elə bil, indicə, nə isə, fövqəladə bir hadisə baş verəcəkdi. O, tamam arxayın və adi ifadə ilə sözə başladı:

– Mən heç bir zaman sizin içinizdə özümü yad hesab eləməmişəm. Ona görə, acı sözünüz də qəbulumdur, şirin sözünüz də. Bizim mətləbimizi yerinə yetirsəniz də sağ olun, yetirməsəniz də.

Qabaq cərgədə əyləşmiş Qərənfil bacı “ah” çəkdi. Onunla yanaşı oturmuş Qulunun balaca qara bəbəkləri sürətlə o yan-bu yana qaçaraq, gah Muradın, gah Nəriman əminin üzündə dayanırdı.

Murad bir anlıq fasilədən sonra davam etdi:

– Söyüdlü arxın sahibi sizsiniz. Quzeylilərin vəziyyəti də sizə məlumdur. Ancaq istəyirəm bircə şeyə qəti inanasınız. Söyüdlü arxı Quzey qışlağa qədər uzatmaqdan nə indi, nə də gələcəkdə sizin təsərrüfatınıza ziyan dəyməyəcək. Bunu Hümmət də dedi. Qaldı, Nəriman əminin bizim qaramıza dediyi sözlər. Tamamilə haqlıdır.

O xəfif bir təbəssümlə əlavə etdi:

– Ata vaxtında sizin sözünüzə əhəmiyyət verməyib, atını səyirdib gedib, oğlu ehtiyac ucundan minnətə gəlib. Mən daha sizə nə deyə bilərəm!

Onun üzü birdən-birə işıqlandı. Tələsmədən geriyə dönüb, yavaş addımlarla yerinə getdi.

– Mənə bir söz ver! – Qərənfil bacı sədrin cavabını gözləmədən tribunaya qalxdı.

Tez-tez nəfəs alaraq həyəcanla:

– Camaat, – dedi, – bunun gizlini yoxdur ki, Söyüdlü arx bizim əzizimiz, gözümüzün işığıdır. Söyüdlü arx bizim qaraçuxamızdır. Onu nə əziyyətlə Güney qışlağa gətirib çıxartmağımız da yadımızdadır. O da yadımızdadır ki, Söyüdlü arxın üstündə hamıdan artıq əziyyət çəkən Nəriman olub.

Yerlərdən təsdiq etdilər:

– Elədir, düzdür.

– Söyüdlü arx qazılanda Nəriman həftələrə ev üzü, yorğan-döşək üzü görməyib, oranın torpağını sizinlə birlikdə belində daşıyıb... Ancaq, Nəriman, evdə də sənə dedim, burda da deyirəm, indi düz eləmirsən. Sən el atasısan. El atası təkcə özünü güdməz.

– Qərənfil, mən tək özümü güdürəm? – deyə Nəriman əmi təəccüblə soruşdu.

– Bir tək öz kəndinin, öz artelinin qayğısına qalıb, o birilərini yaddan çıxarmağa ayrı nə ad vermək olar, Nəriman? – deyə arvad mehribanlıqla soruşdu. – Sənin deməyindən belə çıxır ki, məndən ötsün, qardaşıma dəysin.

– Çox sağ ol, Qərənfil. İltifatın artıq olsun...

– Əşi, vallah, düz deyirəm. Quzeylilərin vəziyyəti yadıma düşəndə, yediyim-içdiyim canıma yatmır. Heç insafdır ki, biz bağça-bağ içində oturaq, anbarımızda yemiş-qarpız dağ kimi təl atılsın, amma quzeylilər bu yayın qızmarında ayrana doğramağa bir dəst göy tapmasınlar?! Heç insafdır? Çox da bir vaxt Çıraq sənin sözünə qulaq asmayıb. İndi neyləyək, duraq iyirmi il qabaqkı əhvalatın qisasını camaatdan alaq?

– Çox sağ ol, Qərənfil, – Nəriman yanakı arvadına baxıb, başını ağır-ağır tərpətdi. – Çox sağ ol.

– Sən də sağ ol, əşi, – deyə Qərənfil bacı Nəriman əmi kimi məzəmmətlə deyil, ürəkdən cavab verdi. – Mən üzümü sən Nərimana, bu Güney qışlaq camaatına tutub deyirəm: gəlin quzeylilərin qolundan tutaq. Dünyanın əvvəli-axırı deyil.

Qərənfil bacı qurtaran kimi ortayaşlı bir kişi qışqırdı:

– Nəriman düz deyir, əgər, quzeylilərə su lazım idi, niyə o vaxt yaxalarını kənara çəkirdilər?

– İndi hazırına gəlib nazir olmaq istəyirlər, – bir başqası ona səs verdi.

Poçtalyon Pirverdi ayağa qalxdı:

– Bu nə paxıllıqdır, balam? Əgər, bizə bir ziyanı yoxdursa, niyə razı olmayaq? Camaatdır, qoyun onların da mətləbi düzəlsin.

– Sağ ol, Pirverdi.

– Gödək səxavətə gəlib.

– Xalqın cibindən beş-beş bağışlayır...

Poçtalyon qızarıb pörtərək oturdu. Qarmaqarışıq səslər eşidildi. Hümmət zəngi tərpətdi. İndi onun gözləri iti və sərvaxt bir ifadə almışdı. Sanki zaldakıların ən kiçik hərəkətlərini belə nəzərdən qaçırmaq istəmirdi.

Lap arxadan bir qoca qalxaraq, söz almadan, sakit addımlarla irəliləyib camaatın qabağında dayandı. Bir əlində odu sönmüş qəlyan tutmuşdu. Zala uzun və arxayın bir nəzər salandan sonra:

– Bilirsiniz ki, – dedi, – mən yüzü çoxdan keçmişəm. Atam Kərbəlayı Mürsəl də yüzü addamışdı. Onun anası Bədirxan o qədər yaşamışdı ki, yumurlanıb yumağa dönmüşdü. Rəhmətlik Bədirxan nənəm danışardı ki, Nadir gələndə mən yeniyetməcə qız idim. Deyirdi, əgər, çapıq Eyvaz olmasaydı, Nadirin atlıları bələkdəki uşaqlarımızı da kordadan keçirəcəkdi. Çünki el-elat yad şaha tabe olmurdu. Çapıq Eyvaz əli qılınc tutanı başına yığıb indiki Eyvaz dərəsində, hansı ki, Söyüdlü arxın ayağı gedib orada itir, Nadirin qabağını kəsdi. Gələni qılıncdan keçirdi. Biz köçüb qaçanacan bu tərəfə bir adam buraxmadı.

Yerdən bir nəfər soruşdu:

– Deməli, buna görə oranın adı qalıb Eyvaz dərəsi?

– Bəli, ona görə. Bədirxan nənəm deyərdi ki, Eyvaz dərəsinə o qədər qan tökülmüşdü ki, yeddi il orada ot-əncər bitmədi. İndi sizdən soruşuram: çapıq Eyvaz kim idi?

Nəriman əmi yerində qurcalandı.

– Çapıq Eyvaz, bax, həmin o kişinin üçüncü babası idi. – Qoca qəlyanını Murada sarı uzatdı.

Adamlar tərpəşdi. Kimi öskürdü, kimi dərindən nəfəs aldı. Aralıq sakit olandan sonra qoca sözünə davam etdi:

– Bəs necə olur ki, indi çapıq Eyvazın törəmələrinə su vermirsiniz? Yezid imamlara su vermirdi, çünki onlarla düşmən idi, bəs, sizə nə düşüb?

Nəriman əmi yenə qurcalandı. Kərəm gülümsəyib yoldaşına nə isə pıçıldadı. Qoca dedi:

– Gəlin daşı ətəyinizdən tökün, quzeylilləri boş qaytarmayın. Biz bir el, bir obayıq. Ayıbdır.

Qoca dönüb yerinə getdi. Kərəm ayağa qalxaraq, Hümmətə müraciət etdi:

– Mənim təklifim budur ki, quzeylilərin Söyüdlü arxdan istifadə eləmələrinə icazə verək.

– Verək, verək! – deyə yerdən səsləndilər.

Nəriman əmi həyəcanla yerindən qalxdı:

– Dünyamalı kişinin sözü sizi yerinizdən oynatmasın. Yaxşı fikirləşin...

– Əşi, daha bunun nə fikirləşməyi var?

– Canım, bizə ki, bir ziyanı yoxdur.

– Çox ziyanı var.

– Söyüdlü arxın suyu azalmayacaq?

– Heç bir damcısına da söz ola bilməz.

Səslər təkrar bir-birinə qarışdı. Hümmət söz atanları nəzərdən keçirərək, dalbadal zəng çaldı. Birdən Almurad ayağa qalxdı:

– Ay yoldaşlar, – deyə hərarətlə danışmağa başladı. – Əgər biz Söyüdlü arxın Quzey qışlağacan uzadılmasına icazə verməsək, onda heç adam deyilik!

– Adam deyilik? – deyə bir kişi yanındakı cavandan soruşdu.

Yerdən başqa bir kişi söz atdı:

– Ə, adamın bura nə dəxli var?

– Çox dəxli var. Adam heç vaxt közü təkcə öz qabağına eşməz.

– Adam heç vaxt yoldaşı yolda qoymaz. Qərənfil xala çox yaxşı dedi, insafdırmı ki, bizim inişilimizin sarı buğdası bu ilə, gələn ilə qalsın, amma quzeylilər ondan-bundan borc alsın? Mən bütün Güney qışlaq cavanları adından təklif edirəm: quzeylilərin xahişini yerinə yetirək. Necə ola bilər ki, sən, Söyüdlü arxın, Güney qışlaq kəndini suvarandan sonra axıb Eyvaz dərəsində itməsinə razı olasan, amma qonşunun ehtiyacına sərf olunmasına yol verməyəsən? Belə də vicdan olar?

– Çox sağ ol, – Nəriman əmi yanpörtü ona baxdı. – Deməli, biz vicdansızıq, çox sağ ol.

– Əşi, səni demirəm. Mən sən barədə dünyasında elə söz demərəm.

– Almurad, eşitdik. Almurad, çox sağ ol, – deyə sədr küsmüş halda təkrar etdi.

Kərəmin dodağı qaçdı:

– Mən Güney qışlaq cavanları adından bir də xahiş edirəm: Söyüdlü arxın Quzey qışlağacan uzadılmasına razılıq verək.

– Razılıq verək, razılıq verək, – cavanlar oradan-buradan qışqırdılar.

Əvvəlcə biri, sonra da o biriləri əl vurdular.

Kim isə yoğun səslə qışqırırdı:

– Ə, adam uşağısınız, otağı uçurdunuz.

– Sən ölmüyəsən, bunlara bir hay lazımdır.

– Ə, cavan olanda nə olar, gərək dünyanı dağıdasınız?

– Quzeylilərin bizim suyumuzdan istifadə eləmələri başımızın ucalığıdır. – Almurad bunu deyib səhnədən düşdü.

Təkrar səs-küy, mübahisə qalxdı. Hümmət cəld ayağa durub, bir neçə dəfə zəngi çaldı. Səs-küy yatandan sonra aydın və ciddi ifadə ilə:

– İki təklif var, – dedi, – biri budur ki, Söyüdlü arxın Quzey qışlağa qədər çəkilməsinə icazə verilsin.

– İcazə verilməsin! – deyə bir nəfər yerdən qışqırdı.

Bir başqası ayağa qalxaraq əsəbi halda Hümmətə müraciət etdi:

– Yoldaş ispalkom, Söyüdlü arxın sahibi bizik. Birinci təklif də bizimdir. Yox, əgər, zor eləmək istəyirsiniz, o başqa məsələ.

– Zor nədi, ə? – kim isə qışqırdı.

– Sultanəli, xalqın üstünə motal atma.

– Sultanəli doğru deyir, birinci təklif bizimdir.

– Əlbəttə, bizimdir.

Hümmət yenə təmkinlə:

– Yaxşı, – dedi, – mən Sultanəli deyən kimi səsə qoyuram: kim istəyir Söyüdlü arxın Quzey qışlağa qədər uzadılmasına icazə verilməsin, əlini qaldırsın.

Mənə elə gəldi ki, zaldakıların hamısı bir anda əlini qaldırdı.

– Kərəm, xahiş edirəm, say.

Kərəm ayağa qalxıb, barmağı ilə bərkdən saymağa başladı. – ...Yüz otuz beş, yüz otuz altı, yüz otuz yeddi. Nəriman əmi də yüz otuz səkkiz.

– İndi isə, – deyə Hümmət davam etdi, – ikinci təklifi səsə qoyuram: kim istəyir ki, Söyüdlü arxın Quzey qışlağa qədər uzadılmasına icazə verilsin, xahiş edirəm, əlini qaldırsın. Sultanəli ayağa qalxdı.

– Bunu mən sayacağam.

– Deməli, Kərəmə etibar eləmirsən?

– Ə, lap etibar eləmirəm, dediyiniz nədir?

– Əşi, inanmır, qoy özü saysın, – Kərəm oturdu.

Sultanəli saymağa başladı. Mən, qeyri-şüuri olaraq, qalxıb ayaq üstdə dayanmışdım. Hümmətlə dayısının gözləri eyni gərgin diqqətlə zala zillənmişdi. Murada sarı baxmağa ürəyim gəlmirdi.

Sultanəli "yüz otuz səkkiz, yüz otuz doqquz, yüz qırx" dedikdə, səsi yavaşıyaraq, nəhayət, eşidilməz oldu.

– Ə, say, dayna, niyə boğazın qurudu! – deyə kimsə istehza ilə söz atdı.

– Cəhənnəm olsun. Söyüdlü arxın yiyəsi tək mən deyiləm ki... – Sultanəli əlini çırparaq oturdu.

Mən göz yaşları arasından gülümsəyərək, utanıb-çəkinmədən Murada baxdım. Lakin onun gözləri sərt bir ifadə ilə açmaqda olduğu papiros qutusuna dikildiyindən, mənim baxışlarımı görmədi.

– Demək, güneylilər Söyüdlü arxın Quzey qışlağa qədər uzadılmasına icazə verdilər.

Nəriman əmi Hümmətin bu sözlərini eşidəndə ayağa qalxdı. Zala uzun bir nəzər salaraq, təəccüblü dərəcədə sakit və mütəəssir bir ifadə ilə dedi:

– Mənim oğlum yox, qızım yox. Söyüdlü arxı da goruma tökməyəcəyəm. Mən sizin üçün deyirəm. İndi ki, belə elədiniz, özünüz bilərsiniz. Ancaq onu yadınızda saxlayın ki, bu işdə, nə otuz il mənimlə bir yastığa baş qoyan Qərənfilin, nə də həmişə oğul deyib tutduğum Hümmətin hərəkəti məni yandırmadı. Ancaq siz... Nə isə, salamat qalın.

O, həsir şlyapasını götürüb, ağır addımlarla səhnədən çıxdı.

Qərənfil bacının rəngi elə ağarmışdı ki, mən onun ürəyinin xarab olacağından qorxurdum. Murad kimsənin üzünə baxmadan dalbadal papiros çəkirdi.

– Hə, indi dincəldinizmi, – deyə Sultanəli, Nəriman əminin gedişi ilə zalda yaranan sükutu pozdu.

– Dağ boyda kişini bir qara qəpiklik eləyib yola saldılar.

– Mərdimazara lənət!

– Kişinin əməyini vurdular yerə.

– Bu gündən Söyüdlü arx sənin deyil.

Atmacalar bir-birinə qarışdı. Hümmət ayağa qalxaraq, zəngi səsləndirdi, zal sakit olandan sonra sözə başladı:

– Ədalət də, insaf da bizim sədrə etiraz etməyimizin tərəfində idi. Dayım bütün həyatını bizə, biz güneylilərə sərf edib. Onun bizdən başqa heç bir kəsi olmadığını da bilirik. Ancaq unutmamalıyıq ki, təkcə öz kəndinin xeyrini güdüb, başqalarını yaddan çıxarmaq bizim böyük məqsədimizlə düz gələn iş deyil. Bir növ, xüsusiyyətçilikdir.

O, bir an susub, gözünün üstünə tökülmüş yumşaq xurmayı saçlarını əli ilə yana verdi. Sonra yumruğunu düyünləyib sərt səslə əlavə etdi:

– Biz belə hallarla qəti mübarizə aparmalıyıq. Biz ancaq özümüzü düşünə bilmərik.

– Təkcə öz kəndinin mənfəətini güdmək avamlıqdır! – Qabaq cərgədə oturmuş Qulu sıçrayıb ayağa duraraq şəhadət barmağını yuxarı qaldırdı.

Kərəm və onun yan-yörəsində oturmuş gənclər pıqqıldayıb güldülər. Lakin Hümmət:

– Düzdür! – deyə mühasibin sözünü təsdiq etdi. – Biz keçmiş cəmiyyətin zəhərini damarlarımızdan damcı-damcı sıxıb çıxarmalıyıq. Ancaq o zaman azad, rahat nəfəs ala bilərik. Ancaq o zaman qonşumuzu, bütün namuslu vətəndaşlarımızı özümüzdən ayırmarıq.

İndi onun səsində bir qətiyyət və amansızlıq var idi. Elə bil, ayrı vaxt hamı ilə deyib-gülən yumşaq təbiətli, zarafatcıl oğlan deyildi. Mən belə cavan adamın rayon icraiyyə komitəsi sədri kimi məsul bir işə seçilməyinin səbəbini yalnız indi başa düşdüm.

O, nitqini qurtarandan sonra:

– Bir sözün varmı? – deyə Murada müraciət etdi.

Quzeylilərin sədri ayağa qalxaraq, mərdanə bir təmkinlə dedi:

– Mən bütün camaatımız adından sizə təşəkkür edirəm. Vaxt gələr ki, indi bu işə etiraz eləyən adamlar da bizdən razı qalarlar. Mən arxayınam ki, Söyüdlü arx bizi bir ailə kimi birləşdirəcək, dostluğumuzu möhkəmləndirəcək. Sağ olun.

– Sən də sağ ol.

– Ə, siz kimsiniz, biz kimik, – kəndlilər səsləndilər.

...İclasdan sonra Hümmət, Murad, Qulu, Qərənfil bacı, Nazxanım, bir də mən eyvanda dayanıb söhbət edirdik. Qərənfil bacı mənə xitabən “ah” çəkərək deyirdi:

– Əziz canın üçün, birisi Allahından dönüb desə ki, Nəriman, evini yığ ver mənə, deyər apar. Amma indi niyə belə eləyir, başa düşmürəm.

– Bilirsən, – deyə Hümmət cavab verdi, – Söyüdlü arx dayımın şöhrəti-şanıdır. O bu şöhrəti heç kəslə bölüşmək istəmir.

– Ancaq sən bir yol tap, dayının könlünü al, Nəriman ağıllı adamdır.

– Mən də bayaqdan fikirləşirəm ki, nə cür eləyək ki, Nəriman əmi bizimlə barışsın, – deyə Murad, Qərənfil bacıya baxdı.

Qadın "ah" çəkdi.

– Dayımla bizi zaman özü barışdıracaq, – deyə Hümmət cavab verdi.

Murad zarafatyana gülümsəyib mənə baxdı:

– Zaman barışdıranacan bizimki bizə dəyər.

"Şübhəsiz" deyə mən qüssə ilə düşündüm. "Zaman gələcək, siz barışacaqsınız. Lakin o zaman, kim bilir, mən haralarda olacağam." Bunun ardınca da öz qəribəliyimə güldüm: "Axı, mənim bir zaman harada olacağımın mətləbə nə dəxli var?"

Onlar mənimlə və Nazxanımla xudahafizləşib gedərkən, Murad bir neçə dəfə geri baxdı...

– Nə gözəl aydınlıqdır, Nazxanım, – mən qayğısızlıqla əsnədim.

Mən aktrisayam. Lazım gələndə əsnəməyi bacarmalıyam!

Heç birimiz yatmaq istəmirdik. Eyvandakı skamyada oturduq.

Qurbağalar quruldayırdı. Bu aydınlıq gecədə onların səsi mənə uzaq bir əfsanə kimi gəlirdi. Xeyli hündürə qalxmış Ayın yanında pambıq kimi ağ bulud parçası dayanmışdı. Göz işlədikcə uzaqlarda Qarabağ dağlarının gümüş silsiləsi parıldayırdı. Neçə milyon illərdir bu aydınlıq gecələr gəlib-keçir. Neçə-neçə milyon illər daha gəlib keçəcəkdir... Nəriman əmi ilə Murad dostlaşanda mən burada olmayacağam. Şübhəsiz, olmayacağam... Anlar, dəqiqələr isə keçib gedirdi. Qurbağalar dərdsiz-qəmsiz mahnılarını hey çağırırdılar.

– Nə üçün söhbət eləmirsən, Nazxanım?

– Eh, nə söhbət eləyəcəyəm, – mən onunla tanış olandan bəri birinci dəfə dərdli-dərdli "ah" çəkdi. – Qurbağalara qulaq asıram, deyirəm, dünyada xoşbəxtlik yaxşı şeydir, ancaq, heyf ki, çox adama qismət olmur.

– Niyə elə deyirsən? Məgər, sən xoşbəxt deyilsən?

– Xoşbəxt olsaydım, o damın altında qulyabanı kimi tək qalmazdım.

– Ərindən nə səbəbə ayrıldığını heç mənə danışmırsan.

– Elə bil, danışdım, nə olsun? Danışmaqla yaralar sağalsaydı, dünyada heç dərdli adam olmazdı.

– Sən onu çox istəyirdin?

– İstəyirdim.

O bu sözü elə pıçıldadı ki, elə bil, gənc və sağlam sinəsindən od qopdu.

– Ancaq yaxşı iş görməyib.

– Neyləyəydi? Atasının yurdunu kor qoya bilməzdi ki.

– Nə çox dünyada sonsuz adam. Məsələn, odur, Nəriman əmigil...

– Nə isə. Keçdi-getdi. Canı sağ olsun. Mən ondan incimirəm. Müqəssir öz bəxtimdir, yoxsa, o məni istəyib almışdı.

– Təzə arvaddan uşağı var?

– Bir oğlu olub. Deyirlər, maşallah, lap top kimi uşaqdır.

Ayın yanındakı ağ bulud parçası yavaş-yavaş uzaqlaşıb, mavi ümman içində ağaran tənha bir yelkəni xatırladırdı. Söyüdlərin arasında su səthinin kiçik bir parçası qara şüşə kimi parıldayırdı.

– Ərə getmək fikrin yoxdur?

– Nə bilim? Sən heç ərə getməmisən?

– Yox.

– Bir söz soruşsam, acığın tutmaz ki?

– Qətiyyən.

– Sən Muradı çoxdan tanıyırsan?

– Yox. Ancaq bir dəfə ona oxşayan bir gənc leytenant görmüşdüm. Necə məgər?

– Heç. Elə-belə. Çox gözəl oğlandır, elə deyil?

– Allah yiyəsinə qismət eləsin.

– Sən onun baxışlarından bir şey başa düşmürsən?

– Yox, nə cür baxır ki? – deyə çox təəccüblə soruşdum.

– Mənə elə gəlir ki, Murad sənə aşiq olub.

– Dəlisən, nədir? Bax, bir də mənimlə belə zarafat eləsən, bərk inciyərəm. Muradın o cür gözəl arvadı ola-ola, durub mənə aşiq olacaq?

– Eh, sən də! Elə arvadı deyilmi yazığın gününü göy əsgiyə düyünləyən.

– Özləri bilərlər. Ancaq xahiş edirəm o sözü bir dedin, bir də deməyəsən. İndi də arvadlı kişilərimiz qalmışdı. Niyə, dünyada bir subay

oğlan tapılmırdı ki, mənə aşiq olaydı?! Çox sağ ol, Nazxanım, heç səndən gözləməzdim.

Öz rolumu elə məharətlə oynadım ki, yazıq gəlin dediyinə də peşman oldu.

– Bilsəydim xətrinə dəyəcək, deməzdim. Sən Allah, bağışla.

– Yaxşı, yaxşı. Ancaq bir də desən, bağışlamayacağam. Dur gedək, sənin üçün piano çalım.

Qoy oxucu Nazxanım kimi təmiz qəlbli bir dostuma qarşı göstərdiyim bu saxta hərəkətləri mənim günahıma yazmasın. Məni ikiüzlülükdə təqsirləndirməsin. And içirəm ki, mən həyatımda heç kimə yalan deməmişəm. Ancaq dünyada bir sirr var ki, o mənimlə qəbrə gedəcəkdir...

Pəncərədən düşən Ay işığı səhnəni işıqlandırdığı üçün çıraqları yandırmadıq; mən pianonun arxasında oturub, yenə də "Segah" çalmağa başladım. Lakin bu dəfə o, tamamilə ayrı şeylər hekayə edirdi. Mən, yaxından keçən Söyüdlü arxa baxaraq çalırdım və çaldıqca sanki Ay işığında mürgüyə dalmış söyüdlər diksinib ayılırdı.

Söyüdlər ahəstə-ahəstə yırğalanaraq "Segah"ı dinləyirdi. "Segah" isə, onlara deyirdi ki, sizin sıralarınız Quzey qışlağa qədər uzanacaq, kəndi dövrə vurub su kənarında bitən yaşıl yarpızların üzərinə sərin kölgə salacaq. Quzey qışlağa uçub gələn quşlar sizin salxım-salxım sallanan yarpaqlarınız arasında yuva qurub şən mahnılar oxuyacaq. Saçlarına dən düşmüş ucaboylu bir adam hərdən sizə baxıb, bəlkə də, keçmişləri xatırlayacaq. Kim bilir, o zaman bu qız harada olacaq. "Segah" gələcək ayrılığın hicranı ilə titrəyib üzülürdü. Sonra Söyüdlü arx kimi yavaş-yavaş axıb gedən zamanın biganəliyindən danışırdı. Ah, mənim əzizim! Mənim iki gözüm. Cavan leytenant! Nə üçün sən o gecənin səhəri qayıtmadın? Nə üçün sonralar məni axtarıb tapmadın? Sənin yerinə mən olsaydım, dəmir çarıq geyib Yer üzünü dolaşar və səni tapardım. Lakin sən məni axtarıb tapmadın. Vədə verib gəlmədin. O zaman mənimlə tanış olmağın səndə, bəlkə də, sadəcə bir maraq, bir gənclik həvəsi idi. Bəlkə də, ötəri bir ehtiras idi... Mən isə, səni bütün ali duyğuların yaratdığı bir şah əsər, qızların xəyallarını narahat edən bir qəhrəman sanmışdım. Sən görüş vəd edib gəlmədin. Eybi yoxdur. Mən bunun üçün taleyimdən narazı deyiləm. Çünki sən öz səadətini tapmısan. Onun gözləri yaz səmasıtək dərin və mavidir. O səni sevir! Səni ayağın dəyən daşa, torpağa belə qısqanır. O məni nifrətlə qarşıladı. Lakin mən incimədim. O səni sevdiyi üçün mənə

nifrət edir. O istəyir ki, sən yalnız onun olasan. Sənin gözlərin yalnız ona baxsın. Qulugildə o sənin ötəri bir nəzərini belə mənə çox görürdü. Mən isə, bundan incimirəm. Bu dünyada hər kəsin xoşbəxt olmağa, həyatdan daha çox şey götürməyə can atması tamamilə qanunidir. Lakin bu xoşbəxtliyi mən daha səndən istəyə bilmərəm. Buna mənim haqqım yoxdur.

Çünki sən onunkusan! Siz bir-birinizinsiniz. Mən isə, uzaqdan gəlmiş bir quşam. Bu quşun uçub getməsi ilə Səadətin qəzəbi də yaz tufanı kimi sovuşub keçəcək. Söyüdlü arx kəndinizi dövrə vuracaq... Ay işığında dayanmış o qədd-qamətli adam kimdir? Nə üçün elə pəjmürdədir? Gözlərinin kölgəsi nədən elə qaradır?

"Segah" həyəcanla titrədi, çırpındı. Mən bir anlığa gözlərimi qapayıb-açdığım zaman o, artıq yox idi. Mən qorxmadan, titrəmədən qalxıb, pəncərənin qabağına yüyürdüm. Heç kəs yox idi. Bəlkə bu mənim iztirablı xəyallarımın bir aldanışı idi.

Nazxanım yanıma gəlib soruşdu:

– Nə olub, nəyə baxırsan?

– Heç nə. Pəncərənin qabağından kim isə keçdi. Gedək.

– Gedək. Sən həmişə dərdli adamlar kimi çalırsan.

– Sən Allah, elə demə. Mən yazıq hələ nə görmüşəm ki, nə dərd çəkim, – deyə zarafata saldım.

Belə anlarda o mənə qəribə bir şübhə ilə baxırdı. Bir qədər yanımda qalandan sonra ayağa qalxdı:

– Gecən xeyrə qalsın.

– Xeyirə qarşı get.

O getdi. Mən də öz otağıma gələrək, qapını bağlayıb pəncərəni açdım. Xeyli zaman dayanıb aydınlıq çöllərə baxdım. Heç kəs yox idi.

Qurbağalar hey quruldayırdı. Gecə xoş sükut içindəydi. Mən heç kəsi gözləmirdim. Mənim heç kəsdə gözüm yox idi. Mən yatmaq istəyirdim. Bayır aydınlıq olsa da, otağım qaranlıq idi. Mənim isə, həmişə qaranlıqda ürəyim sıxılır. İşığı yandırıb çarpayıma baxdım. O mənə lal bir yadlıq, bir soyuqluq təlqin etdi. Soyunmaq əvəzinə "Faust"u götürüb oxudum:

Mənə rahatlığımı qaytarmaq üçün, əgər,
Yorğun təbiətdə də yoxdursa əlac, kömək,
Demək ki, çarə yoxdur, bitməyəcək bu kədər,
Heç bir ümid yolu da mənimçin yoxdur, demək!

Sanki birdən-birə bütün vücuduma yorğunluq gəldi və mən taqətsiz halda stula yıxılıb gözlərimi yumdum. Vücudumda hər cür fikirdən, dərddən, qəmdən uzaq elə xoş bir uyuşuqluq var idi ki, qımıldanmaq belə istəmirdim. Eyni ilə körpəlikdə olduğu kimi, mənasız iztirablarla dolu bir yuxunun yavaş-yavaş məni apardığını hiss edirdim. Nə qədər zaman keçmişdi, bilmirəm, birdən qəribə pıçıltı ilə adımın çağırıldığını eşidərək, diksinib gözlərimi açdım, kitab əlimdən düşdü.

O, pəncərənin qabağında dayanıb mənə baxırdı.

– Qorxmadınız ki?

– Yox, qorxmadım. Niyə bayırda dayanıbsınız, gəlin içəri.

– Gecdir. Bəlkə siz yatmaq istəyirsiniz.

– Mən yuxumu aldım.

– Elə şirin yatmışdınız ki...

– Siz məni utandırdınız.

– Nə üçün?

– Deyirlər mən həmişə ağzıaçıq yatıram.

O, gülümsədi. Bir neçə il qabaq məni rəqsə dəvət edən o gənc leytenant kimi gülümsədi.

– Gəlin içəri.

Səsimdəki həyəcan məni qorxudub utandırdı. O, binanı hərlənib gələnə qədər, özümü ələ alaraq, sakit və nəzakətli təbəssümlə qapını açdım.

– Əyləşin. Sizin üçün çay dəmləyim?

– Sağ olun, lazım deyil.

– Nə üçün bikefsiniz?

– Mən həmişə qaraqabağam.

– Düz demirsiniz. Siz o vaxt Gəncədə heç qaraqabaq adama oxşamırdınız.

– Hər yaşın bir xüsusiyyəti var.

Qısa sükut.

Ciddi və nəcib bir görünüşlə soruşdu:

– Siz o gecənin səhəri vədələşdiyimiz yerə gəldinizmi?

– Bəli, gəldim.

– Yəqin ki, hirslənib getdiniz.

– Xeyr, hirslənmədim.

– Sizdən ayrılan gecə məni çox uzaq bir səfərə göndərdilər. Hərbi işdə belə gözlənilməyən hallar olur. Sizin ünvanınızı, familiyanızı bil-

mədiyimdən, məktub qoya bilmədim. Səkkiz aydan sonra qayıdıb Gəncədəki uşaq evlərinin hamısını gəzdim. Nəhayət, vaxtilə siz olan evi tapdım. Dedilər Leninqradda, dağ mədən institutunda oxuyursunuz. İnstitutun direktorluğuna məktub yazıb, ünvanınızı istədim. Cavab gəldi ki, xəstə olduğunuz üçün institutu tərk edib Azərbaycana qayıtmısınız. Bir neçə günlüyə icazə alıb Bakıya getdim. İnstitutların hamısını gəzdim, ancaq, doğrusu, teatr institutu heç ağlıma gəlməyib...

"Eh, Murad, Murad... Siz çox şeylər edə bilərdiniz. Lakin mən sizdən incimirəm."

– Çox sağ olun. Görünür, yaxşı dost imişsiniz.

–...

– Niyə söhbət eləmirsiniz?

– Siz o gecədən sonra heç məni yada salırdınız?

– Tələbəlik həyatını bilirsiniz. Adamın başı o qədər qarışır ki, bəzən öz adı da yadından çıxır.

– Tüstüdən acığınız gəlmir ki?

– Xeyr, uşaqlıqda həmişə qoca nənəmin papirosunu mən yandırardım.

– Amma mən sizi çox tez-tez xatırlayırdım. Heç yadımdan çıxmırdınız...

"Mən isə əzab çəkirdim. Uşaq evindəki mürəbbimizdən icazə alıb, kitabxanaya gedərkən, küçələri bir-birinə vurub səni axtarırdım. Bir saatın içində o qədər gəzirdim, o qədər yerə baş vururdum ki, ayaqlarım qabar atırdı."

– Ola bilər... Bir dəfə mən də Gəncədəki yoldaşlarımdan birigildə bir oğlan görmüşdüm, indinin özündə də gözümün qabağındadır.

– Kim idi o oğlan?

– Leytenant idi. Cavan bir leytenant.

– Adı nə idi?

– Adını unutmuşam.

– Gərək unutmayaydınız.

– Nə üçün?

– Hiss edirəm ki, o gənc leytenant çox xoşunuza gəlirmiş.

– O barədə heç fikirləşməmişdim. Bir dəfə görməklə adam haqqında necə mühakimə yürütmək olar?

– Mühakimə nə üçün? İnsanı hiss etmək, duymaq lazımdır. Mühakimələrsə çox zaman birtərəfli olur. Bəzən sən, nə isə, yaxşı bir iş

görmək istəyirsən. Ancaq səni qova-qova namərd edirlər. Ürəyinə tikan batırırlar. Dünya işığını sənə haram edirlər. Heç nədən xəbəri olmayan başqaları isə, qabaqlarında çay, oturub əsnəyə-əsnəyə səni mühakimə edirlər. Qiyabi olaraq sənə pislik damğası vururlar. Dünyada belə mühakimələrdən də ədalətsiz bir iş təsəvvür etmək mümkündürmü?

"O, kimi nəzərdə tuturdu? Özünümü? Mənimi?"

– Doğrudur. Elə hallar olur. Ancaq yenə də hər şey bizdən asılıdır.

– Nə cür?

– Biz ürəyimizin, vicdanımızın səsini eşidib, səbrlə yolumuza davam etməliyik. O zaman gec-tez həqiqət meydana çıxar. Yaxşılıq elə, balığı at dəryaya, balıq bilməsə, xalıq bilər.

"Bu nədir? Mən əməlli-başlı öyüd-nəsihət verirəm. Mənim ki, belə şeylərdən zəhləm gedərdi..."

– Xalıq bilənəcən bizimki də bizə dəyir.

– Nə olar? Qoyun dəysin!

– Başınıza gəlməyib, bilmirsiniz.

– Sizin başınıza gəlib?

– ...

– Deyəsən, mənim sualım bir az yersiz düşdü. Bağışlayın.

– Nə üçün üzr istəyirsiniz, siz məndən hər şeyi soruşa bilərsiniz.

– Təşəkkür edirəm. Bu çox böyük etimaddır.

O, yerində səbrsiz bir hərəkət etdi.

– Sən Allah, mənimlə bu cür rəsmi danışmayın.

– Sizə elə gəlir. Mən rəsmi danışmıram. Əksinə, mən istəyirəm biz səmimi ürək dostları olaq. Mən buradakı adamların hamısından qabaq sizi tanımışam. Ona görə də, sizi özümə bir qardaş kimi yaxın hiss edirəm.

Axırıncı sözləri deyərkən özümdə elə halsızlıq hiss etdim ki, sanki o sözlərlə bərabər, canım da ağzımdan çıxırdı.

O, üzümə ani bir nəzər salaraq, heç nə demədi. O susurdu. Eynilə bayaq aydınlıq içində gördüyüm o adam kimi susurdu. Nəhayət, ayağa qalxaraq:

– Gecəniz xeyrə qalsın, – deyib qapıya sarı yönəldi.

Mən də heç bir söz deməyərək, daha doğrusu, demək iqtidarında olmayaraq, onun ardınca çıxdım. Eyvanda ayaq saxladı:

– Siz gəlməyin, qayıdın, – dedi.

Lakin mən qayıtmadım. Mən onun qarşısında dayanmışdım. Lal, mat dayanmışdım. Kənd yuxudaydı. Qurbağalar susmuşdu. Hərdən xoruz banlayırdı. Düzənlikdən sərin yel əsirdi. Biz iki nəfər, eyvanın yarıqaranlığında qarşı-qarşıya dayanıb susurduq. Biz nə istəyirdik? Nəyi gözləyirdik?

– Gedin, Murad.

Mədəniyyət evinin səssizliyi içində pıçıldadığım bu sözlərdən vücudum titrədi. Sanki bütün qızlıq duyğularım üsyankar bir həyəcanla təlatümə gəldi. Dodaqlarım qurudu.. Yanaqlarım od tutub yandı. Mən iqtidarımın əldən getdiyini hiss edərək:

– Gedin, Murad, – deyə təkrar pıçıldadım.

Lakin o, yerindən tərpənməyərək, qəmli qara gözləri ilə mənə baxırdı.

"Ah, doğrudanmı, mən özümü saxlaya bilməyəcəyəm? Doğrudanmı, mən bu saat onun ağuşuna yıxılacağam? Doğrudanmı, mən bu qədər gücsüzəm? Doğrudanmı, mən məhv oluram? Yox, bu ola bilməz".

Mən iki əlimlə onun əlindən tutaraq, son gücümü toplayıb təkrar etdim:

– Gedin, Murad.

Nəcib insanlara eşq olsun...

O, iri və qüdrətli əlini mənim əllərimdən yavaşca çəkərək, heç bir söz demədən getdi. O, gözdən itənə qədər bədənim uçuna-uçuna ardınca baxdım. Sonra dönüb otağıma getdim, soyunmadan çarpayıma yıxılıb, əllərimlə gözlərimi qapadım. Mən utanırdım. Özüm-özümdən utanırdım. Mən ancaq yatmaq istəyirdim.

O gecə səhərə qədər Səadəti yuxuda gördüm. Görürdüm ki, biz çayda çimirik. Çay isə, gah dönüb Söyüdlü arx olur, gah da düz-dünya suya çevrilib, gur günəş işığında gözümüzü qamaşdırır. Mən yüzlük elektrik lampasını yana-yana qoyub yatmışdım.

..."Don Kixot"la "Molla Nəsrəddin"in sorağı kəndə yayılmışdı. İşdən sonra adamlar orada-burada toplaşaraq, ya Söyüdlü arxın Quzey qışlağa qədər uzadılması barədə söhbət edir, ya da Kərəmlə onun dostunun Don Kixotdan, "Molla Nəsrəddin"dən danışdıqları əhvalatlara qulaq asıb gülüşürdülər. Şofer Almurad, poçtalyon Pirverdi, İmi ilə Cimi də kitabxanaya gəlib "oxumalı bir şey" istəyirdilər. Səriyyə mənim məsləhət bildiyim kitabları tapıb onlara verirdi. Hətta, qız-gəlinlər də gəlib kitab götürməyə başlamışdılar. Beləliklə, oxucularımızın sayı artırdı. Söyüdlü arx haqqındakı iclasdan qabaq, Nəriman əminin tə-

şəbbüsü ilə artel poçtalyon Pirverdiyə bir motosikl almışdı. İndi o hər gün stansiyadan təzə qəzet və jurnallar gətirirdi. Axşamlar yalnız cavanlar deyil, yaşlı kişilər də axışıb mədəniyyət evinə gəlir, bəziləri tar dərnəyinin məşğələsinə qulaq asır, bəziləri də eyvandakı skamyalarda oturub, papiros çəkə-çəkə, mənim qəzetlərdən oxuduğum xəbərləri dinləyirdilər. Sonra da siyasət aləmindən, dünyanın işlərindən mənə cürbəcür suallar verirdilər. Qəzetin müəyyən bir yerini başa düşmədikdə, təkrar oxudurdular. Mən də onların sadə, mehriban münasibətlərindən ruhlanaraq, bütün suallarına həvəslə cavab verirdim. Mən quru rəsmiyyətçiliyə nifrət elədiyim üçün hər şeyin ailədəki kimi səmimi, təbii olmasına çalışırdım; yeri gəldikdə, onlarla birlikdə zarafat edir, qəhqəhə çəkib gülürdüm. Oxuduğum əsərlərdən məzəli səhnələr danışırdım. Məni öz adamları sandıqlarından, gah soruşur, gah xahiş edirdilər:

– Nuriyyə bacı, bir oxu görək qəzetdə nə yazılıb.

– Nuriyyə bacı, sən Allah, bir az o pianonu dınqıldat.

– Nuriyyə bacı, sən Allah, Don Kixotun yel dəyirmanı ilə davasını danış.

Bütün bunlar, bu münasibət məni sevindirir, mənə təsəlli verirdi. Məni öz-özümlə tək qalmağa qoymurdu.

Mədəniyyət evindəki işlərimdə ən yaxın köməkçim, şübhəsiz, Qulu idi. Bu balacaboylu adamda tükənməz həyat eşqi var idi. Onun civə kimi daim hərəkətdə olan kiçik qara bəbəkləri hey o yan-bu yana qaçaraq, sanki, nə isə, təzə və şən bir şey söyləmək istəyirdi. Qulu gələn kimi məclis canlanır, adamlar gülümsəyirdilər. O da gah sağ, gah da sol ayağını irəli qoyaraq, görüb eşitdiklərini nəşə ilə danışardı. Son zamanlarda yalnız Nəriman əmini soruşanda, mühasibin üzü küt bir kədər və ciddiyyət ifadə edirdi. Elə bil, özünün belə, anlayıb dərk edə bilmədiyi nəyi isə səndən gizləyirdi.

Hər axşam işdən sonra mədəniyyət evinin qabağında yığışan gənclərin deyib-gülmələri, zarafatları mənə xüsusilə xoş gəlirdi. Bu zarafatların mərkəzində həmişə Kərəmlə poçtalyon Pirverdi olurdu. Kərəm ona sataşır, Pirverdi isə, bəzən tutarlı cavablar verir, bəzən də gurultulu qəhqəhələr altında qıpqırmızı pörtərək pərt olub özündən çıxırdı. Bununla bərabər, onların həmişə himi-cimi bir idi.

Şofer Almurad isə, oğrun baxışları, eyhamları ilə bizim Nazxanıma göz verib, işıq vermirdi.

Beləliklə, günlərimiz olduqca şən keçirdi. Lakin Güney qışlaqdakı həyatımda baş verən ilk fırtınalar məni birdən-birə çox çətin vəzifələr qarşısında qoydu. Ələsgər dayı Miçurinin kitabını tapıb göndərmişdi. Mən, səbəbini özüm də bilmədən, onu bir neçə gün evdə, çarpayımın yanındakı stolun üstündə saxladım. Murada göndərəcəyim bu kitab mənim üçün dönüb canlı bir məxluq olmuşdu. Evə girəndə, birinci onu görürdüm. Daha doğrusu, ona baxırdım. Evdən çıxanda, canım onun yanında qalırdı. Gecələr yatağıma uzananda, onu götürüb gah oxuyur, gah da nəzərdən keçirirdim.

Nəhayət, bir gün kitabı səliqə ilə qəzetə büküb Pirverdidən xahiş etdim ki, Murada çatdırsın. Bir saatdan sonra Pirverdi motosiklini tüstülədə-tüstülədə xəbər gətirdi ki, "özü evdə yox idi, verdim Səadətə..."

Bu sözləri deyərkən, poçtalyonun gözlərində, nə isə, ciddi, tutqun bir şey hiss elədim. Təxminən üç-dörd saat sonra bir oğlan uşağı kitabı mənə qaytarıb, bir söz demədən getdi.

Mən təəccüb içində kitaba baxıb, heç bir şey başa düşmürdüm. Nə üçün Murad onu geri qaytarsın? Mən ki, bir pis iş görməmişdim.

Axşamçağı Qulu mədəniyyət evinə gəldi. O, məzəli bir kədərlə üzümə baxır, nə isə demək istəyir, lakin susurdu. Bir sövqi-təbii ilə ondakı bu halın mənimlə əlaqədar olduğunu duyaraq:

– Niyə bikefsən, Qulu? – deyə soruşdum.

O, tələsik cavab verdi:

– Heç...

– Yenə...

Bu dəfə "ah" çəkdi:

– Heç..

– Deməsən, inciyərəm. Sözlü adama oxşayırsan.

– Eh, bu burjuaziya qalıqlarını məhv edənəcən bizimki bizə dəyəcək.

Ürəyimin döyünməsinə baxmayaraq güldüm:

– Burjuaziya qalıqları yenə nə eləyib?

– Əşi, heç nə.

– Demək, mənə etibar eləmirsən, çox sağ ol...

– Axı, deməli sözdür ki, deyəsən.

– Hər nə olursa-olsun, biz dostuq. Dost dostdan heç bir şey gizlətməməlidir.

– Elədir.

O, sanki cəsarətə gəlib döşünü qabartdı:

– Ancaq, Nuriyyə xanım, sən mənim ölmüşüm, gərək ürəyinə salmayasan.

– Dərdimin odu yox idi ürəyimə salım. De görüm, nə olub?

– Bilirsiniz, sizin o kitabı göndərməyiniz böyük qalmaqala səbəb olub.

Rəngimin ağardığını hiss etdim, lakin yenə də qayğısız ifadə ilə soruşdum:

– Nə qalmaqala?

– Səadət evdə qab-qacaq qoymayıb, hamısını vurub sındırıb. Ağabəyimlə gedib çıxmasaydıq, Allah bilir, neyləyəcəkdi.

– Axı, nə üçün? Kitabın təqsiri nədir?

– Heç nə. Burjuaziya qalığıdır da... Deyir niyə o kitabı sənə Nuriyyə göndərib.

– Bəs, Murad nə dedi?

– Nə desin, yuxarı baxır, bığ, aşağı baxır, saqqal, qalıb məəttəl. Ayrılsın, nə cür ayrılsın, uşağı var, camaat var, ayrılmasın, neyləsin?

– Eybi yoxdur, Qulu. Səninlə mən filosofuq, – deyə həmişəki zarafatımı təkrar etdim. – Filosof gərək belə şeylərə dərindən baxsın.

– Elədir, – deyə ciddiyyətlə təsdiq etdi.

Mühasib çönüb idarəyə yollandı. Mən heç bir şey düşünməmək üçün tar dərnəyinin məşğələsi gedən otağa keçdim. İmi uşaqlara azərbaycanlılarda ən şən oyun havası olan "Bağdaduri" öyrədirdi.

...Həmin axşam isə belə bir məktub aldım:

*"Nuriyyə xanım!*

Sizdən min dəfə üzr istəyirəm. Mən həyatımın necə bir faciə olduğunu sizə demişdim. İndi görün ki, bəzən adamlar uğursuz bir səhv ucundan nələr çəkirlər. Başqa nə deyə bilərəm?! Sağ olun. Zəhmətinizə qarşı təşəkkür edirəm.

*Hörmətlə: Murad".*

Bu sətirləri oxuyub qurtarandan sonra özümü o qədər pərişan və ümidsiz hiss elədim ki, elə bil, birdən-birə dünya gözlərimdə sarı rəngə boyandı. Elə bil, məni həyata bağlayan iplər bir anda boşaldı. Çünki nə mən xoşbəxt idim, nə o, nə özümə bir gün ağlamaq iqtidarındaydım, nə ona. Nə özümə bir təsəlli tapırdım, nə də ona.

...Nəriman əmi Söyüdlü arx haqqındakı yığıncaqdan sonra evdən çıxmırdı. Axşamçağılar mədəniyyət evinin qabağında bu barədə qızğın mübahisələr gedirdi.

– Kişinin inciməyə haqqı var. Quzeylilər başımızı tovlayıb istədiklərini elədilər.

– Biz paxıl camaat deyilik. Qoy onların da əli çörəyə çatsın. Yazıqların ayrı yerdən su gətirməyə imkanları yox adi. Nəriman düz eləmirdi. Bu iş gərək çoxdan olaydı.

– Ə, Nəriman hər nə eləyib bizimçün eləyib. Niyə indi tanrınıza təpik atırsınız?

Kərəmlə Pirverdi də ağız-ağıza verib deyirdilər:

– Heç kəs Nərimanın haqq-sayını itirmir. Ancaq, əgər, sən-mən istəyiriksə, iş ədalətlə getsin, onda gərək atamızın da səhvini qulaq ardına vurmayaq.

– Ay sağ ol! Bax, əsl söz budur.

...Bir axşam eyvanda dayandığımız zaman kənddən aralı bir neçə yerdə ocaq yandığını görüb, onların nə olduğunu Nazxanımdan soruşdum.

– Quzeylilərdir, – dedi, – yəqin özlərinə çay-çörək hazırlayırlar. Söyüdlü arxın gerisini qazmağa gəliblər.

Mən anlaşılmaz həyəcan və sevinc içində:

– Bu lap əsgər düşərgəsinə bənzəyir, – dedim. – Gəlsənə gedək tamaşa eləyək.

– Nə olar, gedək.

Eyvandan düşüb işıqlar gələn tərəfə üz tutduq. Söyüdlü arxın Güney qışlağa buruldduğu yerdə mən Nazxanımın əlindən tutaraq:

– Dayan, – dedim, – o yana getmək lazım deyil.

– Nədən çəkinirsən, hamısı tanış adamlardır.

– Yox, onsuz da buradan görürük.

Biz arxın yanında dayanıb söyüd budaqları arasından quzeylilərin düşərgəsinə tamaşa edirdik. Yüzlərlə adam üç-bir, dörd-bir əyləşib ocaqların işığında kimi çörək yeyir, kimi çay içir, kimi danışıb-gülür, kimi çəkici dəmirə döyəcləyərək nə isə düzəldirdi. Nazxanım dedi:

– Yazıqlar sevinirlər. Ancaq sədrləri yaman bikefdir.

Murad balaca bir yamacda arxası üstə uzanaraq, əllərini başının altında çarpazlamışdı. Yaxındakı ocaqdan düşən işıq onun səmaya zillənmiş fikirli gözlərini, solğun çöhrəsini işıqlandırmışdı.

– Ə, Murad, durub çaydan-zaddan içsənə! Səhərdən nə dünyanın haqq-hesabını çəkirsən! – deyə bir kişi mis çaydanı ocaqdan götürüb, onu səslədi.

Sədr dinmədi.

– Yazıq yaman bikefdir, – deyə Nazxanım təkrar etdi.

– Yazıq niyə olur?

– Evdə günü qaradır.

– Eybi yoxdur. Ər-arvad arasında söz-söhbət olar.

– İnsafən, Səadət heç qızlığında belə deyildi.

– Nə cür idi?

– Deyib-gülən, sənin, mənim kimi zarafatcıl. Özünü də neçə yerdən istəyirdilər. Deyirdilər Bakıda bir nazir müavini onun dərdindən dəli-divanəymiş, heç kəsi bəyənmədi, Muradı seçdi. İndi də belə eləyir.

– Bəlkə Səadətin qısqanmağına bir səbəb var?

– Nə səbəb olacaq, bəyəm, yazıq Muradın aşnası-zadı var?

Kürəklərimin arasından soyuq bir gizilti keçdi. Mən "aşna" sözünə nifrət edirəm.

Xəfif yel söyüdlərin yarpaqlarını üzümüzə toxundururdu. Qurbağalar səslənirdilər.

O isə, səmada uçuşan ulduzlara baxırdı. Onun gözləri qapqara və kədərli idi.

– Gedək, Nazxanım.

– Gedək.

...Mən o səhər həmişəkindən tez qalxdım. Quzeylilərin düşərgəsindən səslər gəlirdi. Bəzən maşın fiti eşidilirdi. Bəzən də motosikl səslənirdi; onun gurultusu uzaqlaşanda, mən otaqda dərin bir yalqızlıq hiss edərək, yoldaşlarımın gəlmələrini səbrsizliklə gözləyirdim. Qulu, adəti üzrə, hər səhər işə gedərkən mədəniyyət evinə baş çəkərdi. Bu gün də, qoltuğunda portfel, gəlib Söyüdlü arxa tərəf başı ilə işarə edərək:

– Bizimkilər başlayıblar, – dedi.

– Bilirəm.

– Hümmət söz verib ki, rayondan ekskavator da göndərsin.

Azca sonra İmi ilə Cimi də gəlib çıxdı.

Cimi:

– Nuriyyə xanım, – dedi, – biz bir təşəbbüs qaldırmaq istəyirik...

Qulu pıqqıldayıb əli ilə ağzını tutdu.

– Nə təşəbbüsdür? – deyə mən də bilaixtiyar gülümsədim.

İmi nəzərlərini yerə dikərək, kirpiklərini tez-tez qırpmaqdaydı. Cimi, Qulunun gülməyinə əhəmiyyət verməyərək davam etdi:

– Bilirsiniz ki, biz güneylilər böyük vətənpərvərlik edərək, Söyüdlü arxın Quzey qışlağa qədər uzadılmasına icazə vermişik.

İmi ləyaqətli bir əda ilə dostunun sözünü kəsdi:

– Ay Cimi, onlar hamısı məlumdur, müxtəsər elə.

– Müxtəsəri odur ki, bu gün böyük tarixi bir işə başlayan quzsylilərə mədəni xidmət eləyək.

– Nə cür?

– Elə lap işin üstündəcə onlara bir konsert verək.

– Ay sağ ol, – Qulu şəhadət barmağını yuxarı qaldırdı. – Bax, bu təşəbbüsünüzə varam.

İmi yalnız indi gözlərini qaldırıb mənə baxaraq izah etdi:

– Bilirsinizmi, Nuriyyə xanım, deyirik qoy rayon təşkilatları da, mərkəz də görsün ki, Güney camaatı öz qonşularına su da verir, mədəni xidmət də göstərir.

– Qoy görsünlər ki...

– Cimi, məlumdur, – İmi burnunu qırışdırdı.

– Nə olar, pis təşəbbüs deyil, – deyə mən laqeyd ifadə ilə cavab verdim. – Onsuz da, biz onları mədəni şefliyə götürmək istəyirik.

– Şeflik ayrı, bu ayrı. Biz arxımızın suyunu çəkib aparanlara, üstəlik, konsert də veririk. Heç bilirsinizmi bu nə deməkdir?

İmi əlini yellədi:

– Cimi, məlumdur.

Lakin Cimi davam edirdi:

– İmi bizim bu təşəbbüsümüzü mərkəzi mətbuata da yazacaq...

Biz elə oradaca quzeylilər üçün verəcəyimiz konsertin proqramını tutduq.

İki gün məşq eləyəndən sonra İmi alabəzək hərflərlə böyük bir afişa yazdı, onu səliqə ilə taxtaya yapışdırandan sonra aparıb quzeylilər işləyən yerdə söyüd ağacına vurdu. Afişanın lap baş tərəfində "Dostlara alovlu salam!" sözləri yazılmışdı.

Axşam sərin düşəndə İmi, Cimi, Səriyyə, mən, bir də Nazxanım yığışıb, tarlı-qavallı, getdik quzeylilərin düşərgəsinə.

Kəndlilər işdən sonra dincəlirdilər.

Artel sədri üzünü taraş etdirmiş və boynu nişastalı ağ köynək geyinmişdi. Mən onunla, aramızda heç bir şey olmayıbmış kimi, şən və sərbəst görüşdüm. O bərkdən:

– Nuriyyə xanım, – dedi, – nə yaxşı gəlmisiniz! Sizin konsertinizə qulaq asmaq hamımızın ürəyindən keçirdi.

Sonra zarafatla əlavə etdi:

– O gecəki konsertinizdən sonra əməlli-başlı şöhrət qazanmısınız.

Mən də eyni zarafatla cavab verdim:

– Belə gözəl kompliment üçün sizə təşəkkür edirəm. Bizim bura gəlməyimizin təşəbbüskarı İmi ilə Cimidir.

Kim isə:

– Ə, vallah, kişilərin ruhu var, – dedi.

Digəri soruşdu:

– Bəs, Qulu "Məşədi İbad"da oynamayacaq?

– Qulunun əvəzindən üzr istəyirəm, – dedim. – Vacib işi olduğu üçün gələ bilmədi.

Mazuta batmış kepkasını yan qoyaraq, əlində tüstülənən bahalı papiros tutmuş nazik qarabığlı bir oğlan mənə işarə ilə:

– Bəs, bacı oxumayacaq? – deyə yoldaşına göz vurdu.

Mən onun hərəkətini görməməzliyə vuraraq gülümsəyib:

– O barədə fikirləşərik, – dedim.

Sonra Murada müraciətlə soruşdum:

– Gecə burada ilandan qorxmursunuz?

Gülüşdülər. Murad özü də gülümsəyərək:

– Yorğun olduğumuz üçün yerə uzanan kimi yuxuya gedirik, – dedi, – oyaq qalsaq, bəlkə də, qorxarıq.

Mazutlu kepkasını yan qoyan oğlan yoldaşına xitabən bərkdən:

– Sən ölməyəsən, – dedi, – bayaq aşağı tərəfdə bir gürzə gördüm, uzunluğu, yalan olmasın, düz iki metr olardı.

– Oy! – deyə mən ilandan qorxmuş adam rolunu elə oynadım ki, Murad mənim həqiqətən bərk qorxduğumu zənn edərək oğlana sərt bir nəzər saldı.

Oğlan dərhal ciddi görünüş aldı, lakin Murad üzünü çevirəndə, o yenə də yoldaşına göz vurub, çiyinlərini qısa-qısa güldü. Bu adamların hamısı mənə təəccüblü dərəcədə yaxın və doğma görünürdü. Hamısına qanım qaynayırdı. Hamısının üzünə gülümsəmək, xoş bir söz demək istəyirdim.

– İcazə verirsinizmi konsertimizə başlayaq?

– Buyurun, buyurun, – deyə yerbəyerdən səsləndilər.

– Başladığınız böyük iş üçün sizi təbrik edirəm. Gün o gün olsun ki, Quzey qışlağın Söyüdlü arxı altında yaxşı bir şadyanalıq eləyək.

– Sağ ol, çox sağ ol.

Mən zarafatyana bir ifadə ilə davam etdim:

– Su xoşbəxtlikdir, su aydınlıqdır.

– Düzdür, sağ ol.

– Günlər, illər gəlib keçəcək, Söyüdlü arx həmişə güneylilərlə quzeylilərin ürəkləri arasında yol salacaq.

Arxasını dolu çuvala söykəmiş yaşlı bir kişi:

– O vaxt, – dedi, – Nəriman da indiki əməlindən peşman olacaq.

– Söyüdlü arx bütün acıqları, kədərləri yuyub aparacaq, onun suyu ilə boy atmış ağacların kölgəsində gənc analar uşaqlarına layla deyəcək. Acıqlanmış cavan ərlər arvadlarını əfv edəcək, günlər də Söyüdlü arx kimi sülh ilə, mehribanlıqla axıb gedəcək, çünki su xoşbəxtlikdir, su aydınlıqdır!

– Yaxşı deyirsən, bacıqızı, de gəlsin, – kürəyini dolu çuvala söykəyən kişi dərindən nəfəs aldı.

– Gecələr Söyüdlü arxda ulduzlar çiməcək. Ay işığında yuxulu yarpaqlar suya zərif kölgə salacaq. Quzey qışlaqda qurbağaların şən səsləri eşidiləcək. İndi ürəklərə əzab verən gizli dərdlər də o zaman xoş xatirələrə çevriləcək. Çünki su xoşbəxtlikdir, su aydınlıqdır!

– Vallah, sağ ol!

– O qurbağanı yaxşı dedin.

– İndiyəcən eşitdiyimiz cırcırama səsi olub.

– Qapılarda cavan çinarlar qalxacaq. Alma, armud çiçəkləri arasında quşlar yuva salacaq. Söyüdlü arxın kənarında bitən yarpızlar hər tərəfə ətir saçacaq. Onların üzərində əlvan böcəklər uçuşacaq. O zaman saçları ağarmış atalar bığ yerləri təzəcə tərləyən gənc oğullarına baxıb, iftixarla köks ötürəcəklər. Çünki su xoşbəxtlikdir, su aydınlıqdır.

– Sən ölmüyəsən, ürəyim birtəhər oldu, – deyə arxadan kimsə dilləndi.

Kepkasını yan qoyan oğlan lap qabaqda bardaş qurub oturmuşdu, o daha zarafat etmirdi, ağzını azca ayırıb dərin maraqla qulaq asırdı.

– İndi isə, bizim hörmətli sazəndələrimiz "Bağdaduri" çalacaqlar. Əvvəla, xahiş edirəm, əl vurasınız. İkincisi, kimin sümüyünə düşsə, durub oynasın.

Gülüşüb əl vurdular.

İmi ilə Cimi çalmağa başladılar.

– Ə, cavanlar, niyə ayağa durmursunuz, – deyə arxasını çuvala söykəyən kişi yerindən dilləndi.

Kepkasını yan qoyan oğlan, bunu gözləyirmiş kimi, qalxıb oynamağa başladı.

– Sağ ol, ə, Qaqaş.

– Ay namərd.

– Ayaqlara bax!

– Elə bil, zalımın sümüyü yoxdur.

Qaqaş, həqiqətən, qəşəng oynayırdı. Onun hərəkətləri ahəngdar, gözəl və mərdanə idi. Şit deyildi. Onun oyunu tükənməz həyat qüvvəsi və igidlik ifadə edirdi.

O, hərdən başını qaldırıb yoldaşlarına baxaraq, elə nəcib bir qürurla gülümsəyirdi ki, elə bil, heç bayaq məni dolamaq istəyən oğlan deyildi. Murad diqqətlə oğlanın ayaqlarına baxırdı. Sanki onun nə dərəcədə düzgün oynadığını təyin etmək istəyirdi. "Bağdaduri"dən sonra Səriyyənin oxuduğu "Qarabağ maralı"na qulaq asdılar. Sonra Qaqaş ayağa durub, məndən xahiş etdi ki, gülməli bir şey danışım: "O Güney qışlaqdakı kimi..."

– Baş üstə, – dedim, – heç sənin kimi oğlanın sözünü sındırmaq olar?

Hamı gülüşdü. Murad da gülümsəyib Qaqaşa baxdı.

Təbiətimdəki azacıq yumor qabiliyyətinə görə taleyimdən çox razı idim. Bu mənə xeyli kömək edirdi. Yalnız səhnədə deyil, həyatın özündə də...

– Bizim hörmətli klassikimiz Cəlil Məmmədquluzadənin "Quzu" hekayəsini danışmaq istəyirəm.

Qaqaş yoldaşlarına tərəf dönərək:

– Məktəbdə oxumuşam, ləzzətli şeydir, – dedi.

Mən "Quzu" hekayəsini qabaqcadan düşünüb hazırladığım qaydada nağıl etməyə başladım. Məlum olduğu üzrə, bu kiçik hekayədə kələkbaz bir kəndlinin bütün gününü eyş-işrətdə keçirən xanı necə aldatdığı təsvir olunur. Bir gün kəndli görür ki, xanın evində qonaqlıqdır. Buna görə də, bir quzu götürüb aparır ki, bəlkə ağaya satıb bir xərclik alsın. Sərxoş xan quzunun əvəzində çıxarıb kəndliyə üç manat verir. Ancaq kəndli ağanın bərk kefli olmağından istifadə edərək, pul ilə bərabər quzunu da götürüb aparır. Sonra bir gün həmin kəndli eşidir ki, xanın evində yenə də qonaqlıqdır. Durub gəlir xanın qapısına. Keçən dəfə quzunun pulunu vermədiyini söyləyir və xan bərk kefli olduğundan yenə də ona üç manat verir. Beləliklə, bunu bir neçə dəfə təkrar edir.

Mən danışdıqca, həm kəndlinin, həm də xanın roluna girirdim. Ağanın kefli-kefli kəndlinin qabağında dayanaraq: "Nə pul? Nə quzu?" deməyini elə yamsılayırdım ki, hamı, hətta, Muradın özü də gülməkdən uğunub gedirdi.

Mən danışıb qurtarandan sonra xeyli müddət əl vurdular.

– Çox gülsəniz, dadı qaçar, – dedim, – indi də hamınızın dostu Cimi sizin üçün "Segah" oxuyacaq.

Özüm isə, gedib Nazxanımla Səriyyənin yanında oturdum. Fənərlər aralı olduğundan, yerimiz qaranlıq idi. Ona görə də, mənim özümü daim şən göstərməyə çalışmağıma daha ehtiyac yox idi, mən buradan hər bir kəsə istədiyim qədər baxa bilərdim. Yaxındakı fənər Muradın üzünün bir tərəfinə işıq salmışdı. Lakin işıq zəif olduğundan, onun gözləri iri, qara dairə kimi görünürdü. Bayaq mənim hərəkətlərimə onun necə ürəkdən güldüyünü dönə-dönə xəyalımdan keçirir, bir ana, bir bacı riqqəti ilə qaranlıqdan ona tamaşa edirdim.

"Segah" başlanan kimi onun üzü tutuldu. Elə bil ki, bu dəfə ona ağır bir əhvalat söyləyəcəkdilər. Lakin "Segah" həyatımızın bizə təsəlli olan əbədi ahəngindən danışırdı. "Segah" keçən dəfəki hekayətinə davam edərək, deyirdi ki, bütün insanlar kimi, sənin də öz səadətini istəməyə haqqın var. Lakin sən gecikmisən. O, artıq başqasınındır. İndi sənin öz səadətini geri qaytarmağın üçün bir başqasının ağır iztirabları, göz yaşları lazımdır. Lakin, yazıq Nuriyyə, sən bunu istəməzsən. Çünki o, anadır. Ana isə, Yer üzündəki məxluqatın ən əzizi, ən müqəddəsidir. Sən onun əzablarına dözməzsən, çünki o, anadır! Sənin bədənin möhkəmdir. Sən uşaqlıqdan qəm-qüssənin ağır yükünü daşımağa öyrənmisən, həyatının ağır günlərində taleyindən şikayət eləməmisən. Sən dözümlüsən. Bu, qaydadır: həyat özü həmişə dözümlülərin yükünü artırır.

Sən öz əzablarınla kimsəni incitməməyi bacarırsan. Sən aktrisasan. Lazım gələndə göz yaşlarını şən qəhqəhələrlə əvəz edə bilərsən. Sən böyük sevgi hicranının nə demək olduğunu duyub hiss etmisən. Sən cəfalar çəkmiş bir qızsan, Nuriyyə!..

"Segah"ın hekayəti bu yerdə sanki başqa bir fəslə keçmək üçün qırıldı, mən sıçrayıb ayağa qalxdım, kətilin üstünə qoyulmuş fənərin işığına gəlib gülə-gülə:

– Görünür, "Segah" o qədər xoşunuza gəlib ki, əl vurmaq da yadınızdan çıxıb.

Sanki yuxudan ayılaraq, bərkdən əl vurdular. Səriyyə də bir mahnı oxuyandan sonra:

– İndisə, – dedim, – sizə şirin yuxu arzu edirəm. Səhər tezdən günəş çıxacaq, siz sevinc içində qalxıb, Söyüdlü arxı qazımağa başlayacaqsınız.

Sonra, məxfi bir şey söyləyirəmmiş kimi, başımı azca qabağa əyərək, əlimi ağzıma qoyub mülayim bir təbəssümlə pıçıldadım:

– Çünki su aydınlıqdır, su xoşbəxtlikdir.

Bərkdən gülüşərək təkrar əl vurdular. Qaqaş ayağa qalxıb dedi:

– Ancaq bir təvəqqəmiz var.

– Buyurun.

– Xahiş edirik, bu axırıncı gəlişiniz olmasın.

– Yəni, konsertimiz xoşunuza gəldi? – mən sadədil, məsum bir qız ədası ilə soruşdum.

– Gəldi, gəldi, – deyə gülüşərək cavab verdilər.

Eyni məzəli sadədilliklə "ah" çəkərək:

– Xoşagəlmək elə yaxşı şeydir ki, – dedim. – Baş üstə, tez-tez gələrik. Ancaq, gərək siz də bizim mədəniyyət evinə gələsiniz.

– Orada nə var ki?

– Alma dolması, – deyə kimsə yavaşdan səsləndi.

Gənclərin qulağı bu sözü dərhal aldı, orada-burada pıqqıldayıb güldülər. Muradın qaşları çatıldı, o şit zarafat edən oğlana tərəf çevrilib, nə isə demək istədi. Lakin mən qanqaralığına yol verməmək üçün şən-şən:

– Bizim mədəniyyət evində hər şey var, – dedim, – tar, qaval, piano, çalan, oxuyan, gözəl-gözəl kitablar.

Murad ayağa qalxaraq yerlilərinə müraciətlə:

– Gəlin, – dedi, – əvvəlcə bu axşamkı konsert üçün Nuriyyə xanıma və onun yoldaşlarına təşəkkür edək. Sonra da, Qaqaş deyən kimi, xahiş eləyək ki, bizi yaddan çıxarmasınlar.

Alqış səsləri kəsiləndən sonra:

– Çox sağ olun, – dedim. – Tez-tez gələcəyik. Biz incəsənət adamları öz tamaşaçılarımızı asanlıqla yaddan çıxara bilmirik.

Səsimin titrədiyini hiss etdirməmək üçün gülümsəyərək əlavə etdim:

– O qədər də utancaq qonaq deyilik. Ancaq mən arzu edirəm ki, sizin Qaqaş da gəlib bizim konsertlərimizdə iştirak eləsin.

– Nə cür iştirak eləyim? – deyə Qaqaş təəccüblə soruşdu.

– İki-üç rəqs hazırlayarsınız, biz də onları repertuarımıza salarıq. Konsertlərdə çıxıb oynayarsınız, sizdə gözəl istedad var.

Gənclər yenə gülüşdülər.

– Nə var, ə? – deyə Qaqaş bərk acıqlandı. – Bacı, bir sözdür deyir, dayna. Elə mən o saat gedib artist olmadım ha.

– Artist olanda nə olar ki? Məgər, mən pisəm? – deyə zarafatyana soruşdum.

– Pis niyə olursunuz. Ancaq hərənin bir işi var...

– Siz arteldə nə iş görürsünüz?

– Bu bizim yaxşı traktorçularımızdan biridir, – Murad onun əvəzindən cavab verdi. – Siz bunun hələ başqa oyunlarını görməmisiniz. Görsəniz, əl çəkməzsiniz.

– Onsuz da mən əl çəkən deyiləm.

– Qaqaş, işin bitdi.

– Ə, artistlik pis deyil ki.

– Özüm ölüm, Qaqaşdan lap yaxşı artist çıxar, – deyə oradan-buradan söz atdılar.

Cavanlardan biri barmağını yuxarı qaldırıb:

– Bağışlayın, – dedi, – Qaqaşın da o Bakıdakı oynayanlar kimi xəncər-çuxası olacaq?

Qaqaş təhdidedici görünüş aldı:

– Özünü ələ sal, ə, Sülü, yoxsa, bilirsən ha.

Murad dedi:

– Sən bunlara qulaq asma, Qaqaş, yaxşı oynamaq da çalmaq, oxumaq, şer yazmaq kimi bir qabiliyyətdir. Vaxtın olanda get mədəniyyət evinə. Qoy Nuriyyə xanımın dəstəsində quzeylilərdən də bir nəfər olsun.

Kim isə yerindən dilləndi:

– Sonra güneylilərin acığı tutar.

– Acığımız niyə tutur, – deyə Nazxanım cavab verdi. – Siz kimsiniz, biz kimik.

– Doğrudur, – Murad onun sözünə qüvvət verdi. – Biz bir camaatıq.

Nazxanım dil açdı:

– Canım üçün, Murad, mən ömrümdə sizinlə özümüzə təfavüt qoymamışam.

– Bilirəm, vaxt gələr ki, suyumuz bir olan kimi, kəndlərimiz də birləşər. Aramızda elə bir uzun məsafə yoxdur.

Bir cavan oğlan dedi:

– Suyumuz olandan sonra hərə başlayacaq özünə təzə ev tikməyə. Bir də gördün gəlib çıxmışıq lap buralara.

Biz kəndlilərlə vidalaşdıq. Muradla Qaqaş bizi Söyüdlü arxın körpüsünə qədər ötürdülər.

– Daha siz zəhmət çəkməyin, – deyə mən ayaq saxladım.

Elə bu zaman, göydən düşmüş kimi, Səadət qaranlıqdan çıxıb bizə yaxınlaşdı.

– Nə olub, haradan belə? – deyə Murad acıqla soruşdu.

– Yoxsa, sizin konsertinizə başqaları qulaq asa bilməz.

– Səadət bacı, gecikmisən, – deyə Qaqaş sadəlövhlüklə gülümsədi.

– Eybi yoxdur. İkinci dəfə vaxtında gələrik.

Murad mülayim səslə dedi:

– Axı, gecə vaxtı dörd-beş kilometr yolu pay-piyada...

– Yolda motosiklli bir oğlana rast gəldim. Saxlayıb məni də tərkinə götürdü.

Qəflətən başına toxmaq dəymiş adam kimi gözlərim qaraldı. Biz düşərgədə olduğumuz müddətdə yoldan heç bir motosikl-zad gəlib keçməmişdi. Oxun haraya atıldığı aydın idi. Mən özümü ələ almaq, ona xoş bir söz demək istəyirdim. Ürəyimə hücum edib məni öz hökmü altına almağa çalışan kin və qəzəb dalğaları qarşısında mərdanəliklə dayanmağa, təslim olmamağa cəhd edirdim. Məni qova-qova namərd etmək istəyirdilər. Lakin mən əsirliyə, köləliyə hər şeydən çox nifrət edirdim. Mən bu ulduzlu göylərə, bu qaranlıq çöllərə, yoldaşlarımın və dünyada mənim üçün əziz olan bir adamın üzünə azad baxmaq istəyirdim.

Murad:

– Xudahafiz, Nuriyyə xanım, – deyə bizdən ayrılaraq arvadı ilə getdi.

Güney qışlaq kəndinin girəcəyində İmi ilə Cimi də öz evlərinə döndülər. Nazxanımla mən Səriyyəni aparıb ötürdük.

Nazxanımı od götürmüşdü:

– Sən bir bunun hirsinə-hikkəsinə bax! Adama “xoş gördük” də demir.

– O demədi, sən deyəydin.

– Niyə, nə olub? Mən ondan əskik kişinin qızıyam, nədir? Utanıb ölmür, durub gecə vaxtı o kənddən bu kəndə gəlir. Guya, bunun ərini “hop” eləyib udacaqlar.

Onun Səadət üçün "utanıb ölmür" deməsi mənə çox pis təsir elədi. Elə bil, bu sözlərlə məni təhqir etdi.

– Yaxşısı budur başqasının sözünü danışmayaq, – deyə dalğınlıqla cavab verdim.

O incidi:

– Mən başqasının sözünü danışan deyiləm. Sənə görə acığım tutdu.

Daxilən keçirdiyim böhrandan başımı o qədər itirmişdim ki, bu sadə, səmimi dostumun ürəyini nə cür alacağımı bilmədim.

Biz Nəriman əmigilin qapısından keçərkən qonşu həyətdən çıxan Qərənfil bacıya rast gəldik. Xoş-beşdən sonra:

– Sən Allah, gedək bir az oturun, – dedi. – Mən də darıxıram.

– Nəriman əminin kefi necədir? – deyə soruşdum. – Neçə gündür görmürəm.

– Eh, Nəriman əminin işi uzundur. O gecədən bəri nə mənimlə danışır, nə Hümmətlə. Gündüzlər evdən çıxmır. Gecələr atı minib hara isə gedir. Soruşuram, cavab vermir.

Qərənfil bacı bir qədər susduqdan sonra əlavə etdi:

– Saatda bir görəcəksən Qulu gəldi, çəkildilər aşağı başa, nə danışdılar-danışmadılar, qayıdıb getdi. Qərəz, kişinin işi olub bir sirr.

Bu əhvalat məni çox maraqlandırdı:

– Nə üçün Quludan soruşmursunuz ki, nə danışırlar?

– Elə bil, soruşdum, deyər?

– Bəs, Nəriman əmi gündüzlər evdə neyləyir?

– Sabahdan axşamacan bu eyvanda var-gəl eləyib fikirləşir. Soruşanda da, üzünü o yana çevirib cavab vermir. Uzaq olsun, qorxuram kişinin başına hava gələ.

– Sən də qoy görək, – Nazxanım dilləndi. – Dağ kimi kişinin başına hava niyə gəlir?

– Nə bilim, lap qalmışam məəttəl.

Çox keçmədən Nəriman əmi qaşqa ürgənin üstündə həyətə girib, həmişəki kimi, cəld və gümrah hərəkəti ilə atdan düşdü. Başını qaldırıb bizə tərəf baxmadan atın yəhərini alıb, tövləyə çəkdi.

Sonra eyvana çıxıb mənə müraciətlə:

– Hə, bacıqızı, nə var, nə yox? – deyə bərkdən soruşdu.

Və cavabımı dinləmədən, şapkasını təkyənin üstünə ataraq, ağ, tüklü biləklərini çirməyib əlüzyuyana yaxınlaşdı. Yəqin ki, qabın boş olduğunu görüb, üzünü bağa tərəf tutdu:

– Ay uşaq, deyin, bura su töksünlər.

Əlbəttə, bu söz Qərənfil bacıya aid idi. Ona görə də, arvad bizə göz vuraraq, cəld qalxıb əlüzyuyana su tökdü. Nəriman əmi neçə gündən bəri taraş edilməmiş çəhrayı üzünü, başını, yoğun ətli boynunu sabunlayıb, ətrafa ağ köpük və su sıçrada-sıçrada səs-küylə yuyundu. Yenə də ayaqlarında təzə uzunboğaz, əynində nazik sürməyi parçadan köynək və şalvar var idi. Yenə də belinə enli toqqa çəkmişdi.

Tiftikli ağ məhraba ilə bərk-bərk qurulanandan sonra mənimlə üzbəüz əyləşdi və yenə də üzünü bağçaya tutaraq bərkdən soruşdu:

– Ay uşaq, bir stəkan çaydan-zaddan yoxdur?

Qərənfil bacı quş kimi süzərək, aşağı başdakı samovarın yanına getdi. Kişi mənim üzümə baxmadan:

– Hə, bacıqızı, – dedi, – eşitdim bu axşam quzeylilərə “Segah” oxuyurmuşsunuz.

Bilaixtiyar gülümsəyərək:

– Bəli, – dedim, – onları mədəni şefliyə götürmüşük.

– Hələ özünüzə umac ovmamış, başqasına əriştə kəsirsiniz. Güney qışlağın hesabına hər gün quzeylilərə kef verirsiniz.

– Əlbəttə, bu sizin başınızın ucalığıdır.

Lakin Nəriman əmi məni dinləməyərək, sözünə davam etdi:

– Bircə o qalıb ki, Çıraq oğlu Murad dəstəsini çəkib gəlsin ki, bu evlərdən də köçün, biz olacağıq.

Qərənfil bacı məcməyidə bizim üçün çay və mürəbbə gətirib süfrəyə qoydu:

– Əşi, vallah, Söyüdlü arx gedib Quzey qışlağa çatandan sonra onlar bizimkilərdən də yaxşı evlər tikəcəklər.

Nəriman əmi üzünü bağçaya tərəf tutaraq:

– Xahiş olunur, – dedi, – camaat bizim adımızı tutmasın.

Nazxanım gizlin təbəssümlə stolun altında dizini dizimə toxundurdu.

– Əşi, vallah, adını da tutacam, hələ o yana da ötəcəm. Sənsiz mənim bir günüm olmasın.

Nəriman əmi bağçaya xitabən gileyləndi:

– Bunlar hamısı quru sözdür. Gördük vəfanızı.

– Əşi, ağac götür, döy məni, amma elə demə!

İndi Qərənfil bacının səsində əvvəlki zarafatyana ahəng deyil, yalnız onların özlərinin anlaya biləcəyi çox dərin bir hiss duyulurdu. Nə-

riman əmi yəqin ki, bu hissin təsiri ilə öz kişilik mətanətini itirəcəyindən qorxaraq, dərhal mənə müraciətlə söhbəti dəyişdi:

– Hə, bacıqızı, demək, getdiniz quzeylilərə “Segah” oxudunuz.

Elə bu zaman Qulu, əlində portfel, tələsik eyvana çıxdı, ağzını açıb bizə salam vermək istəyirdi ki, Nəriman əmi cəld yerindən qalxıb onu aşağı başa çəkdi. Mühasib bir gözü bizdə olduğu halda, nə isə, tez-tez deyirdi. Nəriman əmi birdən özündən çıxaraq qışqırdı:

– Mənim adımdan ona deyərsən ki, bu il pambığın hamısı maşınla yığılacaq! Bildin, maşınla!

Birdən kişi bizim qulaq asdığımızı görüb susdu, sonra qəddini düzəldərək pıçıltı ilə danışmağa başladı. Qulu altdan yuxarı ona baxırdısa da, balaca qara bəbəkləri tez-tez bizə tərəf qaçır, mənim nəzərlərimlə qarşılaşır və bu vaxt onun üzü çox gülməli ifadə alırdı.

Nəhayət, Nəriman əmi:

– Yaxşı... – deyə bərkdən səsləndi.

Bu zaman Qulu fürsət tapıb bizi salamladı:

– Axşamınız xeyir, Nuriyyə xanım, eşitdim bu axşam konsertiniz qiyamət keçib.

– Pis olmadı.

– Heyf ki, mən vaxt eləyib gələmmədim.

Nəriman əmi hövsələdən çıxdı:

– Qulu, işində ol!

– Deməli, sədr, sabah yox, o biri gün biz pambıq yığımına...

– Hiş-ş, – deyə Nəriman əmi sirrinin açılacağından qorxaraq, Quluya gözünü ağartdı.

Mühasib müqəssir halda susaraq, başı ilə bizə “xudahafiz” işarəsi eləyib getdi.

Sədr gəlib əyləşdi.

– Nəriman əmi, – dedim, – mən idarə heyətindən xahiş etmək istəyirəm mədəniyyət evi üçün dörd-beş dəst rəqs paltarı tikdirməyə icazə versin.

– Nə paltarı?

– Rəqs paltarı. Yəqin ki, filarmoniyada görmüsünüz. Biz də balaca bir rəqs dəstəsi düzəltmək istəyirik. Çox istedadlı gənclər var. Bayaq Quzey qışlaqlı bir oğlan öz oyunu ilə məni lap heyran etdi.

“Quzey qışlaqlı” sözünü eşidən kimi kişi üz-gözünü turşutdu:

– Mənə dəxli yoxdur, mən sədr deyiləm.

Qərənfil bacı bizə göz vurdu:

– Əşi, sənin nə ixtiyarın var özün-özünü sədrlikdən azad eləyəsən?

Nəriman əmi bağa xitabən cavab verdi:

– Xahiş olunur camaat bizə hücum eləməsin. Bu da Söyüdlü arxın məsələsi deyil.

– Deməli, biz sənə hücum eləmişik?

– Biz cavab verməyəcəyik...

– Eh, ay Nəriman. Bircə sənin bu küsməyin olmayaydı. Lap adamın ürəyi qısılır.

Nəriman əmi gözlərini bağdan çəkməyərək, bu dəfə nazik və yumşaq səslə:

– Adam ürəyini qısmasın, – dedi, – bunun ürəyə qətiyyən dəxli yoxdur.

Nazxanım stolun altından mənim dizimi basdı.

– Necə dəxli yoxdur, əşi? Məgər, biz işi ürəklə görmürük? – deyə Qərənfil bacı mənə göz vurdu.

– Xahiş olunur camaat böhtana əl atmasın.

– Yazıq canımız. Axırda böhtançı da olduq. Bu gün Quzey qışlaqlı Ballı qarını görmüşəm. Deyir lənət yezidə. Allah Nərimanın ömrünü uzun eləsin. Biz də qapımızda su görərik.

– “Ballı qarı!” Ballı qarı yaxşı arvad idi, niyə Nəriman belində torpaq daşıyanda, dik-dik ortalıqda gəzən cahıl-cuhullarına demirdi ki, su bizə də lazımdır?

– Əşi, qanmayanı öldürməzlər ki!

– Qətiyyən düz deyil, – deyə Nəriman əmi bağa xitabən təkrar etdi. – Qətiyyən düz deyil. Biz hər səhvi bağışlasaydıq, bu boyda işlər görə bilməzdik.

– Deməli, gərək indi biz sənin səhvini bağışlamayaq?- Qərənfil bacı oğrun təbəssümlə mənə baxdı.

– Hansı səhvimi? – deyə kişi istehza ilə bağdan soruşdu.

– Bəs, o gün iclasda demədik? Belə xüsusiyyətçilik səhvini...

– İclasda düz eləmədiniz, – deyə Nəriman əmi təqsir məndəymiş kimi, gözünü bağdan çəkib, qəzəblə üzümə baxaraq qışqırdı. – İndiki zamanda gərək hamı zəhmət çəksin. Hamı özünü işə versin. Heç kəs dayanıb gözləməsin ki, qonşu onun üçün nə vaxt su çəkər? Söyüdlü arx Güney qışlağındır. Mənim nankor bacım oğlu stol başına keçən ki-

mi özünü yuxarının yanında yaxşı göstərmək üçün bu həngaməni çıxartdı. Çörəyi ilə böyüdüyü kəndini bir "maladesə" satdı.

– İnsafsız danışma, əşi, Hümmətin özünü yaxşı göstərməyə nə ehtiyacı var idi? Hamı onun başına and içir!

– Qərənfil, bəsdir. Qərənfil, məni haldan, təbdən çıxartma.

– Sağ ol, əşi. Neçə gündür mənim adımı çəkmirdin, dünya gözümə görünmürdü.

– Qərənfil, sənin baldızın oğlu nankordur.

– Əşi, sən Allah, necə qıyıb Hümmətə elə deyirsən?

– Elə olmasaydı, dünən şeş, bu gün beş, mənimlə canbaza çıxmazdı. Atalar yaxşı deyib: kor atlanar, öz kəndini çapar.

– Nəriman, sən bir kəndin dərdini çəkirsən, amma o bütün rayonun. Bir də, axı, Hümmət zorla eləmədi. Görmədin ki, camaat özü razılıq verdi?

"Camaat" sözünü eşitdikdə, elə bil, odun üstünə su tökdün. Kişinin acığı bir anda söndü. Üzü gücsüz və pərişan bir ifadə aldı. Günəşdən yanmış iri əli ilə alnını ovuşdurub, məyus nəzərlərlə bağçaya baxdı. Gözləri onda olan Qərənfil bacı bu dəfə ciddi və mehriban səslə:

– Ay Nəriman, – dedi, – bu uşaqlar da özgə deyil. Otuz ilə yaxındır səninlə bir damın altında yaşayırıq. Mən həmişə səndən xəcalətəm. Çünki bu cür cuvanəzəni (Nazxanıma işarə etdi) uşaq üstündə əri atıb getdi, amma sən...

– Bu sözlər nəyə lazımdır, Qərənfil?

– Dediyim odur ki, sənin nə cür adam olduğunu mən də bilirəm, xalq da. Bu otuz ildə mən bir dəfə görməmişəm ki, sən camaatın dərdini-odunu unudub, özün haqqında düşünəsən.

– Bu sözlər artıqdır, Qərənfil.

– Artıq olsa da, deyəcəyəm. Sən həmişə bu kənddə böyüyə kiçik, kiçiyə ata olmusan. İndi, ay Nəriman, həmin camaat haqq bir işin üstündə sənin sözünü yerə saldı, gərək bundan inciməyəsən.

Kişi dərindən nəfəs aldı.

– Sənin yaşın altmışa çatıb. Mən də qocalmışam. Biz öz camaatımıza qulluq eləyə-eləyə gəlmişik, elə də gedəcəyik.

– Ürəyimi birtəhər elədin, ay Qərənfil xala, – deyə Nazxanım söhbətə qarışdı. – Vallah, neçə gündür Nəriman əmini kəndin arasında görmürəm, elə bilirəm bir şey itirmişəm.

Mən isə, bir söz demirdim. Mən onları dinlədikcə qeyri-iradi olaraq özüm haqqında düşünürdüm.

...Gecədən xeyli keçməsinə baxmayaraq, yatmaq istəmirdim. Ürəyim dolu idi. Kağız-qələm götürüb iki gün qabaq məktub aldığım rəfiqəm Aynaya cavab yazmağa başladım:

"*Əziz bacım.* Məktubunu, otağıma qapanıb ürək döyüntüsü ilə oxudum. Sən onunla mənim münasibətimin mabədini bilmək istəyirsən. Hər şey öz yolu ilə gedir. Anadan dözümlü doğulduğum üçün taleyimə təkrar-təkrar təşəkkür edirəm və bilirəm ki, hər əzabın bir sonu vardır. Bir az qabaq bizim artel sədri Nəriman əmigildəydim. Onların, ər-arvad sözü-söhbəti, umu-küsüləri ancaq və ancaq başqaları haqqındaydı. Hiss edirdim ki, hər gün bir yerdə işlədikləri insanların həyatı onların öz həyatı olmuşdur. Hiss edirdim ki, bu insanların taleyi eyni ilə öz şəxsi talelәri kimi onları həyəcanlandırır, sarsıdır. Hətta, bir-birindən küsdürür. Demək, yalnız öz əzablı duyğularınla deyil, ikinci və daha böyük bir həyatda da yaşamaq mümkündür. Əgər, mən bunu indi hiss edərək sənə yazıramsa, demək, bu, doğrudan da, belədir. Mən bu sözləri özümü aldatmaq üçün demirəm. Mən heç bir zaman öz vicdanımın qarşısında ikiüzlülük eləməmişəm. Əlbəttə, hər gün onu özümlə bir damın altında görmək, onun yaxınlığını hiss etmək mənim üçün yalnız nağıllarda eşitdiyim bir səadət olardı. Vaxta ki, bu mümkün deyil, o zaman nə etmək? Onsuz yaşamaq mənim üçün nə qədər çətin olsa da, həyatdan getmək istəmirəm. Çünki bu, mənim tərəfimdən namərdlik olardı. Belə çıxardı ki, mən onsuz çəkəcəyim iztirablardan qorxaraq, həyatıma son qoyuram.

Bu axşam verdiyimiz konsertdə onun, yoldaşlarının mənim söz və hərəkətlərimə neçə ürəkdən güldüklərini düşündükcə, fərəhimdən gözlərim yaşarır. Demək, mən də onlar üçün bir şeyə yarayıram. Demək, mən də Nəriman əmi kimi, Qərənfil bacı kimi öz vətəndaşlarıma xidmət eləyə bilirəm. (O isə, mənim üçün vətəndaşların ən əzizi deyilmi?) Qəlbimdəki yara için-için sızlasa da, üstü köz bağlayır. Mən ətrafdakı adamlarla zarafatlaşır, danışıb-gülürəm. Bütün günü ora-bura qaçaraq, gah kitabxanaya gələn kəndlilərin suallarına cavab verir, gah onlar üçün qəzet və jurnallardan maraqlı xəbərlər oxuyuram. Gah dram dərnəyimizdə məşq edirəm, gah hazırlamaq istədiyimiz "Əlli yaşında cavan" musiqili komediyasında iştirak etmək üçün Nazxanımı dilə tuturam. Mənə elə gəlir ki, bunların hamısını da onun üçün, o bu dünyada yaşadığı üçün edirəm.

Yalnız bircə şey – onun ailə həyatındakı dram məni çox pərt edir. Onun arvadı Yer üzündəki qadınların ən gözəlidir desəm, mübaliğə sanma. Onun oğlu o qədər qəşəng, o qədər sağlamdır ki, görsən, valeh olarsan. Heyf ki, insanların qəlbinə girmək mümkün deyil. Əgər, mümkün olsaydı, mən saatın necə xoş vaxtında yarandığını Səadətə hiss etdirərdim. Mən ona deyərdim ki, sənin əsassız üzüntülərin, şübhələrin bu böyük səadətin qarşısında heçdir, əzizim. Sən nahaq yerə ərin üçün elədiyim kiçik bir xidməti mənə çox görürsən. Güclülər, xoşbəxtlər bu qədər amansız, bu qədər xudpəsənd olmamalıdırlar. Rəhmətlik nənəm həmişə deyərdi ki, igid basdığını kəsməz. (Biz qadın olanda nə olar? Məgər, igidlik yalnız kişilərəmi aiddir?)

Aynacan, – mənim indiki halımın səni çox pərişan etdiyini yazırsan. Elə demə, əziz bacım! Çünki mən, heç olmazsa, bircə nəfərin (sən dünyada mənim bu sirrimi bilən yeganə adamsan) mənim bədbəxt olmadığım haqqındakı inamımı təsdiq etməsini istəyirəm. Mən buna möhtacam. Axı, mən, doğrudan da, bədbəxt deyiləm. Onu öz canından min dəfə artıq istəyən bir adam necə bədbəxt ola bilər? Gecən xeyrə qalsın, əzizim. Mən də dururam yatam. Sabah işə gecikməməliyəm. Tez-tez məktub yaz. Səni qucaqlayıb bərk-bərk öpürəm.

*Bacın Nuriyyə*".

Səhər kənd mağazasından qayıdanda şofer Almurad sədrin "Pobeda"sında qabağıma çıxdı. Maşını saxlayıb:

– Sabahınız xeyir, Nuriyyə xanım, – dedi, – gəlin əyləşin, aparım.

– Çox sağ ol, Almurad. Piyada getmək istəyirəm. Belə tezdən hardan gəlirsən?

– Xəbəriniz yoxdur? Nəriman əmi sancılanmışdı. Apardım, rayon xəstəxanasına qoydum.

– Həkim nə dedi?

– Nə bilim, deyirlər, guya, bağırsağı çevrilib.

– Qərənfil bacı da getdi?

– Yox, Qulu ilə aparmışdıq. O qaldı yanında, mən qayıtdım.

Bu əhvalat məni xeyli kədərləndirdi. Bilirdim ki, bağırsaq çevrilməsi ağır xəstəlikdir, cərrahiyyə əməliyyatı lazımdır. Bu isə, Nəriman əmi kimi kök və yaşlı adam üçün asan iş deyil.

Lakin dünyada nə olur-olsun, həyat öz qaydası ilə davam edəcəkdir. Biz, hər günkü kimi, saat üçə qədər məşq elədik. Axşam sərini

qalxanda kitab götürüb, Söyüdlü arxın üstünə getdim və quzeylilərin düşərgəsi yaxınlığında xəlvət bir yerdə oturub mütaliə elədim.

Mən onların səs-küyünü eşidirdim. Murad tez-tez ora-bura gedir, bəzən dayanıb əlinin hərəkəti ilə adamlara nə isə deyirdi.

Qürub günəşinin dolayı, qəmgin şüaları ilə işıqlanmış geniş çölün fonunda onun görünüşü mənim üçün yalnız bir xəyal, bir nağıl idi. Sonra o, motosiklinə əyləşib sürətlə öz kəndlərinə tərəf getdi, elə bil, bütün insanlar, bütün həyat bir anda məni tərk edib, tamam başqa bir aləmə köçdü. Elə bil, mən hamı tərəfindən unudulub yurdda qaldım. Lakin mən özümü bu hissin, bu ağır dərdin öhdəsinə ata bilməzdim. Mən "ah" çəkmədim. Ürəyimin ağrısına dözmək üçün dişlərimi bərk-bərk sıxıb, üzümü o biri tərəfə çevirdim. Bu zaman iki atlının toz qopara-qopara çapdığını gördüm.

Onlardan birinin Nəriman əmi, digərinin isə, Qulu olduğunu görüb təəccüb etdim. Nəriman əminin əynində xəstəxana paltarı vardı, başı açıq idi. Onlar məni görmədən Söyüdlü arxın taxta körpüsünü keçib getdilər. Görünüşləri çox məzəli olduğundan, istər-istəməz, gülümsədim və motosiklin gözdən itdiyi tərəfə baxdım.

...Mütaliə edə bilmirdim, qalxıb körpünün üstünə getdim. Mən orada dayanıb Söyüdlü arxa tamaşa etməkdən qəribə bir rahatlıq, xoşhallıq duyurdum. Elə bil, əsəblərim hər cür gərginlikdən xilas olub dincəlirdi. Arxa tərəfə əyilmiş bir yarpızın balaca zərif yarpağı axan suya təmas etdiyindən, biaram titrəyirdi. Elə bil, Söyüdlü arx onu qoparıb aparmaq istəyir, yarpaq isə, nə buna razı olur, nə də sudan ayrılırdı. Elə bil, "sən mənim həyatımsan. Ancaq mən səninlə getmək istəmirəm" deyə o, suya səssiz nəğmə oxuyurdu.

Kəndə qayıtmaq istəyirdim ki, təcili yardım maşını sürətlə gəlib körpünün yanında dayandı.

Şofer başını kabinədən çıxarıb, məndən soruşdu:

– Bağışlayın, bir az qabaq bu kəndə iki atlı gəldi?

– Necə məgər?

– Qəhrəman qaçıb.

– Hansı qəhrəman?

Şoferin yanında oturmuş ağ xalatlı qız həyəcanla izah etdi:

– Bilirsinizmi, Nəriman əminin bağırsaqları çevrildiyi üçün bu gün operasiya olunmalı idi. Ancaq bunu eşidən kimi xəstəxana paltarında çıxıb qaçıb. Axtarmamış yer qoymamışıq. Axırda bir uşaq dedi ki, biri

xəstəxana paltarında, iki atlının qəsəbədən çıxdığını görüb. Siz bu kənddə olursunuz?

– Bəli.

– Xahiş edirəm Nəriman əminin evini bizə göstərəsiniz...

– Baş üstə.

Qız şoferə sarı çəkilərək yanında mənə yer elədi.

...Ağ xalatlı qızla sədrin bağçasına daxil olduğumuz zaman qəribə bir mənzərə gördük. Nəriman əmi ilə Qulu iydə ağacının altında oturub kabab yeyirdilər. Nəriman əmi yaxşı qızarmış maça sümüyünü dişinə çəkərək (yaşının altmışa çatmasına baxmayaraq, onun dişləri sədəf kimi idi) nə isə deyir, Qulu da çiyinlərini qısıb gözlərini yumaraq, gülməkdən qəşş eləyirdi. Onlardan bir az o tərəfdə Qərənfil bacı yerə çökərək, kabab şişləri düzülmüş ocağı yelləyirdi.

Ağ xalatlı qız əvvəlcə dayanıb, elə bil, gözlərinə inanmadı. Sonra birdən sədrə tərəf qaçaraq qışqırdı:

– Yoldaş geroy! Yoldaş geroy! Nə qayırırsınız? Sizin bağırsağınız çevrilib.

Nəriman əmi dik atıldı:

– Əşi, sağ olmuşun qızı, məni lap diksindirdin. Gəlin, yaxşı gəlmisiniz. Gəlin oturun, kababdan-zaddan yeyin görək.

– Siz nə danışırsınız? Durun! Tez olun! Cərrah sizi gözləyir.

– Xahiş eləyirəm əyləşəsiniz.

Ağ xalatlı qız qalxıb, ayaq üstə dayanmış Qərənfil bacıya tərəf çöndü:

– Siz nə edirsiniz, xala? Bəs, bağırsağı çevrilən adama kabab vermək olar?

Qərənfil bacı:

– Neyləyim, ay qızım, istədi, mən də bişirdim.

Qulu pıqqıldayıb əli ilə ağzını tutdu. Ağ xalatlı qız yanıb tökülərək:

– Bax, özünüz cavabdehsiniz, – deyə hədələdi.

Sonra mənə müraciətlə soruşdu:

– Bağışlayın, sizin familiniz nədir?

– Adım Nuriyyədir.

– Yoldaş Nuriyyə, siz də şahid olun ki, nə qədər çalışdım, qəhrəman mənim sözümə qulaq asmadı. Özü də əyləşib qısaboylu bir adamla kabab yeyir.

Qız “qısaboylu” sözlərini deyərkən qəzəblə Quluya baxdı. Lakin mühasib pərt olmadı, eyni şənliklə:

– Yoldaş həkim, – dedi, – xahiş edirik əyləşib bu kababın dadına baxasınız. Sizə hörmət eləyək, qulluğunuzda olaq.

Ağ xalatlı qız heç bir söz demədən, hətta, mənimlə də xudahafizləşmədən dönüb sürətli addımlarla həyətdən çıxdı.

Nəriman əmi onu səslədi:

– Yoldaş həkim! Bir dəqiqə dayanın, Qərənfil xəstəxananın paltarını da versin, aparın (o indi öz paltarında idi).

– Özünüz göndərərsiniz, – darvazanın arxasından qızın səsi eşidildi.

Təcili yardım maşını yola düşdü.

– Sən Allah otur! – deyə Qərənfil bacı qolumdan yapışıb məni əyləşdirdi.

Nəriman əmi nəşə ilə başını bulayaraq:

– Siz ölməyəsiniz, – deyirdi, – bu həkimlərin işi lap qəmədiyədir.

Mən soruşdum:

– Bəs, necə oldu ki, sancınız kəsdi?

– Canım üçün, elə həkim deyən kimi “bağırsağı çevrilib, gərək yarılsın, elə bil, heç sancı-zad yoxmuş, hamısı xrıp kəsdi”. Di gəl, əl çəkmirlər. Deyirəm, canım heç bir şeyim yoxdur. Deyirlər, yox, sən bilmirsən, bağırsağın çevrilib, gərək qarnını yaraq. Gördüm dirigözlü məni yıxıb kəsəcəklər, dedim, ə, Qulu, tez mənə at! Maşın səs-küy qaldırar...

Qulu, Qərənfil bacının gətirdiyi kababı alıb mənim boşqabıma çəkərək:

– Yaxşı ki, – dedi, – Kərəmgilin atları rayonda idi. Amma, sədr, nə qaçdıq!..

– Üstünü vurma.

Nəriman əmi gülümsədi və pomidor olan nimçəni götürüb mənim qabağıma qoydu:

– Sən mənim canım, yaxşı ye. Amma, Qərənfil, ordan çıxıb qaçanda elə bildim anadan təzə oldum. Gərək bu dünyanın qədrini bilək. Adam ki, gedib düşdü o ağ xalatlıların əlinə, bay, bay!.. Hə, Nuriyyə xanım, mədəniyyət evində işlər necə gedir? Deyəsən, axşam oyunçular üçün paltar istəyirdin. Qorxma, hər nə lazım olsa, Nəriman əmin düzəldəcək. Təki salamatlıq olsun. Siz işinizdə olun.

Qulu qımışıb, nə üçünsə, mənə göz vurdu. Mən isə, fikirləşdim ki, dünəndən bəri kişidə əmələ gələn bu yeni əhvali-ruhiyyə haradandır?

Görünür, böyük qorxu kiçik qorxuları əhəmiyyətsiz etdiyi kimi, bəzən başımızın üstünü alan ciddi təhlükənin sovuşması da təbiətimizdəki daha gözəl duyğuların meydana çıxmasına səbəb olur. Nəriman əmi hər şeydən elə ruh yüksəkliyi ilə danışırdı ki, guya, doğrudan da, dünyaya yenidən gəlmişdi. O daha iş barəsində Qulu ilə danışmağını da, axşamkı kimi, Qərənfil bacıdan gizlətmirdi.

Artıq işıqlar yanmışdı. Biz qalxıb eyvanda çay içdiyimiz zaman Hümmət gəlib çıxdı:

– Ay hamınızı xoş gördük, beş gördük, – deyə əlində tutduğu kepkasını asılqana keçirərək, stul çəkib əyləşdi. – Dayı, nə var, nə yox?

Nəriman əmi cavab verməyib, üzünü bağa sarı çevirdi.

Hümmət soruşdu:

– O nə əhvalatdır, əşi, deyirlər xəstəxanaya gəlibmişsən, mənə də xəbər eləməmisən.

Nəriman əmi bağa xitabən acıqlı-acıqlı deyindi:

– Nərimanın heç kəsə ehtiyacı yoxdur. Nərimanın ayağı hələ üzəngi tutur. Nəriman hələ ölməyib!

O, yumruğunu stola çırparaq, ayağa qalxdı. Elə bu zaman darvaza açıldı, bir dəstə kəndli həyətə daxil oldu.

– Sədr, evdəsən? – deyə qoca Dünyamalı kişi səsləndi.

Nəriman əmi əsəbi gümrahlıqla cavab verdi:

– Evdəyəm, gəlin.

Kəndlilər eyvana çıxıb əyləşdilər.

– Nə olub, Nəriman, səsin nə bərk gəlirdi? – Dünyamalı kişi arxayın hərəkətlə tənbəki kisəsini çıxarıb çubuğunu doldurdu.

Nəriman əmi stulu taqqıltı ilə çəkib oturdu:

– Nə olacaq, bəziləri Nərimanı diri-diri torpağa basdırmaq istəyir.

Pirverdi təəccüblə soruşdu:

– Bu nə sözdür, əşi?

Kərəm əlavə etdi:

– Maşallah, sədr yeriyəndə yer tərpənir.

– Yox, Nəriman qocalıb. Nəriman geri qalıb. Nəriman çəkilib otursa yaxşıdır. Xahiş edirəm, özünüzə ayrı bir sədr seçəsiniz. Ancaq qoy bəzi-bəzi adamlar bilsinlər ki, Nəriman sədr oldu-olmadı, yenə də Nərimandır.

Dünyamalı kişi eyni arxayın hərəkətlə qəlyanını ağzına alıb odlayaraq:

– Ay Nəriman, – dedi, – bayaqdan əsib-coşursan, biz də bir şey başa düşmürük. Yoxsa, yenə Söyüdlü arxın məsələsidir?

Sədr bu dəfə yavaş səslə cavab verdi:

– Söyüdlü arx sizindir. Sizin alnınızın təridir. Vaxta ki, elə məsləhət gördünüz...

Dünyamalı kişi qəlyanını sümürərək:

– Yaxşı, indi ki, belədir, – dedi, – bəs, o gecə niyə atılıb-düşürdün?

– Ona görə atılıb-düşürdüm ki, gərək hamı işləsin. Zəhmət çəksin. Heç kəs qonşusuna yük olmasın. O vaxt Söyüdlü arxı qazanda quzeylilər əlləri ciblərində gəzirdilər. Amma mən bilirdim ki, bir gün gəlib deyəcəklər: "Qonşu, bizə də su!" Mən də onlara cavab verəcəkdim ki, gedin Güney təpəni çapın, Köndələnçaydan özünüzə su çəkin. Siz qoymadınız, mən də demədim. Ancaq, qoy bəzi adamlar Nərimanı ortalığa qoyub, camaata leksiya oxumasınlar.

Kərim soruşdu:

– Kim oxuyub, əşi?

Hümmət, həmişəki kimi, şən və açıq ifadə ilə:

– Mən oxumuşam, – dedi. – Üç-dörd gün qabaq partiya kabinəsində "Kəndimiz yeni inkişaf mərhələsində" adlı mühazirə oxuyurdum. Söyüdlü arxın məsələsini orada misal çəkmişəm.

Sədr yana-yana kəndlilərə baxdı:

– Eşitdiniz ki? Sən ilan kimi qabıq qoy, su çək, başqası gəlib hazırına nazir olsun, üstəlik, səni leksiyaya da qoysunlar ki, geridə qalmısan. Guya, mən gərək çoxdan gedib deyəydim ki, quzeylilər, buyurun gəlin, hazırdır.

– Dayı...

– Mənim sən adlı bacım oğlu yoxdur!

Dünyamalı kişi məzəmmətlə sədrə baxdı:

– Ay Nəriman, bir qoy kişi sözünü desin.

Hümmət gülümsədi.

– Əşi, niyə bir tərəfini deyirsən, o biri tərəfini yox... Mən şəxsən sən dayımın iş təcrübəsindən, azı, yarım saat danışmışam.

– Lazım deyil.

– Sənə lazım deyil, başqalarına lazımdır. Sonra mən artellərin qarşılıqlı münasibətindən danışanda, dedim: elə təsərrüfat rəhbərləri var ki, onlar ancaq öz kəndlərinin varlanmasına çalışıb, başqalarının işləri ilə maraqlanmırlar.

– Atalar məsəlidir, bir gül ilə bahar olmaz. Gərək hamı varlansın. Kəndin biri tox, o biri ac olacaqdısa, onda, keçmişlə bizdə nə təfavüt?

– Tamamilə doğrudur, – deyə Hümmət, Dünyamalı kişinin sözlərini təsdiq etdi, – hamının, bütün ölkənin, bütün xalqın varlı olması, bolluq içində yaşaması bizim birinci məqsədimizdir.

– Paho... paho... yenə təbliğat, yenə siyasi dərs! Qərənfil, bir stəkan su!

– Əşi, çay ola-ola, suyu neyləyirsən?

Nəriman əmi təkrar etdi:

– Qərənfil, bir stəkan su! Camaat birdəfəlik bilsin ki, mənim dərs öyrənmək vaxtım keçib.

Lakin, mən onun gözlərinin dərinliklərində, nə isə, başqa şey hiss edirdim. İndi onun gözlərinin ifadəsi ilə sözləri bir-birini tutmurdu. Səsi əvvəlki kimi qəzəbli deyildi.

Hümmət gülümsəyərək, Qərənfil bacıya göz vurdu.

– Yaxşı, mən susdum.

Çox qəribədir ki, kişinin gözlərində, danışığının ahəngində hiss etdiyim bu son ifadə məndə anlaşılmaz bir fərəh doğurmuşdu və mən kəndlilərin dalbadal içib-boşaltdıqları stəkanları həvəslə aparıb doldururdum.

Dünyamalı kişi beşinci stəkanı qabağına çəkdi:

– Bircə, dayı-bacıoğlu, umu-küsünü qoyun bir tərəfə, bizim bura gəlməkdən məqsədimiz var.

Dünyamalı kişi çaydan qaynar-qaynar bir qurtum alaraq davam etdi:

– Nəriman, biz istəyirik ki, Söyüdlü arxın o tayından ta Quzey qışlağa qədər toxmacarlıq eləyək.

– Yəni, söyüdün əvəzinə toxmacar əkəsiniz?

– Bəli.

Kərəm əlavə etdi:

– Hər il barama vaxtı yarpaqdan korluq çəkirik. Biz də istifadə edərik, quzeylilər də.

Qərənfil bacı onların sözünə qüvvət verdi:

– Siz yarpağı bol eləyin, görün biz baramaçılar nə eləyirik!

Araya uzun bir sükut çökdü. Hamı sədrin nə deyəcəyini gözləyirdi. Nəhayət, o, gözünü bağdan çəkib, kimsənin üzünə baxmadan yavaş səslə:

– Yox, – dedi, – qoyun Söyüdlü arx elə söyüdlü arx olsun. Söyüd özü də bir ağacdır. Qaldı yarpaq məsələsi. Çoxdan mənim belə bir fik-

rim var ki, dəyirman altındakı açıqlığı toxmacarlıq yox, toxmacar şitilliyi eləyək. Orda, azı, iyirmi beş-otuz min toxmacar şitili əmələ gətirmək olar. Şitildi, istəyirsən, özün ək, istəyirsən, başqasına ver.

Hümmət, atasının yaxşı sözündən fərəhlənən uşaq sevinci ilə cavab verdi:

– Çox ağıllı fikirdir. Rayonun belə bir şitilliyə çox ehtiyacı var. Siz vaxtı gələn kimi başlayın. Nə kömək lazım olsa, rayon verər.

Sədr üzünü bağa tərəf çevirdi:

– Güney qışlağın heç kəsin köməyinə ehtiyacı yoxdur.

– Təki elə olsun, ay dayı...

Hümmətin hərəkətləri getdikcə mənə daha artıq xoş gəlirdi. Mən, üzünə süni niqab taxan, əslində olduğu kimi deyil, uydurduğu kimi görünməyə çalışan adamlara nifrət edirəm. Rayon icraiyyə komitəsinin sədrində dərhal ətrafındakılara sirayət edən təbii bir xüsusiyyət var idi. Elə bil ki, onu görərkən, sən birdən-birə canlanır, nə isə, fərəhli bir iş eləmək istəyirsən.

Əvvəllər olduğu kimi, onun baxışları yenə də hərdən bir an mənim üzümdə dayanırdı. Bu zaman mən ona qarşı özümdə dərin bir səmimiyyət, doğmalıq hiss edirdim. Bəlkə də o, Muradın dostu olduğu üçün mənə bu qədər xoş gəlirdi. Onu görərkən, söhbət edərkən mənə elə gəlirdi ki, Murad burada, lap yanımızda dayanıb bizə qulaq asır.

O, Güney qışlağa az-az gəlsə də, aramızda açıq və mehriban bir dostluq yaranmışdı. O, çox zarafatcıl idi. Mənim isə, zarafatdan xoşum gəlirdi. Görünür, buna görə də, xasiyyətimiz tuturdu.

Bir dəfə ondan soruşdum:

– Mənim kimi bir bacınız olmasını istərdinizmi?

Heç gözləmədiyim halda birdən-birə tutuldu. Sonra özünü toplayaraq zarafatyana:

– Yox, – dedi, – istəməzdim...

Mən sadədil bir qız ədası ilə incidim:

– Çox sağ olun. Mən pis qızam?

– Anamın ikinci ərindən üç bacım var. Sizinlə olardı dörd. Mən yazıq bu qədər bacının cehizini necə yetirərdim?

– Məgər, məni cehizsiz almazdılar?

Boynumu büküb elə məsum və məyus görünüş aldım ki, o, qəhqəhə ilə güldü. Sonra birdən susub ciddi və qayğılı nəzərlə düz gözlərimə baxdı.

Əgər, Səadət mənə qarşı düşmənçilik aparmasaydı, hər iş öz qaydası ilə gedərdi və mən yalnız öz dərdimlə necə mübarizə aparmaq haqqında düşünərdim. Lakin o mənə göz verir, işıq vermirdi. Tez-tez Güney qışlağa gəlirdi (bəzən qohumlarıgilə, bəzən mağazadan şey almağa). Məni harada görsə, nifrətlə üzünü çevirib görməməzliyə vurur, haqqımda yanındakılara nə isə deyirdi. Kənddə çox adamın mənə "bir cür" baxdığını hiss edirdim. Ancaq çarəm nə idi? Nə edə bilərdim? Neçə dəfə qərəzləndim ki, yanına gedim, danışım, hər şeyi izah edim. Lakin o mənə elə kinli, elə amansız baxırdı ki, ağzımı açmamış söyülüb qovulacağımdan çəkinirdim. Onun bu hərəkəti mənim ikinci böyük dərdim olmuşdu. Ona görə yox ki, mən camaat içində biabır olmaqdan qorxurdum. Ona görə ki, mənim üstümdə bir başqası əzab çəkir, eyni zamanda, mənim üçün canımdan əziz olan bir adamın gününü qara edirdi. Mən gələndən bəri (xüsusən kitab əhvalatından sonra) onların evindən dava-şavanın əskik olmadığını Ağabəyimdən eşitmişəm. Murad özü isə, bu barədə mənə heç nə demirdi. Lakin mən onun nələr çəkdiyini hiss edirdim. Mənim kimi ona da ikiqat zərbə dəyirdi.

Nə qədər fikirləşirdimsə, bu əhvalata son qoymaq üçün Güney qışlağı tərk edib getməkdən başqa ayrı bir çarə tapmırdım. Ancaq gedə bilmirdim. Bir tərəfdən başladığım işi yarımçıq qoyub qaçmaq mənə ar gəlirdi, digər tərəfdən də, mənim gedişimlə onların xoşbəxt ola biləcəyini güman etmirdim. Görünür, nə isə, başqa bir yol, başqa çarə axtarıb tapmaq lazım idi.

Quzeylilər üçün verdiyimiz konsertdən bir neçə gün sonra İmi ilə Cimi yanıma gəldilər. İmi bir nöqtəyə baxaraq susur, Cimi isə:

– Nuriyyə xanım, – deyirdi, – bizimkilər sabah pambıq yığımına başlayırlar. Bütün Güney qışlaq camaatı çöldə olacaq. Gəlin biz də onlardan geri qalmayaq.

– Nə cür?

– Tənəffüs zamanı düşərgələrdə kiçik konsertlər verək.

– Nə olar, etiraz etmirəm.

– Ancaq düşərgələri gəzmək üçün bizə bir minik maşını lazımdır.

Hər şeyə öz aləmində dərin bir məna verməyə çalışan İmi təmkinlə söhbətə qarışdı:

– Bilirsinizmi, biz gərək həmişə camaatla yaxın əlaqə saxlayaq.

– O zaman, kənddə də, rayon təşkilatları yanında da hörmətimiz çox olar, – deyə Cimi əlavə etdi.

Lakin İmi üz-gözünü qırışdıraraq, dostunun sözünü kəsdi:

– Cimi, sən bir dayan, məsələ rayon təşkilatlarından “sağ ol” almaqda deyil. Biz xalqa, camaata xidmət edirik, başa düş!

– Düzdür, düzdür! – deyə Cimi təqsirkar halda təsdiq etdi.

İmi ilə Ciminin bu yeni təşəbbüsü məni də sevindirdi. Tək qalmamaq üçün çox işləmək lazım idi. Bir də ki, İmi demişkən, bu bizim vəzifəmiz idi.

...Həmin günün səhəri maşın üçün artelə getdim. Nəriman əmi üzünü, başını tərtəmiz təraş etdirərək, gümrah görkəmlə iri yazı stolunun arxasında oturub, iki nəfərlə bərkdən danışırdı. Onlardan biri Kərəm, digəri də, mənim tanımadığım qarabığ, ortayaşlı bir adam idi. Qulu ilə Almurad da orada idilər.

Nəriman əmi məni görərkən, söhbətini kəsib kefi saz halda:

– Xoş gəlmisən, yoldaş mədəniyyət naziri. Buyur əyləş, – dedi.

Mən stul çəkib oturan kimi, o yenə də Kərəmlə yoldaşına müraciətlə sözünə davam etdi:

– İkinizin də pambığını maşın yığacaq.

– Axı, özün bilirsən ki, bizim yer kələ-kötürdür. Orada maşın kar verməz, – deyə qarabığlı adam cavab verdi.

– Fərzəli! – deyə Nəriman əmi ayağa qalxaraq, qətiyyətlə təkrar etdi:

– İkinizin də pambığını maşın yığacaq!

– Yəni, əmrdir? – Fərzəli acıqlı-acıqlı altdan yuxarı sədrə baxdı.

– Əmrdir! Yerinə yetirməsən, səni işə buraxmayacağam.

– Axı, belə şey olmaz, sədr. Biz briqadirlərin də bir haqqı-hüququ var, ya yox?

– Fərzəli, qurtardıq. Fərzəli, maşınla yığacaqsan.

Bayaqdan bəri tərəddüd keçirən Kərəm yoldaşına dedi:

– Canım, söz güləşdirməyin mənası yoxdur. Vaxta ki, sədr maşına arxayındır, qoy maşın yığsın.

Fərzəli gileylənə-gileylənə otaqdan çıxdı:

– Sən ölməyəsən, camaatın işi qaravəllidir. Söz sözə gələndə, məsləhətdən danışırlar, amma əmrlə iş görürlər...

Sədr inciyərək onun ardınca qışqırdı:

– Fərzəli, çox sağ ol!

Mən soruşdum:

– Bəlkə, doğrudan da, onun sahəsi pambıqyığan maşın üçün əlverişli deyil?

Nəriman əmi əlini yellədi:
– Sözdür. Sən bunları tanımırsan. Bir sürü qohum-əqrəbası var. İstəyir onlara bir az artıq əməkgünü çıxsın. Başı gətirmir ki, artelin xeyri maşınla yığmaqdadır. İndi maşın əyyamıdır.
O, birdən hirslənərək, Kərəmə tərəf döndü:
– Geridə qalıb, öz briqadasından başqa heç nə barədə fikirləşmir. Artelin xeyrini güdmür, xüsusiyyətçidir! Bildin?!
Cavan briqadir özünü saxlaya bilməyib güldü:
– Mənim təqsirim nədir, əşi?
– Sənin təqsirin odur ki, Fərzəlini başa salmırsan.
– Əşi, Fərzəli tərsin biridir. Mən onu nə təhər başa salım?
– "Tərsin biridir..." Sən ölməyəsən, ona bir gəliş gələrəm, quzuya dönər. Dönər, ya yox?
– Dönər.
– Di onda başa sal. Denən adam ol. Xalq ulduz qayırıb göyə buraxır, sən pambıqyığan maşına əks gedirsən.
Sədr mənə tərəf döndü:
– O Fərzəli heç mədəniyyət evinə-zada gəlir?
Mən onun mədəniyyət evinə belə əhəmiyyət verməsindən fərəhləndnm.
– Xeyr, onu birinci dəfə görürəm. Amma bu oğlan, – Kərəmi göstərdim, – bizim kitabxanaya təzə üzv olub. Tez-tez gəlib-gedir.
– Özü kitabxanaya gedir, amma dostunu dartıb aparmır. Bu da, bir növ, xüsusiyyətçilikdir.
Mən keçən dəfə onun Hümmətlə olan söhbətini xatırlayıb, ürəyimdə güldüm.
Kərəm dedi:
– Əşi, ömründə əlinə qəzet də götürmür. Mən onu kitabxanaya nə cür dartıb aparım?
– Hə? Bəs restoranlarda araq vurmağa nə cür aparırsan?
– Araq nədir, əşi, adam da araq içər?
– Eşitmişəm, eşitmişəm. O gün həkim leksiya oxuyandan sonra konyaka keçmisiniz. Bakıdan beşulduz gətirdirsiniz.
– Nə olar! Hökumətimizin konyakıdır, dayna. Biz də içməyəndə kim içəcək?
Kişi yandığından bir-iki saniyə söz tapmadı. Sonra başını yana əyərək, kinayə ilə gülümsədi.

– Dədən Mövlamverdi necə? O da beşulduz içir?

– Niyə içmir? Hərdənbir əlli qram verirəm, atır. Deyir, yaman iştaha açan şeydir.

– Bax, buna sözüm yoxdur. Afərin! Mövlamverdi ki, konyak içir, demək, dünyanın axırıdır.

Mən sonralar bildim ki, Mövlamverdi kişi Nikolay vaxtı Güney qışlaqda ən yoxsul adam olub, naxıra gedirmiş, indisə, mal fermasında işləyir.

Sonra sədr üzünü Almurada tutdu:

– Cavanlar barəsində bir məruzə qoyarsan, özüm danışacağam. Sizə deməli sözüm çoxdur.

– Məruzənin adı nə olsun?

– Adı? Adı elə "Cavanlar barəsində".

Bununla da, kişinin acığı soyudu. Sonra üzünü mənə tutdu:

– Hə, yoldaş mədəniyyət naziri, indi nə qulluğun var, buyur.

Mən gəlişimin məqsədini söyləyəndə, yalnız Nəriman əmi deyil, o biriləri də təsvib etdilər. Qulu dedi:

– Hər gün saat birdən üçə qədər pambıqyığanların istirahət saatlarıdır. Düşərgələri də elə mədəni düzəltmişik ki, görəndə xoşunuz gələcək.

Sədr Almurada tapşırdı ki, təzə "QAZ-69" bizi gəzdirsin.

Pambıq yığımının ilk günü tamam bir bayrama çevrilmişdi. Göz işlədikcə uzanıb gedən tarlalar sanki ağ çiçək açmışdı. Orada-burada pambıqyığan maşınlar, uzun günlüklü kepka qoymuş oğlanlar, əlvan paltarlı qız-gəlinlər görünürdü. Müxbirlər, əllərində dəftər-qələm, adamların arasında gəzib qeyd götürürdülər. Nəriman əmi öz "Pobeda"sında buradan vurub oradan çıxır, hamıya göstəriş verir, pambıqyığan maşınların işini diqqətlə izləyirdi.

Adamlar günorta vaxtı tənəffüsə çıxdılar, kərpicdən tikilib ağardılmış düşərgə binasının kölgəsində yeyib-içib dincəldikləri zaman biz konsertimizə başladıq.

Musiqi, incəsənət nə qədər gözəl şey olsa da, "hər şeyin öz yeri, hər nöqtənin öz məqamı var". Lakin, onların bizi həvəslə dinləmələri, bəzən mütəəssir olub kədərlənmələri, bəzən mənim söylədiyim hekayə və lətifələrə gözləri yaşarıncaya qədər gülmələri bütün gizli şübhələrimi vurub dağıdırdı. Mən inanırdım ki, biz həqiqətən xeyirli, lazımlı bir iş görürük. Biz öz kiçik istedadımızla bu böyük zəhmət adamlarına xidmət edirdik. Eyni hiss, eyni təəssürat mənim yoldaşla-

rımda da olduğu üçündür ki, düşərgələrdə verdiyimiz hər konsertdən sonra biz bir-birimizə daha da mehriban olur, gələcək konsertlərimizdən daha həvəslə danışırdıq. İmi ilə Cimi yeni-yeni təşəbbüslər irəli sürürdülər (etiraf edirəm ki, onların indiki təşəbbüsləri bizim balaca dəstəmizin işinə çox xeyir verirdi).

Biz gündüzlər pambıqyığanlara, axşamlar isə, Söyüdlü arxın üstündə işləyən quzeylilərə xidmət edirdik. Sədrimiz bu barədə bir söz demirdi. Görünür, quzeylilərə konsert verməyimiz onu əvvəlki kimi əsəbiləşdirmirdi.

...Günlər belə gəlib-keçirdi. Mən gecələr tez yuxuya getmək üçün səhərdən axşamacan işləyir, deyib-gülürdüm. Camaatla elə yaxın olmuşdum ki, küçədə uşaqlar məni görən kimi qabağıma yüyürüb deyirdilər: "Nuriyyə xala, bu gecə nə var? Nuriyyə xala, məni də tar dərnəyinə götür. Nuriyyə xala, nə vaxt teatr verəcəksiniz?"

Mən klassik və müasir yazıçıların əsərlərindən xoşuma gələn parçaları seçib, axşamçağı mədəniyyət evinin sərin eyvanına yığılan kəndlilər üçün oxuyurdum. Bədii qiraət ustası olmasam da, ürəkdən oxuyurdum. Həqiqi sənətin (oxuduğum əsərləri nəzərdə tuturam) təsiri mənə böyük təsəlli olurdu. Sanki Nizamidən, Füzulidən, Şekspirdən, Lermontovdan oxuduğum parçalarla mən, qulaq asanlara, nə isə, özümə, öz qəlbimə aid sirlər söyləyirdim. Elə bil, bu əsərlərlə özümdən danışırdım və bunun başqalarına təsirini gördükdə, özümü, ağlayıb ürəyini boşaltmış adamlar kimi, yüngül hiss edirdim.

...Bir istirahət axşamı Söyüdlü arx yuxarı gəzməyə çıxmışdım. Orada-burada çoxdan quruyub saralmış ot-əncər içində bitmiş yaşıl böyürtkən kolları adama qəribə, qüssəli təsir bağışlayırdı. Lakin yaxınlaşıb tər yarpaqlar arasında qara muncuqlartək parıldayan böyürtkənləri görəndə, qəlbimi anlaşılmaz bir şadlıq hissi bürüyürdü. Havada qurumuş küləş ətri duyulurdu. Bir dəstə bildirçin biçilmiş zəmi yerinə tökülərək dənlənirdi. Daha aşağılarda pambıq tarlaları görünürdü. Mən hərdən böyürtkən qoparanda, uşaqlıqda qızlara qoşulub meşəyə moruq, çiyələk yığmağa getdiyim günləri xatırlayırdım. Zaman necə tez keçib gedir... Uşaqlıq çağı gecə qayaların dibində qaladığımız ocağın ətrafında halay vurub ayıdan, canavardan danışdığımız, sonra, işıqlanar-işıqlanmaz, qalxıb bir-birimizə macal vermədən, şehli otlar əlimizi üşüdə-üşüdə moruq dərdiyimiz vaxtlar, elə bil, dünənmiş.

Mən düşünürdüm ki, indiki günlər eləcə tez keçib-gedəcək, yalnız bircə şey lazımdır: dözmək! Qoy oxucu, Allah göstərməsin, bəzi tən-

qidçilər kimi, mənim gəldiyim bu nəticəni ümumiləşdirməsin. Çünki bu iztirab ancaq mənim özümə aiddir. Əgər, mənim kimi, dünyada bir başqası varsa, qoy məni o mühakimə etsin.

İlk günlər, dünyada hər əzabın bir sonu olduğunu düşünərək, özümə təsəlli verirdim. Lakin bu cür təsəlli qorxaqlıqdır, vəfasızlıqdır. Çünki mən onun üçün için-için yanmaqdan nəhayətsiz bir zövq duyuram. Bu mənim səadətimdir. Məgər, böyük ağıl sahibi olan Füzuli, Şekspir belə bir fədaiyə haqq verməmişlərmi? Əgər, mən onun uğrunda daxilən əzab çəkirəmsə, bunun kimsəyə ziyanı yoxdur. Bu, mənim səadətimdir. Doğrudur, mən onun arvadı olsaydım, bu səadət başqa cür olardı. Lakin eybi yoxdur. Mən yenə də xoşbəxtəm. Çünki mən onun üçün yanıram. Mən əminəm ki, o mənim bir dırnağıma da daş dəyməsinə razı olmazdı. Mən bilirəm, hiss edirəm ki, o mənim üçün özünü oda-suya atardı. Ona görə də, mən çox xoşbəxtəm və mən bu səadətimi hamıdan, birinci növbədə, onun özündən gizləməyə məcburam. Çünki mən onu və ona aid hər bir şeyi sevirəm, istəyirəm. Mən onun varlığı ilə yaşayıram. Onun səadəti mənim səadətimdir. Biz iyirminci əsrin qızları keçmişlərdəkilərə nisbətən daha sərtik. Biz dediyimiz yerdən kəsməyi bacarırıq. Biz incə, sentimental "ah-zarlara" qarşı amansızıq!

Mən bu cür düşüncələrlə böyürtkən kollarının arasında dolaşarkən, arxadan səs eşidib diksindim. Ürəyim qırılıb ayağımın altına düşdü. Mən hiss edirdim ki, gələn odur. Biz görüş təyin etməmişdik. Lakin hiss edirdim ki, gələn odur. Mütləq odur. Mən özümü ayaq üstündə güclə saxlayaraq, geri döndüm. Gələn, doğrudan da, o idi.

– Oy, məni yamanca qorxutdunuz. Xoş gördük. Səadət bacı və Əlimərdan kişi necədirlər?

– Çox sağ olun, yaxşıdırlar...

Biz üfüqdən-üfüqə uzanan çöllərin sükutu içində yanaşı yeriyirdik. Bu sükut məxmər kimi yumşaq idi. Bu sükut birgə nəfəs aldığımız indiki anların əbədiyyəti idi. Bu sükutda nəhayətsiz bir mehribanlıq var idi.

Mən, tez-tez əyilib kollardan böyürtkən dərərək ağzıma atırdım. Mən, bu dəqiqələrin bir də heç zaman qayıtmayacaq xatirələri ilə xoşbəxt idim. Mən, yarpaqların içində gizlənərək, yetişib qapqara qaralan, şəvə boyunbağı kimi bir budağa düzülmüş böyürtkənləri yığıb ona vermək istəyirdim. Lakin...

– Siz də böyürtkən xoşlayırsınızmı? – deyə qayğısız halda soruşdum.

Ancaq mən bu dəfə öz rolumu yaxşı ifa edə bilmədim. Bütün cidd-cəhdimə baxmayaraq, səsim titrəyirdi.

O, başını aşağı salaraq susurdu. Birdən darıxırmış kimi:

– Gəlin, – dedi, – bu kolluqdan çıxaq.

Mən də zarafata salaraq:

– Neyləyək, – dedim, – vaxta ki, siz bu gözəl böyürtkənləri xoşlamırsınız, gəlin çıxaq.

Xeyli aralıda, çöllərin sonsuzluğu içində iri, qollu-budaqlı tək bir ağac görünürdü. Hələ işıq olan ləkəsiz, mavi səmanın altında o, yavaş-yavaş qaralmaqda idi. Biz böyürtkənlikdən bir qədər aralanandan sonra:

– Görəsən, necə olub ki, o ağac bu düzün ortasında bitib? – deyə soruşdum.

– Kim bilir, dünyada o qədər qəribə işlər olur ki.

“Doğrudur, əzizim, dünyada çox qəribə işlər olur.”

– Eh, – dedim, – siz lap filosof kimi cavab verdiniz. Məncə, dünyada hər şey o qədər aydındır ki, heç o barədə düşünməyə dəyməz. Məsələn, götürək o ağacı, yəqin ki, quş-zad toxumunu aparıb salıb ora və yaxud vaxtilə buralar meşə olub.

Əvvəl o mənə cavab vermədi. Sonra birdən dayanıb, mənə baxdı.

– Yox, bu belə davam edə bilməz. Biz nə vaxta qədər bir-birimizi aldadacağıq?..

Bədənim uyuşub açıldı, dizlərim titrədi.

– Nə olub? – deyə laqeyd-laqeyd gülümsəməyə çalışdım.

Lakin onun iri qara gözlərində elə mükəddər, elə məzəmmətli ifadə gördüm ki, davam gətirə bilmədim:

– Murad, – dedim. – Sizin o cür oğlunuz var...

– Günü-dirliyi cəhənnəm əzabı içində keçən bir ata mənim oğlumun nəyinə lazımdır?

– Elə deməyin. Nə üçün elə deyirsiniz?

– Çünki elədir.

– Hər dərdin bir çarəsi var.

– Yalan sözdür. Bu dünyada insanların həyatını zəhərləyib məhv edən, onların səbrindən, iradəsindən asılı olmayan o qədər çarəsiz dərdlər var ki!

– Hər halda, siz bir yol tapa bilərdiniz.

– Tapa bilmirəm. Ayrılmaqdan başqa çarəm yoxdur. O heç bir şey itirməyəcək. Ali təhsilli, gənc, gözəl qadındır.

– Bəs oğlunuz?
– Ya özü saxlayar, ya da verər mənə.
– Siz ki, bir-birinizi istəyib evlənmisiniz, Murad...
– Doğrudur. Ancaq mən ondan qabaq sizi görmüşdüm.
– Mən o zaman da, indi də sizə bir qardaş gözüylə baxmışam.
– Düz demirsiniz.
– Bəlkə siz məni səhv başa düşmüsünüz? Bizim aramızda heç bir şey olmayıb, ola da bilməz.
– Bu sizin qəti cavabınızdır?
– Qəti!
Artıq enməkdə olan axşam qaranlığında o, əlimdən tutaraq həyəcanla:
– Nuriyyə, – dedi, – doğrudanmı, mən bu qədər aldanmışam?
Mən tamamilə qeyri-şüuri bir hərəkətlə onun əlini sıxdığım üçün diksinib dərhal əlimi geri çəkdim.
– Siz yanılmısınız, Murad.
Sonra saçlarımı düzəldərək onun üzünə baxmadan soyuq və biganə bir ifadə ilə:
– Gedək, – dedim, – gecdir.
Biz geri qayıdıb Söyüdlü arxa qədər dinməz getdik. Arxa çatanda o, “sağ olun” deyib sürətlə uzaqlaşdı. Mən dərindən nəfəs alıb, seyrək ulduzlar çıxmış göyün altında qaralan o tək ağaca baxdım. İndi onun sükutu ağır və soyuq qurğuşun kimi ürəyimi əzirdi. Mən qaranlıqda, yarpızların arasında yerə çökərək ovuclarımı su ilə doldurub üzümə vurdum. Vücudumu tərk etməkdə olan huşumu geri qaytarmalı idim.
Söyüdlü arxın suyu ılıq və mehriban idi.
Söyüdlü arx yarpaqların incə xışıltısı altında səssizcə axıb gedirdi. Birdən lap ayağımın ucundan suya şappıltı ilə bir qurbağa atılıb, həyəcanla səsləndi, başqaları da ona qoşulub çölün qaranlıq sükutunu pozdular. Mən tamamilə sakit halda ayağa qalxıb, gur elektrik işığına qərq olmuş mədəniyyət evinə doğru addımladım.
...İşlərimiz pis getmirdi. Son günlərdə xeyli şeyə nail olmuşduq. Yeri gəlmişkən deyim ki, traktorçu Qaqaş da indi bizim dəstəmizin məşqlərində iştirak edirdi. Mən onun köməyi ilə mədəniyyət evinə Güney və Quzey qışlaqdan altı gənc oğlan cəlb edərək, balaca rəqs ansamblı düzəltmişdim. Həmin gənclərin içində bizim şofer Almurad da var idi. Bu, Nazxanıma çox maraqlı görünürdü. Biz Qulu ilə köməkləşib, idarə heyətini oyunçularımız üçün paltar tikdirməyə razı salmışdıq.

Paltarlar hazır olana qədər qədim Azərbaycan rəqslərindən “Yallı”, “Uzundərə” və “Mirzəyi” havalarını hazırladıq. Lakin İmi ilə Cimi yalnız bunlarla kifayətlənməyərək, proqrama iki yeni hava salmağı təklif edirdi.

– Biz, birinci növbədə, müasir şeyləri göstərməliyik, – deyə İmi izah edirdi.

Mən onunla ciddi mübahisəyə girərək cavab verirdim:

– Biz müasir həyatla bərabər, keçmişimizi də yaddan çıxartmamalıyıq. Gözəl ənənələrimizi həmişə yaşatmalıyıq.

Cimi isə, “düzdür, düzdür” deyə hər ikimizin fikrini təsdiqləyirdi.

Rəqs ansamblımızda iştirak edənlərdən dördünün Quzey qışlaqdan olması mənə xüsusilə xoş gəlirdi. Orası da çox maraqlı idi ki, Nəriman əmi bu məsələnin üzərindən sükutla keçir, bizim ansamblda quzeylilərə bu qədər yer verməyimizə heç nə demirdi. Lakin, bu barədə söz düşəndə, kimdən isə küsmüş kimi üzünü yana çevirirdi.

...Paltarlar hazır olandan sonra yeni ansamblın iştirakı ilə böyük bir konsert düzəldib, quzeyliləri də dəvət elədik.

Bir neçə nömrədən sonra növbə oyunçulara gəldi. Əvvəlcə “Yallı” rəqsindən başladıq. Ayaqlarında yüngül məs, başlarında qıyqacı qoyulmuş gümüşü papaq, əyinlərində uzun atlas arxalıq, vəznəli çuxa, bellərində kiçik xəncər olan səkkiz nəfər boylu-buxunlu, incə, şivərək qəşəng oğlan qol-qola tutuşub, musiqinin cəsur ahənginə uyğun oynadıqca, babalarımızın artıq bir nağıl olmuş həyatı gözlərim qarşısında canlanır, mən gözəl vətənimizin sıldırımlarından üzüaşağı at sallayan igidlərin səslərini eşidirdim.

Gənclər gözəl, zərif bir ahənglə oynayırdılar. Onların hər bir hərəkəti təbii və coşğun idi.

Mən quzeylilərin və onların arxada oturmuş sədrlərinin oynayanlara necə fərəhlə baxdığını görürdüm. Onlar bu incəsənət işində özlərindən də iştirak edənlərin olduğuna sevinirdilər.

“Yallı” qurtaran kimi gurultulu alqış qopdu. Nəriman əmi həyəcanla ayağa qalxaraq dedi:

– Mən öz hesabıma bu səkkiz nəfəri ağ çuxa ilə mükafatlandırıram.

(İndi əyinlərindəki sürməyi çuxa idi. Qədimdə isə, babalarımız, yay-yaz, ağ çuxa geyirmişlər.)

Mən düşündüm:

“Səkkiz nəfərin səkkizini də, demək, sədrimiz Quzey gənclərini bizimkilərdən ayırmır.”

O gecə Səriyyə ilə Cimi də yeni mahnılar oxudular. Konsertdən sonra Murad bir neçə kəndlisi ilə yanımıza gələrək mənə təşəkkür etdi.

...Səhər işdən sonra, otağımda əyləşib radioda “Otello”ya qulaq asırdım. Mənə elə gəlirdi ki, Dezdemonanın danışığında, nidalarında, nə isə, yalnız səhnəyə məxsus bir şey vardır. Bu “bir şey” məni incidirdi, əzab verirdi. Mən bir yerdə qərar tapmır, tez-tez yerimi dəyişir və əsəbiləşirdim. Mən aktrisadan nə tələb edirdim? Bilmirdim. Ancaq onun duyğularında nəyinsə çatmadığını hiss edirdim. Hiss edirdim ki, o, məhz “təsir etməyə” can atır. Halbuki Dezdemona günahsız olduğunu söyləyərkən, ərinin ürəyini yumşaltmaq, ona “təsir etmək” xəyalından çox uzaq idi. Bu məsumluq onun qanında idi. O, ərinə xəyanət edə biləcəyini təsəvvürünə belə gətirmirdi.

Lakin bütün bunların mənə nə dəxli var idi? Əgər, bu hisslərimi o məşhur aktrisaya söyləsəydim, bəlkə də, mənə gülərdi. Mən kimsənin tanımadığı adi bir adam idim. Səhnə, Dezdemona, Ofelya mənim üçün məhv olub getmiş uzaq arzular idi. Mən böyük sənətə “Əlvida!” demişdim.

Birdən qapımın döyüldüyünü eşidərək, qalxıb açdım. Qonşuluğumuzdakı oğlan uşağı mənə mavi bir zərf uzatdı:

– Nuriyyə xala, bunu Murad əmi verdi, deyir rayondan göndəriblər.

– Murad əmin haradaydı?

– İndi buradan keçirdi.

Mən uşağa konfet verib, yola salandan sonra otağıma girib qapımı bağladım və pəncərənin qabağına gələrək xeyli hərəkətsiz dayandım. Ürəyimin döyüntüsü sakit olandan sonra zərfi cırıb məktubu oxumağa başladım. O, adımı çəkmədən birbaş mətləbə keçərək yazırdı:

“Mən sizi tamamilə başa düşürəm. O axşam siz nəcib, namuslu bir insan kimi hərəkət elədiniz. Ancaq istəyirəm ki, siz də məni olduğum kimi başa düşəsiniz. Məni namərd hesab eləməyəsiniz. Birinci dəfə sizi görərkən, nə üçünsə, mənə elə gəlmişdi ki, biz heç bir zaman bir-birimizdən ayrılmayacağıq. Ancaq biz ayrıldıq. Mən uzun zaman sizi yaddan çıxara bilmədim. Lakin günlər gəlib keçdi. Ordudan təxris olunub kəndə qayıtdım, evləndim. Əgər, desəm ki, özümə həyat yoldaşı seçdiyim adamı əzəldən istəməmişəm, bu, namuslu hərəkət olmaz. Mən onu istəyib, xoşlayıb evlənmişdim. İlk zamanlar xoşbəxt yaşayır-

dıq. Lakin sonralar heç bir əsas olmadan o məni qısqanmağa başladı. Əvvəllər buna o qədər də əhəmiyyət vermirdim. Fikir edirdim ki, uşağımız olar, başı qarışar, elə şeylər də yadından çıxıb gedər. Ancaq təəssüf ki, belə olmadı. Qısqanclıq getdikcə şiddətləndi. Kəndə təzə bir müəllimə gəldimi, mən təsadüfən bir qadınla danışdımmı həftələrlə evimizdən dava-şava qurtarmır. Nə qədər çalışdım, nə qədər and-aman elədim, bir şey çıxmadı. Bu nə qədər belə davam etməlidir?

İnanın, məni özümdən çox onun halı düşündürür. Bu lənətə gəlmiş qısqanclıq onun özünü də məhv edir. O, daim əzab çəkir. Axı, nə üçün belə olsun? Buna birdəfəlik son qoymaq daha yaxşı deyilmi?

Odur ki, bir dost, bir yoldaş kimi sizə müraciət edib soruşuram: mən nə etməliyəm?"

Bu məktubu oxuyandan sonra mən: "Madam ki, – deyə fikirləşdim, – onlar bir-birilə xoşbəxt deyillər, əlbəttə, bu belə davam edə bilməz. Axı, onlar nə qədər dalaşacaqlar? Nə vaxta qədər bir-birilərinə əzab verəcəklər? Belə yaşamaqdansa, əlbəttə, ayrılmaqları yaxşıdır. Səadət gənc, gözəl qadındır. İstədiyi adama ərə gedə bilər. Doğrudur, əvvəllər Muradı unutmaq onun üçün çətin olacaq. Lakin sonra... Bir də, axı, nə etməli, başqa çarə yoxdur..."

Dəhşətli bir sevinc qəlbimi bürüdü, bədənimin uçunduğunu hiss etdim. Nəfəsim təngiyir, hava mənə azlıq edirdi. "Onlar ayrılarlar. Aradan bir müddət keçər, köhnə yaralar sağalar. Sonra biz evlənərik. Mən pərvanə olub onun başına dolanaram. Günlərinin fərəhli keçməsinə çalışaram. Biz əl-ələ verib Quzey qışlağın gələcəyi üçün yeni-yeni işlər görərik. Söyüdlü arxın altında dinc həyat quraraq. Görünür, tale özü məni gətirib bura çıxarmışdır. Ah, Murad! Mənim əzizim, sənin qadının olmaq, hər gün sənin köynəklərini yuyub ütüləmək, səhər tezdən durub sənə çay-çörək hazırlamaq, nahar vaxtı stolun üstünü düzəldib yolunu gözləmək, gecələr sənin və sənin iş yoldaşların üçün yeni-yeni konsertlər vermək o qədər böyük səadətdir ki, sevincimdən az qalır nəfəsim tutulsun."

Və mən oturub ona belə bir məktub yazdım:

"Öz böyük sirrinizi mənə açdığınız üçün, mənə bu qədər yüksək etibar göstərdiyiniz üçün sizə təşəkkür edirəm. Siz bir dost kimi mənə müraciət edib soruşursunuz: "Nə etməliyəm?" Mən də bütün biliyimi, bacarığımı, azca həyat təcrübəmi köməyə çağıraraq, sizə cavab yazıram: mən sizin ailə həyatınız haqqında başqalarından da eşitmişdim.

Bu, əlbəttə, arzuolunmaz haldır. Məktubunuzda hər şeyin namusla və ürəkdən yazıldığına şübhəm yoxdur. Siz əzab çəkirsiniz. Bunu az-çox müşahidə bacarığına malik olan hər bir kəs sizin üzünüzdən də oxuya bilər. Ancaq siz bunun üçün öz arvadınızı təqsirləndirməyin, çünki o sizi hədsiz və şiddətlə sevir. Özünüz etiraf edirsiniz ki, siz də onu xoşlayaraq, istəyərək evlənmisiniz! Bu elə bir məqamdır ki, Arximed demişkən, siz ona istinad edərək, dünyanı aşıra bilərsiniz! Bundan başqa, sizin o cür oğlunuz var! Xoşbəxtliyiniz ilk meyvəsini vermişdir! Siz məndən soruşursunuz: "Nə etməliyəm?" Mən də sizə deyirəm: "Dözün, çünki o, anadır! Siz öz səbrinizlə ananın qəlbindəki şübhələri məhv edin! Öz mehribanlığınızla onun ürəyinə təsir edin! Əgər, mən sizi sevsəydim belə, ondan ayrılıb mənimlə evlənməyinizə razı olmazdım. Mən oğlunuzun anasının yerində oturub özümü xoşbəxt hesab edə bilməzdim. Dərdinizdən ölsəydim də, belə edə bilməzdim. Bəlkə o sizin işinizə də mane olur. Sizi hədsiz dərəcədə incidir. Ancaq siz onu atsanız, o məhv olar. Halbuki o, anadır. O, müalicə olunub sağala bilər. Siz onun təbibi olun. Dünyada mümkün olmayan işi mümkün eləyin! Çünki o, anadır. Çünki o sizi sevir!"

Bu cümlələri yazdıqca, elə bil, ürəyimə yüzlərlə buz kimi soyuq iynələr sancırdılar. Lakin mən geri çəkilmirdim. Düzmü hərəkət edirdim? Sözlərimdə haqlı idimmi? Bilmirəm. Mən öz mətanətimdən razı idim. Mən, "həqiqi insan ləyaqətinin qarşısında hər şey yalandır" deyə özümü öyürdüm.

Mən öz hərəkətimdən misilsiz bir zövq aldığıma özümü inandırmağa çalışırdım. Mən özümü tilsimli qapılar açan "Min bir gecə" qəhrəmanları yerinə qoyurdum. "Qəhrəman da yazıq olarmı?" Lakin bu nə sözdür? Kim deyir mən yazığam? Kim deyir mən özümü başqaları üçün fəda edirəm? Yox! Mən hər nə edirəmsə, hər nədən binəsib oluramsa, ancaq özüm üçün, öz səadətim üçün edirəm. Siz hələ biz qızları az tanıyırsınız. Mən sübut edəcəyəm ki...

Burada mənim daxili nitqim qırıldı. Nə oldu? Nə baş verdi? Bilmirəm. Lakin üzümə çilənən sudan diksinib gözümü açdığım zaman özümü döşəmənin üstünə yıxılmış gördüm.

Nazxanım yanımda oturub qollarımı ovurdu. Mənim ayıldığımı görüb:

– Ay başına dönüm, – dedi, – sənə nə olmuşdur?

– Heç nə.

Tələsik qalxdım, stolun üstündə yarımçıq qalmış məktubu götürüb, kitabın altına qoydum.

– Sənin yanına gəlirdim. Arakəsməyə girəndə gördüm bir şey tappıldadı. Yüyürüb gördüm sənsən. Elə pis oldum ki, elə pis oldum... Bir yerin-zadın əzilməyib ki?

Mən əlimi başımın ardına sürtdüm:

– Heç nə olmayıb, əhəmiyyət vermə, məndə hərdənbir belə hallar olur, yaxşı ki, sən gəlib çıxmısan.

– İndi ki, ürəkkeçmən var, niyə mənə deməmisən?

– Nə bilim... Adam utanır.

– Məndən sənə əmanət, heç vaxt ürəyini qısma.

– Eh, sən də... Ürəyimi niyə qısıram? Canımdan-zadımdan keçməmişəm ki.

– Odur ha...

İravanda xal qalmadı,
O xal nə xaldır,
Ora düzdürmüsən.
De görüm, nə xaldır,
Üzə düzdürmüsan.

Nazxanım qalxıb çırtıq vura-vura süzdü.

Mən onun həssas qəlbi olduğunu bilirdim. Bilirdim ki, ayrı vaxt əri yadına düşəndə "ah" çəkir. Bəlkə də, hansı xoş dəqiqələri isə xatırlayaraq göz yaşı tökür. Ona görə də, indi ona riqqətlə tamaşa edirdim və bu məndə ikinci bir hissin – həyatdakı vəzifələrimi yerinə yetirmək hissinin qüvvətlə baş qaldırmasına səbəb olurdu. Mənim kədərimi unutdurmaq üçün bu sadə, gənc və gözəl gəlinin öz dərdlərini bu cür ayaqlayaraq rəqs etməsi mənə deyirdi ki, nə olur-olsun, yaşamaq və başladığımız işləri axıra çatdırmaq bizim borcumuzdur.

O, oynayıb qurtarandan sonra mən qəribə bir ruh yüksəkliyi ilə yenə də "Əlli yaşında cavan" musiqili komediyasından söz salaraq, onu dilə tutdum. Deyəsən, bir az yumşaldı:

– Yəni, deyirsən bacararam?

– Bacararsan!

Şaqqıldayıb güldü:

– Vallah, elə ürəkdən deyirsən ki, elə bil, məni birdən-ikiyə səhnədə oynayan görmüsən.

Elə bu zaman Qulu gəlib çıxdı. Söhbətin nə yerdə olduğunu bilən kimi ayağının birini irəli, birini geri qoyub Nazxanıma xitabən:

– Sən öz qədrini bilmirsən, – dedi, – səndə istedad var!

– Qulu dayı, məni az təriflə, istedad nədir?

– Bacarıq, istedad!

Qulu şəhadət barmağını yuxarı qaldırdı. Sonra bir addım irəli atıb nitq söyləyirmiş kimi əlavə etdi:

– Onu məhv etmək cinayətdir. Bəli, bəli, cinayətdir!

Nazxanımı yola gətirmək üçün Qulu çox qəribə misallar çəkirdi. Onun deməsinə görə, bir çox böyük artistlərin əvvəli Nazxanım kimi imiş...

O qədər dil tökdük ki, axırda gəlinin saqqızını oğurladıq. Bu, İmi, Cimi və Səriyyədən sonra bizim üçüncü qələbəmiz idi.

...Uzun əsrlərdən bəri suyun həsrətini çəkmiş quzeylilər elə həvəslə işləyirdilər ki, baxanda adamın ürəyi kövrəlirdi. Murad, Hümmətin köməyi ilə rayondan bir ekskavator da gətirmişdi. Söyüdlü arx qara şərid kimi, yavaş-yavaş Quzey qışlağa doğru uzanmaqda idi. Mən, işin bu qızğın vaxtında Muradı pərişan edəcəyimdən qorxaraq, ona yazdığım cavab məktubunu qoynumda gəzdirir, verməyə cəsarət eləmirdim. O kiçik kağız parçası od olub sinəmi yandırırdı. Hər dəfə Muradla qarşılaşanda o, sualedici nəzərlərlə üzümə baxır, mən isə, pərt olub susurdum. Heç bir zaman mən ondakı qədər iztirab çəkməmişdim.

Nəhayət, bir gün kənddən mədəniyyət evinə gəldiyim vaxt onunla rastlaşdım. Salamdan sonra ikimiz də bir neçə saniyə susub danışmadıq. Axırda o gülümsəyərək:

– Nuriyyə xanım, – dedi, – görünür, siz mənə cavab verməyi də lazım bilmədiniz.

Mən bütün gücümü toplayaraq, məktubu qoynumdan çıxarıb ona verdim və kənardan bizi görən ola biləcəyi barədə düşünmədən onun əlindən yapışıb:

– Murad, – deyə titrək səslə pıçıldadım, – məni bağışla. Başqa cür mümkün deyil. Mümkün olsaydı, mən canımı da səndən əsirgəməzdim.

Sonra çevrilib heç bir şey görmədən, duymadan mədəniyyət evinə getdim. Eyvana çıxanda, taqətdən tamam düşərək skamyanın üstündə oturdum. İmi ilə Cimi eyvanın o biri tərəfində uşaqlara tar dərsi keçir-

dilər. Əlində qəzet tutmuş Almurad nə isə deyir, Nazxanım gülürdü. Qulu bir neçə kəndli ilə bərkdən söhbət edirdi. Mən onların hamısını bir tor arxasından görürdüm. İndi onlar hamısı məndən uzaq, mənə yad idilər. İndi onların üzündə mənə qarşı dözülməz dərəcədə soyuq, biganə bir ifadə hiss edirdim. "Ax, biz insanlar nə üçün beləyik? Nə üçün bir-birimizin qəlbinə girə bilmirik? Birimiz bu qədər dərd içində ikən, nədən digərimiz elə gülür? Ax, biz nə qədər xudpəsəndik! O mənim məktubumu oxuyub nə düşünəcək? Mənim göstərdiyim bu fövqəladə fədakarlıq kimin üçündür? Bunu kim biləcək, kim qiymətləndirəcək? Mən öz səadətimi kimdən ötrü məhv edirəm? Biz insanlar buna dəyərikmi? Mən dünyada misli görünməmiş bir axmaqlıq etmirəmmi? Durub Muradın ardınca yüyürsəm..."

Qulu mənə yaxınlaşıb həmişəki təki şən və gümrah görünüşlə:

– Nuriyyə xanım, – dedi, – tufan olacaq.

– Nə var ki?

– Ağabəyim deyir, əgər, sən o Nazxanımla bir yerdə teatr versən, dünyanı dağıdacağam.

– Nə üçün? Yazıq Nazxanım ona nə pislik eləyib? – deyə əsəbi halda soruşdum.

– Elə onu deyin...

Mənim dalğın olduğumu hiss edərək, söhbəti dəyişdi:

– Eybi yoxdur, əşi, birtəhər sovuşdurarıq. Bağışlayın, bu gün məşqimiz saat neçədədir?

– Altı tamamda.

– Demək, hələ qırx beş dəqiqə var. Mən bir elektrik stansiyasına dəyim gəlim. Deyirlər nə isə xarab olub.

Bu sözlərdən sonra o, yel kimi getdi. "Bu da qəribə adamdır, – deyə eyni əsəbiliklə düşünürdüm, – sən mühasib babasan. Sənin elektrik stansiyası ilə nə işin var? Maşın xarab olur, qoy onunla, kim lazımsa, o məşğul olsun, sənə nə dəxli var?"

Lakin bu fikirdən sonra özüm özümə o qədər kiçik, o qədər xəbis göründüm ki, bilaixtiyar əllərimlə üzümü qapadım.

..."Əlli yaşında cavan" musiqili komediyasının məşqləri qızğın getməkdəydi. Qulu tez-tez şəhadət barmağını yuxarı qaldıraraq:

– Sizi inandırıram ki, – deyirdi, – bu Nazxanım istedaddır.

Nazxanım isə, gah küsür, gah hirslənib Quluya hücum edir, gah da həqiqətən elə istedad göstərirdi ki, mən özüm də heyran qalırdım.

Hamısından maraqlısı o idi ki, Nazxanımla Qulunun rolları bir düşmüşdü.

...Gözlənilən axşam gəlib çatdı. Mədəniyyət evinin tamaşa zalı ağzına qədər dolu idi. Quzeylilərdən də xeyli adam var idi. Mən güman etmişdim ki, Murad gəlməyəcək. Lakin gəlmişdi. Bunun üçün ürəyimdə ona min dəfə təşəkkür edirdim. Elə bil, bütün dünyanı mənə vermişdilər. Elə bil, nişanlım bizə qonaq gəlmişdi. (Bu özü özlüyündə çox kədərli bir hiss idi.)

Nazxanımın səhnəyə ilk çıxışı çox maraqlı oldu. Əvvəlcə tutulub sözü yadından çıxartdı. Mən pərdə arxasından pıçıldayan kimi, elə bil, ona birdən-birə cəsarət gəldi. Dərhal rola girərək oynamağa başladı. O, getdikcə elə sərbəst, elə şən oynayırdı ki, sevincimdən ürəyim döyünürdü. Qabaq cərgədə oturmuş Ağabəyimin matı-qutu qurumuşdu. O, Nazxanımın oyununa elə tamaşa edirdi ki, elə bil, möcüzə görürdü. Nəriman əmi də qəribə bir təəccüblə baxırdı. Qərənfil bacı hey gülümsəyirdi və elə oturmuşdu ki, sanki bütün bədəni ilə rəqs edirdi.

Ümumiyyətlə, operetta çox gözəl təsir bağışlayırdı. Hamı gülürdü. Hamının üzündə şən ifadə var idi. Qulu lap qiyamət edirdi. Onun roldakı adı da Qulu olduğundan, çox məzəli çıxırdı. Bir yerdə Nazxanım ona (yəni, səhnədəki sevgilisinə) müraciətlə oxuyurdu:

Qulu, Qulu, ay Qulu,
Başına bir daş, Qulu,
Sən mənimsən, mən sənin,
Neynirsən pulu-mulu.

Elə bunu yenicə deyib qurtarmışdı ki: "Başına da daş, hələ bir az da o yana" deyə Ağabəyim yerindən səsləndi. Kərəm və başqaları bərkdən gülüşdülər. Nəriman əmi dönüb Ağabəyimə acıqlandı: "Bu, səhnədir, başa düş!" Sonra yerbəyerdən pıçıldadılar: "Hişş". Oyun davam etdi. Nazxanım qətiyyən pərt olmayaraq, daha da cəsarətlə oynayırdı. Onun müvəffəqiyyəti bizi o qədər sevindirmişdi ki, uçmağa qanadımız yox idi. Tənəffüs zamanı hamımız Nazxanımın başına yığışıb onu təbrik edirdik.

Nazxanım isə:

– Dayanın hələ, – deyirdi, – o Ağabəyimin acığına gərək elə oynayım ki, lap Bakının özündən gələnlərin də ağzı açıla qalsın.

Qulu da bir gözü qapıda olduğu halda:

– Sən mənim canım, incimə. Burjuaziya qalığıdır, – deyib Nazxanımı dilə tuturdu.

Elə bu zaman bir oğlan bizim qrim otağına girərək mənə dedi:

– Səadət bacı sizi görmək istəyir.

Elə bil, ürəyimi qırıb yerə saldılar. Çünki Səadət tamaşa zalında yox idi. Demək, indi gəlmişdi. Bu vaxt onun mənimlə nə sözü ola bilərdi? Tez qapını açıb gördüm ki, dayanıb arakəsmədə. Gülümsəyə-gülümsəyə yaxınlaşdım.

– Xoş gördük, Səadət bacı, – deyə əl uzatdım.

Cavab vermədi, alt dodağını dişləri arasına sıxıb, xəncər kimi kəskin nəzərlərlə gözlərimin içinə baxdı. Sonra dalbadal üzümə iki sillə çəkdi:

– Dərələrin iti! Şəhərdən bura ev dağıtmağa gəlmisən?! Əliuşaqlı ananı ərindən eləmək istəyirsən?! İki kəndin arasına qan salırsan?! (Səadət Güney qışlaqdan idi.) Sən yönlü adam olsaydın, bura gəlib çıxmazdın.

Səs-küyə hamı tökülüb gəlmişdi. Səadəti tuturdular, tutulmurdu. Bu incə gəlində nə yaman güc varmış! Qulu qrimli-qrimli onun qabağını kəsdi:

– Səadət! Səadət! Axı, mən də, Ağabəyim də sənə dedik ki, səhv edirsən, Nuriyyə xanım elə adam leyil.

– Cəhənnəm ol! Gödək koramal! Elə bu işlərin hamısını eləyən sənsən.

Qulu dal-dalı çəkilərək təəccüblə soruşdu:

– Hansı işlərin?

Bu zaman Nəriman əmi də gəlib çıxdı. Məsələnin nə yerdə olduğunu biləndən sonra ondan gözlənilməyən bir mehribanlıqla:

– Yekə adamsan, – deyə Səadəti məzəmmət elədi. – Sənə belə şey yaraşmaz.

Qərənfil bacı da gəlinin əlindən yapışdı:

– Niyə ortada heç nə olmaya-olmaya, özünü də, ərini də camaat arasında biabır eləyirsən? Bu yazıq qızın nə günahı var?

"Yazıq"!" Mən diksindim. Mən yazıq deyiləm! Mən bu saat özümü hamıdan güclü hiss edirəm. Mənə elə gəlir ki, sıldırım bir dağı çıxdığım zaman qəflətən sürüşüb üzü üstə yerə dəydim. Elə bil, bu səs-küy, bu danışıqlar aşağıdan, dərənin dibindən gəlirdi.

– Bu yazıq elə adam deyil.

– Yazıq, gələndən bizim üçün canından-başından keçir.

– Yazıq, ürəyiaçıq qızdır, – deyə ətrafımıza yığılmış adamlar səslənirdilər.

Səadət isə, gözləri alacalanmış halda qışqırırdı:

– Hamınız yalan deyirsiniz, hamınız ikiüzlüsünüz. Siz bunu tanımırsınız. Bu gələndən bəri Murad evdən-eşikdən didərgin düşüb. Boğazından çörək, su getmir. Bu mənim ərim üçün gah kitab göndərir, gah bilməzsiniz neyləyir. Soruşun görək, bunun yad kişiylə böyürtkənlikdə nə işi var idi?

Nazxanım yeriyib onun qabağında durdu:

– Aaz... aaz... – dedi, – bir insafın olsun. Mən gecə-gündüz bu qızla bir yerdəyəm. Niyə havayı söz danışırsan?

Lakin Səadət heç nə görmür, heç nə eşitmirdi. Mən isə, təəccüblü bir soyuqqanlılıqla dayanıb, ona elə diqqətlə baxırdım ki, guya, bu dəqiqə camaatın içində təhqir edilən mən deyildim. Elə bil, mən nəyi isə öyrənmək, nəyi isə dərk etmək istəyirdim. Lakin mən heç nə öyrənmək istəmirdim. Mən qarşımda çırpınan, əzab çəkən, ürəyi od tutub-yanan bu gənc və gözəl qadına acıyırdım. Mən özümün təhqir olunmağım barədə düşünmürdüm. Onun mənə zillənmiş ala gözləri, zərif ağ çöhrəsi tamamilə ayrı şeylər söyləyirdi. Onların ümumi ahəngində gənc qadının yağdırdığı bu dəhşətli sözlərlə əlaqəsi olmayan bir məsumluq var idi. Sanki bu danışan əslində o deyildi.

Birdən, Murad (görünür, yalnız indi xəbər tutmuşdu) adamları o yan-bu yana edərək tələsik yaxınlaşıb tutqun səslə:

– Gedək, Səadət, – deyə yavaşca qadının qolundan yapışdı.

Səadət əvvəlcə kinli nəzərlə ərinə baxdı. Sonra birdən əlləri ilə üzünü tutub hönkürdü.

– Aparın, içəridə bir az sudan-zaddan verin, sakit olsun, – deyə Nəriman əmi qaşqabaqlı halda dilləndi.

Əri onun qoluna girərək, bizim qrim otağına apardı. Mən Səriyyəyə:

– Get, mənim otağımda stolun yeşiyində valerian var, gətir, – dedim.

Qrim otağında o, taqətsiz halda yıxıldığı stulun arxasına söykənərək, yanıqlı-yanıqlı ağlayır, elə bil, heç kəsi görüb-duymurdu. Elə bil, indi o, öz kədərindən başqa hər şeyə biganə idi.

Qulu suya bir neçə damcı valerian töküb ona verdi. Səadət dərmanı alıb içdi.

– Nuriyyə xanım, – Murad mənə müraciət etdi. – Xahiş edirəm, tamaşanı davam etdirəsinnz. Camaat gözləyir.

Mən qrim otağından çıxdım. Səadətin indi bu gücsüz, aciz göz yaşları tökməsi ilə sanki bir az qabaq özümdə hiss etdiyim güc də yox olub getdi. Mən yorğunluqdan ayaq üstə zorla dayanaraq, Qulunu çağırtdırdım və tapşırdım ki, səhnəyə çıxıb tamaşanın bu gecə daha davam etdirilməyəcəyini bildirsin.

Əgər, bu uğursuz hadisə olmasaydı, Nazxanımın ilk müvəffəqiyyəti bizim üçün tamam bir bayram olacaqdı.

...Görünür, dünyada ədalət, insaf vardır və bu, bizim iradəmizdən asılı deyil. O gecədən sonra yalnız mənim iş yoldaşlarımda deyil, başqalarında da özümə qarşı mərhəmət, hüsn-rəğbət duyurdum. Elə bil, o əhvalat adamların ürəyində mənə qarşı olan yaxşı hissləri vurub üzə çıxartmışdı. Əlbəttə, bu mənim üçün böyük təsəlli idi. Lakin, nə gizlədim, indiki vəziyyətimdə bu məni çox az maraqlandırırdı. Başqalarının mənim o cür təhqir olunmağıma necə baxdıqları barədə nə düşünür, nə də narahat olurdum. Bəlkə mən şəxsi ləyaqət hissimi itirmişdim? Bəlkə heç əvvəldən bu hiss məndə yox idi? Lakin elə böyük hisslər var idi ki, onların qarşısında hər şey kiçik və mənasız görünürdü.

İmi mənə əvvəlkindən daha artıq nəzakətlə salam verib nəzərlərini dərhal başqa səmtə çevirirdi. Cimi isə, ağzını-gözünü mərhəmətlə bürüşdürür və mənimlə sağalmaz bir xəstə kimi danışırdı. Elə bil, üzümə baxıb ürəyində: “Aşna, daha sənin bayatın çağırılıb. Ancaq, heyf, biz bunu istəmirdik” deyirdi. Nəriman əmi isə, məni görəndə: “Hə, bacıqızı, nə var, nə yox?” deyə bərkdən kefimi soruşur, dünyagörmüş adamlar kimi gülümsəyir və sanki demək istəyirdi: “Eybi yoxdur. Bir işdir eləmisən, keçib-gedər”.

Qulu da məni inandırmağa çalışırdı ki, bunlar hamısı burjuaziya qalığıdır. Ona görə də, o, Ağabəyimin sözünün başına ip salmır. Biz sənətkarıq. Sənətkar isə, gərək belə şeylərə əhəmiyyət verməsin. Çünki biz həyata filosof gözüylə baxırıq.

Mənim isə, xəyalım bütün bunlardan çox-çox uzaqlardaydı. Mən Səadətin məhəbbəti haqqında düşünürdüm. Bu məhəbbət fırtınaya uğrayaraq, əlacsız halda dənizin ortasında qalıb, haraya yol alacağını bilməyən gəmi kimiydi. Bu məhəbbət mənim üçün dünyada ən əziz olan bir adama aid idi. Bu gənc qadın da mənim kimi həmin adam üçün

özünü oda-suya atmağa hazır idi. "Yazıq bacım, biz ikimiz də bir dərdə mübtəlayıq. Ona görə də, sən nahaq yerə məni döyürdün... Nahaq yerə. Doğrudur, mən istərdim ki, o, ancaq məni sevsin, mənim olsun, lakin... Budur, o xoşbəxtlik özü mənim qapıma gəlmişdir. O mənə deyir ki, yolunu kəsən o məhəbbəti öldür, sonra əlinin qanını silərək, gülümsəyə-gülümsəyə mənim ağuşuma atıl! Ah, kama yetən eşq, sən nə gözəlsən! Nə cazibədarsan!

Əzizim! İndi qılınc mənim əlimə keçmişdir və onun sivri ucu sənin gilas kimi şəffaf, durna boynu kimi uzun boğazına dayanmışdır. Səni cəhənnəm əzabı ilə məhv etmək üçün mənim kiçik bir hərəkətim kifayətdir. Halbuki bu saat mən özümdə bir div gücü, bir ifritə hünəri hiss edirəm. Mən səni, məni adamların içində haqsız olaraq, ədalətsiz olaraq təhqir edən səni "Min bir gecə" nağıllarında saçlarından asılan gözəllərdən daha müdhiş cəzaya məhkum edə bilmək iqtidarına malikəm. Yoxsa, bu qapımı döyən sənsən? Haradan ürəyimə damdı ki, bu gələn sənsən?"

– Buyurun!

"Ancaq rica edirəm bu dəfə məni döymək fikrinə düşməyəsiniz! Əvvəla, ona görə ki, bunun heç bir mənası yoxdur. İkincisi, mən teatr institutunda oxuyanda ən yaxşı idmançılardan hesab olunurdum."

– Buyurun, əyləşin...

"Ax, mənim gözümün işığı olan onun qadını! Sənin görünüşün nə acınacaqlı və dəhşətlidir! Gözlərin nə yaman alacalanmışdır! Saçların nə yaman pərişandır! Rəngin necə solğundur! Yoxsa, doğrudan da, sən ağlını itirmisən? Ax, mənim yazıq bacım, sən niyə bu günə düşmüsən? Sən nədən bu qədər ürək dağlayan olmusan?"

– Buyurun, əyləşin.

– Lazım deyil. Mən bura oturmağa gəlməmişəm!

– Elə isə, mən sizi dinləyirəm.

– Əgər, yaşamaq istəyirsinizsə, buradan çıxıb gedin. Sizə bircə gün möhlət verirəm.

– Bir gün çox azdır, Səadət xanım.

– Yoxsa, mənim sözüm sizə gülməli gəlir? Yoxsa, siz mənim adam öldürə biləcəyimə inanmırsınız?

– İnanıram, Səadət xanım, inanıram.

– Elə isə, gedin, getdiyiniz yerdən ona məktub, filan yazmaq xəyalına da düşməyin. Onu bilin ki, təkcə özünüzün yox, onun da məh-

vinə səbəb olarsınız. Bu saat mən hər bir şeyə hazıram, eşidirsinizmi, hər bir şeyə!

– İnanıram, Səadət xanım.

– Yox, mən sizin səsinizdə qorxu hiss etmirəm. Siz mənə...

– Mənim qorxmağım sizin nəyinizə lazımdır?

– Ona görə lazımdır ki, siz buradan cəhənnəm olub gedəsiniz.

– Səhviniz var, Səadət xanım. Siz məni qorxutmaqla heç bir şeyə nail ola bilməzsiniz. Bizim, yəni, sizinlə mənim üçün ölüm nədir ki!

– Məni özünüzə tay etməyin.

– Tay olmasaq da, mən bunu deməyə məcburam. Çünki mən də sizin kimi onu sevirəm.

Onun gözləri dəhşətlə parlayıb yırtıcı bir ifadə aldı. Alt dodağını dişləri arasında sıxıb, qana susamış bir qəzəblə üzümə baxdı. Elə bil, ana pələng, balasını əlindən almaq istəyən ovçunun üzərinə sıçramağa hazırlaşırdı. Görünüşü o qədər qorxunc idi ki, tüklərim ürpərdi. Lakin mən ona bir az da yaxınlaşaraq, sakit səslə:

– Səadət xanım, – dedim, – burada olan söhbətlərin bir sirr olub ölənəcən öz aramızda qalacağına, birinci növbədə, ərinizə heç bir şey deməyəcəyinizə namusla söz versəniz, mən hər nə olubsa, hamısını sizə söyləyərəm.

O məni dinləməyə bilməzdi. Əl atıb qapının dəstəyindən yapışaraq, batqın səslə əmr etdi:

– Danışın!

– Yox, söz verməsəniz, danışmayacağam.

– Söz verirəm.

– And için.

Ehtimal ki, qəlbində, nə isə, bir ümid qığılcımı parlayıb onun acığını soyutdu.

– Oğlumun canına and içirəm ki, nə desəniz bu dörd divarın arasında qalacaq.

O, qapıdan aralanaraq, stul çəkib əyləşdi, digər stulu da mənə göstərərək:

– Oturun, danışın, – dedi.

Mən onunla qabaq-qabağa əyləşərək, Muradla ilk görüşümüzü, bura gələrkən yolda ona təsadüf etməyimi artırıb-əskiltmədən nağıl etdim (lakin Muradın mənə qarşı olan hissləri barədə heç nə danışma-

dım. Danışmaq üçün özümü haqlı da bilmirdim). Sonra nitqimi bu sözlərlə bitirdim:

– Mən Güney qışlağa gələn axşam onun evli olduğunu bildim. Bununla da hər şeyə nöqtə qoyuldu. Sizin əriniz mənim ona uzun zamandan bəri bəslədiyim hisslər barəsində heç nə bilmir, ölənəcən də bilməyəcək. Buna arxayın ola bilərsiniz. Ancaq sizdən bir xahişim var: keçmişə görə, məni təqsirləndirməyin. Buna sizin haqqınız yoxdur.

Mən yanılmamışdım. Danışığım o qədər təbii, o qədər ürəkaçan idi ki, o buna inanmaya bilməzdi... O mənim ürəyimin necə yandığını görürdü. O, cəllad belə olsaydı, için-için yanıb-tüstülənən, kimsəyə bir ziyan, bir qanqaralığı verməyən bu ürək ona təsir etməli idi.

O, gözlərini məndən çəkmədən susurdu. Sükut isə, məni daha bərk sıxırdı. Sükut mənim üçün dözülməz əzab idi. Ona görə təkrar sözə başlayıb:

– Bilirsinizmi, – dedim, – mənim başqasına öyüd-nəsihət verməkdən zəhləm gedir. Ancaq icazə versəniz sizə bir məsləhət verərdim.

– Buyurun.

İndi onun səsində yorulub əldən düşmüş adamlara məxsus bir hal var idi.

– Qısqanclıq hissini öldürün. Yoxsa, gec-tez sizi məhv edər.

O, başını aşağı salaraq, güclə eşidiləcək səslə:

– Bacarmıram, – dedi.

– Bacarın! Bunun üçün sizin hər cür imkanınız vardır. Siz gəncsiniz, gözəlsiniz. Sizin o cür oğlunuz var. Murad sizi xoşlayıb, istəyib evlənmişdir.

Burada mənim səsim titrədiyi üçün bir neçə saniyə susdum və özümü ələ alandan sonra davam etdim:

– Sizin ərinizin nəcib adam olduğuna mənim zərrə qədər şübhəm yoxdur. Ancaq siz mərdi qova-qova namərd etməyin.

Axırıncı sözləri deyəndə qışqırmamaq üçün dodağımı bərk-bərk dişlədim.

– Mənim sizin ailə sirlərinizə toxunmağa haqqım yoxdur. Ancaq vaxta ki, aramızda söhbət açılıb, qoyun bir sual da verim. Onun bir ər kimi sizinlə rəftarı necədir?

O, başını qaldırıb diqqətlə üzümə baxaraq:

– Bu barədə, – dedi, – mənim heç bir şikayətim yoxdur.

– Evləndiyiniz müddətdən bəri o, bir ər kimi sizə xəyanət etmişdirmi?

– Yox.

– Bəs nə istəyirsiniz? Niyə özünüzü də, onu da məhv edirsiniz? Niyə xoşbəxtliyinizin qədrini bilmirsiniz?

Mən daha yağdırdığım töhmətləri onun necə qəbul edəcəyi barədə düşünmürdüm. Mən qaynayıb daşan qəzəbimin qarşısını ala bilmirdim. İndi mən onu ölüncəyə qədər döymək istəyirdim.

– Həyatdan daha nə istəyirsiniz? – Mən çay kimi axan göz yaşlarımı saxlaya bilməyib qəzəblə soruşurdum. – O ər, o oğul, o böyük xoşbəxtlik sizə kifayət deyilmi? Nə üçün özünüzə də, ona da, başqalarına da əzab verirsiniz?

O mənə elə təəccüblə baxırdı ki, elə bil, dünyada gözləmədiyi, təsəvvür etmədiyi ağlasığmaz bir hadisəyə rast gəlmişdir.

– Yazıq, kimsəsiz bir qızın varlığı nə üçün sizin yerinizi dar edir? Siz ondan nə pislik görmüsünüz?

Burada hönkürtüm danışmağa imkan vermədiyi üçün susub əllərimlə üzümü qapadım. Mən ağlayırdım. Onun yanımda olduğunu unudaraq, hıçqıra-hıçqıra ağlayırdım.

– Nuriyyə xanım, – o, mülayim səslə dilləndi, – hər nə olub, olub. Mən sizdən üzr istəyirəm.

– Lazım deyil! – deyə əllərimi üzümdən götürdüm. – Mən bunu sizdən tələb etmirəm.

– Çox sağ olun, mən sizin bu fədakarlığınızı qiymətləndirməyə bilmərəm.

– Mən heç zaman fədakarlıq etmək fikrində olmamışam. Sizin bir sədəqə kimi başqasından fədakarlıq ummağa ehtiyacınız da yoxdur.

O, kövrək səslə:

– Mən qadınam, Nuriyyə xanım, – dedi. – Sizin nə çəkdiyinizi hiss edirəm. Məni bağışlayın. Bəlkə dəliyəm, bəlkə xəstəyəm, bilmirəm. Ancaq ixtiyarım özümdə deyil. Mən onu nəfəs aldığı havaya da qısqanıram. Ona zillənən yad bir qadın nəzəri xəncər olub ürəyimə sancılır. Hər dəqiqə, hər an onu itirəcəyimdən qorxuram. Mənə elə gəlir ki, hamı onu məndən almaq istəyir. Bəzən onu didib-parçalamaq dərəcəsinə gəlirəm. Bəzən bir təsadüf nəticəsində sifətinin eybəcər hala düşməsini arzu edirəm. İstəyirəm məndən başqa heç kəs ona baxma-

sın. Heç kəs onunla maraqlanmasın. Bəzən turşu atıb gözlərini kor etmək, sonra da bütün ömrüm boyu qolu bağlı qul kimi qabağında durmaq xəyalı ilə yanıram. Elə vaxt olur ki, gecələr oyanıb saatlarca ona tamaşa edirəm. Onun yuxuda sayıqlayıb kiminsə adını çəkəcəyini güman edirəm. Mənə elə gəlir ki, onun üzünün hər cizgisində mənə məlum olmayan bir sirr gizlənmişdir. Ax, Nuriyyə xanım! Bu, dəhşətdir. Dəhşətdən də betərdir. Mən ali təhsilli qadınam. Saysız-hesabsız kitab oxumuşam. Keçirdiyim böhranın qeyri-normal bir hal olduğunu dərk edirəm. Ancaq bu məlun hissə qalib gələ bilmirəm, inanın. İnanın ki, mən, hətta, onun iş sahəsində müvəffəqiyyət qazanıb başqaları tərəfindən tərifIənməsinə belə dözmürəm. Mən istəyirəm, o, ancaq mənimlə, mənim qayğı və xidmətimlə şad olsun. Ancaq mənim haqqımda düşünsün. Mən onu öz körpə balama belə qısqanıram. Görürsünüz, mən nə qədər pis, nə qədər yaramaz bir məxluqam! Mənim ona yazığım gəlir. Bəzən ağlayıb üzr istəyirəm. Tövbə edirəm. Bir daha onu incitməyəcəyimə and içirəm. Ancaq onun bir qadınla deyib-danışdığını eşidəndə, görəndə ağlım başımdan çıxır. Nə dediyimi, nə etdiyimi bilmirəm. Budur mənim həyatım...

Mən gözlərimin yaşını silərək zarafatyana:

– Siz onu bir qədər az istəyin! – dedim. – Hər şey qədərindən artıq olanda...

– Mən onu az istəyə bilmərəm, – deyə pıçıldadı.

Sanki bədəninin hər bir nöqtəsi bu sözlə od tutub yandı. Gözləri mavi bir alova çevrildi. Yanaqları qızardı. Bu, Ay işığında incə xəyallar doğuran romantik məhəbbət deyildi, bu, gənc qadını sarsıdan bir atəş idi.

Ürəyim acı-acı sızladı:

– Səadət xanım, – dedim, – əgər, biz dindar olsaydıq, siz də öz sirrinizi açıb bir ruhaniyə danışsaydınız, yəqin o sizə deyərdi: “Çoxlu dua edin, o zaman Allah şeytanı sizin ürəyinizdən çıxardar”. Ancaq bizim inamımız başqa şeyədir. Biz hər cür ruhi böhranların çarəsini zəhmətdə, vətənimizə xeyir verməkdə görürük. Siz gəncsiniz, sağlamsınız, yaxşı təhsil almısınız, ancaq, bununla bərabər, siz cəmiyyətdən ayrı düşmüsünüz.

– Mən dərs deyirəm.

– Dərs demək hələ cəmiyyətə qaynayıb-qarışmaq demək deyil.

– Bəs, ayrı nə etməliyəm?

– Əgər, siz öz mühitinizlə, ətrafınızdakı insanlarla yaxından bağlı olsaydınız, nə etmək lazım olduğunu həyat özü deyərdi. Bizim görməli o qədər işimiz var ki. Kəndlərimizin vəziyyəti sizi düşündürmürmü?

– Siz indicə dediniz ki, hər şeyin başı zəhmətdir.

– Nə cür zəhmət? Biz zəhməti ona görə çəkirik ki, əsl insan kimi yaşayaq. Günlərimiz fərəhli keçsin. Həyatımız mədəni, məzmunlu olsun. Məsələn, Güney qışlağı götürün. Gecə-gündüz işləyirlər. Artelin varı-dövləti istədiyiniz qədərdir. Amma, fərəhsiz, zövqsüz yaşayırlar. İşdən gələn kimi çörəklərini yeyib, başlarını qoyurlar yerə.

– Bu barədə mən sizin fəaliyyətinizi qiymətləndirirəm.

– Təşəkkür edirəm. Ancaq təkcə mənim və ya bir-iki mənim kimi mədəniyyət evi işçisinin fəaliyyətindən bir şey çıxmaz. Bu işdən hamımız, kənddə olan bütün ziyalılar yapışmalıdırlar. Əriniz gecə-gündüz Söyüdlü arxın üstündə əlləşir. Zəhmət çəkir. Kəndinizi yoxsul vəziyyətdən turtarmağa can atır. Siz isə, ancaq özünüzü düşünürsünüz. Əgər, siz öz həyat yoldaşınıza bir kömək edə bilmirsinizsə, heç olmasa, ona mane olmayın.

O diqqətlə qulaq asaraq susurdu. Mən daha danışmaq iqtidarında olmadığımı hiss edərək:

– Səadət xanım, – dedim, – ürəyimdə sizə və sizin ərinizə aid hər nə var idisə, hamısını bildiniz. Bundan sonra mən sizə daha bir kəlmə söz deməyəcəyəm. Nə cür istəyirsiniz o cür də hərəkət edin. Qaldı mənim buradan çıxıb getmək məsələm. Onun sizə qətiyyən dəxli yoxdur. Gedərəm, getmərəm, özüm bilərəm. Rica edirəm bir də bu barədə mənə əmr vermək fikrinə düşməyəsiniz. Çay içmək istəyirsinizmi?

– Çox sağ olun. Mümkünsə bir stəkan su verin...

Qalxıb su verdim. Aradan qısa və gərgin bir sükut keçdi. Mən onun üzünə baxmamağa çalışaraq, saçlarımı düzəldirdim. Nəhayət, o, müqəssir kimi:

– Nuriyyə xanım, – dedi, – sizdən bir şey xahiş etmək istəyirəm.

– Buyurun.

– Sabah bizə gəlin. Evdə tək olacağam.

Mən onun təklifinə qətiyyən təəccüb etmədim.

– Baş üstə, əgər, vaxtım olarsa, gələrəm.

– Xahiş edirəm, vaxt tapasınız, Almurada deyərsiniz maşınında gətirər, söz verirsinizmi?

– Yaxşı.

– Hələlik. Gözləyəcəyəm.

Mən onun arakəsmədən eşidilən yüngül ayaq səslərini dinləyərək, bitab halda stolun arxasına söykənib gözlərimi yumdum.

Səhəri məşqdən sonra, kimsəyə demədən, piyada yola düşüb Quzey qışlağa getdim. Mən Güney qışlaqdan çıxanda Muradgilin dəstəsi Söyüdlü arxın üstündə qızğın işləməkdəydi. Murad ekskavatorun yanındakılara nə isə deyirdi. Məni görməsin deyə, şose yoldan burulub, aşağı tərəfdən keçən balaca cığıra düşdüm.

Mən onlara gedirdim. Onun doğulub böyüdüyü, evlənib ailə qurduğu evə gedirdim. Mənə elə gəlirdi ki, xırdaca boz təpələrin arası ilə qıvrıla-qıvrıla uzanan bu cığır qurtarmayacaq. Elə bil, mən yada gəlməyən uzaq zamandan bəri bu yolla addımlayıram. Şüurumdakı keylik, tutqunluq məni heyrətə salırdı. Mən heç nə düşünmürdüm. Mən hər şeydə yalnız bir intəhasızlıq, əbədi bir lallıq hiss edirdim. Qeyri-iradi tez-tez dönüb geriyə, Muradgil işləyən tərəfə baxırdım. Mən ondan uzaqlaşıb, onun evinə yaxınlaşdıqca, ürəyimdəki boşluq da artırdı. Bu mənim həyatımda qəti bir gün idi. Bu gedişlə mən öz eşqimə, öz böyük səadətimə əbədi “Əlvida” deyirdim.

Mən onun özü və oğlu doğulan evdə onun arvadı ilə qabaq-qabağa oturub duz-çörək kəsəcəkdim. Mən öz sevgimi ona və onun oğluna hədiyyə aparırdım. Çünki mənim bu sevgidən qiymətli bir şeyim yox idi.

Onların eyvanında məni ilk qarşılayan Əlimərdan oldu. O yan-bu yana qaçaraq, səs-küylə oynayırdı. O qədər şən, o qədər dərdsiz idi ki... Mən onu qucağıma götürüb üzündən öpdüm. Elə şirin uşaq idi ki, adam əlindən yerə qoymaq istəmirdi.

Birdən o, sevimli uşaq dili ilə:

– Murad yoxdur, – dedi (o, atasını adı ilə çağırırdı).

Təəccüb etdim. Mən ki, onun atasını soruşmurdum.

– Bəs, anan hardadır?

Cavab vermədən başını tərpətdi.

Bu zaman Səadət qaçaraq otaqdan çıxdı.

– Xoş gördük, Nuriyyə xanım, xoş gördük. Sən Allah, bu gombuşu qoyun yerə, qolunuzu qırar.

– Maşallah! – Mən təkrar uşağın üzündən öpdüm.

Sonra qadına sürəkli bir nəzər salaraq zarafatyana:

– Şadlıq sizə o qədər yaraşır ki, – dedim, – adam, baxdıqca, baxmaq istəyir.

– Doğrudanmı, – deyə gülümsəyib qızardı.

Mən kompliment demirdim. O, həqiqətən indi o qədər gözəl, o qədər lətafətli görünürdü ki, elə bil, tamamilə başqa adam, başqa bir gözəl idi. Əynində qolları çiyninə qədər açıq uzun ev paltarı, ayaqlarında yüngül çust vardı. Saçını başına dolayıb sancaqladığından, durna boyu kimi uzun qəşəng boynu çılpaq qalmışdı.

– Əli, düş yerə, xalanı incitmə.

– Düşmürəm, – deyə oğlan inadla başını buladı.

İkimiz də güldük.

– Yadınızdadırmı, o dəfə Qulugildə də sizə yaman qanı qaynayırdı.

– Bilir ki, xalası onu çox istəyir.

– Amma mənimlə arası yoxdur. Bununku atasıdır. Görəndə uçmağa qanadı olmur. Keçin içəri.

Biz iki pəncərəsi küçəyə, ikisi həyətə baxan böyük otağa girdik. Yalnız bu zaman Əlimərdan qucağımdan düşdü və məni incitmək istəmirmiş kimi, "bu saat gəlirəm" deyib bayıra yüyürdü.

Otağın içi elə təmiz, sadə və gözəl bəzənmişdi ki, bilaixtiyar ürəyimdə ev sahibinə "afərin" dedim. Açıq mavi kağızla örtülmüş divarlardan zərif çərçivəli portretlər asılmışdı. Ortadakı iri, dəyirmi stolun üstünə incə naxışlı məxmər süfrə salınmışdı. Arxa divarın qabağında o zaman çox dəbdə olan və üstünə Çin ipəyi çəkilmiş taxt qoyulub, arxasına ipək kimi nazik, əlvan xalça vurulmuşdu. Taxtın üstündə qədim Şərq üslubunda düzəldilmiş mütəkkə və yastıqlar var idi. Yuxarı tərəfdə qəhvəyi rəngli stolun üstündə radioqəbuledici qoyulmuşdu. Hər şey yerində, gözəl və səliqəli idi.

Mən, qızıl naxışları olan firuzə rəngli güldandakı təzə qərənfillərə işarə ilə:

– Bunlar haradandır?! Quzey qışlaqda gözümə göyərti dəymir, – dedim.

– Mənim balaca bir bağçam var, gəlin baxın.

Həyətə açılan pəncərələrin qabağına getdik. Aşağıda təxminən on kvadrat metr sahədə körpə ağaclar, qızılgül kolları, rəngbərəng qərənfillər adamın üzünə gülürdü. Onların arasında balaca nanə, keşniş, şüyüd, vəzəri ləkləri var idi. Təzəcə suvarıldıqlarından dibləri hələ yaş idi.

– Bilirsinizmi, Murad göy-göyərtini, dovğanı çox xoşlayır.

– Bəs, bunları necə suvarırsınız? – deyə mən sözü dəyişdim.

– Əl ilə suvarıram, hamısını özüm əkib-becərmişəm.

“Məlumdur. Ərinizin xoşuna gəldiyi üçün” deyə mən düşündüm.

Pəncərədən aralanıb evin ortasına qayıtdıq. O, yüz ilin dostu, yoldaşıymış kimi, səmimiyyətlə:

– Bircə deyin görüm sizi nəyə qonaq eləyim? – dedi. – Sizin üçün nə bişirim?

– Məgər, mən qonaq gəlmişəm?

– Yox, deyin!

Mən yeməklərin hamısından çox dovğanı xoşlayıram. Lakin demədim. Ayrı şey olsaydı, deyərdim. Ancaq dovğanı demədim.

– Mənim üçün hamısı birdir. Nə istəyirsiniz bişirək. Mənim “bişirək” deməyim xoşuna gəldi.

– Elə isə, mən deyim: əvvəlcə dovğa bişirək, qoyaq soyusun. Sonra da şüyüdlü plov, necədir?

– Əla.

– Onda iş başına!

Oradan-buradan, yeni tamaşalardan, kinofilmlərdən, son vaxtlar çıxan romanlardan söhbət eləyə-eləyə dovğanı bişirib qoyduq soyusun.

Mənim anası ilə birlikdə işləməyim Əlimərdana çox maraqlı görünürdü. Tez-tez gəlib qabağımızda dayanır, mənə diqqətlə tamaşa edirdi.

– Bu da atası kimi dovğa xoşlayandır, – deyə Səadət oğluna baxaraq gülümsədi.

Biz insanların, xüsusən qadınların təbiətində hələ kəşf edilməmiş nə qədər qəribə hallar var! Bir-birimizlə elə danışırdıq ki, elə bil, aramızda heç nə olmamışdı. Şəxsən mənim öz hərəkətim özümə aydın idi. Lakin o... Mənə elə gəlirdi ki, o mənim öz sevgimi qəlbimdə dəfn etməyimə əmin olduğu üçün bu cür şadlıq içindədir. Belə anlarda mən dişlərimi bir-birinə sıxaraq, öz qadınlıq qürurumu zorla boğurdum. Birdən o, saata baxaraq uşaq səmimiyyəti ilə:

– Muradın gələn vaxtıdır, – dedi, – sizin burada olmağınızdan xəbəri yoxdur. Görəndə qiyamət olacaq.

– Bəs, siz dünən deyirdiniz evdə tək olacaqsınız? – Mən soyuq və ciddi ifadə ilə düz onun gözlərinə baxdım.

Sanki diksinib şirin yuxudan ayılaraq, müqəssir halda çaşıb qaldı. Elə bu zaman bayırda motosikl səsi eşidildi. Ürəyim elə şiddətlə

döyünürdü ki, bir an qabaqkı söhbətimizin nə haqqında olduğunu da yadımdan çıxartdım. Əlimərdan:

– Murad gəldi, Murad gəldi, – deyə gurultu ilə bayıra qaçdı.

Səadət özünü itirərək, gah mənə baxdı, gah da qapıya.

Mən sərbəst və şən bir görkəm alaraq:

– Siz ərinizin gəlmək vaxtını nə düz bilirsiniz, – deyə gülümsədim.

Mənim bu hərəkətim ona cəsarət verdi. Yenidən hər şeyi unudaraq gülə-gülə:

– Siz oturun, yerinizdən tərpənməyin... – dedi.

Murad, qucağında oğlu, içəri girərkən bizi yanaşı oturmuş görüb yerində qurudu. Səadət isə, ona baxaraq, elə ürəkdən şaqqıldayıb güldü ki, bayaqdan bəri mənə əzab verən kin və qəzəbim yox olub getdi. Murad heç bir şey anlamayaraq, çaşqın halda dayanmışdı. Birdən Səadət ayağa qalxıb, əlini ərinin əlinin üstünə qoydu.

– Murad, – dedi, – mən Nuriyyə xanımın yanında səndən üzr istəyirəm. O məni bağışlayıb, sən də bağışla.

Muradın iri qara gözləri bir an mənə zilləndi. Sonra əyilib uşağı yerə qoydu və mənə yaxınlaşaraq:

– Xoş gəlmisiniz, Nuriyyə xanım, – deyib əlimi sıxdı.

Mən dərhal söhbəti dəyişməyə çalışdım. (Onun özünü çox namünasib vəziyyətdə hiss etdiyini, mənim üzümə baxmaqda çətinlik çəkdiyini anlayırdım.)

– Murad, – dedim, – işləriniz sürətlə irəliləyir. Bu cür getsə, yəqin ki, Söyüdlü arx iyirmi-iyirmi beş günəcən Quzey qışlağa çatar.

– Görək, – deyə eyni ciddiyyətlə cavab verdi.

Səadət:

– Nuriyyə xanım, – dedi, – bizim camaat Söyüdlü arxı elə gözləyir, elə özləyir ki, daha bu sözdən deyil. Kəndin uşaqları hər gün gedib neçə metr irəlilədiyini xəbər gətirirlər. Qoca arvadlar yığışıb dəstə ilə tamaşasına gedirlər.

Sonra ərinə baxıb zarafatla əlavə etdi:

– Tarix, yoldaş sədrin bu böyük təşəbbüsünü unutmayacaq. Gedək paltarını dəyiş. Üstün-başın toz-torpaqdır. Nuriyyə xanım, bir dəqiqə bağışlayın.

– Buyurun.

O, ərinin qoluna girərək, o biri otağa keçdi. "O mənim Murada olan münasibətimi unutmuşdu. O, xoşbəxt idi. Murad isə, onu istəyib

evlənmişdi. Muradın ondan Əlimərdan kimi oğlu vardı. Onun qadını yeni açılmış yasəmən kimi təravətli və gözəldi. Dünəndən bəri o nə qədər dəyişmiş, nə qədər gümrah və sevimli olmuşdur! Yox, Murad, sən qəm çəkmə! Sən hər şeyi, hər şeyi tezliklə unuda biləcəksən. Mən buna əminəm. Mən bunu hiss edirəm. Qaldı ki, mən... Mənə bundan artıq bir şey lazım deyil. Məgər, sənin səadətin mənimki demək deyilmi? Mən öz hərəkətim üçün nə sənin, nə də arvadının boynuna minnət qoyuram. Çünki mən yalnız və yalnız öz qəlbimin tələbi ilə hərəkət etmişəm. Mən öz taleyimdən qətiyyən narazı deyiləm. Mən, ölsəm də, xoşbəxtəm, qalsam da! Sənin həsrətin, sənin hicranın mənim üçün bir sitəm, bir əzab olacaqdısa, o zaman mən nə ilə fəxr edə bilərdim? Nə ilə yaşayardım? Sənin məhəbbətini dilimə necə gətirə bilərdim? İki gün qabaq kimsənin xəbəri olmadan mənim iyirmi üç yaşım tamam oldu. Lakin mən indi özümü gəncliyi sovulub getmiş bir ana kimi hiss edirəm. Eyvanda Səadət su tökür, sən əl-üzünü yuyursan. Gənc həyat yoldaşın, gülüşünü gizləyərək, sənin boynuna su tökür. Sən sərin sudan diksinərək tez-tez içini çəkirsən. Lakin arvadının zarafatına cavab vermirsən, gülmürsən. Sənin acığın bahar buludu kimi bir şeydir, Murad. Tezliklə günəş görünüb aləmi sevincli nura qərq edəcək. Söyüdlü arx da gəlib çıxacaq. Söyüdlü arx Quzey qışlağa səadət gətirəcək. Sizin həyatınız nə gözəl olacaq! O xoş günlərinizi aydın görürəm."

Murad gəlib əyləşdi. Biz nahara yenicə başlamaq istəyirdik ki, Hümmət gəlib çıxdı. O məni Səadətlə birlikdə görəndə qətiyyən təəccüb etmədi. (Bizim davamızı, şübhəsiz, bilirdi.) Deyirlər, dərin ağıl sahibləri hər cür gözlənilməz hadisəyə qabaqcadan hazır olurlar. Həmişə əlində tutduğu yumşaq günlüklü kepkasını pəncərəyə tullayıb, qarşımda əyləşdi:

– Nə yaxşı ki, nahar eləməmişəm. Yoxsa, bu şüyüdlü plovdan məhrum olardım...

– Hümmət əmi, acmısan? – deyə Əlimərdan soruşdu.

– Yaman. Yüyür, Kərim əmini də çağır gəlsin.

– O da acıb?

– Acıb, yaman acıb, get çağır.

Əlimərdan ondan aralanıb bayıra qaçdı.

– Haradan belə? – deyə Murad soruşdu.

– Kərpic zavoduna getmişdim. Rayonda başladığımız yeni binalar üçün kərpic almaq lazım idi.

– Nə oldu?

– Əlli min boyun oldular. Sifarişləri çoxdur deyə özlərini çəkib qoyublar ulduzun yanında.

Əlimərdanla içəri girən şoferə yanında yer göstərərək:

– Gəl otur, Kərim, – dedi, – qaynanamız bizi çox istəyəcək.

Onun şənliyi Muradla mənim aramda olan gizli gərginliyi yavaş-yavaş unutdurur, Muradın kefi açılırdı. Mən Hümmətlə tez-tez zarafat edir, deyib-gülürdüm. Lakin hər dəfə mən, rayon icraiyyə komitəsinin sədri ilə danışanda, Murad darıxırmış kimi, yerində səbrsiz bir hərəkət edir, üzünü başqa səmtə çevirirdi. Bu isə, təbii hiss idi. Biz öz taleyimizə asanlıqla təslim olmuruq.

Nahardan sonra çay içmək üçün çıxıb eyvanda oturduq.

Muradın üzü yenə də tutqun idi. Biz oradan-buradan danışır, gülür, o isə, papiros çəkərək kəndə tamaşa edirdi.

– Yenə nə olub? Gəmilərin batmayıb ki? – deyə Hümmət ona sataşdı.

– Doğrusu, Hümmət, yediyim-içdiyim canıma yatmır. Bu kəndi hər dəfə belə görəndə, elə bil, dünya uçur, qalıram altında.

– Eybi yoxdur, – deyə Səadət cavab verdi. – Söyüdlü arx gələr. Quzey qışlağın da küçələrində toy-bayram olar.

Hümmət stəkanını qabağa çəkərək öz-özü ilə danışırmış kimi dedi:

– Söyüdlü arx da gələcək, quzeylilərin varı-dövləti də artacaq. Ancaq yenə də çox-çox işlər görmək lazım gələcək...

O, dərindən nəfəs alaraq, daha ciddi ifadə ilə sözünə davam etdi:

– Bizim xalqımız təbiətən fədakar xalq olduğu üçün öz həyatının, rifahının qayğısına az qalır. Kəndlilərimiz yaxşı yeyib-içmək, yaxşı istirahət etmək, mədəni yaşamaq haqqında bəlkə də düşünmürlər.

Bütün bunlar dünən Səadətə söylədiyim fikirlərin mabədi olduğundan:

– Doğrudur! – deyə hərarətlə təsdiq etdim.

O, ağıllı gözləri ilə mənə baxaraq, sözünə davam etdi:

– Bizim vəzifəmiz camaatı varlandırmaqla qurtarmır. Biz nəslimizin sağlam yetişməsi barədə düşünməliyik. Biz çalışmalıyıq ki, kəndli vaxtlı-vaxtında öz ailəsi ilə birlikdə istirahət eləsin. Onun yemək otağı, yataq otağı ayrı olsun. Kəndli gündə səkkiz saat işləsin. Axşamlar kino, teatr tamaşalarına baxsın. Kefli İsgəndərin bir sözü heç yadım-

dan çıxmır: "Hamı mənə deyir oxu, alim ol. Amma bir kəs demir ki, oxu, adam ol!" İndi biz də həmişə deyirik işlə, artel varlı olsun, özün də yaxşı yaşa. Bizim kəndlilərimiz qazandıqlarını lazımi qədər mədəni tərzdə xərcləyə bilmirlər. Təmiz döşəkağılarını təhkimçi üçün saxlayırlar. Belə hallarla mübarizə vaxtı çoxdan gəlib çatmışdır. Bu mübarizəni isə hamımız aparmalıyıq. Sən də, mən də...

O gülümsədi:

– Hətta, ingilis dili müəllimi də.

Bayaqdan bəri diqqətlə qulaq asan Səadət diksinərək, narahat halda, mənim üzümə baxdı. Mən zarafatyana bir ötkəmliklə:

– Yoldaş Hümmət, – dedim, – elə güman etməyin ki, bu barədə düşünən təkcə sizsiniz. Biz özümüz də dünən ingilis dili müəllimi ilə bu barədə danışırdıq.

– Mən buna çox şadam.

Hər dəfə onun nəzəri mənim üzərimdə dayananda gözlərinin dərinliklərində, nə isə, bir işıq yanırdı. Bu zaman mən qəlbimdə anlaşılmaz bir qorxu, bir həyəcan hiss edirdim.

Çaydan sonra kəndin kənarına çıxdıq. Səadətlə mənim davamız hər iki qışlağa sürətlə yayıldığından, təsadüf etdiyimiz kəndlilər ayaq saxlayıb təəccüblə ardımızca baxırdılar. Qulugilin evinin yanından keçəndə, eyvanda qazan asmış Ağabəyim bizi görüb əvvəlcə gözlərinə inanmadı. Sonra ayağa qalxıb:

– Həmişə kefdə-damaqda, – deyə şadlıqla səsləndi. – Siz Allah, gəlin qonağımız olun. Qulu da bu saat gələcək.

Mən şən və qayğısız halda:

– Çox sağ ol, – dedim. – Ayrı gün gələrik. Ancaq sən də dostları itirib-axtarmırsan.

– Sən Allah, elə demə, vallah, sənə o qədər qanım qaynayır ki, elə bilirəm Güney qışlaqda bir bacım var. Ancaq o Nazxanımı bir də teatra çıxartma...

– Sən nə danışırsan, Ağabəyim, – deyə Hümmət şən halda cavab verdi. – Nazxanım daha böyük artist olub.

– Olar, olar. O üz ki, onda var, artist də olar, o yana da keçər.

Mən qəhqəhə ilə güldüm.

Hümmət başını buladı:

– Böyrümüzdə artist dura-dura elə söz danışırsan?..

– Sən də qoy görək, ay Hümmət. Mən bu cür artisti demirəm.

– Sən doğru deyirsən, Ağabəyim bacı, – dedim, – biz artistlər bir az üzlü oluruq.

Kəndin yaxınlığındakı balaca təpənin üstündə dayandıq.

Həmişə öz işlərindən danışanda odluğu kimi, Murad yenə də birdən-birə canlanaraq:

– Söyüdlü arx, – dedi, – bax, bu təpənin qabağından keçib kəndə burulacaq. HES-i də aşağıda, o tək evin yanında tikəcəyik.

Sonra tarlalara çəkəcəkləri xırda arxlar, salacaqları bağlar barəsində danışdı. Bu dəqiqələrdə mənə elə gəlirdi ki, hər şey sonsuz dərəcədə gözəl və fərəhlidir. Və bu gözəllikdə, fərəhdə, əgər, mənim payım yoxdursa, nə eybi var?! Kəndin üzərinə enən sakit axşam, qapılardan yavaş-yavaş qalxan tüstü sanki mehribanlıqla: "Nə eybi var, nə eybi var" deyə eyni duyğunu təsvib edirdi.

Hümmət astadan nə dedisə, Murad bərkdən güldü. Səadət xoşbəxt təbəssümlə ərinə baxdı. Yalnız bu an, bu bircə an mən o axşam sükutu içində özümü kimsəsiz, qərib hiss etdim. Elə bil, bu kədərli duyğu dərhal Səadətə əyan oldu. O, təəssüf, mərhəmət andıran bir ifadə ilə mənə baxdı. Mən qayğısız görünməyə çalışdım, dizimə vurub qaçan Əlimərdanın ardınca yüyürərək, onu tutub yuxarı qaldırdım.

Səadət mənə yaxınlaşdı:

– Sən Allah, bunu yerə qoyun, sizə sözüm var.

Biz kişilərdən bir neçə addım aralanandan sonra o, əlimdən tutub:

– Nuriyyə xanım, – dedi, – mən hamısını bilirəm. Bilirəm ki, bu gün bizdə olmaq sizin üçün çox ağır idi. Ancaq mən istəyirdim ki, siz başladığınız işi axıra çatdırasınız.

– Zənn edirəm ki, siz məndən narazı qalmadınız.

– Nə danışırsınız, Nuriyyə xanım! Mən sizdən dünyalar qədər razıyam. Siz heç kəsin eləməyəcəyi bir işi elədiniz. Siz nə qədər nəcib insanmışsınız!

– Səadət xanım, bunlar hamısı artıq sözlərdir. Mən sizin istədiyiniz kimi yox, öz ürəyimin istədiyitək hərəkət etmişəm. Mənim sizin boynunuza minnət qoymağa haqqım yoxdur.

Daha sonra mən qışqırıb demək istəyirdim ki, nə edirsiniz edin, lakin təşəkkür etməyin! Mənə təşəkkür lazım deyil. Sizin öz qurbanınıza "sağ ol" deməyinizin nə qədər dəhşətli olduğunu bilirsinizmi? Gedin, yaşayın, xoşbəxt olun! Lakin öz təşəkkürlərinizlə məni ikinci dəfə yaralamayın.

– Kim gedir, kim qalır? – deyə Hümmət bərkdən soruşdu.
– Gecəniz xeyrə qalsın, Səadət.
– Xeyrə qarşı, Nuriyyə xanım.
– Sağ olun, Murad.
– Xoş gəldiniz, – deyə o, ahəstə səslə cavab verdi.

Biz Söyüdlü arxın körpüsünə çatanda, mən şoferdən maşını saxlamasını xahiş etdim. Ürəyim darıxdığından, qalan yolu gəzə-gəzə getmək istəyirdim. Hümmət də mənimlə bərabər düşərək, maşını dayısıgilə göndərdi.

Biz körpünü keçib yavaş-yavaş mədəniyyət evinə tərəf yollandıq. Elə bu zaman radioda qəmli bir mahnı oxunmağa başladı. Çıraqban küçələr birdən-birə mənə yad və qüssəli göründü. Könlümdə elə bir pərişanlıq vardı ki, elə bil həyatımda fərəhli nə vardısa, hamısını itirmişdim.

Hümmət də fikirli və tutqun görünürdü.

Hərdən bir-iki kəlmə danışıb susurduq. Mən yol yoldaşımla danışmağa mövzu tapmadığım üçün xəcalət çəkirdim. Bu nə qəribə təbiət idi! Elə bil, mən hamını əyləndirib məşğul etməyə borclu idim.

Mədəniyyət evinə tez çatdığımıza sevinib:

– Buyurun, gedək içəri, – deyə təklif etdim. – Sizi çaya, konfetə qonaq edə bilərəm.

– Yox, – dedi, – yorulmamısınızsa, bir az eyvanda oturaq, sizə sözüm var.

Ürəyim şiddətlə döyünməyə başladı (yeri gəlmişkən deyim ki, çox şeyi qabaqcadan duymaq hissi məndə güclüdür və mən bunun ucundan az qorxular çəkməmişəm).

Biz eyvana qalxıb skamyada oturduq. Uzun və gərgin sükutdan sonra:

– Nuriyyə xanım, – dedi, – mən həmişə qısa və aydın danışmağı xoşladığım üçün rica edirəm cəsarətimi pisliyə yozmayasınız.

– Mən sizdən heç bir zaman pis hərəkət gözləmərəm.

– Elə isə, bilin ki, lap ilk görüşümüzdən mən sizi xoşlamışam. Həmişə sizin barənizdə düşünmüşəm. Çox düşünmüşəm.

Bir qədər susduqdan sonra ahəstə səslə davam etdi:

– Siz də neçə vaxtdır məni görürsünüz. İndi deyin görüm, mənə həyat yoldaşı olarsınızmı?

Aralığa qısa bir sükut çökdü.

– Nə üçün dinmirsiniz?

Mən köksümü ötürdüm:

– Hümmət, – dedim, – siz məni o qədər də yaxından tanımırsınız...

– Mən sizi tanımışam.

– Mən kimsəsiz, qərib bir qızam.

O özünəməxsus zarafatyana əda ilə:

– Siz Allah, elə danışmayın, – dedi, – mən uşaqlıqdan melodramı sevmirəm.

Mən də gülümsəyərək, tamamilə melodramatik bir ahənglə davam etdim:

– Mənim heç bir kəsim, heç bir şeyim yox. Siz isə...

– Xahiş edirəm, ardını deməyəsiniz.

– Yaxşı, elə isə, icazə verin, ardını bir neçə gündən sonra deyim. İndi birdən-birə cavab verməkdə çətinlik çəkirəm.

– Etiraz etməyə nə haqqım var? Bir neçə gündən sonra olsun. Ancaq gəlin belə bir şərt kəsək.

– Nə şərt?

– Əgər, cavabınız müsbət olsa, sabah zəng edib məni çaya dəvət edin. Əgər, müsbət olmasa, sükut edin. O zaman mən də hesabımı götürəcəyəm.

– Mən sizi həmişə çaya dəvət edə bilərəm.

– Yox, qoyun şərtimiz mən deyən kimi olsun. Yaxşımı?

– Yaxşı.

– Gecəniz xeyrə qalsın.

O, ayağa qalxıb iti addımlarla uzaqlaşdı.

O gecə uzun zaman gözümə yuxu getmədi.

Hümmət ağıllı, gənc, yaraşıqlı bir oğlan idi. Lakin onun arvadı olmaq... Nə qədər fikirləşdimsə, ürəyimi bu fikrə isinişdirə bilmədim. Muraddan başqa ayrı bir adamı istəmək, onun qadını olmaq... Mən bunu xəyalıma belə gətirə bilmirdim. Mən Hümməti qardaş kimi, yaxşı, nəcib bir insan kimi istəyə bilərdim. Lakin onun arvadı olmaq...

Mən bu halımı Hümmət kimi hər cəhətdən ləyaqətli bir oğlanın şəninə sığışdırmırdım. Mən özümü ona rəva görmürdüm. Bütün varlığı, gedib-gələn nəfəsi başqası üçün yanan bir qız onun nəyinə lazım idi? Axı, onu məndən də yaxşı qızlar sevə bilərdilər. Mən ondan öz qəlbimi gizləyə bilməzdim. Ürəkdə bir cür, üzdə başqa cür ola bil-

məzdim. Mən, başqasının oduna yandığım halda, onunla bir yastığa baş qoymazdım. O "başqasını" ürəyimdən qoparıb atmağa isə iqtidarım çatmırdı.

...Səhəri gün mənim üçün daha da ağır keçdi. Elə bil, Hümmətin təklifini rədd etməklə həyatımın son ümid çırağını da üfürüb keçirmişdim. Mən onu yaxşı bir dost, yaxşı bir insan kimi qiymətləndirirdim. İndi artıq o da yox idi.

Güney qışlaqla yarışan Bəhmənli kəndində "Əlli yaşında cavan" musiqili komediyasının ikinci tamaşasını verdik. Bu dəfə hamımız əvvəlkinə nisbətən yaxşı oynayırdıq. Nazxanım o qədər təbii, canlı və sərbəst oynayırdı ki, elə bil, iyirmi ilin artisti idi.

Dərdi-qəmi çox olan adam üçün ən böyük təsəlli yaxşı bir iş görməkdir. Mən Nazxanımı kəşf etməyimlə fəxr edirdim. Onun oyununu diqqətlə izləyərək, hər şeyin yerində olmasına, hər duyğunun eyni ilə həyatda olduğu kimi təbii çıxmasına çalışırdım. Bunun üçün ona kiçik bir işarə kifayət idi.

Artıq o özü də öz qüvvəsinə inanmağa başlayırdı. Ona görə də, savadını artırmaq üçün mənim seçib verdiyim kitabları həvəslə oxuyur, başa düşmədiyi yerləri tez-tez gəlib soruşurdu. Beləliklə, Nazxanımı öz yetişdirməm hesab edərək, dərin ruhi rahatlıq duyurdum.

Bizim gənc aktrisamızla hamıdan çox maraqlanan şofer Almurad idi. Tamaşa zamanı o, lap qabaqda oturub Nazxanımın oyununa elə təəccüblə baxırdı ki, elə bil, möcüzə görürdü. Gəlin hara gedirdisə, kölgə kimi böyründən ayrılmırdı. Adamların yanında belə, alov saçan gözlərini ondan çəkmirdi.

...Bir gecə otağımda bərk darıxdığımdan, qapımı bağlayıb, Nazxanımın yanına getmək istədim. Lakin onun çəpərinə yaxınlaşanda bağçada danışıq səsləri eşidib ayaq saxladım. Nazxanım ağaca söykənərək başıaşağı dinləyir, Almurad isə, onun qabağında dayanıb soruşurdu:

– Niyə məni yandırıb-yaxırsan? Bəlkə haqqımda bir pis şey-zad eşitmisən?

– Heç nə eşitməmişəm.

– Bəs, onda niyə sözlərimə inanmırsan?

– Ona görə inanmıram ki, siz kişilər etibarsızsınız.

– Qoyunu qoyun ayağından, keçini keçi. Kişilərin hamısı birdir? Vallah, səni qoymayacağam ayağın quru yerə dəysin.

– Mağıl, dayna. Mənim sənə nə ehtiyacım?

Nazxanım yönü bağçaya dayandığından, mən onun üzünü qaranlıqda əməlli seçə bilmirdim. Almuradın üzünə isə pəncərədən işıq düşmüşdü.

– Dörd sənin kimi oğlan dolandıraram.

– O düzdür. Amma kişi gərək sənin kimi cavanəzəni gözünün üstündə saxlasın.

– İndi belə deyirsən.

– Sən ölmə, bu ürəyimə güllə dəysin, qocalıb belimiz bükülləndə də elə deyəcəyəm. Ay insafsız, görmürsən dərdindən dəli-divanəyəm?

O, əl atıb gəlinin biləyindən tutdu.

– Burax, – gəlin qolunu çəkdi. – Bax, bir də əl-ayağını dağıtsan, mənim gözümə görünməyəcəksən.

– Yaxşı, bəs, indi mənə nə deyirsən?

– Mən səndən iki yaş böyüyəm.

– Bir gör nəyin dərdini çəkirsən! İki yaş nədir ki? Baxan mənə səndən çox yaş verər özüm ölüm. Başım ağarıb.

– Nə qədər olsa da, arvad kişidən tez qocalır.

– Ay dəli, mən səni qoyaram qocalasan?

– Qocalanda əlini qabağa verəcəksən?

– Arvadı əri saxlayar, pendiri dəri.

– O məsəli ayrı şeyə çəkiblər.

– Aaz, bax, bu ürəyimə güllə dəysin, səndən əl çəkəsi deyiləm.

– Gədədə üzə bax ey... – Nazxanım xısın-xısın güldü.

Mən öz otağıma qayıtdım.

...Səhəri Nazxanım yanıma gəldi. Sözlü adam kimi, gülməkdən uğunub gedirdi.

– Nə olub? – deyə soruşdum.

Qoynundan pambığa bükülü balaca bir şey çıxarıb mənə uzatdı. Alıb gördüm yaqut qaşlı bir qızıl üzükdür. Heç bir şey anlamayaraq onun üzünə baxdım.

– Almurad verib, – deyə pıçıldadı. – Götürmürdüm. Dedi sən öl, almasan, baş götürüb ilim-ilim itəcəyəm. Mən ha eləyib, cavab verənəcən qoyub getdi. Ağlın nə kəsir, özünə qaytarım?

Mən onun gözlərindəki qaynar təbəssümə diqqət yetirib:

– Nə üçün qaytarırsan? – dedim, – istəyirsən yazıq oğlan özünü həlak eləsin?

Şaqqıldayıb güldü. Sonra eyni ilə “Arşın mal alan”dakı xala kimi məzəli bir əda ilə cavab verdi:

– Vallah doğru deyirsən.

...Bizim balaca dəstəmizin şöhrəti getdikcə artırdı. Tez-tez başqa kəndlərdə də tamaşalar verirdik. Yeni pyeslər hazırlamaq lazım gəlirdi.

Bir gün yenə də bəzi məsələləri danışmaq üçün artel idarəsinə getmişdim. Nəriman əmi, əynində təzə paltar, həmişəki kimi başı-üzü tərtəmiz qırxılı, kefi kök, stulun arxasına söykənmişdi. Cimi onun qabağında dayanaraq, bərkdən qəzet oxuyur, Qulu, İmi və Almurad da sədrlə birlikdə qulaq asırdılar.

Mən daxil olan kimi Nəriman əmi qəddini düzəldərək:

– Yaman yazıblar, – o, nəşə ilə mənə baxıb qəzetə işarə elədi.

– Nəyi yazıblar? – deyə mən qorxmuş halda soruşdum.

– Cimi, başdan oxu, – deyə sədr əmr etdi.

Məqalə bizim mədəniyyət evi haqqında idi. Kəndlilərə verdiyimiz tamaşaları, kitabxananın fəaliyyətini tərifləyərək, İmi ilə Ciminin, Səriyyənin, Nazxanımın adlarını çəkirdilər. Axırda məni xüsusi qeyd edərək, başqalarına nümunə göstərirdilər.

Ömrümdə birinci dəfə idi ki, öz işim haqqında bu cür sözlər eşidirdim. Mən təbiətən şöhrətpərəst deyildim. Lakin indi... Məhz indi qəzetdəki tərif məni sevindirir və şəxsi ləyaqət hissimi gücləndirirdi. Mən başqaları üçün lazımlı bir adam olduğuma özümü dönə-dönə dərindən inandırmaq istəyirdim. Mən ruhi müvazinətimi itirməməli idim.

Məqaləyə qulaq asarkən, "əlbəttə, bu, ölümdən yaxşıdır" deyə başımdan qəribə bir fikir keçdi və mən hələ gənc olduğumu anlaşılmaz bir məmnuniyyət hissi ilə xatırladım (elə bil, gənc olduğumu çoxdan unutmuşdum). Məqalə oxunub qurtarandan sonra Nəriman əmi mənə:

– Sağ ol, qızım, – dedi, – çox sağ ol. Başımızı uca elədin.

(O həmişə mənə "bacıqızı" deyərdi, indi isə, məni birinci dəfə "qızım" adlandırırdı.)

Sonra Quluya sarı dönərək sözünə davam etdi:

– Orasına fikir verdinmi, bizim mədəniyyət evinin başqa kəndlərdə tamaşa göstərməyini də yazıb. Qoy indi bəzi-bəzi adamlar görsünlər ki, Nəriman necə xüsusiyyətçidir.

– Hələ quzeylilərə mədəni xidmət eləməyimizi də yazıb, – deyə İmi əlavə etdi.

Sədr onun nəyə işarə vurduğunu anlayaraq, əsəbi nəzərlərlə pəncərədən çölə baxdı və bir qədər sükutdan sonra Almurada dedi:

– Sabah cavanlardan otuz nəfərini götürüb onlara köməyə gedərsən.
– Kimlərə?
Sədr ağır bir yükün altından çıxırmış kimi dərindən nəfəs alıb, heç kəsin üzünə baxmadan:
– Quzeylilərə! – dedi.
Qulunun balaca qara bəbəkləri sürətlə o yan-bu yana qaçmağa başladı. İmi ilə Cimi təəccüblə bir-birinə baxdı. Almurad:
– Baş üstə! – deyə həvəslə cavab verdi.
– Ancaq deyərsiniz Nərimanın bu işdən xəbəri yoxdur. Özümüz gəlmişik!
– Niyə, əşi?
– Lazım deyil. – Nəriman əmi alnını ovuşdurdu.
İndi onun çöhrəsini kədər bürümüşdü. Bəlkə bu, başqalarına qəribə görünərdi. Lakin, necə deyərlər, dərdli dərdlini tez anlayar. Mən bunu başa düşürdüm. Mən hiss edirdim ki, bütün ömrünü öz yerlilərinin yaxşı güzəran keçirməsinə sərf edən, dünyada ürəyi xəstə arvadından başqa heç kəsi olmayan, heç bir şeyə göz dikməyən bu qoca, iki oğlundan birinə acıqlanıb, sonra peşman olmuş ata kimi pərişandır. İndi sanki onun ağ, nəcib alnının hər bir qırışı dil açıb qəmli-qəmli deyirdi: “Nərimanı bağışlayın. Bu dünyada qoca Nərimanın sizdən başqa heç kəsi, sizin xoşbəxtliyinizdən başqa heç bir arzusu yoxdur. O, sizin üçün yaşayıb, eləcə də öləcəkdir”.
Mən onun qəmgin halda stolun üstünə düşmüş iri və qəşəng əlinə baxırdım.
...Həmin gün işdən sonra otağımda təkcə oturub özümə kofta tikə-tikə Nəriman əminin səhərki hərəkəti barədə düşünürdüm: “Sən dərinlərə kök salmış qüdrətli, qocaman bir ağacsan. Sənin kölgəndə minlərcə adam dincini alır. Sənin qol-budağın arasında quşlar şən nəğmələr oxuyur. Mən isə, indi-indi boy atan zəif, kövrək bir zoğam. Mən yalqızam. Bu dünyada yalqız olmaq nə çətinmiş! Biz insanlar kiçik bir təsəlliyə, bir dost sözünə nə qədər möhtacmışıq! Siz hamınız məni sevirsiniz. Mənim işimdən, hərəkətimdən razısınız. Əlbəttə, bu mənim üçün böyük təsəllidir. Lakin, bununla bərabər, mən yalqızam. Çünki sizin heç birinizin mənim qəlbimdə nələr olduğundan xəbəriniz yoxdur. Siz məni dərdsiz-qəmsiz bir qız kimi, artist kimi tanıyırsınız. Mən isə, öz dərdimi hey danışmaq istəyirəm. Mən istəyirəm ki, siz mənim kədərimlə mütəəssir olasınız. Öz səadətindən əbədi olaraq əli

üzülmüş bir qızın halına acıyasınız. Bu, mənim nəyimə lazımdır? Bilmirəm. Lakin mən öz qüssəmlə sizə nə isə demək arzusu ilə yanıram. Ona görə də, bir yerdə qərar tapıb dayana bilmirəm. Gecəm, gündüzüm yoxdur. Mən dahi bir piano çalan olsaydım, ürəyimi mahnılarla sizə açardım. Lakin mənim çaldıqlarım qəlbimdəkilərin qarşısında o qədər sönük görünür ki...”

Bayırda maşın səsi eşidildi. Sonra qapım döyüldü.

– Buyurun!

Hümmət içəri girdi. Mən tikişi tullayıb cəld ayağa qalxdım:

– Xoş gəlmisiniz, xoş gəlmisiniz. Həmişə siz gələsiniz.

Xalqımızda nə gözəl ürək sözləri var!

Hümmətin əlindən tutub stula tərəf çəkdim, mən onun gəlişinə o qədər sevindim ki, elə bil, min il görmədiyim əziz bir adamım gəlmişdi.

– Yox, oturmayacağam, bir dəqiqəliyə gəlmişəm, – dedi.

Və əlini yavaşca mənim əlimdən çəkərək davam etdi:

– Nuriyyə xanım, siz zəng eləmədiniz, mən də, şərtləşdiyimiz kimi, öz hesabımı götürdüm...

Mən qeyri-ixtiyari bir addım geri çəkilərək, həyəcanla ona baxdım. O, kirpiklərini endirib bir neçə saniyə susdu. Sonra ağıllı gözləri təkrar üzümə dikildi.

– Əlbəttə, sizdən rədd cavabı almaq mənim üçün o qədər də asan deyildi. Ancaq neyləmək olar?! Bu barədə bizim bir-birimizi məzəmmət etməyə haqqımız yoxdur. Mən bura umu-küsü eləmək üçün gəlməmişəm. Gəlmişəm deyəm ki, mən bütün ömrüm boyu sizi özümə yaxın, doğma bir adam hesab eləyəcəyəm. Hara gedirsiniz, gedin, kimi sevirsiniz, sevin, ancaq bilin ki, bu dünyada sizi bacı kimi istəyən, əziz tutan bir nəfər də vardır və siz istədiyiniz vaxt onun köməyinə, məsləhətinə müraciət edə bilərsiniz. Bir dost kimi ürəyinizi ona aça bilərsiniz.

Boğazıma yığılmış göz yaşımın qabağını ala bilmədim. Hümmət irəliləyib əlimdən tutdu:

– Ağlamaq nə üçün?

Mən başımı onun sinəsinə qoyaraq uşaq kimi hönkürdüm. O məni stula oturtdu.

– Sakit olun, Nuriyyə xanım. Bu nədir? Yəni, siz də ağlayarmışsınız! Yuxuda da görsəydim inanmazdım.

Nəhayət, mən gözümün yaşını silərək:

– Gəlin əyləşin, – dedim. – Bayaqdan ayaq üstəsiniz.

– Yox, icazə verin gedim. Mərkəzdən adam gəlib, rayonda məni gözləyir.

Mən stuldan qalxaraq:

– Ancaq söz verin ki, hərdən buralara da gələcəksiniz, – dedim.

– Mütləq. İndisə salamat qalın.

O çevrilib tələsik otaqdan çıxdı.

...Söyüdlü arxın Quzey qışlağa gedib çatdığı gün adamlarda gördüyüm sevinci heç zaman yaddan çıxarmayacağam. Hər iki kəndin camaatı tökülüb gəlmişdi. Rayon Partiya Komitəsinin katibi Süleymanzadə, rayon İcraiyyə Komitəsinin sədri Hümmət və bir çox başqa məsul işçilər də ordaydılar. Hamı dayanıb gözünü quru arxa zilləmişdi. Zurna-balabanda qədim bir hava çalınırdı. Qərənfil bacı ilə yanaşı dayanmış Nəriman əminin görünüşü ciddi və təntənəli idi.

Murad bir dəstə yerlisi ilə kənarda papiros çəkir, tez-tez saatına baxırdı. Nəhayət, uzaqdan çapa-çapa gələn bir atlı göründü. Adamlar tərpənişdi. Murad papirosunu tulladı. Nəriman əmi bir ayağını götürüb, o birini qoydu. Adamların üzündə narahat, həyəcanlı ifadə oxundu. Atlı çatıb xəbər verdi ki, suyu buraxdılar.

Bütün camaat hərəkətə gəldi. Zurna-balabanda "Koroğlu" havası çalındı. Uşaqlar suyun qabağına yüyürdülər, bir xeyli uzaqlaşandan sonra:

– Gəlir, gəlir – deyə qışqırışaraq, dönüb bizə sarı qaçdılar.

Bir qədərdən sonra quzeylilərin əsrlərdən bəri həsrətində olduqları su, uşaqların müşayiəti ilə, gəlib çıxdı. Adamlar gülümsəyirdilər. Qarılar bellərini əyərək suya baxır, dodaqlarının altında nə isə pıçıldayırdılar. Yaşlı kişilər diqqətlə tamaşa edirdilər. Cavan oğlanlar papaqlarını göyə atıb-tuturdular.

– Sağ olsun Murad! – deyə birdən onlar qışqırdılar.

Lakin Murad qədd-qamətinə yaraşan tələsik və gözəl bir hərəkətlə "sakit olun" mənasında əlini yuxarı qaldırdı. Sonra Nəriman əmiyə yaxınlaşaraq, onun əlindən tutub ucadan:

– Çox sağ ol, Nəriman əmi! – dedi. – Sənin iyirmi il qabaqkı zəhmətin olmasaydı, indi bu su gəlib bura çıxmazdı. Biz nankor adam deyilik. Quzeylilər səni heç bir zaman unutmayacaqlar.

Nəriman əmi, əli Muradın əlində, nəzərlərini yerə dikərək susurdu. Axırıncı sözləri eşidəndə sanki diksinərək başını qaldırıb Murada baxdı və birdən onu özünə tərəf çəkərək qucaqladı. Mən onun gözlərində yaş parladığını gördüm. Bu mənzərəni seyr edən yaşlı bir kişi dərindən "ah" çəkdi (mən o "ah"ın səbəbini indi bu sətirləri yazarkən də anlaya bilmirəm).

– Sağ olun, Nəriman əmi! Sağ olun, güneylilər! – deyə quzeylilər qışqırdılar.

Nəriman əmi Muradı boşlayaraq, dəsmalını çıxarıb gözlərini sildi.

...Mənim, min cür fikir və xəyallarla, kimsənin xəbəri olmayan acı iztirablarla, gülüş və qəhqəhələrlə dolu qış günlərim keçib getdi. Bu müddət ərzində həyatımda əhəmiyyətli bir hadisə olmadı. İşlərimiz, əvvəllərdə dediyim kimi, pis getmirdi. Biz "Əlli yaşında cavan"dan sonra iki musiqili komediya da hazırlayıb oynadıq. Gündüzlər məşq edir, kitabxanada məşğul olur, gecələr səhnəyə çıxırdıq. Artıq kitabxanamızın da xeyli oxucusu var idi. Kəndlilərin qışda asudə vaxtları çox olduğundan, hər gün kitabxanaya yığılırdılar. Yerli şivə ilə desək, sobaları dəmləyib otururduq. İndi tək mən yox, Səriyyə, hətta, Pirverdi, Kərəm, Almurad da kitabxanaya yığılan azsavadlı adamlar üçün bərkdən kitab, qəzet oxuyur və bundan ləzzət alırdılar.

Səriyyə bizim özfəaliyyət dərnəyimizdə iştirak etməklə bərabər, eyni zamanda, yaxşı bir kitabxanaçı olmuşdu. Mən adamlarımızın istedadına getdikcə daha çox heyrət edirdim. Onların bir işi sevib ondan ciddi yapışmaları lazımdır. Sonra dağı dağ üstünə qoyacaqlarına şübhə yoxdur. Səriyyə az zaman içərisində o qədər kitab oxumuş, o qədər tərəqqi etmişdi ki, sanki doqquz-on ay əvvəl mənim birinci dəfə gördüyüm qız deyildi. Nişanlısı bizim haqqımızda çıxan məqalədə onun da adını oxuyub təbrik yazmışdı. Ondan bəri qızın həvəsi daha bu sözdən deyildi. Hiss edirdim ki, mənim hər bir hərəkətimə diqqət yetirir, bəzən mənim kimi olmağa çalışır, bu, uzaq kənddə adi, xırda bir işçi olan məni fərəhləndirir və məsuliyyət hissimi artırırdı. "Görürsənmi, – deyirdim, – səni də təqlid etmək istəyənlər var". Ona görə, mən də hərəkətimə, geyim və bəzəyimə fikir verməyə məcbur olurdum.

– Ay Nuriyyə bacı, bu qədər oxumağa necə vaxt tapmısınız? – deyə o tez-tez soruşardı.

– Mənim sənin kimi nişanlım olmadığından, mehrimi kitablara salmışam, – deyə zarafatla cavab verərdim.

Mən, eyni zamanda, ona qarşı özümdə bir analıq məhəbbəti hiss edirdim. Onun inkişafı məni sevindirirdi. Yalnız Səriyyənin deyil, hətta İmi ilə Ciminin də müvəffəqiyyəti məni fərəhləndirirdi. İndi onlar ora-bura qaçıb boş təşəbbüslərlə baş aldatmırdılar. Kəndin ortasında veyllənib bundan ona, ondan buna söz gəzdirmirdilər. Bunun üçün onların artıq nə vaxtı var idi, nə də həvəsi. Çünki onların təbiətində olan bir şey yaratmaq, bir şeylə nəzərə çarpmaq meyli, cəmiyyətdə müəyyən mövqe tutmaq cəhdi öz həqiqi istiqamətini tapmışdı. Nəhayət, onlar ürəkdən sevdikləri işlə həyatlarını təmin etmək imkanına malik olmuşdular. Artıq onların yaşamaq üçün saxta vasitələrə, yalan və fitnəyə əl atmağa ehtiyacları yox idi.

Mən bu fikrə gəlmişdim ki, bizim cəmiyyətimizin hər bir nöqsanlı üzvünü öz yerində oturtmaqla, ona həvəsi, qabiliyyəti olan işi verməklə düz yola salmaq olar. Bunun üçün adamlarımızın qəlbinə, ruhuna nüfuz etməyi bacarmalıyıq. Bizim bir-birimizi dərindən tanımağa, bir-birimizin ürəyinə yol açmağa, ona təsir etməyə imkanımız vardır. Qurduğumuz böyük cəmiyyət bizi ruhən bir-birimizə yaxın və doğma etmişdir. Biz qəlbən yalqız deyilik! Mənim könül bağımda nadir bir gül açmışdı. Mən onun ətri, onun rayihəsi ilə xoşbəxt idim. Mən onun hüsnünə heyran idim. Onunla yaşayırdım, onun əsiri, pərəstişkarı idim. Səhərlərim onunla işıqlanırdı. Gecələrim onun xəyalı ilə dönüb bir əfsanə olurdu. Bir gün təbiətə həyat verən bir yaz tufanı onu vurub məhv etdi. Mən onun qurumuş, cansız ləçəklərini yığıb qəlbimin vərəqləri arasında gizlətdim. Özüm isə, ölmədim, yaşadım. Mən ən əziz balasını itirərək, sağ qalmış digər övladlarından təsəlli alan bir anaya döndüm. Mən sarsıldım, vaxtından əvvəl qocaldım, lakin ölmədim. Mən ana və vətəndaşam. Artıq nə lazımdır?

Tez-tez ya Səadət bizə gəlir, ya mən onlara gedirdim. Muradın işi çox olduğundan, bizim məclisimizdə az-az görünürdü (quzeylilər Söyüdlü arxdan kəndin müxtəlif yerlərinə, tarlalara xırda arxlar çəkirdilər).

Səadətlə heç bir zaman keçmişləri xatırlamazdıq. Heç zaman o, Murad haqqında danışmazdı. Hər dəfə görüşəndə mən ondan "Murad necədir? Əlimərdan necədir?" deyə hal-əhval tutardım. O da mənim üzümə baxmadan "yaxşıdırlar, çox sağ olun" deyə yavaş səslə cavab verərdi. Yalnız bircə şey çox pis idi: mən Muradı tez-tez yuxuda görürdüm. Bu yuxular həmişə fərəhli və məsud olurdu. Biz, dərdsiz-

qəmsiz şən vaxtlar keçirirdik. Biz nəyə isə gülür, nəyə isə sevinirdik. Ən şirin anlarda mən diksinib yuxudan ayılırdım və o xoşbəxt aləm mənə çox baha otururdu. Ona görə də, yuxu görməmək üçün gecələr turş qatıq içirdim.

Ürəyimdə yaşatdığım ikinci həyatdan hamının xəbərsiz olması məni məmnun edirdi. Çünki öz kədərimlə başqalarının ovqatına soğan doğramaq istəmirdim. Lakin bir gün Nəriman əmigildə olduğum zaman Qərənfil bacı əlimdən tutaraq dedi:

– Vallah, kişi qızı imişsən.

– Nəyə görə məni belə tərifləyirsiniz?

– Tərifləmirəm, düzünü deyirəm. Beləliyimizə baxma. Biz kəndlilər çoxbilmiş oluruq. Ancaq yaxşı elədin. Ev dağıtmaqla heç kəs xoşbəxt olmayıb.

Mən bütün vücudumla titrədim. Əgər, mənim şəxsi həyatıma bir başqası bu cür müdaxilə etsəydi, hirslənib özümdən çıxardım. Lakin Qərənfil bacıya heç nə demədim. Görünür, biz nə qədər möhkəm iradəyə malik olsaq da, dərdimizi, heç olmasa, bir nəfərin bilməsini istəyirik. Bu, bizim həmişə insan ünsiyyətinə olan dərin ruhi ehtiyacımızdır. Bizim bir-birimizdən tamam təcrid olunmuş, tamam qapalı halda yaşamağımız çətindir. Ona görə də, mən özümdə daxili bir yüngüllük, qəribə bir xoşhallıq hiss edərək susurdum. Mən indi doğma anasını dinləyən qız kimiydim. Qərənfil bacı deyirdi:

– Mən Hümmət deyən qədər də mövhumatçı deyiləm. Amma bir şeyə inanıram, o da budur ki, dünyada nə yaxşı, nə də pis iş əvəzsiz qalmır.

Burada mən özümü saxlaya bilməyib, dərhal etiraz etdim:

– Mənə heç bir əvəz lazım deyil, Qərənfil bacı.

– Elə demə, qızım.

O, “ah” çəkdi:

– Bir vaxt gələr, lazım olar. Hələ cavansan. Ürəyin quş kimi pərvazdadır. Bir gün olacaq, sən də yorulacaqsan. Sən də yaxın bir adamından xoş söz eşitmək, dərdini-qəmini onunla bölmək istəyəcəksən. Biz insanlar beləyik.

“Bəlkə də eləyik” deyə düşündüm, lakin cavab vermədim.

...Həmin yaz gözlənilməyən bir hadisə mənim həyatımda tamamilə yeni səhifə açdı. İmi ilə Cimi xəbər gətirdilər ki, Azərbaycan Dövlət Dram Teatrının artistləri bir neçə tamaşa vermək üçün bizim rayon

mərkəzinə gəlmişlər. Qulu əl-ayağa düşüb dedi: "Gərək biz artistlər mütləq gedib o tamaşalara baxaq. Çünki böyük sənətkarlardan öyrənmək lazımdır".

...Birinci gecə Cəfər Cabbarlının "Aydın" pyesini göstərəcəkdilər. Rayon mədəniyyət evinin böyük zalı tamam dolu idi. Hələ, bilet çatmadığından, adamların çoxu geri qayıtmışdı. Başda Qulu olmaqla, biz – Güney qışlağın artistləri beşinci cərgədə oturub, tamaşanın başlanmasını səbrsizliklə gözləyirdik.

Bir il idi ki, mən, vaxtilə sevib, xəyalları, surətləri ilə yaşadığım, məharətlərinə heyran olduğum artistlərin oyununu görmürdüm. Mən indi oturub gözümü səhnənin pərdəsinə dikərək, keçən günləri, institutda oxuduğum illəri, o illərlə birlikdə çıxıb getmiş arzularımı xatırlayırdım və kədərlə düşünürdüm: "İnsan hər şeyə necə tez alışır, hər şeyi necə tez unudur!"

Birdən mədəniyyət evinin işçilərindən tanış bir oğlan mənə yaxınlaşaraq, qulağıma sarı əyildi:

– Nuriyyə xanım, yoldaş Hümmət xahiş etdi ki, zəhmət çəkib direktorun otağına gələsiniz.

Tələsik qalxıb getdim. Raykom katibi Süleymanzadə və Bakıdan gəlmiş artistlərin rejissoru da orada idilər. Hümmət məni görərkən, aramızda heç nə olmamış köhnə bir dost kimi, açıq və sərbəst ifadə ilə:

– Nuriyyə xanım, Gültəkin rolunu ifa edən aktrisa, ürəyi bərk ağrıdığından, səhnəyə çıxa bilməyəcək, dedik bəlkə siz onu əvəz edəsiniz...

Mən dinmədim.

– Deyirlər, axı, siz teatr institutunu bitirmisiniz? – deyə bakılıların rejissoru həyəcanla dilləndi. – Yəqin ki, "Aydın"la tanışsınız.

– Bəli, tanışam.

– Gültəkinin sözlərindən, hərəkətlərindən heç yadınızda qalanı varmı?

– Bir az yadımdadır.

– Mən özüm sizə suflyorluq edəcəyəm. İndisə vaxtı itirməyək.

Rejissor Aydın rolunu ifa edən artisti çağırtdırıb, bizimlə iyirmi-iyirmi beş dəqiqəlik məşq keçdi. Sonra saatına baxaraq:

– On səkkiz dəqiqə gecikmişik, – dedi və tamaşanın başlanmasını əmr etdi.

Bu mənim həyatımda fırtınalı, qeyri-adi bir gecə idi. Ömrümdə birinci dəfə idi ki, məşhur artistlərlə birlikdə səhnəyə çıxırdım. Doğrudur, institutda oxuyarkən, mən Gültəkinin hərəkət və sözlərini yüzlərcə dəfə zehnimdən keçirmişdim. Onun iztirablarını yüzlərcə dəfə öz iztirablarım kimi yaşamışdım. Lakin xəyal başqa, səhnə başqadır. Dram teatrının aktrisaları mənə ürək-dirək verirdilər. Mən səhnənin arxasında dayanıb öz növbəmi gözləyirdim. Ürəyim sıxılıb-açılırdı. Səhnədə cəsarət və inamla hərəkət edən artistlərə tamaşa etdikcə vücuduma qorxu çökür, öz-özümə son dərəcə kiçik görünürdüm. Lakin növbəm yetişəndə, elə bil, bütün qorxum bir anda yox olub getdi. Elə bil, mənə ömrümdə hiss eləmədiyim ruhi bir qüvvət gəldi, mən cəsarətlə, güclü bir inamla səhnəyə girib, öz rolumdan başqa hər şeyi unutdum. Necə oynadığımı bilmirdim. Lakin hiss edirdim ki, bütün zaldakılar nəfəslərini çəkmədən məni dinləyir.

Səhnələr gəlib-keçdikcə, Gültəkinin faciəsi də şiddətlənirdi. Mən bu gənc qadının iztirablarından başqa heç nə hiss etmirdim. Mən Gültəkin idim! Mən özümü öz böyük eşqimə qurban verirdim. Mən cəfakeş bir eşqin ali səadəti ilə sevərək, gülümsəyərək ölürdüm. Mən, uğrunda həlak olduğum oğlanın xəyalını özümlə birlikdə əbədiyyətə aparırdım.

Sanki uzun zamandan bəri ürəyimdə sükuta dalmış duyğular birdən-birə oyanıb pərvaz edərək, öz faciəli səadəti ilə, öz munisliyi ilə kainatı qavrayırdı. Mən Gültəkin idim. Mən, "vəfasız olmuşam, ey Məcnun" deyən bir Leyli idim. Mən sinəsini sevdiyi oğlana sipər etmiş bir fədai idim.

Yalnız gurultulu alqış səsləri məni o qəribə aləmdən həqiqi həyata qaytardı. Mən ayağa qalxaraq, xoşbəxt bir yuxudan ayılmış kimi, zala baxıb gülümsədim. Ətrafıma göz gəzdirərək təəccüblə düşündüm: "Bu nədir, bütün artistlər məni dövrəyə almışlar. Hamı məni alqışlayır, hamı mənə heyrətlə baxır."

Rejissor əlimi tutub iki əli ilə bərk-bərk sıxdı, zalda təkrar alqış səsləri qopdu. Bakı teatrının qocaman artistlərindən biri alnımdan öpdü.

"Doğrudanmı, mən bu qədər böyük müvəffəqiyyətlə oynamışam?"

Tərif çiçək kimi üzərimə yağırdı. Həddindən artıq kök olan rejissor həyəcandan qızarıb-pörtmüş üzünün, boynunun tərini yaylıqla silə-silə:

– Nuriyyə xanım, – dedi. – Biz sizi kəşf etmişik. Səfərimiz uğurlu olub.

...Azərbaycan Dövlət Dram Teatrının artistləri rayonda tamaşalarını qurtarıb gedəndən on beş gün sonra Pirverdi mənə bir teleqram gətirdi. Mədəniyyət nazirliyinin incəsənət işlərinə baxan rəisi bildirirdi ki, mən nazirin xüsusi əmri ilə Azərbaycan Dövlət Dram Teatrına aktrisa təyin olunuram. Sonra qeyd edirdi ki, nazirlik məni mənzillə təmin edəcəkdir.

Bu, mənim üçün təsəvvür eləməyəcəyim bir səadət idi. Lakin xeyli fikirdən sonra belə qərara gəldim ki, nazirliyə teleqram vurub, gəlmək istəmədiyimi bildirim. Çünki buradan çıxıb getmək, üz-gözümün öyrəşdiyi adamlardan ayrılmaq, oyunlarımı xoşlayan bu sadə tamaşaçılarımı birdən-birə tərk etmək mənə xəyanət kimi görünürdü.

Ancaq, bununla bərabər, daxili bir qüvvə məni elə şiddətlə teatra cəlb edirdi ki, fikrimi həyata keçirə bilmirdim: “Bu nədir? Yoxsa, mən adi bir şöhrətpərəstəm? Məgər, burada da öz vətəndaşlarıma xidmət etmirəmmi? Məgər, mənim az-çox olan qabiliyyətim burada xalq işinə sərf olunmurmu? Üstəlik, axı, mən bu adamları sevirəm. Axı, buradan Quzey qışlağa cəmi altı-yeddi kilometrdir...”

Mən səhərdən axşama qədər tərəddüd və həyəcan keçirir, nazirlikdən gələn teleqramı kimsəyə göstərmirdim. Çox götür-qoydan sonra Nəriman əmidən icazə alıb, Almuradın maşınında rayon mərkəzinə, Hümmətin yanına getdim. Özümə söz vermişdim. “O nə cür məsləhət görsə, elə də edəcəyəm!”

Hümmət teleqramı oxuyandan sonra:

– Getmək istəyirsinizmi? – deyə soruşdu.

– Heç bir qərara gələ bilmirəm. Həm istəyirəm, həm də istəmirəm.

O, ağıllı gözlərini yerə dikərək, bir neçə saniyə düşündü. Sonra üzümə baxaraq, qəti ifadə ilə:

– Məncə, getmək lazımdır, – dedi.

– Bəs, buradakı işlər?

– Buradakı işlərinizi də Qulu, Nazxanım, İmi ilə Cimi davam etdirər. Doğrusu, sizin o günkü oyununuz məni lap heyran edib. Mən “Aydın”ı çox görmüşəm. Ancaq heç bir aktrisa Gültəkini sizin qədər təbii oynamamışdır. Sizdə böyük istedad var, Nuriyyə xanım.

Mən tərif xoşlamıram. Lakin o, bu sözləri o qədər səmimi deyirdi ki, ürəyim kövrəlir, sevincimdən ağlamaq istəyirdim.

– Gedin. Sizin yeriniz oradır. Özünüzə xəyanət etməyin.

Susub bir qədər mənə baxdıqdan sonra müztərib bir təbəssümlə əlavə etdi:

– Biz birtəhər keçinərik.

Mən onun əlini bərk-bərk sıxaraq ayrıldım.

...Güney qışlaqda mənim şəhərə dəyişildiyimi bildikdə, Nazxanımdan tutmuş İmiyə, Cimiyə qədər bütün iş yoldaşlarım çox məyus oldular. Nəriman əmi isə, "heç vaxt, heç vaxt elə şey olmaz" deyib birbaş nazirin özünə zəng vurdu. Nə danışdıqlarını bilmədim. Lakin zəngdən sonra kişinin halı birdən-birə sakit və ciddi oldu.

– Mən heç bir zaman mərdimazar olmamışam, – dedi, – vaxta ki, ora getmək sənin üçün də vacibdir, get.

– Əsl iş də odur! – deyə Qulu dostum şəhadət barmağını yuxarı qaldırdı. – İstedadlara şərait lazımdır.

Hamıdan çox Nazxanım bikef olmuşdu:

– Bizi artist elədin, indi başsız qoyub gedirsən.

– Biz Nuriyyə xanımdan çox şey öyrəndik, – Qulu məni tərifləyirdi. – İndi özümüz də keçinə bilərik. Qoyun o getsin. Bizim fəxrimizdir.

İmi ilə Ciminin təşəbbüsü ilə mən bir vida konserti verməli oldum. Hamımız birlikdə proqram düzəltdik. Mən zəng vurub Hümməti də dəvət elədim. Mənim getməyimi eşidən bütün kənd tökülüb gəlmişdi. Nəriman əmi, Qərənfil bacı, Murad, Səadət, Ağabəyim, Pirverdi, Kərəm, qərəz mənim tanıyıb-tanımadığım hamı oradaydı. Adam çox olduğundan, konserti mədəniyyət evinin qabağında – açıq havada verdik.

Mən yeni mahnılar çalıb-oxudum. Lakin bu dəfə tamaşaçılarımın ən çox sevdikləri yumor nömrələrini göstərə bilmədim. Ayrılıq həmişə kədərlidir.

Konsertin axırında Qulu ayağa qalxaraq, bütün güneylilərin, quzeylilərin adından mənə təşəkkür edib, nitqini bu sözlərlə qurtardı:

– Nuriyyə xanım! Bizim camaatımız yaxşılıq biləndir, sizi heç bir zaman unutmayacaq. Gedin, böyük sənətkar olun. Ancaq siz də bizi yaddan çıxarmayın.

Sonra balaca bir qız mənə bir dəstə çiçək verərək:

– Nuriyyə xanım, – dedi, – bunları Quzey qışlaqdan, Söyüdlü arxın altında məktəb üçün saldığımız bağçadan dərib gətirmişəm.

Alqış səsləri uzun zaman kəsilmədi.

Nəhayət:

– Əziz dostlarım, – dedim, – mən sizin hamınızdan yerdən göyəcən razıyam. Harada oluramsa-olum, sizi unuda bilməyəcəyəm. Sizinlə birlikdə sevinib-kədərləndiyimiz saatlar həyatımın ən əziz xatirələri olacaq.

Sonra gülümsəyib əlavə etdim:

– Ayrılıq zamanı adamın ürəyi nazik olur, əgər, birinizi incitmişəmsə, xahiş edirəm məni bağışlasın. Mənim sizdən, siz əziz tamaşaçılarımdan başqa bir kəsim yoxdur.

Bu axırıncı sözləri hansı hissin təsiri altında söylədiyimi bilmirəm. Lakin onları deyərkən, səsim titrədi, ağlamaqdan özümü zorla saxladım.

...Səhər məni ötürməyə Muradla Səadət də gəlmişdi. Murad həmişəkindən artıq danışıb-gülürdü. Gözləri elə yanırdı ki, mən onun xəstə olduğundan qorxdum. Səadət əlimdən tutub məni kənara çəkdi. Sonra barmağındakı iki üzükdən birini çıxarıb mənə uzadaraq:

– Çox xahiş edirəm. – dedi, – bunu məndən yadigar götürəsiniz... Siz mənə o qədər yaxşılıq eləmisiniz ki, istəmirəm yadınızdan çıxım. İstəyirəm siz hər bu üzüyü görəndə məni xatırlayasınız.

Mən üzüyü almayaraq:

– Sizə nə yaxşılıq eləmişəm ki? Siz onsuz da yaxşı idiniz.

– Bəlkə də elədir. Ancaq siz olmasaydınız, məndə yaxşı nə vardısa, məhv olub gedə bilərdi. Bir il qabaqkı həyatım indi yadıma düşəndə...

O, qəflətən üstünə buzlu su tökülmüş adam kimi içini çəkərək bir an susdu. Sonra əlimi tutub üzüyü barmağıma keçirərək:

– Götürməsəniz inciyərəm, – dedi.

Və qulağıma tərəf əyilərək pıçıldadı:

– Mən də, əgər, qızım olsa, adını Nuriyyə qoyacağam.

– Yoxsa... – deyə gülümsədim.

Qızararaq başı ilə təsdiq etdi.

Mən onu qucaqlayıb, ləkə düşmüş üzündən öpdüm.

Hamı ilə görüşəndən sonra Almuradın maşınına əyləşdim. Nazxanım, Səriyyə və Qulu da mütləq məni ötürmək istədiklərini bildirərək, maşına mindilər.

Biz Söyüdlü arxın körpüsünü keçəndə, qanrılıb geri baxdım. Söyüdlü arx günəşin qızmar ziyası içində sükuta dalmış çöl ilə xoş bir xəyal, bir ömür kimi Quzey qışlağa qədər uzanırdı.

Biz stansiyaya çatanda Hümməti də orada gördük.

– Nə zəhmət çəkirdiniz, – dedim.

O, cavab verməyərək, Qulunun təzə dama-dama köynəyinə sataşdı, bir növ, zarafat elədi.

Biz stansiyada gəzir, oradan-buradan söhbət edirdik. Günlərin necə tez gəlib keçməsindən danışırdıq.

– Elə bil, – deyirdim – Güney qışlağa təyinnamə alıb gəldiyim dünənmiş.

Hümmət də uzaqlara baxaraq:

– Taleyimiz belədir, – deyirdi, – başladığımız hər işin bir sonu var.

("Hər əzabın bir sonu var" deyə mən tez-tez özümə verdiyim təsəllini xatırladım.)

Yolumuz nə qədər uzun olur-olsun, axırda qurtaracaqdır.

Qulu isə, şəhadət barmağını yuxarı qaldırıb təsirli bir pafosla:

– Həyat müvəqqəti, sənət isə daimidir, – deyirdi.

Sonra biz, filosofluq etməyə başladığımıza ürəkdən gülərək, tamamilə başqa şeylərdən danışdıq.

Nəhayət, qatar gəlib çıxdı, mən öz dostlarımdan ayrıldım.

...Əvvəllər dediyim kimi, şəhərdə ayrı bir yaxın adamım olmadığından, maşını Ələsgər dayıgilə sürdürdüm. Şoferi yola salandan sonra çamadanımı əlimə alaraq, gəlib alt mərtəbədəki balaca otağın qapısını döydüm.

– Kimdir? – deyə Ələsgər dayı öskürərək soruşdu. – Gəl içəri.

Mən daxil olub şeylərimi yerə qoydum. Ələsgər dayı otağın yarıqaranlığı içində mənə tanış olan balaca döşəkcənin üstündə oturub qəlyan çəkirdi. Məni görəndə:

– Bıy, – deyib ayağa qalxdı. – Xoş gəldin, ay qızım!

Kişinin sevincdən dodaqları titrəyirdi.

– Bəs Güllü nənə hanı? – deyə soruşdum.

Bir neçə saniyə dinmədi. Sonra üzümə baxmadan yavaş səslə:

– Güllü nənə ömrünü sənə bağışladı, – dedi və bir şey axtarırmış kimi otağa göz gəzdirdi.

– Nə vaxt?

– Ay yarım olar.

– Bəs, niyə mənə xəbər vermədin?

– Nə bilim, xəbər vercək nə olacaqdı ki?

– Xəstəliyi nə idi?

– Heç nə. Bir gün elə buradaca oturmuşduq. Birdən, elə bil, diksinib qalxdı, dedi ki, ürəyim birtəhər olur. Dedim, nə olacaq, bir az uzan. Durub mütəkkə verdim. Elə uzanmağı ilə quş kimi uçub getməyi bir oldu.

Kişi xeyli müddət gözlərini xalçadan çəkmədi. Sonra öz-özüylə danışırmış kimi toxtaq səslə:

– Allah rəhmət eləsin, – dedi, – əməli düzmüş. Heccə kəsə əziyyəti dəymədi. Ayaq üstə niyə durmusan?

Mən stul çəkib oturandan sonra, özü də döşəkcəyə əyləşib:

– Elə müəllimlər də, tələbələr də sağ olsunlar, – dedi, – hamısı yığılıb gəldi. Yoxsa, tək mən neyləyə bilərdim? İndi tərs kimi özümün də qılçamda yel əmələ gəlib. Həkim deyir gərək buradan çıxasan. Rütubətdir. Qalmışam belə. Direktorumuz yaxşı adamdır. Söz verib ki, ikinci mərtəbədə-zadda mənə balaca bir otaq kimi düzəltsin. Görək nə olur. Sənin işin-kücün nə cürdür?

Bir neçə gün sonra mən Ələsgər dayını yığışdırıb öz yanıma apardım. Əvvəl getmək istəmirdi.

– Qoca adamam, – deyirdi, – sənə başağrısı olaram.

Mən də təkid edərək:

– Ələsgər dayı, – deyirdim, – tək qızam. Mənə bir həyan lazımdır. Sən getməsən, gərək bir başqa adam tapam.

Mənə üçotaqlı mənzil vermişdilər. Şəhərdən bir qədər uzaqda da olsa, rahat idi. Otaqlardan birinə çarpayı qoyub, Ələsgər dayı üçün yer düzəltdim. Kişi bilmirdi nə desin, razılığını necə bildirsin.

...İndi o vaxtdan xeyli keçir. Mən bir mühəndisə ərə getmişəm. Məndən on səkkiz yaş böyük olsa da, yaxşı adamdır. Həmişə bir-birimizə hörmət edirik. Quludan tez-tez məktub alıram. Səadət əhdinə vəfa edərək, qızının adını Nuriyyə qoymuşdur. Söyüdlü arxdan sonra Quzey qışlaqda gözəl bağlar, bağçalar əmələ gəlib. Qulu yazır ki: “Görsəniz tanımazsınız”.

Nazxanım şofer Almurada ərə getmişdir. İmi ilə Cimi isə, hələ də subaydır. Dram dərnəyinin işi müvəffəqiyyətlə davam edir. Bir neçə gün qabaq mənə Əməkdar artist adı verilməsi münasibətilə onlardan aldığım təbrik teleqramı məni başqa təbriklərdən çox mütəəssir etdi. Hər şeyin təzəsi, dostun köhnəsi...

Nəriman əmi ilə Qərənfil bacı həmişə Bakıya gələndə bizə düşürlər. Deyirlər Söyüdlü arxdan sonra Quzey qışlağın evləri arxyuxarı ar-

taraq lap gəlib Güney qışlağa çatmışdır. Ona görə də, Nəriman əmi məsələ qaldırıb ki, hər iki arteli birləşdirib böyük bir təsərrüfat eləsinlər. Sədri də Murad olsun. Deyirlər Nəriman əmi ömründə birinci dəfə qocaldığını boynuna almışdır.

Hümmət nazir müavini olub, Bakıda yaşayır. Tez-tez görüşürük. Özü kimi ağıllı və gözəl bir qızla evlənmişdir.

Muradı isə, yalnız bircə dəfə, Dezdemona rolunu ifa etdiyim zaman səhnəyə yaxın lojalardan birində görmüşəm. Mənim gənc leytenantımın saçları xeyli ağarmışdır. Lakin lojadan səhnəyə dikilən gözləri yenə də əvvəlki kimi sakit, ciddi və odlu idi. Zənn edirdim ki, o, səhnənin arxasına gəlib mənimlə görüşəcək. Lakin gəlmədi. Mən də incimədim.

Ələsgər dayı təqaüdə çıxmışdır. Gündüzlər gedib dəniz kənarında qocalarla söhbət edir. Axşamlar isə, yenə də çarpayısının üstündə bardaşqurma oturaraq, sazını dınqıldadıb oxuyur:

“Üzü bəri baxan dağlar,
mənim sizdə nəyim qaldı”.

*1958*

# GERİYƏ BAXMA, QOCA

## MÖHNƏT QOCANIN NAĞILLARI

### KÜRDOBADAKI SƏKİNƏ İLƏ MAHAL MUROVUNUN ƏHVALATI

Uca dağlı, bağlı-bağatlı, aranlı-yaylaqlı Qarabağda "Kürdoba" deyilən bir tərəkəmə obası var idi. Adamları təmiz azərbaycanlı olan bu tərəkəmə obasına niyə "Kürdoba" deyirdilər, məlum deyildi.

Kürdobalılar "Qarabağ cinsi" adlanan quyruqlu qoyunlar, hər biri iyirmi pud yük götürən nərlər saxlayardılar, ceyran ayaqlı Qarabağ atları minərdilər.

Qışda qışlaqda olardılar, yazda hər tərəfi qıpqırmızı lalə olan, min cür çiçək dolu otu dizə çıxan, göz işlədikcə uzanıb gedən Haramılara köçərdilər. Qoyunlar südlü-sünbüllü otlardan yeyib doğardılar, arvadlar pendir tutardılar, nehrə çalxardılar, bulama, suluq bişirərdilər. Yay yaxınlaşanda, Haramıların otları saralanda fərməşlər qovlanıb dəvələrə yüklənərdi, atlar yəhərlənərdi və el yaylağa köçərdi. On gün-on gecə köç yol gedərdi. "Gəyən" deyilən düzdə igidlər cıdıra çıxardılar. Bütün atları ötüb-keçən at mahalda ad çıxardardı, sorağı ellərə yayılardı.

– Ə, – deyərdilər, – Hacıquluoğlu Şahbazın səmənd atı yüz seçmə atı yarı yolda qoyub.

Səmənd ata elçilər gələrdi, amma Hacıquluoğlu:

– Cəmənd atı min erkəyə də verməərəm, – deyib onları boş yola salardı.

Köç yollarında bəzən hamilə gəlinlərdən doğan da olardı.

Sonra Dəliçay yaylağına çatıb, "Eşşək bulağı" deyilən yurdda keçə alaçıqlar – komalar qurardılar. Yurd hündürdəydi, Eşşək bulağı aşağı dərədə. Eşşək bulağı dünyalar yola salmış sarı qayalardan qaynayıb çıxırdı. Yaşıl baldırğanların, ətirli yarpızların arasıyla göz yaşı kimi dumduru su axırdı. Suyun içində muncuq kimi rəngbərəng daşlar görünürdü, amma onu da heç kəs bilməzdi ki, bu zərif bulağa niyə "Eşşək bulağı" deyirlər? Kim bilir ki, Eşşək bulağı yurdundan xeyli yuxarıdakı yaylağa nə üçün "Qızıl boğaz", ondan daha yuxarıda, dağın döşündəki əriməz qara niyə "Əyri qar" deyirlər? Ya da "Eşşək bula-

ğı" yurdundan aşağıda göylə yer birləşənəcən uzanıb gedən laləli düzənliyə niyə "Altıntaxta" deyirlər?..

Hər obada böyük ağ keçədən qurulmuş bir ağ alaçıq, onun yan-yörəsində də qara keçəli komalar olardı. Ağ alaçıqda obanın sayılan varlı adamı, qara keçəli alaçıqlarda kasıblar yaşayardı, varlı gərək kasıbdan seçiləydi, obaya gələn yad atlı gərək biləydi ki, "bax, bu ağ alaçıq Hacı filankəsindir". Hacı filankəs də bütün obanın başçısı, ağsaqqalı olardı. Obanın bir adamına ayrı bir obadan sataşan olsaydı, demək o, oba başçısına sataşmış olurdu. Beləydi tərəkəmələrin qanunu...

Eşşək bulağı yurdundakı qara keçəli komalardan azca yuxarıda iri bir ağ alaçıq görünürdü. O ağ alaçıq kürdobalıların sayılan adamı Kərbəlayı İbixanın idi. Kərbəlayı İbixan on min qoyunu, səkkiz yüz atı olan Hacı Alış qədər dövlətli olmasa da, ondan ağıllı, çörəkli, qonaqqaralı bir adam idi. Qapıya gələn aşığı boş yola salmazdı, köməksizə kömək olardı, kasıba əl tutardı. Mahal murovu, Kərbəlayı İbixanın adsanını eşidib, onu Arazboyu tərəkəmələrinə vəkil təyin elədi.

Kürdobanın komaları, alaçıqları yaz vaxtı Haramılarda qurulanda murov Haramılara gəlib Kərbəlayı İbixanın alaçığına düşdü və onun qızı Səkinəni görüb ağlı zayıl oldu, ona görə "zayıl oldu" deyirəm ki, murovun 60 yaşı, dörd arvadı vardı, gözünün də biri mayıf idi, amma Səkinə on yeddi yaşında, ağ üzündə qoşa xalı, bir dünya gözəli idi. Varlı yerdən neçə-neçə igid ona elçi düşmüşdü, amma Səkinə öz qohumları Gülməmmədə sevgi yetirmişdi və Kərbəlayı İbixan da bunu bilib, qızını ona nişanlamışdı. Gülməmmədin atası Uzun Həsən, kasıb da olsa, sayılan igidlərdən idi, neçə-neçə xəncər-bəlgə davasında şücaət göstərmişdi, bir sözünü iki eləyən olmamışdı.

Murov başlamışdı Kürdobaya, vəkil Kərbəlayı İbixanın evinə yol açmağa. Axırda bir gecə Səkinə nişanlısı ilə xəlvət görüşəndə əhvalatı açıb ona dedi. Dedi ki, murov məni görəndə qoca yabı kimi dişini ağardır, özü də o günü bizə gələndə dədəm obada yox idi, mən aparıb alaçıqda qabağına süfrə salanda biləyimdən yapışdı, güclə əlindən çıxıb qaçdım.

Gülməmməd dedi:

– Görünür, buynuzunun dibi gicişir.

Sonra Gülməmməd, Səkinənin anasına dedi:

– Bibi, Kərbəlayı dayıma denən, əgər, o kor murov bir də bu evə gəlsə, öldürəcəm onu.

Səkinənin anası Gülməmmədin dəli-dolu oğlan olduğunu bilirdi, bilirdi ki, öldürər! Ona görə də, əhvalatı açıb ərinə dedi. Kərbəlayı İbixan hələm-hələm yerindən oynayan adam deyildi. Bir az fikirləşib arvadına dedi:

– Sən Gülməmmədə yetir ki, onun işi yoxdur, murovla mən özüm təhər çəkərəm.

Atalar deyib: abırlı abrını gözləməsə, axırı it axırına dönər. Günlərin birində murov Kürdobaya gəlib yenə Kərbəlayı İbixanın evinə düşdü. Kərbəlayı da iki cavan çağırıb dedi:

– Murovun atının quyruğu çox uzundu, gedin onu bir az gödəldin.

Cavanlar da başa düşdülər ki, Kərbəlayı nəyə işarə edir.

Murov bu dəfə gözəl Səkinəni görə bilmədi, ürəyində qərar verdi ki, gedib qız üçün elçi göndərsin. Amma gedəndə gördü ki, atının quyruğunu kəsib lümə toyuğa döndəriblər.

Murov qəzəblə soruşdu:

– Kərbəlayı, bu nə işdi?

Kərbəlayı İbixan dağdan ağır adam idi, murova sakit tərzdə baxıb dedi:

– Ağa, altmışında yorğalamaq istəyən yabını bizlərdə belə eləyərlər ki, bir az yüngülləşsin, bəlkə yolunu azmaya!

Murov dedi:

– Yaxşı, Kərbəlayı İbixan!

Kərbəlayı İbixan da cavab verdi ki:

– Ağa, Allaha şükür elə ki, Kürdobadan salamat gedirsən.

Murov, xoruzlansa da, qorxağın biri idi. Bilirdi ki, Kərbəlayı İbixana bir şey eləsə, kürdobalılar torpağını at torbasında aparar.

Ona görə də hesabı içəri verib, bir də Kürdobaya ayaq basmadı. Amma igiddən qada, canlıdan cəfa əskik deyil, deyərlər. Bir gecə İrandan keçən quldurlar “Mandılı” deyilən qışlaqda qoyun sürüsü saxlayan binələrə basqın eləyib, Gülməmmədgilin sürüsünü atdöşü eləyəndə, atası kimi ucaboylu, enlikürək, zorlu bir oğlan olan Gülməmməd çomağı qapıb başladı atlıları budamağa ki:

– Köpəkuşağı, çıxın qoyundan!

Quldurbaşı atının başını çəkib:

– Əyə, – dedi, – itil o yana, qoyundan ötrü özünü güdaza vermə.

Gülməmməd:

– Ə, anasının oğlu, mənə Uzun Həsənin oğlu Gülməmməd deyərlər, çıxın qoyundan! – deyib çomağını endirəndə, quldurbaşı da qılıncını endirdi, Gülməmməd gördü ki, çomaq tutan əli birdən-birə qov kimi yüngül oldu, təəccüblə baxıb gördü ki, nə əli var, nə də çomaq. Zalım oğlu qılıncı necə endiribsə, çomaq tutan əlini biləyindən qələmə kimi kəsib tullayıb.

Ballı qarı kərə yağı dağ eləyib Gülməmmədin yarasını bişirdi, məlhəm qayırıb sarıdı, Gülməmmədin biləyini sağaltdı. Mərdlər onu tayqol görüb heyfsiləndilər, namərd yağılar sevinib dedilər:

– Qoşa xallı Səkinə daha tayqol Gülməmmədə getməz.

Amma ona da Kərbəlayı İbixan qızı deyərdilər. Mərd kişinin belindən gəlmişdi, halal anadan süd əmmişdi. Xəlvətə salıb Gülməmmədə dedi:

– Heç ürəyini qısma! Sən iki gözümdən də əzizsən, pərvanə olub başına hərlənəcəm, qul olub qulluğunda duracam!

Eşşək bulağının üstündə böyük mağar quruldu, neçə cöngə, neçə erkək kəsildi. Göyçə mahalından aşıq Vəli dəstəsilə gəldi. Zəngəzurdan zurnaçı Nikolay dəstəsilə gəldi. Səkinə ilə Gülməmmədə üç gün, üç gecə bir toy elədilər ki, gəl görəsən.

...Onların dörd oğlu, bir qızı oldu, Gülməmməd Xorasana gedib "Məşədi Gülməmməd" oldu. Amma Kərbəlayı İbixandan bir neçə il sonra Məşədi Gülməmməd də rəhmətə getdi. Kürdobanın başbiləni, qonaq qabağına çıxanı, qan bağlayanı, elçi gedəni Səkinə arvad oldu. Dünyagörmüş kişilər deyərdilər, "Səkinə ağılda, kamalda atası Kərbəlayı İbixana çəkib".

Səkinə gördü ki, xanların, bəylərin uşaqları böyük-böyük məktəblərdə oxuyub rusun, firəngin dilini bilirlər, paqon taxıb böyük "nəçərnik" olurlar. Öz-özünə dedi: "Kərbəlayı İbixan bəy olmasa da, bəylərdən əskik kişi deyildi ki, niyə onun nəvəsi də oxuyub nəçərnik olmasın?"

Səkinə bunu fikirləşib, oğlu Bayramı bir dəvə yükü sovqatla apardı Şuşa qalasına. Qarabağ xanzadələrindən olan Nəcəf ağa, Kərbəlayı İbixanı yaxşı tanıyırdı, Araz qırağındakı rəiyyətlərinə baş çəkməyə çıxanda həmişə Kərbəlayı İbixanın alaçığına düşərdi. Onun üçün ceyranlar, turaclar vurulardı, erkəklər kəsilərdi.

Səkinə dedi:

– Kərbəlayı İbixanın nəvəsini sənə tapşırıram, ağa! Özün bilirsən ki, biz haqq-say itirən döyülük, iltimasımız budur ki, onu böyük rus məktəbinə qoyasan, oxusun, zamana adamı olsun.

Nəcəf ağa əzazil adam olsa da, bilirdi ki, Səkinəyə hörmət eləmək havayı getməz, bütün Arazboyunda deyəcəklər ki, "Nəcəf ağa, Kərbəlayı İbixanın duz-çörəyini tapdamadı". Ona görə də Bayramı qoydu gimnaziyaya.

Bayram gimnaziyanı qurtarandan sonra da Nəcəf ağa onu nəçərnikin idarəsində qulluğa düzəltdi. Arazqırağı tərəkəmələrin arasında Səkinənin hörməti-izzəti birə on oldu, zarafat deyildi, onun oğlu, Kərbəlayı İbixanın nəvəsi "qızıllı paqon" taxıb, padşahın idarəsində qulluq eləyirdi, rusun dilini bilirdi, özünə də "Bayram bəy" deyirdilər.

İndi sizə başqa bir əhvalat danışım... Görün ki, insanlar haralarda dünyaya gəlib, haralarda qovuşurlar. Görün taleyin nə qəribə işləri olur.

## XANIM ARVADLA DAMLICA MÜLKÜNÜN ƏHVALATI

Dünyaya çox igidlər, nəcib atlar verən gözəl Qarabağın "Kirs" deyilən qalın meşələrində Alyanlı adlı bir oba vardı. "Alyanlı" obasında hamıdan çox sayılan bir adam vardı ki, onun da adı Bağdad bəy idi. Məlum deyildi ki, dünyanın qurtaracağında, bu qalın meşələrin, bu sıldırımlı dağların arasına "Bağdad" adı haradan gəlib çıxmışdı. Bağdada kim bəylik vermişdi? Ancaq onu da deyim ki, Bağdad bəylə rəiyyətin fərqi ancaq onda idi ki, onun (yəni, Bağdad bəyin) içində su dəyirmanı olan "Damlıca" adlı bir mülkü vardı. Bağdad bəy də başqa kəndlilər kimi, patavalı çarıq geyib, uzuntüklü qoyun dərisindən basma papaq qoyardı, dəyirmanda şahıdı özü alardı, Damlıca mülkündəki torpaqları özü şumlardı, özü də qabağından yeməyən igid bir adam idi, mahalda ən yaxşı at onda olardı.

Siz taleyin işinə baxın ki, Bağdad bəyin də Kərbəlayı İbixan kimi gözünün ağı-qarası bircə qızı vardı və onun adı Xanım idi.

Alyanlı meşələrinin o biri tərəfindəki dağlarda fələyə bəndəlik eləməyən Şahmar bəy yaşayırdı. Bu, savadlı da olsa, qızıl vəznəli çuxa, güzgü kimi parıldayan uzunboğaz çəkmə geyib, qəbzəsi daş-qaşa tutulmuş qızıl xəncər bağlasa da, qaba, azğın bir adam idi. Onun me-

şələri gəlib Bağdad bəyin Damlıca mülkünə dirənirdi. Şahmar bəy bir dəfə Bağdad bəyi çağırtdırıb dedi:

– Kasıb adamsan, Damlıcanı sat mənə. Yaxşı pul verərəm, özünə əməlli gün-güzəran düzəldərsən.

Bağdad bəy də, dediyim kimi, qabağından yeyən deyildi. Əlini babasından qalmış xəncərin qəbzəsinə qoyub cavab verdi ki:

– Şahmar bəy, bu sözü mənə bir dedin, bir də desən, yaxşı olmayacaq.

Şahmar bəy namərd adam idi, ancaq baxıb gördü ki, Bağdad bəyin əli xəncərin qəbzəsindədi, ona görə də zarafata salıb dedi:

– Bağışla, bilmədim xətrinə dəyər.

Bu əhvalatdan bir neçə ay sonra Damlıca meşəsində Bağdad bəyi doğrayıb öldürdülər. Alyanlılar təəssübkeş camaat idi, amma sübut tapa bilmədilər. Bağdad bəyin arvadı Gülnisə də, qızı Xanım da bilirdilər ki, yüzü yüz söz deyə, bu Şahmar bəyin işidi. Hamı bilirdi ki, o namərd adamdır, öz gədələrinə gizlincə adam öldürtmək onun peşəsi idi, kimdən ki, bir balaca korası oldu, gərək o adam yox ediləydi.

Bağdad bəy öldürüləndən bir-iki il sonra Şahmar bəy saxta qəbələ çıxarıb divanda sübut elədi ki, Damlıca mülkü onun babasınındır. Atalar deyib ki, "arxalı köpək qurd basar". Şuşada oturan qəza naçalniki, Gəncədə oturan qubernator, Şahmar bəyin dostları idi, həmişə Kirs meşələrinə ova gələndə onun evinə düşərdilər, sonra bəy onları qiymətli hədiyyələrlə yola salardı. Ona görə Şahmar bəyin kəsdiyi başın sorğusu yox idi. Qərəz, Damlıca mülkünü alıb verdilər Şahmar bəyə, Gülnisə ilə qızına köhnə bir damla, bir qulac yer qaldı.

Gülnisə yana-yana dedi:

– Viran qalsın bu dünyanı, əgər, Bağdad bəyin oğlu olsaydı, qanı yerdə qalmazdı, Şahmar bəy də Damlıcada at oynatmazdı.

Xanım, anasının bu sözlərini eşidirdi, amma ürəyi daş kimi bərk olduğundan ağlamırdı, hələ desəniz, anasına da irad tutub dedi:

– Ah-vay eləmə!

Anasına belə desə də, Xanımın ürəyinin odu sönmürdü, anasının oğul barədəki sözləri onu yandırırdı.

Günlərin birində Dünyamalı kişinin arvadıyla Şuşa bazarında satmağa yavanlıq apardığını Gülnisə eşidib, çoxdan çirişlərə yığıb saxladıqları yağı, motalları yüklədi ata. İki də öyəc erkək ayırıb qızına dedi:

– Sən də Dünyamalı kişigillə bunları apar sat, özünə paltarlıq al, çəkmə al. Ərgən qızsan...

...Xanım apardığı şeyləri Şuşa bazarında satıb-sovandan sonra köhnə müştəriləri baqqal Tağıya dedi ki, onlar üçün bir tapança alsın. Tağı istədi desin ki, "sizdə kişi xeylağı yoxdur, neyləyirsən tapançanı?" Amma fikirləşdi ki, "deyərəm, birdən qızın ürəyinə toxunar". Baqqal Tağı onu da bilirdi ki, Alyanlı arvadlarından kişi kimi tüfəng-tapança atanı olur. Qızın pulundan neçə manat verib, "Aynalı" tüfəngin vaxtındakı tapançalardan birini aldı. Sonra da Xanım özünə bir dəst ipək paltarlıq, qırmızı ipək kəlağayı, bir cüt çəkmə alıb Dünyamalı kişigillə qayıtdı obalarına. Gülnisə arvad tapançanı görəndə heç təəccüblənib-eləmədi, ancaq qızından soruşdu ki:

– Sən bunu atmağın qaydasını bilirsən?

Qız da dedi ki, bilir. Gülnisə daha bu barədə bir söz danışmadı, Alyanlı obasından da heç kəsin bu tapançanın alınmağından xəbəri olmadı.

...Şahmar bəy hər axşamçağı atlı gəlib Damlıca mülkünü gəzməyə adət eləmişdi. Bir dəfə də gəlib alt tərəfi dərin uçurum olan meşəli dağın döşündəki dar cığırla atını sürdüyü zaman Xanım qarağat kollarının arasından qəfil çıxıb şax dayandı onun qabağında. Şahmar bəy onu görüb təəccüblə atın başını çəkdi.

Xanım soruşdu:

– Bəy, məni tanıyırsan?

Şahmar bəy dedi:

– Bağdadın qızı döyülsən?

(Bağdad bəy kasıb olduğu üçün Şahmar bəy onu "bəy" adlandırmağı şəninə sığışdırmadı.)

– Bəli, sənin namərdliklə öldürüb mülkünə yiyə durduğun Bağdad bəyin qızıyam.

Qız bunu deyib, Şuşadan aldığı, ipək çarqatın altında gizlətdiyi tapançanı çıxarıb Şahmar bəyin düz sinəsinə sıxdı.

Şahmar bəy, ürəyindən vurulmuş qarğa kimi atdan səssizcə aşıb uçurum aşağı yuvarlandı. Xanım onun ardınca uzun bir nəzər salıb özünü verdi meşənin qalınlığına.

Xanım əvvəl istəyirdi, Şahmar bəy cığırı gəlib-keçəndə onu xəlvətcə kolların arasından vursun, ancaq sonra fikirləşdi ki, bu əsl intiqam olmaz, onu öldürənin kim olduğunu gərək Şahmar bəyin özü görsün.

Şahmar bəyin düşməni çox idi, ona görə də oğlanları, qardaşları tapa bilmədilər ki, onu kim vurub. Bağdad bəyin isə, nə oğlu, nə qarda-

şı, nə də əmisi, dayısı oğlu olmadığından, yurdunda bircə arvadla qız uşağı qaldığından, güllənin onlar tərəfdən atıldığı ağıllarına gəlmədi.

Şahmar bəy öldü, amma Damlıca mülkü yenə də onun oğlanlarına qaldı.

...Sonra Gülnisə, Xanımı ərə verdi. Özü isə bir neçə ildən sonra vəfat etdi. Xanımın üç qızı, üç oğlu oldu. Özü də başladı Şahmar bəyin oğlanlarından Damlıca mülkünü tələb eləməyə. Şuşaya gedib naçalnikə şikayət elədi, qulaq asmadılar, Gəncəyə gedib qubernatora şikayət elədi, qulaq asmadılar. Axırda Xanım arvad dəmir çarıq geyib, dəmir əsa götürüb neçə gün, neçə gecə yol gedib çatdı Tiflis şəhərinə, axtarıb, soraqlaşıb Qafqaz canişininin iqamətgahını tapdı.

Canişin dilmancı vasitəsilə arvada diqqətlə qulaq asıb dedi:

– Ərizəni qoy get, baxarıq.

Xanım Alyanlı meşələrinə qayıdıb gözlədi, gözlədi, ərizəyə cavab çıxmadı, yenə də Xanım neçə gün, neçə gecə yol gedib çatdı canişinin iqamətgahına və məlum oldu ki, ərizə yaddan çıxıb qalıb kağızların arasında, baxılmayıb. Canişin dedi:

– Get, baxarıq.

Xanım arvad Alyanlıya qayıdıb yenə də gözlədi və günlərin birində cavab gəldi ki, Xanım arvadın tutarlı bir dəlili olmadığı üçün ərizəsi rədd olunur. Ancaq ona da Xanım deyərdilər, Şuşadakı vəkil Fərəc bəyə neçə manat verib uzun bir ərizə yazdırdı. Alyanlı ilə qonşu olan kəndlərin mötəbər qocalarını şahid göstərdi, babasından qalmış qəbələnin təkrar üzünü çıxartdırdı və yenə də neçə gün, neçə gecə yol gedib çatdı Tiflis şəhərinə.

Canişin onu görəndə tanıyıb təəccüb etdi, ərizəsini, kağızlarını bu dəfə özü alıb baxdı. Xanım arvad dilmanca dedi:

– Ağaya de ki, əgər, bu dəfə də mənim ərizəmi rədd eləsə, gedəcəm lap padşahın yanına.

Canişin gülümsədi, acığı tutmadı. Xanım arvadın xəbəri yox idi ki, canişin padşahın yaxın qohumudur. Uzaq Qarabağ meşələrindən gələn bu qarayanız, arıq arvadın təmkinindən, cəsarətindən, iradəsindən canişinin xoşu gəldi və o, xoş əhvalla da dilmanca dedi:

– Onu başa sal ki, mən özüm əlahəzrət imperatordan xahiş eləyəcəm onun mülkünü özünə qaytarsınlar.

Xanım arvad yenə də qayıtdı Alyanlıya, gözlədi. Canişinin vədi düz çıxdı. Damlıca mülkünü Şahmar bəyin oğlanlarından alıb qaytardılar Bağdad bəyin qızı Xanıma.

...İndi sizə kimdən deyim, Xanım arvadın qızlarından.

Bağdad bəy özü çox gözəl, yaraşıqlı kişi idi, xoşbəxtlikdən nəvələri də gözəllikdə ona çəkmişdilər. Həmişə bu barədə söz düşəndə, tək-tək hallarda üzü gülən Xanım arvad gülümsəyib deyirdi:

– Nə yaxşı ki, qızlar babalarına oxşayıblar, mənim kimi qarayanız olmayıblar.

Xanım arvad qızlarına əməlli-başlı cehiz düzəltdi, əvvəl böyük qızı Bəyazı yaxşı, hörmətli bir oğlana ərə verdi. Bu oğlan qonşu kənddən çıxmış cavan Hacı Şükür idi. Hacı Şükür kasıb bir kəndlinin oğlu idi, molla məktəbində yaxşı oxuyan ağıllı bir oğlan olduğu üçün kənd camaatı pul yığıb onu göndərdi Bağdada. Hacı Şükür ordakı böyük mədrəsələrdə neçə il təhsil alıb qayıtdı Şuşa şəhərinə, cavan olsa da, hörməti-izzəti o biri ruhaniləri kölgədə qoydu. Atalar deyib ki, ağıl yaşda deyil, başdadı. Cins adam olmaq dövlətdə, varda döyül! Hacı Şükür o biri mollalar kimi acgöz deyildi, kasıblardan pul almazdı. Hər gün adi kəndli paltarı geyib Cıdır düzündə tikdirdiyi evin həyətində işlərdi, cürbəcür ağaclar əkərdi, dirrik becərərdi. Minbərdə danışarkən camaatı öz halal zəhmətilə dolanmağa, nainsaf, əyri iş dalınca getməməyə, fəqir-füqəraya əl tutmağa çağırardı. Ona görə də kasıblar həmişə Hacı Şükürün yanına məsləhətə gələrdilər, çətinliklərini, sirlərini ona açıb deyərdilər. Cavan Hacı Şükür bir gün Alyanlıdakı qohumlarına qonaq gedəndə Xanım arvadın böyük qızı Bəyazı görüb ona elçi düşdü. Qızın da cavan Hacı Şükürdən xoşu gəldi və onlar evləndilər.

## CAVAN BAYRAMLA GÖZƏL FATMANIN ƏHVALATI

Bu əhvalatdan üç il sonra Qara Əmrah, Xanımın ən gözəl qızı Fatmaya elçi göndərdi. Qara Əmrah sayılan nəsildən deyildi. Özünün də bir qatırla, beş-on keçidən başqa heç nəyi yox idi. Ona görə də Xanımı od götürdü, elçiləri söyüb qapıdan qovdu, ancaq Qara Əmrah bir könüldən min könülə qıza aşiq idi, dedi öldü var, döndü yoxdu! Cavan taytuşlarını başına yığıb bir gün qız bulaqdan qayıtdığı zaman onu götürüb qaçdı. Bir ildən sonra Fatmanın bir oğlu oldu, adını qoydular Cəlil.

Ancaq Xanım sakit olmurdu ki, olmurdu. Hər gün Fatmanı xəlvəti çağırtdırıb öyrədirdi ki, boşan o qara köpək oğlundan, gözəl-göyçək qızsan, yüz müştərin olacaq.

Axırda Fatma uşağı da götürüb gəldi, oturdu evlərində. Amma Qara Əmrah Fatmanı boşamaq istəmədi. Xanım arvad papirosunu tüstülədə-tüstülədə divan-dərəni qatdı bir-birinə və axır ki, Fatmanı boşatdırdı.

Bu əhvalatdan iki il sonra yay vaxtı Fatma Şuşaya, bacısı Bəyazgilə qonaq getdi. Axund da baldızının gəlişinə çox şad oldu, onun üçün Ay-ulduz çarqat, qızıl boyunbağı, zərxara paltarlıq aldı. Bəyaz da bu parçaları şəhərsayağı tikdirdi, gözəl əndamlı, alagözlü, qıvrımsaçlı Fatma geyinib-kecinib bacısıyla Cıdır düzünə gəzməyə çıxanda handa bir bəy qızı ona həsəd aparırdı. Cıdır düzü qız-gəlinlərin, oğlanların seyr-səfa yeri idi. Qız-oğlan bəyənmək istəyənlər Cıdır düzünə çıxardılar. Cıdır düzünün bir tərəfi şəhər, o biri tərəfi "Xəzinə qayası" deyilən dərin uçurum idi. Uçurumun dibilə Daşaltıçay axırdı. Cıdır düzündən üzüaşağı baxanda çayın qırağındakı adamlar güclə seçilirdi. Çaydan o tərəfdə – ta uzaqlarda gümüşü duman içində görünən Ziyarət, Kirs dağlarına qədər qalın meşələr uzanıb gedirdi. Daşaltı çayının qırağında, sıldırım qayaların arasında qədim bir qalaça vardı. Deyilənə görə, bu qalaçanı Qarabağ hakimi İbrahim xan tikdirib ki, yadelli şahlar güc gələndə xan köçüb orada sakin olsun. Qalaçanın gizli yeraltı yolu vardı ki, ondan savayı başqa yerdən ora girmək mümkün deyildi. Şuşa qalasının o biri tərəfində, Arana gedən yolun üstündə qədim qala hasarının yanında başqa bir gəzmək yeri də vardı. Bura "Ərimgəldi" deyirdilər. Ona görə "Ərimgəldi" deyirdilər ki, yayda aran kişiləri arvad-uşaqlarını gətirib dünyanın ən səfalı yaylaqlarından olan Şuşa qalasında qoyub, əkin-biçinlərini yığıb-yığışdırmaq üçün, kimi də ticarət işləri üçün arana qayıdardı. Cavan gəlinlər də axşamçağı Ərimgəldidə oturub göz işlədikcə uzanıb gedən arana tamaşa eləyə-eləyə ərlərinin yolunu gözləyərdilər.

Qarabağ xanəndələr, sazəndələr yurdudur. Yayda Şuşa qalasının hər gəzməli yerində bir dəstə sazəndə çalıb-oxuyurdu. Onda görərdin ki, Xəzinə qayasının ən uca zirvəsi olan Üçmıxdan kimsə zil səslə bir "qatar" oxudu. Buna cavab olaraq, Ərimgəldidən kimsə bir şikəstə çağırdı. Qulaq asardın, deyərdin, bəs, bu səslər dünyanın o tayından, yəni, bizə məlum olmayan ayrı bir dünyadan gəlir. Özü də nə qədər möhkəm adam olsaydı, ürəyini yumşaldıb muma döndərərdi. Eh... sizi inandırıram ki, Xəzinə qayasının uçurumunda, Topxana meşəsində, Ərimgəldiyə gələn aran yollarında o səslər hələ də durur... Bəli... bəli, durur! Mən o səsləri zaman-zaman eşidirəm.

Hə... Deyəsən, mətləbdən uzaq düşdüm.

Gözəl bir yay axşamında, yəni, gün Ziyarətin üstündən o tərəfə aşanda, Fatma da, bacısı Bəyaz da zərxara geyən, müşk-ənbər saçan qız-gəlinlə Cıdır düzündə seyrə çıxmışdı. Bir də gördü ki, vallah, ucaboylu kəhər ürgənin üstündə bir oğlan gəlir, yemə, içmə, tamaşasına dur. Ayaqlarında güzgü kimi parıldayan uzunboğaz çəkmə, əynində qızıl vəznəli sürməyi çuxa, belində gümüş xəncər, başında sur dərisindən papaq, sağ yanağında qoşa xal, qumralbığlı, qumralsaçlı bir oğlan... Fatma ürəyində dedi: "İlahi! Bu, Həzrət Yusifdi, kimdi?.."

Oğlan gəlib yanlarından keçəndə Fatma qanavuz çarşabının yaxasını açıb, alagözlü, qələmqaşlı üzünü oğlana göstərib gülümsədi. Oğlan ona baxıb ürəyində dedi: "İlahi, bu buluddan çıxan Aydı, nədi?.."

Oğlan kəhər ürgəni neçə dəfə dolandırıb alagözlü, qələmqaşlı gözəlin yanından keçdi. Hər dəfə də gəlin üzünü açıb ona göstərdi. Şuşa balaca şəhərdi. Hamı bir-birini tanıyırdı. Bəyaz dedi:

– Bu oğlan Arazqıraxlıdı. Adı Bayram bəydi. Özü də nəçərnikin idarəsində qulluq eləyir. Sonra gülümsəyib əlavə elədi:

– Keçən yay Şuşaya yaylağa gələn gürcü knyazın qızı Tamara buna bənd olmuşdu. Gecə-gündüz oğlana dinclik vermirdi.

Conra Fatma öyrəndi ki, oğlan Hacı Axundgilin məhəlləsində Zarıslı Cavadın evində olur.

Bayram bəy də öyrənib bildi ki, bu alagözlü, qələmqaşlı, qıvrımsaçlı gözəl Hacı Axundun baldızıdır, özü də duldur. Sonra Bayram bəy dul gəlinləri cavan oğlanlara, cavan qızları dul kişilərə calayan, aradüzəldən, sözgəzdirən Güllübəyimi salışdırdı Fatmanın üstünə. Dedi ki, "gecə adamlar yatandan sonra çıxsın Cıdır düzünə, söhbət eləyək". Güllübəyim yağlı dilini işə salıb nə qədər elədisə, Fatma dedi:

– Yox, iki dünya bir ola, biri də heç, mən naməhrəmlə görüşmərəm. Məni istəyirsə, Hacı Şükürün yanına elçi göndərsin.

Fatmanın eşqi Bayramı Kərəmdən də betər günə salmışdı, bir gün onu görməyəndə dəli olurdu, odur ki, Kürdobaya sifariş elədi ki, evlənirəm, anam gəlsin.

Səkinə bir dəvə yükü sovqat götürdü, kəhər madyanı özü mindi, kəhər atı da oğlu Eyvaz, gəldilər Şuşaya. Səkinə əvvəl Fatmanın cins nəsildən, özü də Hacı Şükürün baldızı olduğunu eşidib şad oldu. Ancaq biləndə ki, duldur, hələ üstəlik o biri kişidən bir oğlu da var, az qaldı dünyanı dağıtsın: "Xanların, bəylərin, hampaların qızları Bayra-

mın həsrətindədi, küçəyə çıxanda tamaşasına dururlar... Heylə bir oğlan indi gəlib yanı küçüklü dul arvad alsın?!"

Ancaq Səkinə baxıb gördü ki, xeyr, bu alagözlü gəlin oğlanın ağlını yaman oğurlayıb, oğlan ondan əl çəkməyəcək, ona görə də Səkinə acıq eləyib qayıtdı Kürdobaya. İş belə olanda Bayram Şuşadakı dostunun atasını iki ağsaqqalla Hacı Şükürün yanına elçi göndərdi və bir aydan sonra kürd qızı Fatma oldu Bayram bəyin haqq-halal arvadı.

...Sonra onların bir qızı oldu, adını qoydular Yaqut, sonra da bir oğulları oldu, adını qoydular Nuru.

## NADİRİ TAXTA GÖRMÜŞ KAMIRXAN QARININ ƏHVALATI VƏ BAYRAM BƏYİN QARABULAĞA GƏLMƏSİ

İndi sənə kimdən danışım, Kamırxan qarıdan...

Qarabağda bir adamın çox yaşlı olduğunu bildirmək istəyəndə zarafatyana deyərdilər: "Filankəs Nadiri taxtda görüb". Amma Kamırxan qarı, doğrudan da, Nadiri taxtda görmüşdü, yəni, Nadir şah Qarabağa hücum eləyəndə o, nişanlı qız imiş. Amma mən Kamırxanı görəndə qarı o qədər qocalmışdı ki, balacalaşıb olmuşdu bir tikə, gözləri də olmuşdu noxud boyda. Kamırxan qarıgil Güney Güzdək kəndində olurdular. Kənd Ərgünəş meşələrinin yaxınlığında idi. Kamırxan qarı nağıl eləyirdi ki: "mən nişanlı qız idim, bir gün səs düşdü ki, İran şahı Nadir qoşun çəkib, gəlib Qarabağın üstünə, kəndləri dağıdır, adamları qılıncdan keçirir. Biz də ayın-oyunumuzu ata-eşşəyə yükləyib qaçdıq Ərgünəş meşəsinə. Mənim babam ağır xəstə idi. O bizə dedi ki, hamısı birdi, mən sizinlə gedə bilməyəcəm. Yanıma bir bardaq su, bir az da çörəkdən-zaddan qoyun, gedin.

Biz də naəlac qalıb onun yanına bir bardaq su, bir tabaq da çörək qoyub qaçdıq. Neçə müddət Ərgünəş meşələrində qaldıq. Nadirin qoşunu çəkilib gedəndən sonra gəlib gördük ki, damın qapısı qoyub getdiyimiz kimi örtülüdü. Amma qoca yoxdu. Kişilər gedib meşələri, çölləri qarış-qarış gəzdilər ki, bəlkə babamdan əsər-əlamət tapsınlar, amma heç nə tapmadılar. O vaxt ağsaqqallar fikirləşib dedilər ki, kişi Allahın mömin bəndəsi olduğu üçün mələklər gəlib onu aparıblar göyə.

Kamırxan qarının neçə qızı, neçə oğlu olmuşdu. Ancaq mən qızı Xəlsə barədə demək istəyirəm.

Xəlsə tez-tez danışan, bir yerdə duruş gətirib dayanmayan bir qız idi. Onu aldılar Qarabağda hamının tanıdığı, hamının hörmət elədiyi Abdulla Əfəndinin qardaşı Ağa Məhəmməd Əfəndiyə.

Xəlsə nənənin dörd oğlu, bir qızı oldu. Ancaq uşaqlar lap körpə ikən Ağa Məhəmməd Əfəndi vəfat etdi, cavan, gözəl-göyçək bir gəlin olan Xəlsə də, Kürdobadakı Səkinə kimi, Alyanlı meşələrindəki Xanım kimi, dünyanın bütün zövq-səfasından gözünü çəkərək ərə getməyib, başladı uşaqlarını böyütməyə. Güneylərdə oturan qocalar başlarını ağır-ağır tərpədib onun haqqında dedilər:

– Sağ olsun, kişi qızıymış...

Nə qədər uşaqlar körpə idi, qonşu kişilər:

– Qorxma, bacı, – deyirdilər. Yerini şumlayıb əkirdilər. Hov eləyib taxılını biçib döyürdülər.

Ortancıl oğlu Abdulla çox fərasətli, zirək uşaq olduğu üçün əmisi Abdulla Əfəndi məsləhət gördü ki, onu Güney Güzdəkdən səkkiz kilometr aralıdakı Qarğabazar kəndində açılan beşillik rus-tatar məktəbinə qoysunlar.

Abdulla hər gün qarda, tufanda səkkiz kilometrlik Qarğabazar kəndinə ayaq döyüb bu məktəbi qurtardı.

Yaşda özündən böyük bacısı Şirinin əri Əbdüləziz Qarabulaq kəndində tikinti şeyləri satan böyük mağaza açmışdı, gödək, savadsız bir kişi idi. Güclə qol çəkə bilirdi, amma biclikdə şeytana papış tikərdi. Abdullanı götürdü öz mağazasına satıcı. Abdulla rus dilini bildiyi üçün Moskva, Xarkov kimi şəhərlərdən mal alıb gətirməyə yeznəsi onu göndərirdi. O da, çox cavan olsa da, bu cür işləri böyük məharətlə yerinə yetirirdi. Bilmirəm, necə oldusa, üç-dörd ildən sonra Abdulla mağazaya şərik çıxdı. Sonra yeznəsindən ayrılıb özü o cür mağaza açdı. Az zamanda əli elə gətirdi ki, yeznəsini sıxışdırıb bazardan çıxardı. Ona görə də yeznəsi Əbdüləziz, Abdulla ilə oldu həmişəlik düşmən.

Söhbəti yenə də hərləyək kürdobalı Bayram bəyin üstünə. O bir müddət Şuşada qulluq eləyəndən sonra onu Qarabulaq şəhərinə pristav təyin elədilər.

Bayram bəy, oğlu Nurunu gimnaziyaya götürüb qoydu ki, poçt naçalniki olan dostu İvanovun evində qalıb oxusun. Arvadı Fatma xanımla qızı Yaqutu da götürüb gəldi Qarabulaq şəhərinə. Araz boyuna səs düşdü ki, kürdobalı Səkinənin oğlu Bayramı Qarabulağa pristav

göndəriblər. Obalardakı dövlətli ağsaqqallar dəstə-dəstə bəyin görüşünə gəlirdilər, özləri də əlbəttə ki əliboş gəlmirdilər, bahalı-bahalı sovqatlarla gəlirdilər. Kimi at, kimi dəvə, kimi qiymətli xalı... Bayram bəy də atları, dəvələri verirdi qardaşı Eyvaz aparıb Kürdobada qatırdı öz dövlətinə. Buna da Fatma xanımın acığı tutmağa başlayırdı:

– Ay kişi, – deyirdi, – hər şeyi verirsən qardaşına, bəs, fikirləşmirsən ki, axı, bizim də oğlumuz, qızımız var?

Bayram bəy də arvadına acıqlanıb deyirdi:

– Sənin borcuna qalmayıb, arvadsan, otur arvad yerində.

O vaxtdan da Fatmanın ürəyində ərinin anasına, qardaşına qarşı bir kin düyümləndi. Səkinənin Fatma ilə arası olmasa da, tez-tez oğlunun görüşünə gəlirdi, hər gələndə də Bayram bəy onu payla, sovqatla yola salırdı.

Bayram bəy istəyirdi ki, qardaşının qoyunu, atı, dəvəsi o biri dövlətli tərəkəmələrinkindən əskik olmasın, el yaylağa, arana gedəndə Məşədi Gülməmməd oğlu Eyvazın köçü o birilərinkindən kasıb görünməsin. Çox çəkmədi ki, Bayram bəyin hörməti-izzəti lap naçalnikin özündən də artıq oldu.

Bunun bir səbəbi də o idi ki, Araz boyundakı adlı-sanlı qaçaqlar kürdobalı Bayram bəyi öz adamları hesab edirdilər, onun başına and içirdilər. Çünki Bayram bəy onların öz içindən çıxmışdı, yəni, onlar kimi rəiyyət oğlu idi, özü də cins nəsildən idi. Bir dəfə belə bir əhvalat oldu. Qəzaya Volkov adlı təzə naçalnik gəlmişdi. Bir az keçəndən sonra o gördü ki, camaatın bütün işi-sözü pristav Bayram bəylədi, onu heç sayan yoxdu. Başladı Bayram bəyi burunlamağa. Xəbər getdi çatdı Qaçaq Süleymana. Qaçaq Süleyman padşahdan qaçmışdı. Camaatla işi olan deyildi. Kasıblara, əlsiz-ayaqsızlara kömək eləyərdi, igidliyi də Qaçaq Nəbi kimi dillərdə dastan olmuşdu. Qaçaq Nəbi aynalı tüfəngin zamanında ad almışdı, Qaçaq Cüleyman da onatılanın...

Bir gecə naçalnik evində əyləşib xanımı ilə şıdırğı söhbət elədiyi zaman qapı taybatay açıldı, Qaçaq Süleyman əlində onatılan içəri girdi. Naçalnikin arvadı qışqırdı. Süleyman tapançasını qobura qoyub arvada dedi:

– Qorxma, xanım, biz adamyeyən deyilik.

Xanım bu solğun, sarıbəniz, arıq oğlanın nə dediyini başa düşməsə də, onatılanı qobura qoyduğunu görüb sakit oldu. Qaçaq Süleyman naçalnikə dedi:

– Qospadin komandor (o, paqonlu çar naçalniklərinin hamısını "komandor" adlandırırdı), əgər, bu mahaldan sağ-salamat getmək istəyirsənsə, kürdobalı Bayram bəylə işin olmasın!

Naçalnik azərbaycanca yaxşı bilməsə də, Qaçaq Süleymanın nə demək istədiyini başa düşüb dedi:

– Yaxşı... yaxşı!

Qaçaq Süleyman naçalnikə dedi:

– Komandor, dediklərimi yaddan çıxarsan, yaxşı olmayacaq!

Sonra naçalnikin cavan arvadına:

– Bağışla, xanım! – deyib qapıdan çıxdı.

Bu əhvalatdan sonra naçalnikin yanında Bayram bəyin bir sözü iki olmadı.

## CAVAN TACİRLƏ PRİSTAV QIZININ ƏHVALATI

Bayram bəyin qızı böyüyüb mina gərdənli, uzunsaçlı, bulaq suyu kimi şəffafgözlü bir gözəl olmuşdu. Qocası Səkinədən gələn bir xal qar kimi ağ boğazının yanına qonmuşdu. Müəllimlər gəlib ona evdə dərs vermişdilər. Kürdobalılarla yaylağa, arana köçəndə qız at minib oğlanlarla cıdıra çıxardı, nişana atardı, Şahnamənin rəvayətlərini, Füzulinin, Natəvanın qəzəllərini oxuyardı. Anası Fatma xanımın tütünündən götürüb xəlvətcə çəkə-çəkə öyrənmişdi papirosa. Qulluqçularına o vaxtın ən bahalı papirosundan aldırıb atasından gizlədərdi, anası Fatma xanım qızının papiros çəkdiyini bilirdi, amma bir söz demirdi. Çünki özü də elə bu yaşlarında anası Xanımdan papiros çəkmək öyrənmişdi, özü də anası Xanım kimi əzazil deyildi, ürəyiyumşaq arvad idi. Bayram bəyin hər ay oğluna kifayət qədər pul göndərməsinə baxmayaraq, Fatma xanım da ərindən gizlin eyzən ona pul göndərərdi. Ucaboylu, alagözlü, Həzrət Yusif kimi gözəl bir oğlan olan Nuru bəy də pulları sağa-sola səpələyib kef çəkərdi. Şuşa qalasının ermənilər yaşayan hissəsində olan klublarda səhərəcən qızlarla rəqs edərdi...

Yaquta hər tərəfdən elçilər gəlirdi, amma Bayram bəy anası Səkinənin, Kürdoba ağsaqqallarının məsləhətilə Muradxanlı obasından olan Hacı Hüseynin oğlu Məhərrəm üçün gələn elçilərə söz verdi. Hacı Hüseynin dörd-beş min qoyunu, neçə yüz atı, neçə dəvəsi var idi. Özü də tikanlı tayfadan idi. Obanın yarısı onun qohum-qardaşı olub, hamısı da sayılan, karlı adamlar idi. Hacı barmağını qaldırsaydı, yüz

atlı, tüfəngli adam hazır olardı. Məhərrəm də at minib tüfəng tutan boy-buxunlu, yaraşıqlı bir oğlan idi. Neçə dəvə yükü yağ, motal, neçə qaradiş erkək, neçə mötəbər ağsaqqal gəldi, nə qədər qızıl, zinət, zərxara, parça gətirdilər. Yaquta nişan taxdılar.

Sonra Hacı Hüseyn, Bayram bəyi bütün ailəsilə Haramıya qonaq çağırdı. Qonşu obalardan da adlı-sanlı adamlar gəldi, erkəklər kəsildi, hərəsi iki vedrə sututan iri qazanlar asıldı. Böyük qonaqlıq oldu, sonra ən qaçağan atların cıdırı başlandı. Nişanlı oğlan atın qızğın qaçarağında beşatılanla dalbadal səkkiz nişana vurub igidliyini göstərdi. Yaqut da alaçıq çətənəsinin arasından baxıb gülümsədi, zarafatcıl gəlinlər də bunu görüb bicliklə bir-birinə göz vurdular. Oğlanın boy-buxunu, at minməyi qızın xoşuna gəlirdi. Amma heç bir dəfə də üz-üzə əyləşib söhbət eləmədilər. Atalar qərara aldılar ki, payızda, yəni, el dağdan qayıdanda toy eləsinlər. Ancaq bu dünyada azmı qəribə işlər olur?!

Qarabulaq şəhərinin şimal tərəfində, bir-birindən aralı olan Quruçayla Köndələnçayın arasında başıkəsik ehrama oxşayan Qarı dağı var. Qoy əvvəlcə ondan danışım.

Şəhər otuz doqquz gün mühasirədə qalaraq, uzaq məmləkətdən qoşun çəkib gəlmiş şahla vuruşdu. Qırxıncı gün şahın iyirmi yaşlı cəsur oğlu Maliktac beş yüz nəfər seçmə pəhləvanla hasarın bir tərəfindən hücum edib şəhərə girdi. Onun ardınca bütün qoşun yol tapıb şəhərə doldu.

Yerli əhalinin inadından, təslim olmaq üçün dəfələrlə edilmiş təklifi rədd etməsindən qəzəblənmiş şah vəziri Taygöz Yusifi çağırıb kimsəyə aman verməməyi əmr etdi.

Taygöz Yusif şəhərin sağ qalmış yeddi min əhalisini uşaqdan böyüyə qılıncdan keçirdi. Evlər dağıdıldı. Qan su yerinə axdı.

Üçgünlük qırğından sonra şah şəhərdən çıxıb yaşıl bir təpə üstündə çadırlar qurdurdu. Üç gün, üç gecə şadyanalıq etməyi, qalibiyyət badələri qaldırmağı qoşun əhlinə əmr etdi.

Qızıl işləməli, firuzə rəngli kuzələr yeddiillik Şiraz şərabları ilə dolduruldu. Əti məcun olan beşillik qara erkəklər kəsildi. Ovçular Qarabağ meşələrindən tükləri alov kimi yanan qırqovullar gətirdilər.

Hökmdar yeddi dirəkli çadırında, yeddi tirmə döşək üstündə əyləşdi. Atlas geyimli Nişapur sazəndələri gəldi. Süfrələr döşəndi, qızıl qədəhlər düzüldü. İlk badələr qaldırılan zaman yetmiş yeddi şeypur şahlar şahının qələbəsi şərəfinə gurladı.

Lakin elə bu vaxt şahın qorxunc vəziri Taygöz Yusif içəri girib hökmdarın hüzurunda yerə qədər təzim etdi. Şah boşalmış qədəhini yanındakı qara qula verib qaşlarını çatdı.

– Haradasan, vəzir? – Yoxsa, mənim qələbəmin təntənəsi, səncə, mənasızdır?

Taygöz Yusif bir daha yerə qədər təzim edib:

– Qibleyi-aləm, – dedi, – mən aciz Yusif sənin sadiq qulunam. Şahlar şahının hüzuruna gecikməyimin səbəbi var.

Hökmdar vəzirinin səsindəki qara xəbər əlamətini duyaraq:

– Nə olub, vəzir? Tez söylə! – dedi.

Vəzir üçüncü dəfə təzim edib:

– Qibleyi-aləm yüz illər sağ olsun! Oğlun Maliktac xəstələnmişdir, – dedi.

– Nə danışırsan, vəzir? – deyə şah ayağa qalxdı.

Şahzadə Maliktac qonşu çadırda, qızdırma içində yatırdı. Hər tərəfində yeddi qara qul, əlləri döşündə, sükut içində dayanıb gözlərini ona zilləmişdi.

Hökmdar, vəzirin müşayiəti ilə çadıra daxil olduqda qullar yerə döşənib alınlarını torpağa qoydular. Sonra qalxıb dalı-dalı on addım geri çəkildilər. Şah oğluna yanaşıb, barmaqlarında ləl-cavahir sayrışan ağ əlini onun alnına qoydu.

– Oğlum, Maliktac! – deyə həyəcanla səsləndi.

Lakin xəstədən cavab gəlmədi. O zaman şah rəngi ağarmış üzünü vəzirə sarı çevirib qorxulu və titrək səslə:

– Bu saat hər tərəfə çaparlar göndərilsin. Qoy dünyanın bütün biliciləri buraya toplansın, – dedi.

Şah bütün günü oğlunun başı üstündən tərpənmədi, gözlərini yummadı. Heç nə yemədi.

Səhəri vəzir qayıdıb:

– Qibleyi-aləm, – dedi, – şəhərdə ancaq tək-tək qocalar, uşaqlar qalıb, qırılan qırılıb, sağ qalanlar da gecə ikən meşələrə qaçıb. Çox axtarandan sonra bir falçı qarıya rast gəldik.

– Bəs, falçı nə oldu? – deyə şah qəzəblə soruşdu.

– Gəlmədi. Şahzadənin yanına gətirilməsini istədi. Mən onu ocağa atdırıb yandırardım, qibleyi-aləm, ancaq...

Şah vəzirin sözünü kəsib:

– Taxt-rəvan hazırlansın, – dedi.

Hökmdar öz rəiyyəti ilə birlikdə insan cəsədləri ilə dolu xaraba küçələrdən keçib, balaca bir komanın qabağında dayandı. Taxt-rəvanı qulların çiynindən alıb yerə qoydular. Şahzadəni ehtiyatla içəri gətirdilər. Yarıqaranlıq evin içində ucaboylu bir qarı durmuşdu. Şah daxil olan zaman o, yerindən qımıldanmadı, təzim etmədi, bir heykəl sükunəti ilə dayanıb durdu.

Şah keçib xəstənin baş tərəfində qoyulmuş döşək üstündə əyləşərək:

– Qarı, – dedi, – deyirlər, sən cinlərin, uğursuz ruhların dilini bilirsən. Sağalmaz dərdlərə dava edirsən. Budur, mənim oğlum Maliktac od tutub yanır. Məşum ruhlar onun huşunu oğurlayıb aparmışlar. Səndən əlac istəyirəm, qarı! Əgər, onu sağaltsan, evinin dirəklərini qızıla tutduracağam. Əgər, xəyanət etsən, cəhənnəm kimi zəbanə çəkib yanacaqsan.

Qarı:

– Mən anayam, – dedi və bir qab su alıb taxt-rəvanın qarşısında yerə çökdü. Sonra dodağının altında nə isə oxuyub suya üfürdü və bir an kasaya diqqət edərək ağır zəhmli nəzərlərini qaldırıb:

– Ey şah, – dedi, – mən burada minlərlə qəzəbli ruh görürəm. Onlar xəbər alırlar: “Şah oğlunu çoxmu sevir?”

– Nə danışırsan, qarı? – dedi. – O mənim yeganə varisimdir. Böyük bir məmləkət gözünü ona dikmişdir. Mən yeddi il dua edib, yeddi min qurban kəsəndən sonra böyük Yaradan onu mənə əta etdi. O böyüdü, Kəyan mülkündə birinci pəhləvan oldu.

Falçı təkrar suya baxıb:

– Ağsaçlı bir qarı soruşur: “Şahzadənin anası varmı?”

– Var, qarı, – dedi, – onun anası Xədicəbanu yer üzündəki arvadların ən xoşbəxtidir. Çünki o mənə Maliktac kimi oğul bəxş etmişdir. Tez ol, qarı, oğlumun dərdinə əlac et. İndi Xədicəbanunun yuxusuna qara ilanlar girir.

Qarı bayaqdan bəri ilk dəfə olaraq başını qaldırıb xəstə şahzadəyə baxdı və elə bil ki, oğlanın solğun gözəlliyi onun gözlərini qamaşdırdı. Qarının kirpikləri qırpındı, bəbəkləri böyüyüb quru bir parıltı ilə yandı. Qarı qalxıb xəstəyə yanaşdı. Damarları çıxmış quru və kobud əlini onun sinəsinə qoydu.

Xəstə göz qapaqlarını qaldırdı. Yaralı ceyran gözlərinə bənzər bir cüt qara, məlul göz arvada zilləndi. Qarının günəşdən və dərddən yanıb qaralmış heybətli üzü qəribə bir nurla işıqlandı. Axı, o, ana idi.

Sonra qarı dağlara gedib bir ətək çiçək gətirdi. Onların şirəsini çəkib qaşıq-qaşıq xəstənin boğazına tökdü. Gecə-gündüz yanından tərpənmədi.

Şəhərdə sağ qalmış yerliləri ona lənət yağdırdılar. Güneylərdə oturan qocalar onu gördükdə, gözlərini endirib ayaqlarının ucuna baxdılar, yadellilərin nəzərindən iraq yerdə görüşən arvadlar başını bulayıb:

– Eh, Ballı qarı, imansız oldu, – dedilər.

Xəlvətə düşəndə uşaqlar onun ardınca düzülüb:

– Ay falçı, bəs, qızıl başmağın hanı? – deyə tənə etdilər.

Qarı həmyerlilərinin bütün bu nifrətini sükutla qarşılayır, hər gün dağlara gedir, qucaq-qucaq çiçək gətirir, xəstəni müalicə edirdi.

Nəhayət, yeddi gündən sonra şahzadə gözlərini açıb yemək istədi. On birinci gün isə, onun tamamilə sağalıb ayağa qalxdığını qoşun əhlinə xəbər verdilər.

Şah falçıya bir kisə qızıl verib:

– Qarı, – dedi, – o çiçəklərin hikmətini aç mənə söylə.

Qarı başını bulayıb:

– O sirri mən heç kəsə aça bilmərəm, hökmdar, – dedi. – Ancaq oğluna o çiçəklərdən çəkilmiş elə dərman verərəm ki, bir də azar üzü görməz.

Bu sözlərdən sonra qarı qızılgül rəngli maye ilə dolu bir kasa gətirdi. Şah kasanı alıb burnuna tutdu:

– Bu müşkdür, ənbərdir, nədir, qarı? Ətri insanı bihuş edir.

– O dünyanın ən nadir çiçəklərindən çəkilib, – deyə qarı cavab verdi.

Hökmdar dərmanın yarısını özü içib qalanını da oğluna verərək:

– And içirəm ki, mən ömrümdə bu şirinlikdə şərbət görməmişəm, – dedi.

Şahzadə qalan şirəni son damlasına qədər içib, kasanı qaytardığı zaman falçı rahat nəfəs aldı. Şah qarının üstünə daha bir kisə qızıl tullayıb, yanında dayanmış Taygöz Yusifə müraciətlə:

– Vəzir, – dedi, – o vaxt uğursuz ruhlar mənim şənliyimi pozmuşdu. İndi dünyada heç bir dərdim yoxdur. Qoşun əhlinə tapşır, üç gün, üç gecə elə bir şadyanalıq etsinlər ki, göydə günəşin üzü tutulsun.

– Atılan ox bir daha geri qayıtmaz, hökmdar, hər dəqiqənin bir hökmü var! – Ballı qarı astadan dilləndi.

– Dəlimi olmusan, arvad? Nə danışırsan? – deyə şah qəzəblə yerindən qalxdı və birdən mədəsində hiss etdiyi ağrıdan sarsılaraq əl atıb vəzirin çiynindən yapışdı.

Elə bu anda şahzadə də kökündən qırılmış sərv kimi silkələnib, arxasında dayanmış qara qulun qucağına aşdı.

– Zəhər! – Hökmdarın sinəsindən vəhşi bir səs qopdu.

– Bəli, zəhər... – deyə Ballı qarı arxayınlıqla təkrar etdi.

Şah, yerdə ilan kimi qıvrılan oğluna baxıb:

– Vəzir, əlac! – deyə qışqırdı.

Və ayaq üstündə dayana bilməyib, döşəyin üstünə yıxıldı. Sonra başını qaldırıb:

– Qarı, – dedi, heç olmasa, oğluma bir çarə elə. Axı, sən onu ölümdən qurtarmışdın, axı, sən deyirdin mən anayam.

– Bəli, qibleyi-aləm! – deyə Ballı qarı "ah" çəkdi. – Mən anayam!..

Şah ilə oğlu dəhşətli əzablardan sonra öldülər...

Taygöz Yusifin əmri ilə qarını öz otağında qoyub qapını bağladılar. Sonra qoşun əhlinin hər biri onun komasının üstünə bir at torbası torpaq tökdü. Günün axırında günəşin son işığı Savalanın zirvəsindəki buludlarda saralıb sönən zaman qarının koması üstündə böyük bir təpə qalxdı. Sonra yağan yağışlar onun torpağını bərkitdi. Gələn bahar təpədə sarı tikanlı boz qanqallar bitdi. Təpəyə "Qarı dağı" dedilər.

Sonrakı əsrlərin küləkləri, selləri şəhərin xarabalıqlarından heç bir əsər qoymadı. Onun yeri hər bahar qızıl lalələrlə örtülən bir düzənlik oldu. Şəhərdən yadigar yalnız Qarı dağı qaldı. O vaxtdan bəri Qarı dağının altından bir çeşmə qaynayır. Uzaq mənzildən gəlib-keçən yolçular onun suyundan içib ürəklərinin yanğısını söndürürlər...

Yaz-yay axşamlarında şəhər əhli Qarı dağına, Quruçayın kənarlarına, çaydan bir az bəridəki Molla Yaqub bağına gəzməyə çıxardılar. Molla Yaqub malakan olub, əsl adı da Yakov idi. Uzunsaqqal, xoşsifət bir kişi idi. Yerli əhali Yakovu azərbaycanlılaşdıraraq Yaqub eləyib yanına da molla sözünü əlavə eləmişdi. Vaxtilə çarın bu yerlərə sürgün elədiyi malakanların dövlətli ağsaqqallarından idi. Molla Yaqub da öz qaydası ilə yerli əhalinin, yəni, biz azərbaycanlıların bütün xeyrində, şərində iştirak eləyib, hörmətli bir şəxs kimi yuxarı başda əyləşdirilirdi.

Molla Yaqub şəhərdən aralı, həmin Quruçayın yaxınlığında saldığı bağda nadir ağaclar əkmişdi. Yazda bu ağacların hərəsi bir cür çiçək

açır, bir cür ətir saçırdı. Molla Yaqub bağını çəpərləməmişdi, yəqin ona görə ki, yazda-yayda gəzməyə çıxan adamların ayağını bağdan kəsmək istəmirdi. Öz qaydası ilə adamlar da Molla Yaqubun bir ağacına, bir meyvəsinə də toxunmazdılar, ancaq dəcəl uşaqlara görə bağın qoca bir qarovulçusu var idi, o da bağın aşağı tərəfində hündür bir talvar qurub, gecələr orada yatardı...

Bir yaz axşamı əynində bahalı tünd parçadan kostyum, belində qızıl toqqa, ayaqlarında par-par parıldayan şibilit çəkmə, başında qiymətli sur dərisindən papaq, qaragöz, qaraqaş, enlikürək bir oğlan olan Abdulla öz dostlarıyla Molla Yaqubun bağına gəzməyə çıxdığı zaman orada bir dəstə qız-gəlinin içində pristav Bayram bəyin qızı gözəl Yaqutu görüb bir könüldən min könülə vuruldu ona. Əynində uzun qanovuz tuman, ayaqlarında dikdaban tufli, zərxara arxalığının üstündən incə belinə daş-qaşa tutulmuş enli qızıl kəmər çəkilən, boğazının altında qızıl silsilə, ağ biləklərində qızıl bilərzik olan gözəl Yaqut da cavan tacirə baxıb gülümsədi. Bu vaxt yenicə daşmış Quruçay qüdrətli nəşə ilə qıjıldayırdı, yenicə açılmış ərik çiçəkləri arasında quşlar sevinclə çığırışırdı, qurşağa qədər qalxmış yaşıl buğda zəmilərinin üzərilə əsib gələn ətirli meh Yaqutun geriyə sürüşmüş ağ, ipək kəlağayısı altından çıxan xurmayı saçlarını xəfif-xəfif tərpədirdi. Bağın üst tərəfindən keçən və ətrafında sarı, firuzəyi, qırmızı çiçəklər bitən cığırda dayanmış qızlar cavan tacirin Yaquta necə baxdığını görüb gümüş qəhqəhələrlə gülürdülər.

...Sonra cavan tacir pristav Bayram bəyin ailəsi yaşayan ikimərtəbəli binanın qabağından gündə on dəfə belədən-beləyə keçməyə başladı. Hər dəfə də nişanlı qız ona baxıb gülümsəyirdi. ...Tacir oğlan da gülümsəyirdi. İkisi də gözəl idi, ikisinin də mirvari kimi dişləri görünürdü. Cavan tacir heç malakan qızı Katya ilə görüşəndə belə olmurdu.

Yaqut da, nişanlısı Məhərrəmi görəndə belə olmurdu.

Cavan tacir bilirdi ki, pristavın qızı ondan da dövlətli bir oğlana nişanlıdır. Bir gün tacir ucaboylu təzə qazağı yəhərli qəşəng ürgənin üstündə həmin nişanlı oğlanın pristav yaşayan evin həyətindən çıxdığını görüb xeyli pərişan oldu. Ancaq nişanlı oğlan ona əhəmiyyət verмədən ayaqlarını yavaşca tərpədərək cavan ürgəni çapıb gedəndən sonra qız yenə də eyvana çıxaraq Abdullaya baxıb gülümsədi.

Səhər cavan tacir gözəl xətlə, ipək kağızda pristav Bayram bəyin qızına aşiqanə bir namə yazıb axırını da Füzulinin qəzəlindən bu misralarla qurtardı:

Ah eylədiyim sərvi-xuramanın üçündür,
Qan ağladığım qönçeyi-xəndanın üçündür.
Sərgəştəliyim kakili-mişkinin ucundan,
Aşüftəliyim zülfi-pərişanın üçündür.

Sonra Bayram bəyin Kürdobadan gətirdiyi on altı-on yeddi yaşlı ev nökəri dələduz Bünyada bir qızıl beşlik bağışlayaraq, məktubu onun vasitəsilə göndərdi qıza. Yaqut da məktubu alıb gül-sənubərə bürünən dal eyvana qaçaraq ürəyi atlana-atlana oxudu. Gözəlliyi haqqında, məhəbbəti haqqında qız öz nişanlısından belə sözlər eşitməmişdi, nişanlısı onun "yay qaşları", "ox kirpikləri" haqqında, "müşkü-ənbər saçan qulac-qulac saçları" haqqında ona bir kəlmə də deməmişdi. Onu Bakı, Tiflis, Peterburq kimi şəhərlərə aparıb gəzdirməyini vəd eləməmişdi. Cins qadın tayfası cins madyan kimidi. Nə qədər oxşanıb tumarlansa, o qədər mehriban olar...

Sonra Yaqut özü də bir namə yazıb Bünyad vasitəsilə göndərdi cavan tacirə. Oğlanın şadlığı yerə-göyə sığmırdı. O saat yenə bir namə yazıb verəndə, dələduz Bünyad dedi:

– Gərək mənə bir dəst dioqonal paltarlıq alasan, sonra kağızı aparım.

Ayrı vaxt qəpiyin haqq-hesabını çəkən cavan tacir bu dəfə çək-çevir eləmədən sövdəgər Məşədi Qaradan bir dəst paltarlıq alıb Bünyada verdi. Bünyad da gətirib paltarlığı zirzəmidə odunların arasında gizlədərək, məktubu aparıb verdi Yaquta.

Oğlan bu məktubunda Yaquta təklif edirdi ki, gəlsin ona. Ancaq qız cavabında qəmgin-qəmgin yazdı ki, bu mümkün deyil, çünki o başqasına nişanlıdı. Özü də kəbinləri kəsilib bu gün-sabah toyları olasıdır və qız bu dərdli naməni "Leyli və Məcnun"dan götürdüyü bu nisgilli misralarla qurtardı:

Ey möhnəti eşqdən xəbərdar,
Gör tanrı üçün nə möhnətim var!
Qıl taleyi-ahimə nəzarə,
Gör var isə rəhmin, eylə çarə!

O zaman cavan tacir qıza uzun bir namə yazıb dedi ki: "Gəl, səni götürüm qaçım". Oğlanın bu təklifi qızın gözləri qabağında bir aləm açdı. Bu aləmdəki qorxular qıza bir nağıl kimi cazibədar göründü, lap

Kərbəlayı İbixandan da o yana, şahlarla vuruşan qaçaq-quldur babalarının, at minib tüfəng atan Səkinə nənəsinin, atasının düşmənini güllə ilə vuran Xanım nənənin qanı qızın damarında qaynamağa başladı və o, oğlana yazdı ki, "səninlə lap tilsimli Qaf dağına da gedərəm".

Cavan tacir ağıllı oğlan idi, bilirdi ki, arxası Kürdoba, Arazqırağı tərəkəmələrinə bağlı olan, divan-dərədə sözü ötən pristav Bayram bəyin nişanlı qızını götürüb qaçmaq nə deməkdir. Bilirdi ki, Hacı Hüseynin kəbinli gəlinini götürüb qaçmaq nə deməkdir. Ona görə də, bu qorxulu işə diqqətlə hazırlaşdı. Özü kimi zirək bir oğlan olan kiçik qardaşı Fərhadı kənddən gətirdib mağazada oturdaraq şeylərin qiymətini, alverin yol-yolağasını ona başa saldı. Sonra ora-bura gedəndə həmişə faytonuna əyləşdiyi uzunburun, qumarbaz Çarvadar Həbibi çağırıb dedi:

– Gərək gecə ikən bizi çatdırasan Ağdama!

Belə işlərdən Çarvadar Həbibin sümüyü oynağa gedərdi. O qiymət-filan danışmadan əlini sağ gözünün üstünə qoyub dedi:

– Sənin kimi oğlandan ötrü lap Fitilbörkə də gedərəm, özü də belə xeyir iş üçün.

Çarvadar Həbib bilirdi ki, cavan tacir faytonçudan, hamamçıdan, bir də dəlləkdən pul əsirgəyən deyil. Çarvadar Həbib Şuşa qalasından idi. Dumanlı dağlarda, gözəl səsli xanəndələrin "Segah"ını, "Rast"ını, "Çahargah"ını eşidə-eşidə böyümüşdü. Məhəbbətin nə demək olduğunu bilirdi, özü də pəsdən oxuyan lotu bir oğlan idi.

Gecə bütün şəhər yatandan sonra Abdulla, Çarvadar Həbibin üç saz atlı faytonuna əyləşərək sürdürdü qızla vədələşdikləri yerə. Yaqut da pal-paltarla, zinət şeylərilə dolu çamadanını xəyanətkar Bünyada götürdərək xəlvətcə evdən çıxdı. Onu da deyim ki, qız ona nişan gələn şeylərdən birini də götürmədi. Brilyant nişan üzüyünü də çıxarıb qoydu stolun üstünə.

Fayton tərpənəndə dələduz Bünyad fürsəti fövt eləməyib cavan tacirə dedi:

– Bəs, mənim salamatım?

Cavan tacir bu barədə əvvəldən düşünmədiyi üçün xırda pul götürməmişdi. Qızdan utanaraq, elə bütöv bir qızıl çıxarıb verdi Bünyada. Bünyad da qızılı alan kimi götürüldü. Çarvadar Həbib:

– Yaman bic gədədi, – deyib güldü. Sonra çamadanları faytonun arxasına qoyub, diqqətlə bağladı. Sonra qozlaya qalxaraq:

– Ya Allah! – deyib atları tərpətdi.

Fayton səssizcə şəhərdən çıxıb şose yola düşdükdə, Çarvadar Həbib atların cilovunu boşaltdı, bütün günü möhkəm yeyib dincələn harın atlar Ağdama doğru həvəslə götürüldü. Onlar bu yolu çox getmişdilər, bilirdilər ki, onları qabaqdakı dayanacaqlarda ağ arpa, sərin bulaq suyu gözləyir.

Fayton gecənin səssizliyində şəhərdən çıxaraq bir qədər gedib əvvəl xoş şırıltı ilə axan Hacılı arxını keçdi. Sonra köpükləri Ay işığında ağaran, qızmış nər kimi nərildəyən Quruçaya yaxınlaşdı. Çarvadar Həbib atların cilovunu çəkib dayandıraraq, düşüb keçalatı diqqətlə nəzərdən keçirdi. Abdulla da faytondan qalxıb baxdı. Adama elə gəlirdi ki, dağlardan hücumla gələn bu çayın qabağında heç nə dayanmaz. Ancaq Çarvadar Həbib sakitcə qozlaya qalxıb:

– Ya allah! – deyərək cilovunu tərpətdi.

Atlar özlərini cəsarətlə vurdular çaya, cavan tacir istəklisinə pıçıldadı:

– Qorxmursan ki?

Qız, Ay işığında oğlana yanakı baxıb gülümsədi:

– Nədən qorxacam?..

Bu onların arasında olan ilk mükalimə idi.

Su faytonun ayaq qoyulan yerinə qədər qalxmışdı. Əlbəttə, bu keçalat çayın ən dayaz yeri idi. Ancaq su iti axdığı üçün az qalırdı faytonu aşırsın.

Kürdoba camaatı yaylağa köçəndə qız atla, dəvə ilə belə daşqın çayları çox keçmişdi. Ona görə də, cavan istəklisinin narahatlığı qızı əyləndirirdi.

Çarvadar Həbib atları ürəkləndirmək üçün cürbəcür səslər çıxarırdı. Çayın ortasına çatdıqda cavan tacirə elə gəldi ki, düz-dünya Ayın işığında ağaran bu harın çaydan ibarətdir. O diqqətlə istəklisinə baxdı, amma gördü ki, qızın Ay işığında gülən gözlərində zərrə qədər də qorxu yoxdur. Atlar sahilə yetib yamaca qalxanda Çarvadar Həbib axırıncı dəfə:

– Ya Allah! – deyib şallağı havada şaqqıldatdı.

Həmişə onları tumarlayıb əzizləyən, bəzən arpalarına kişmiş qatan sahiblərinin bu səsindən atlar cuşə gəlib çayın sahilindəki yoxuşu dörddəmə çıxdılar.

Fayton dolayları enərək Köndələnçayı da keçdikdə, Çarvadar Həbib bir papiros yandırıb qoydu damağına. Fayton Dövlətyarlı kəndinin içindən keçəndə xoruzlar banlayırdı. Həmişə belə gecəyarısı xo-

ruz banlayanda, nə üçünsə, Yaqutun ürəyindən bir qəmginlik keçərdi. İndi də belə oldu. Qıza elə gəldi ki, ata-anasından, doğulduğu yerlərdən ayrılıb tamam başqa bir aləmə gedir... Onun ürəyi kövrəldi. Oğlan əyilib usdufca qızın üzündən öpdü.

Atlar yüngül yorğa ilə gedirdi. Ay batmışdı. Bəzən yolun bu tərəfindən o tərəfinə gözləri yaşıl fənər kimi parıldayan tülkü, ya canavar qaçıb keçərək adam boyu qalxmış zəmilərin arasında yox olurdu. Atların zınqırovları xoş avazla səslənirdi, dan yerindən sərin yel qalxırdı. Qız ilə oğlan faytonçudan həya edərək danışmırdılar. Ancaq məlum məsələdir ki, bir-birilərini hiss edirdilər. Bir-birilərinə baxıb gülümsəyirdilər.

Dediyim kimi, yaxşı pəsdən oxumağı olan Çarvadar Həbib də həya eləyib susurdu. Amma faytondakılar ancaq kişi tayfası olsaydı, Çarvadar Həbib bütün yol boyu gah "Rast" üstündə, gah da "Segah" üstündə zümzümə edərdi. Qarabağ toylarında Çarvadar Həbibin çırtıq vura-vura məzəli oynamağı da var idi. Hətta bu barədə:

Bu havanın adı ənzəli, Çarvadar Həbib,
Bir addım da tullan irəli, Çarvadar Həbib,
Çal çuxanı, vur çırtığı, Çarvadar Həbib! -

deyə başlayan gülməli bir mahnı da qoşmuşdular.

Dan yeri qızarırdı. Bir azdan gün çıxıb Qarabağ çöllərini işıqlandırdı. Fayton az getdi, üz getdi, çatdı Pirağbulaq dərəsinə. Bu o dərə idi ki, burada Güney Güzdəkli Bayandur öz igidlərilə axta Ağa Məhəmmədin qoşunlarına divan tutmuşdu. Bu o dərə idi ki, Gəncə qaçağı dəli Alı burada namərd Şiralı xanı öldürüb həmyerlilərinin qisasını almışdı. Fayton dərəyə girəndə Çarvadar Həbib dərənin o tayında köhnə günbəzin qabağındakı tək ağacın kölgəsində dayanmış bir adam görüb atları qovmaq istədi. Ancaq dar yolun o tərəf-bu tərəfindən ona tuşlanan tüfəngləri görüb atların cilovunu çəkdi. Kolların dalından çıxan iki tüfəngli qaçaqdan biri Həbibə əmr etdi:

– Ə, uzunburun köpəkoğlu, döndər faytonu, sür günbəzin yanına!

Ona da Çarvadar Həbib deyərdilər! Qaçağa qəzəblə baxıb dedi:

– Ağzını dağıtma, ə, adam oğlusan! Sür deyirsən, sürərəm!

– Sür! – deyə qaçaq qışqırdı.

Cavan tacir qaçaqlara dedi:

– Qoy qız otursun faytonda biz gedək.

Qaçaq ona qulaq asmayıb yenə də Çarvadar Həbibə qışqırdı:

– Ə, heyvərə! Sənə demirəm döndər faytonu?!

Həbib faytonu döndərib köhnə gümbəzin qabağına sürdü.

Faytonu saxlayanda ağacın kölgəsində dayanan oğlan bir-iki addım irəli yeriyib, Çarvadar Həbibdən soruşdu:

– Kimdi apardıqların?

Cavan tacir faytondan düşüb, sakit səslə oğlana dedi:

– Mən Abdulla Əfəndinin qardaşı oğluyam. Faytondakı qız da mənim nişanlımdır.

Qaçaqbaşı soruşdu:

– Güney Güzdəkli Abdulla Əfəndinin qardaşı oğlusan?

Abdulla dedi:

– Bəli.

Qaçaq soruşdu:

– Bəs, bacı kimlərdəndi?

Abdulla dedi:

– Kürdobalı pristav Bayram bəyin qızıdır.

Qaçaqbaşı soruşdu:

– İndi səfəriniz hayanadı?

Abdulla dedi:

– Gedirik Ağdama.

Sonra qaçaqbaşı portmanatından bir üzük çıxarıb faytona yaxınlaşdı:

– Bunu sənə boygörüncəyi verirəm, bacı! Qoy Qaçaq Xanmuraddan sənə yadigar olsun.

Yaqut nişanlısına baxdı. Cavan tacir təmkinlə dedi:

– Boygörüncəyini rədd etmək olmaz. Götür.

Yaqut üzüyü alıb taxdı barmağına və lap köhnə tanışlar kimi qaçaqbaşıya dedi:

– Sağ ol, Xanmurad.

Qaçaqbaşı dedi:

– Bacı, Bayram dayı məni yaxşı tanıyır. Bağışla ki, uşaqlar səni yoldan saxlayıblar.

Sonra qaçaqbaşı cavan tacirə dedi:

– Sizə yaxşı yol, qardaşlıq!

Fayton tərpənib Pirağbulaq dərəsinə çıxdı, bu vaxt bayaqkı yerə başqa bir fayton gəldi.

Abdulla diqqət yetirib gördü ki, faytonun içində əyləşən barmağında iri brilyant üzük olan lopabığ, xəsis milyonçu Nersesdi. Qaçaqlar o faytonu da döndərib apardılar Qaçaq Xanmuradın hüzuruna.

Çarvadar Həbib gülümsəyib dedi:

– Allah yaxşılığı əvəzsiz qoymaz, – deyərlər. Nersesin barmağındakı brilyant üzüyün min qızıl qiyməti var.

Çarvadar Həbib papağının dalını qaldırıb atları tərpətdi, qaçaqlar onun atlarını tutub almadıqları üçün Çarvadar Həbibin kefi doxsan doqquza qalxmışdı. Fayton Pirağbulaq dərəsindən uzaqlaşanda Çarvadar Həbib əlavə etdi:

– Qaçaq Xanmurad deyilmişcən varmış... Sağ olsun.

Qaçaq Xanmurad təzə meydana çıxmışdı. Özünün də iyirmi iki-iyirmi üç yaşı ancaq olardı. Onun da Qaçaq Süleyman kimi, kasıb-kusubla işi yox idi. Çox əli iti igid idi.

Nişanlısının cavan qaçaqbaşıya necə maraqla baxdığını fikirləşəndə, ayaqlarında uzunboğaz çəkmə, başında bahalı buxara papaq, belində üç qatar patron, böyründə qırmızı ağac qoburlu onatılan olan qaçaqbaşının uca qədd-qamətini gözlərinin qabağına gətirəndə cavan tacir özünü birtəhər hiss elədi.

...Axşam gün batanda fayton Ağdamın yeddi-səkkiz kilometrliyindəki Novruzlu kəndinə daxil oldu. Bəndalı yüzbaşı kürsülü artırmada əyləşib ov tüfənginin gilizinə barıt-qırma doldururdu. Atların zınqırov səslərini eşidib, başını qaldıranda gördü ki, darvazanın ağzında bir fayton dayandı. Kişi əlini işindən çəkməyib bərkdən səsləndi:

– Qonaq, darvaza açıqdı!

Əvvəlcə Çarvadar Həbib çamadanları götürüb girdi həyətə. Sonra cavan tacir, ardınca da nişanlısı daxil oldular həyətə. Qız tamam yaşınmasa da, yaşmağı burnunun qabağına qədər çəkmişdi. Bəndalı yüzbaşı zənən xeylağı ilə cavan oğlanı görən kimi gilizi stolun üstünə qoyub ayağa qalxdı:

– Xoş gəlmisiniz, – dedi, – buyurun yuxarı!

Bəndalı kişinin ətli-canlı arvadı qızın qolundan tutub apardı evin qadınlar olan hissəsinə.

Abdulla da artırmaya çıxıb kişiylə əl tutuşdu. Bəndalı yüzbaşı dedi:

– Həbib, sən də çıx yuxarı!

(Qarabağda Çarvadar Həbibi kim tanımırdı ki?..)

Çarvadar Həbib dedi:

– Allah razı olsun, Bəndalı dayı, atların arpa vaxtıdı, gərək gedim.

Bəndalı yüzbaşı cavan tacirə dedi:

– Qardaşoğlu, buyur içəri.

Onlar xalı-gəbə ilə döşənmiş zala daxil olub ipək döşəkcələrin üstündə əyləşdilər. O saat arvad-uşaq olan tərəfdəki mətbəxdə qazanlar asıldı. Çay qoyuldu. Kəklikli-turaclı plov bişirildi. (Qarabağlıların kəklikli-turaclı plovuna nə söz?)

Yeyib-içəndən sonra Bəndalı yüzbaşı dedi:

– Hə, qardaşoğlu, indi danış görək hansı qohumlardansız?

Abdulla hər şeyi olduğu kimi danışıb qurtaranda Bəndalı yüzbaşının üzü tutuldu. O bir qədər sükutdan sonra dedi:

– Buranı öz eviniz hesab eləyin. Heç bir şeydən də ehtiyatlanma.

Sonra Bəndalı yüzbaşının neçə il qaçaqlıq eləyib, keçən il üzə çıxan kiçik qardaşı Çıraq da gəlib qonaqlara "xoşgəldin" elədi.

Bəndalı yüzbaşının gülöyşə nar, peyvənd əzgil, iri heyva ağacları ilə dolu qalın kölgəli bağı, kürsülü evin sütunlarına sarılan enliyarpaqlı üzüm tənəkləri Yaqutun xoşuna gəlirdi. O burada özünü qərib hiss eləmirdi.

Bəndalı yüzbaşı çoxdan yüzbaşılıq eləməsə də, Qarabağda sayılan karlı adamlardan idi. Cavan tacirin nişanlı qızı götürüb onun evinə qaçmağı havayı deyildi. Cavan tacir bilirdi ki, quş olub göyə uçsalar da, Hacı Hüseynin, Bayram bəyin adamları Qarabağda onların yerini tapacaqlar. Ona görə də gərək elə adamın evinə getsinlər ki, ordan onları bir qoşun da çıxarda bilməsin.

Onlar gələndən üç gün sonra Bəndalı yüzbaşı Ağdam şəhərindəki çayxanalardan birinin qabağında, böyük tut ağacının kölgəsində əyləşib Xanlıq Muxtarla nərd oynayırdı. Xanlıq Muxtar da Bəndalı yüzbaşı kimi karlı adam idi, tapançası həmişə pencəyinin qoltuq cibində dolu olardı. Əgər Xanlıq Muxtar belə sayılan adam olmasaydı, Bəndalı yüzbaşı camaatın gözü qabağında oturub onunla nərd oynamazdı. Hər kəsin öz tayı var!

Elə bu zaman balacaboylu, cırtdaqoz, davakar pristav İsmayıl bəy dalında iki nəfər yasavul nərd oynayanların yanına gəlib dedi:

– Bəndalı yüzbaşı! Bizdə məlumat var ki, Qarabulaqdan bir oğlan, pristav Bayram bəyin nişanlı qızını qaçırdıb gətirib sənin evinə.

Bəndalı yüzbaşı zərləri tulladı, daşları götürüb yerinə qoyandan sonra sakit səslə soruşdu:

– Tutaq elədi, sonra?

Pristav İsmayıl bəy dedi:

– Sonrası budur ki, gərək qızı alıb geri qaytaraq, oğlanı da tutaq!

Bəndalı yüzbaşı dedi:

– Qız öz xoşu ilə qoşulub qaçıb.

İsmayıl bəy ona cavab verdi ki:

– Onun bizə dəxli yoxdur. Öz yerlərində aydınlaşdırarlar.

Bəndalı yüzbaşı dedi:

– Bu nainsaflıq olar, bəy. Onu da nəzərə al ki, oğlan qızı mənim evimə gətirib.

İsmayıl bəy dedi:

– Sənin evin ziyarətgah-zad döyül ki?.. Nə olsun gətirib?

Bəndalı yüzbaşı ağır-ağır qalxdı:

– İsmayıl bəy! İndi ki, belə oldu, mən gedirəm evə. Sən də yasavullarını göndər, gəlib o oğlanla qızı mənim evimdən çıxarsınlar, görək necə çıxarırlar?!

Bəndalı yüzbaşı bu sözü deyib tələsmədən getdi. Xanlıq Muxtar, Bəndalı yüzbaşının ardınca baxa-baxa papiros çıxarıb yandırdı, bu o demək idi ki, Xanlıq Muxtar özü də məhz Bəndalı yüzbaşı kimi edərdi...

Evinə gəlib Abdullaya heç nə hiss etdirmədən qardaşı Çırağı, iki cavan əmisi oğlunu, üç yeniyetmə bacısı oğlunu çağırtdırıb əhvalatı onlara qısaca bildirdi. Tapşırdı ki, tüfənglərini hazır saxlasınlar. Əgər, pristav İsmayıl bəyin yasavulları qızı oğlanın əlindən almağa gəlsələr, atışacaqlar.

"Atışacağıq" sözünü eşidib cavanların sümüyü oynağa getdi.

Onların ağsaqqalına pənah gətirən oğlanın nişanlısını heç kəs bu evdən, bu Novruzlu kəndindən çıxarıb apara bilməz! Uzaq olsun!.. Uzaq olsun, əgər, qızı tutub oğlanın əlindən alsalar, bu, bütün Bəndalı yüzbaşının tayfası üçün, bütün Novruzlu kəndi üçün həmişəlik baş töhməti olardı!

Ona görə də, tüfənglərini doldurub söykədilər bucağa, patrondaşı da asdılar üstündən.

Ancaq İsmayıl bəy gəlmədi. İsmayıl bəy davakarlığı ilə bərabər, həm də bic adam idi. Bilirdi ki, davasız-atışmasız Bəndalı yüzbaşının evindən qız çıxarmaq olmaz. Bir də fikirləşdi ki, başqa qəzadan gətirilmiş bir qızdan ötrü nə üçün Bəndalı uşağı kimi bir tayfa ilə qanlı-bıçaq olsun?..

Ancaq səhəri, gecə xoruzun ikinci banında itlərin bərk hürüşməsinə qulaq verib, Bəndalı yüzbaşı dərhal başa düşdü ki, evin ətrafında

yad adamlar var! Tək bir adam yox, bir neçə adam, çünki itlərin səsi bağın bir neçə yerindən gəlirdi. Bu, pristav adamlarına oxşamırdı. Hökumət adamı gecənin bu vaxtında gəlməzdi. Demək, məsələ başqa cürdür. Bəndalı yüzbaşı cəld geyindi, tüfəngi qapıb, qapını usdufca açıb ehtiyatla çıxdı bayıra. Elə bu anda da qardaşı Çıraq qaranlıqdan səsləndi:

– Kimsiniz, ə?

Qaranlıqdan kimsə ona qışqırdı ki:

– Bəndalı yüzbaşıya denən çıxsın çölə!

Özünü təndirxananın böyrünə verib atışmağa hazır dayanan Bəndalı yüzbaşı sakit səslə cavab verdi:

– Bəndalı yüzbaşı çöldədi, nə sözünüz var?

Qaranlıqdan gələn səs dedi:

– Əşi! Əgər, qan tökülməyini istəmirsənsə, o haramzadə oğlanı da, qızı da ver!

Bəndalı yüzbaşı dedi:

– Ə, bilmirsiniz ki, Bəndalı yüzbaşı heylə binamus işə qol qoymaz! Qayıdın gedin evinizə-eşiyinizə. Bir işdi olub.

Qaranlıqdan gələn səs dedi:

– Qızı aparmasaq, getməyəcəyik.

Bəndalı yüzbaşı sakit səslə dedi:

– Məsləhətdi qayıdasınız!

Qaranlıqdan gələn səs dedi:

– Əşi, əlli-altmış versti at sürüb gəlməmişik ki, əliboş qayıdaq?! Xoşluqla sənə deyirik ki, qızı da, oğlanı da verəsən!

Cavabında Bəndalı yüzbaşı səs gələn tərəfə deyil, havaya bir güllə atdı. Səs-küyü eşidib səngərlərində hazır dayanan bacıoğlular, əmioğlular, bir də Bəndalı yüzbaşının qardaşı Çıraq o, tək güllə atılan kimi, səs gələn tərəfi basdılar gülləyə. Kəndin hər tərəfində itlər hürüşdü, hər tərəfdən qarasına atılan güllə səsləri eşidildi.

Bəndalı yüzbaşı, qız üçün gələnlərə qışqırdı:

– Ə, özünüzü havayı qırdırmayın, çıxın gedin!

Cavabında bir neçə güllə birdən atıldı. Evin pəncərələrinin şüşələri çiliklənib töküldü.

Qaranlıqdan təzə bir səs eşidildi:

– Əşi, Bəndalı yüzbaşı bu köpəkuşağının bir təkini də salamat buraxmayacağıq. Üst tərəflərini kəsmişik!

Bəndalı yüzbaşı dedi:
– Adama atmayın. Qoyun çıxıb getsinlər.
Səs-küyə yuxudan ayılıb bayıra çıxan Abdullanın lap qulağının dibindən güllələr vıyıltı ilə keçib qapı-pəncərəyə dəyirdi. Oğlan qorxaq adam deyildi. Ancaq işin nə yerdə olduğunu bilib xalqa bu cür əngəl açdığı üçün ürəyində xəcalət çəkirdi. Qızı qaytarmağa gələnlər gördülər ki, xeyr, Bəndalı yüzbaşı batmalı kol deyil, qayıdıb getdilər. At ayaqlarının səsləri tamam uzaqlaşıb, itlər susandan sonra Bəndalı yüzbaşı səngər elədiyi yerdən çıxıb bərkdən soruşdu:
– Ə, uşaqlar, ziyanlıq-zad olmayıb ki?!
Çıraq öz qapısından dedi:
– Bir şey yoxdu.
Bəndalı yüzbaşı təkrar soruşdu:
– O biri tərəfdən necə?
Çıraq dedi:
– Salamat getdilər.
Bəndalı yüzbaşının vurub-yıxmaq üçün həmişə bir girəvə axtaran bacıoğlusu İrşad öz qapılarından dedi:
– Ay dayı, qoymadın o it uşağının hamısını qıraq, dayna!
Bəndalı yüzbaşı cavab verməyib artırmaya qalxanda Abdullanı orda görüb, gümrah səslə dedi:
– Ə, qardaşoğlu, sən niyə yuxudan olmusan?
Oğlan xəcalətlə dedi:
– Sizə iş açmışıq...
Bəndalı yüzbaşı dedi:
– İşi-zadı yoxdu, yeri soyun yat.
Abdulla onun üçün ayrılmış otaqda elə paltarlı uzanıb səhərə qədər gözünü yummadı.
Səhər çaydan sonra Abdulla, Bəndalı yüzbaşıya dedi:
– İcazə versəydiniz, bu gün biz gedərdik Yevlağa.
Bəndalı yüzbaşı təəccüblə soruşdu:
– Yevlağa?
– Bəli, oradan da Bakıya gedəsiyik.
Bəndalı yüzbaşı gülümsəyib zarafatyana dedi:
– Yoxsa, gecəki əhvalat qorxutdu səni?
– Xeyr. Elə əvvəldən fikrim Bakıya getməkdir.
Amma cavan tacir düz demirdi. Əslində istəmirdi ki, onların üstündə burada başqaları davaya düşsün.

Bəndalı yüzbaşı dedi:

– Qardaşoğlu, sənə əvvəl də dedim, indi də deyirəm, bura öz evinizdir. Lap bir il də qala bilərsiniz! Heç kəs də yel olub böyrünüzdən ötə bilməz.

Ancaq kişi baxıb gördü ki, cavan tacir qalmaq istəmir. Səhərisi gün özü şəhərdən fayton gətirtdi. Bəndalı yüzbaşının arvadı Yaquta iri firuzə qaşlı bir üzük boygörüncəyi bağışladı. Kişi özü də oğlana əla bir buxara dərisi ilə bir dəst dioqonal kostyumluq bağışladı. Yolları üçün cürbəcür yeməklər qoydular, Bəndalı yüzbaşı bacısı oğlu İrşadla əmisi oğlu Cəmilə tapşırdı ki, onları aparıb lap Yevlağacan ötürsünlər. Oğlanlar da tüfənglərini götürüb atlandılar və faytonu lap Yevlağacan ötürüb qayıtdılar.

Yolda Abdulla fikirləşdi ki, Bakıdansa Gəncəyə getmək daha məsləhətdir, çünki Gəncə Qarabulağa yaxındır. Ona görə də, Gəncəyə gedib düşdülər mehmanxanaya.

...İndi sizə kimdən deyim, Bağbanlar Ələkbərdən.

Bağbanlar Ələkbər otuz beş-otuz altı yaşlarında üzündə tək-tək çopuru olan qarabuğdayı, yaraşıqlı bir adam idi, yüzlərlə düşməni olduğu üçün həmişə çuxanın altında iki tapança gəzdirərdi. Çayxanalarda nərd oynayanda o da həmişə qarabağlı Xanlıq Muxtar kimi kürəyi divara tərəf oturardı, düşmənləri də onunla üzbəsurət atışmağa cürət eləməzdilər, bilirdilər ki, Bağbanlar Ələkbərin bir gözü nərdə baxırsa, bir gözü ətrafındakı adamlardadır. Özü də hər iki əli ilə sərrast atandır.

Abdullagilin düşdüyü mehmanxananın qapıçısı qoca kişi idi. Şeylərini mehmanxanaya daşıyanda cavan tacir ona bir abbası əvəzinə bir manat vermişdi.

Abdulla fikir eləyirdi ki, bir qədər də Gəncədə qalıb ara sakitləşəndən sonra qayıdarlar Qarabulağa, ancaq bir gün qoca xidmətçi onu kənara çəkib dedi:

– Oğul, görürəm, sən yaxşı adamsan, ona görə də sənə bir sirr açmaq istəyirəm, ancaq gərək öz aramızda qalsın.

Abdulla bu sözə bərk təəccüb eləyib and içdi ki, dünyasında onun ağzından sirr çıxmaz. O zaman qoca soruşdu:

– Hər gün gəlib mehmanxananın bağçasında nərdtaxta oynayan Bağbanlar Ələkbəri tanıyırsanmı?

Abdulla dedi:

– Tanımasam da, haqqında eşitmişəm, hər gün bura gəldiyini də bilirəm.

– Yəqin onu da eşitmisən ki, Bağbanlar Ələkbərin kəsdiyi başın sorğu-sualı yoxdur.

Abdulla dedi:

– Eşitmişəm.

Qoca ətrafına baxıb pıçıltı ilə dedi:

– O sənin külfətinə aşiq olub, məsləhətdir ki, lap bu gecə Gəncədən çıxıb gedəsiniz, yoxsa, yaxşı olmaz, heyfsiniz...

Bu əhvalatı Abdulla da, Yaqut da öz-özlüyündə duymuşdular, onlar görürdülər ki, ayaqlarında güzgü kimi parıldayan uzunboğaz çəkmə, başında ən bahalı papaq, qastor çuxalı, qızıl vəznəli, qızıl toqqalı adam hər gün gəlib saatlarla bağçada, nərdtaxta oynaya-oynaya eyzən onlar olan otağın pəncərəsinə baxır, ancaq bu barədə bir-birilərinə heç nə demirdilər. İlk dəfə o Yaqutu görəndə Abdulla otaqda yox idi, ayın-oyun almaq üçün şəhərə çıxmışdı. Yaqut isə sinəsi açıq, zərxara köynəkdə pəncərə qabağında dayanıb qulac-qulac saçlarını hörəhörə şəhərə tamaşa edirdi. Elə bu vaxt nərd oynamaq üçün bağçadakı üstüaçıq çayxanaya gedən bağbanlar Ələkbərin tamam təsadüfi halda gözü qız dayanan pəncərəyə sataşdı, Yaqutu görəndə yerində mıxlanıb qaldı. Pəncərə ikinci mərtəbədə olduğundan Bağbanlar Ələkbər, hətta Yaqutun durna boyu kimi uzun ağ boynundakı qara xalı da aydınca gördü, bu an kənardan Bağbanlar Ələkbərə baxan olsaydı, deyərdi ki, bu adam yəqin ömründə belə gözəl görməyib. Birdən Yaqut gözlərini şəhərdən çəkib bağçaya baxanda heyran-heyran ona tamaşa eləyən cavan kişini görüb bir an, ancaq bir an ona diqqət yetirib pərdənin arxasına çəkildi, elə bu andan sonra Bağbanlar Ələkbər, hətta, Abdulla evdə görünəndə də gözünü, o pəncərədən çəkmirdi.

Qoca xidmətçi məsləhət gördü ki, xoruzun birinci banı Gəncədən çıxsınlar.

Abdulla şəhərə getdi, fayton tutub beh verdi. Onlar hələ dan yeri ağarmamış Gəncədən çıxdılar, bu tələsik gedişin səbəbini oğlan Yaquta açmadı, ancaq qızda şübhə yeri qoymamaq üçün dedi:

– İstəyirəm ki, sən Bakını görəsən, hələ desən səni teatra da aparacağam.

Qız teatr haqqında eşitmişdisə də, görməmişdi, ona görə də, Bakıya getmək xəbərinə sevindi. Ancaq Yevlağa çatana qədər saatlarca gözünü onların pəncərəsinə dikən yaraşıqlı, qarabuğdayı, üzündə tək-tək çopuru olan, güləndə sədəf kimi ağ dişləri görünən, qızıl vəznəli, qızıl toqqalı oğlan xəyalından çəkilmirdi. Sözün düzü, Abdulla

mehmanxanada olmayanda elə Yaqut da maraqdan özünü saxlaya bilməyib, tül pərdə arxasından oğrun-oğrun o oğlanın hərəkətlərinə diqqət yetirirdi, cavan tacirin də belə geyinmədiyinə heyfslənirdi. Dünən həmin oğlan yenə də bağçada nərd oynayırdı, başına beş-altı adam yığışmışdı. Yaqut da həvəsini boğa bilməyib yenə də tül pərdə arxasından onlara tamaşa edirdi. Bu zaman Bağbanlar Ələkbərin başına toplaşmış cavanlardan biri:

– Ley! Ley! – deyə göyə işarə ilə səsləndi.

Yaqut da baxıb gördü ki, bir ley xeyli yüksəkdə dövrə vurur, Bağbanlar Ələkbər tapançasını çıxarıb ancaq bir an nişan alıb atdı, ley bir-iki metr yuxarı qalxıb daş kimi ağacların arasına düşdü, oğlan da tapançanı qoburuna qoyub heç bir şey olmamış kimi oyununa davam etdi. Əlbəttə, qız, atası Bayram bəyin və onun dostlarının Novruz bayramında, toylarda nişana atdıqlarını çox görmüşdü, ancaq bu dəfə nazik bığı şəvə kimi parıldayan bu ədalı oğlanın quşu bu qədər sərrast vurmağı və üzündəki sakit qürur qıza ayrı cür təsir elədi.

Burada aşıq yxşı deyib:

– Ay dünya, nə qəribə işlərin var sənin...

Amma bütün bu xəyallar qızın birinci dəfə gördüyü qatara əyləşəndə yox olub getdi, qız ley vuran oğlanı bir də xeyli sonralar – tacir əri Abdulla ilə tez-tez dalaşanda, onun hərəkətlərindən xoşu gəlməyəndə yad edərdi.

...Bakıda Təbriz mehmanxanasına düşdülər, bu mehmanxananın sahibi Hacı Hacıağa etibarlı, mömin bir şəxs olduğundan qəza şəhərlərindən gələn tacirlərin əksəriyyəti onun mehmanxanasına düşərdi, özü də Cənubi Azərbaycandan idi. Yaqut dənizi birinci dəfə görürdü, ancaq dəniz ona Qarabağın qıjov çayları kimi təsir eləmirdi. Yaylağa getdikləri zaman hüştürümlə axan o harın çayları ucaboylu, yəhərli atla keçərkən qız özündə də bir coşğunluq, göylərə pərvazlanan bir həyəcan hiss eləyirdi. Bozumtul göylə birləşən dəniz ona soyuq, qüssəli görünürdü. Amma gecə opera teatrında tamaşa elədiyi "Leyli və Məcnun" indiyə qədər onun hiss eləmədiyi qəmli bir dünya idi. Məcnunla Leylinin nakam məhəbbətində əlacsız, dərdli, bu fani dünyaya sığmayan ayrı bir gözəllik vardı, bu, qızın heç bir zaman duymadığı, indi heyran qaldığı, göz yaşı tökdüyü bir məhəbbət idi! Bu dərdli məhəbbətin yanında onların, yəni, pristav qızı Yaqutla cavan tacir Abdullanın məhəbbəti çox solğun görünürdü, bu da qızı məyus edirdi, qız bu anda istəyərdi ki, onu da belə sevsinlər, onun özünün də məhəbbəti

Leylinin məhəbbəti kimi belə dərdli olsun. Bir an qıza elə gəldi ki, o özü, kimi isə, Leyli təkin sevir, ancaq onu İbn Salama ərə veriblər və bu cavan tacir Abdulla elə o İbn Salamın özüdür...

Fasilədə Abdulla bufetdən bahalı konfetlər, şəkərçörəyi alıb gətirdi, elə bil, qız bu işə təəccüb elədi, acığı tutdu, konfetlər də ona lap mənasız göründü, qız onlara əlini də vurmadı.

Amma tamaşadan sonra onlar mehmanxanaya gələndə bütün bu duyğular yaz vaxtı Qarabağ meşələrinin üzərində tez-tez zahir olan buludlar kimi yox olub getdi. Yenə də nişanlısı ilə şən zarafatlar başladı, amma nə ki, düzdü – düzdü, ilk dəfə gördüyü o məhəbbət faciəsi qəlbinin dərinliklərində nisgilli bir xatirə olub qaldı, özü də zaman-zaman ona elə gəldi ki, bu elə onun öz xatirəsidir...

Abdullanın isə, əlbəttə, bu haldan xəbəri yox idi. Oğlan narahat idi, ona görə narahat idi ki, ticarət işləri tökülüb qalırdı, hər gün onun filan qədər qazancı itib gedirdi, o biri tərəfdən də, Bakı qoçularının hərəkətləri onu qorxudurdu, nişanlısı sarıdan qorxurdu. Dünən lap mehmanxananın yaxınlığında günün günortaçağı qoçu Fərəclə qoçu Baloğlan düz bir saat atışdılar. Polis də bunu görməməzliyə vurdu. Qoçu Fərəci çox binamus deyirdilər, küçədə gözəl bir qıza, bir gəlinə gözü düşdümü, qurtardı, gərək həmin gün oğurlayaydı.

Bakıya gələnə qədər qoşulub qaçdığı cavan tacirin varı-dövləti haqda düşünmək heç Yaqutun ağlına da gəlmirdi. Amma teatrlarda, küçələrdə rast gəldiyi xanımların daş-qaşını, geyimini gördükdə, burada Hacı Zeynalabdin Tağıyev kimi, Musa Nağıyev kimi milyonerlərin olduğunu bildikdə, qoşulub qaçdığı cavan tacirin varı – mağazası onun nəzərində xeyli kiçildi. Elə bil, cavan tacirin özü də birdən-birə balacalandı. Eh! Dünyada işlər varmış... Dövlətlilər varmış... Brilyantlar, daş-qaşlar varmış... Gözəl binalar varmış... Qız gecə oğlanla küçədə gəzərkən, iri pəncərələrdə yanan gur işıqları gördü... Yəqin ki, o zinətli lampalarla işıqlanan zallarda ayrı cür həyat vardı... Birdən qıza elə gəldi ki, əgər, onun qoşulub qaçdığı oğlan da o Gəncədəki Bağbanlar Ələkbər kimi geyinsəydi, onun kimi bir göz qırpımında uçan quşu tapança ilə havada vuran olsaydı, bəlkə Bakıdakı bu milyonerlər, bu göz qamaşdıran brilyantlar onun gözünə görünməzdi. O, nişanlısı ilə öyünərdi.

...Qarabulağın yeddi-səkkiz kilometrliyində Alıqulular obası vardı. Onlar da kürdobalılar kimi tərəkəmə idi. Kişilərdən oğru olmayanı ta-

pılmazdı, oğurluq bacarmayana qız verməzdilər, deyərdilər, əfəldir. O tərəflərdə məşhur bir məsəl də vardı, deyərdilər: "Alıqululların şahidi sarımərdanlılar olar". Alıqululardan bir adamı oğurluqda təqsirləndirəndə and içərdi ki, oğurluq olan gecə Sarımərdanlıda filankəsin evində idi. O da and içib təsdiq edərdi.

Həmin Alıqulular obasında böyük mülkədar Həsən bəy yaşayırdı. Obadan aralı çayın qırağında bəyin, divarları, sütunları firuzə rəngində, ikimərtəbəli gözəl bir imarəti vardı. Evin hər tərəfi böyük bağ idi. Xalq arasında Həsən bəyə "oğru bəyi" deyirdilər, çünki çar polisi o ətrafda kimi oğurluqda ittiham eləyib həbsə alsaydı, Həsən bəy qurtarardı. Qəza rəisi özü Həsən bəyin dostu idi. Ona görə də, kim böyük oğurluq eləsəydi, tutuldu-tutulmadı, gərək Həsən bəyin payını xəlvətcə verəydi.

Həsən bəyin adlı-sanlı ruhanilərə, o cümlədən də Abdullanın əmisi Abdulla Əfəndiyə böyük hörməti vardı, o, belə nüfuzlu ruhanilərə tez-tez bəxşişlər göndərirdi. Hörmətli ruhanilər də fərqinə varmazdılar ki, bu hədiyyələr oğrulardan gələn pulların hesabınadır. Bəyin ehtiramına qarşı minnətdar olduqlarını bəyan eləyib, ona dua edərdilər...

Cavan tacir uzun-uzadı fikirləşəndən sonra nişanlısı ilə Qarabağa qayıdıb, düz gəldi Həsən bəyin evinə. Həsən bəy boy-buxunlu, tənumənd bir adam idi. Tacir tayfası ilə yaxın olmadığı üçün onların ancaq adlı-sanlılarını tanıyırdı. Ona görə də, cavan taciri əvvəl tanımadı, ancaq Abdulla Əfəndinin qardaşı oğlu olduğunu və Bayram bəyin qızını götürüb qaçdığını biləndən sonra tapşırdı onlara hörmət etsinlər.

Sonra bəy fayton göndərib qəza qazısı Axund Mirzə Qələndəri evinə qonaq dəvət eləyib, əhvalatı ona danışıb dedi:

– Vaxta ki, oğlan qızı mənim evimə gətirib, gərək onu Bayram bəylə barışdıraq.

Qazı Mirzə Qələndər gödək, yoğun, qırmızısifət bir kişi olub, tubulku ağacından qayrılmış iri, qırmızı müştükdə papirosu papirosun oduna yandırardı. Özü də çox söhbətcil, baməzə, arvadbaz bir adam idi. Getdiyi uzaq kəndlərdə saz, dul arvadları siğə eləməyi savab iş hesab edərdi. Həsən bəyin də, Bayram bəyin də dostu, həmsöhbəti idi. Əlbəttə, əgər, qız Bayram bəyin qızı olmasaydı və cavan tacir də Abdulla Əfəndinin qardaşı oğlu olmasaydı, hamısından da mühümü qızı götürüb, Həsən bəyin qapısına gəlməsəydi, qazı ağa bu izdivaca çətin icazə verərdi. Amma indi nə etmək olardı?..

Həsən bəylə qazı ağa böyük qonaq otağında stolun ətrafında əyləşmişdilər. Özü də orucluq vaxtı idi. Həsən bəyin qəribə işləri vardı. Onlardan biri də bu idi ki, heç vaxt orucunu keçirməzdi. Yəqin məsələdir ki, qazı ağa da oruc idi. Stolun üstünə ət, cücə soyutması, cür-bəcür məzələr, göyərtilər düzülüb, bir qrafin də araq qoyulmuşdu. Bəylə qazı ağa oturub, iftarı gözləyirdilər. Qazı ağa arağa işarə ilə gülümsəyib zarafatyana dedi:

– Bəy, görünür, araqla iftar açmağın ayrı ləzzəti var.

Həsən bəy qazı ağanın zarafatından rəncidəxatir olmayıb dedi:

– Oruc öz yerində, araq da öz yerində. Bu azançı zalım oğlu da dillənəcək ki...

Səhərdən dilinə içki, xörək dəymədiyi üçün indi bəyin hövsələsi bir tikə olmuşdu. Qalxıb otaqda səbrsizliklə var-gəl eləyirdi. Birdən ayaq saxlayıb pəncərədən görünən minarəyə xitabla, yəqin ki, azançının qarasına acıqla dedi:

– Nu çort, kriçi da!

Qazı ağa ləzzətlə güldü. Azançı dillənən kimi bəy araqla dolu qədəhi götürüb dedi:

– Qazı, sağ ol.

Bəy qədəhi birnəfəsə boşaldıb yerə qoyaraq əyləşib tələsik yeməyə başladı. Qazı ağa da “bismillah” deyib səliqə ilə orucunu açdı.

Bir qədər yeyəndən sonra bəy qədəhini doldurub dedi:

– Qazı ağa, gəlsənə bir qədəh meyl eləyəsən.

Qazı ağa gülümsəyib cavab verdi ki:

– Xeyr a... mən ləziz təamlardan, pürrəng çaydan, bir də zərif tütündən zövq alıram.

Bəy qədəhini boşaldıb soruşdu:

– Bəs topuğu girdə gəlinlərdən necə?! Hallıca-dulluca arvadlardan necə?

Bəy qəhqəhə ilə gülüb qədəhini doldurdu. Qazı ağa qırqovulun, plovun altında qızarmış zərif budunu götürüb boşqabına qoyaraq dedi:

– Qadın dünyanın ən şirin nemətidir. Ondan necə ləzzət almamaq olar? Siğəni də şəriət ona görə buyurub ki, dul qadınlar özləri də bu ləzzətdən binəsib olmasınlar.

Bəy dəmlənmişdi:

– Ay lotu, – dedi – əməllərinizi paka çıxarmağı bacarırsınız.

Qazı ağa ürəyində bilirdi ki, bir az lotuluğu var. Ona görə də zarafatyana dedi:

– İnsan gərək özünü Allahın yaratdığı ləziz nemətlərdən məhrum eləməsin.

Bəy bir qədəh də vurub soruşdu:

– Deyirlər, sən Kürdobada kor bir qadın siğə eləmisən.

Qazı ağa gülümsünüb dedi:

– Ona baxsan, deməzsən kordur. Çox cazibədar, iri qara gözləri var, di gəl ki, görmür. Özü də o qədər gözəl, ətli-canlıdır ki, o yandan bəri yeriyəndə deyirsən, bəs, bir ağ maya gəlir.

Bəyin hərəmi özü kimi yaşlı, arıq, uzunburun bir arvad idi. Ona görə də, qazı ağanın tərifindən vəcdə gəlib dedi:

– Gecələr lüt soyundurub alırsan qucağına...

Qazı ağa gülüb dedi:

– Daha onu deməzlər ki: Sən araqdan ləzzət alırsan, mən də şux cananlardan.

Bəy qızarıb pörtmüş halda dedi:

– Yaxşı eləyirsən. Bu axmaq dünyada bacardıqca kef çəkmək lazımdır. Qazılığa da bir qoz, bəyliyə də! Qoy nə deyirlər, desinlər. Bilirəm, düşmənlərim məni daldada "oğru bəyi" də adlandırırlar. Amma bilmirlər ki, mənim "oğru bəyi" olmağım onların doğru bəy olmağından yüz dəfə artıq xeyir verir camaata.

Qazı ağa güldü.

Bəy dedi:

– Gülmə, Mirzə Qələndər, düz deyirəm. Məsələn, mən həmişə oğrulara deyirəm ki, a köpəkuşağı, kasıb-kusubla işiniz yoxdur. Kasıb it oğlundan Allah da bezardır, bəndə də! Gedin o kəslərdən aparın ki, Kürdobalı Hacı Qara kimi, on min qoyunu var. Yeriyin sodayar Məşədi Sülünün topdağıtmaz mağazalarına ki, İsveçrə bankında milyonları var! Heylələrindən nə qədər aparsanız halaldır. Mən ölüm belədir, belə döyül, Mirzə Qələndər?

Qazı ağa ayaq üstə güclə dayanan bəyə baxıb, yenə də kişmişi güldü. Bəy bu dəfə özünü çox tox tutub dedi:

– Odur ki, kasıb adamın heyvanını aparan oğru tutulanda onu qurtarıb-eləmirəm, deyirəm, qoy gedib yatsın, köpəkoğlu! Amma başın üçün, Mirzə Qələndər, hampadan, dövlətlidən aparan oğruların hələ indiyəcən birini də qoymamışam qəzəmətə girsin.

Qazı ağa gördü ki, bu dəfə də gülsə, bəy özündən çıxacaq, ona görə də, balaca irişməklə kifayətlənib, nökərin gətirdiyi soyuq dovğadan iki çömçə götürüb öz boşqabına tökdü.

Bəy kefli-kefli birdən dərdlənib dedi:

– Rəiyyət köpəkoğlu xeyrini başa düşən döyül, Mirzə Qələndər. Qulağıma çatır ki, kasıblar da daldada mənim qeybətimi eləyirlər ki, "bəy oğrularla əlbirdi", tay demirlər ki, Həsən bəy olmasa, həmən oğrular onların arvadlarının tumanını da aparar! Sən yaxşı eləyib bu rəiyyət arvadlarının gündə birini siğə eləyirsən.

Qazı ağa dedi:

– Bəy, mən şəriətin buyurduğuna xilaf iş görmürəm.

Bəy əlini çənəsinə çəkib dedi:

– Mirzə Qələndər, mənə yox də... Mən gimnaziya qurtarmışam. Özüm də Allaha inanıram, amma siz mollaların alimibiəməlliklərinizi də bilirəm axı.

Bəy bərkdən gülüb əlini qazı ağaya tərəf uzadaraq dedi:

– Mən ölüm, vur gəlsin.

Qazı ağa hal əhli idi. Gülümsəyib şappıltı ilə vurdu bəyin əlinə, bəy nəşəyə gəlib çırtıq vurub oxudu:

Aç xurcunu, kəs almanı,
Ver yara dilim-dilim,
dilim-dilim...

Sonra da divana uzanıb o saat da şirin-şirin xoruldadı.

Qazı ağa da onun üçün ayrılmış otaqda namazını qılandan sonra soyunub yaylı çarpayıda, təzə ipək yorğan-döşəkdə ləzzətlə gərnəşib Kürdobada siğə elədiyi kor qadının suluq kimi ağ, yumşaq bədənini xatırlaya-xatırlaya yuxuya getdi. Dan yerinə işıq düşəndə durub yenə də namazını qıldı. Sonra bəylə qonaq otağında əyləşib axşamdan hazırlanmış cürbəcür yeməklərlə obaşdanlıq elədilər. Bəy həmişə yanında saxladığı qoçaq oğlanlardan birini göndərdi Qarabulağa, Bayram bəyə xəbər versin ki, qazı ağa ilə Həsən bəy axşam gələcəklər onlara.

Həmin bu vaxtlar Yaqut, Həsən bəyin qızları ilə, Abdulla da, oğlanları ilə olurdu. Olurdu deyəndə, yəni, yemək-içməkləri onlarla olurdu. Bəyin iki oğlu, iki də qızı vardı. Qızlarının böyüyü nişanlı idi. Kiçiyi də elə Yaqutla yaşdaş olardı. Bəyin böyük oğlu Kərim bəy Xarkov şəhərində vəkillik oxuyurdu. Kiçik oğlu Əmir bəy də Şuşada realnı məktəbdə oxuyurdu. İndi yay vaxtı olduğundan tətilə gəlmişdilər. Yaqut fikir verib gördü ki, bu oğlanlar səhərdən-axşamacan nişana atırlar, kart oy-

nayırlar, ov eləyirlər. Özü də onların kartda oynadıqları oyunlar tamam başqa cürdü. Onları nə Abdulla bilir, nə Yaqut. Qız onlara fikir verdikcə özünü birtəhər hiss eləyirdi. Elə bil ki, qız bu oğlanı çoxdan tanıyırdı, elə bil ki, bunlara qarşı qızda çoxdan bir doğmalıq varmış. Onlar hər nə eləyirdisə qıza qəribə görünürdü. Bəyin böyük oğlu çox zorlu idi. Bir dəfə Yaqutla Abdulla pəncərədən baxıb gördülər ki, beş-altı cavan oğlan həyətdə dayanıb bərkdən gülüşürlər. Bəyin böyük oğlu Kərim bəy yekə bir eşşəyin quyruğundan yapışıb, oğlanlardan biri də ağacla eşşəyi "çu!" deyə-deyə döyəcləyir ki, yerisin. Ancaq heyvan nə qədər güc verirsə, yerindən tərpənə bilmir. Yaqut da oradakı oğlanlar kimi qəhqəhə ilə güldü. Amma Abdullanın qıza acığı tutdu.

– Onlar axmaq-axmaq işlər tuturlar, sən də gülürsən.

Ancaq cavan tacirin sözləri qızın xoşuna gəlmədi, ürəyində o, zarafatcıl bəy oğlanlarını heç də axmaq hesab eləmədi. Cavan tacir ağıllı da olsa, qadın tayfası barədə təcrübəsiz idi, elə bildi ki, bu qızıl vəznəli, gümüş xəncərli, yaraşıqlı oğlanların axmaqlığı barədə onun dediklərinə nişanlısı inandı. Tay bilmədi ki, sözləri qızın ürəyində onun, yəni, cavan tacirin zərərinə oldu. Tapışdıqları vaxtdan birinci dəfə olaraq nişanlısının belə bir bəy oğlu olmadığına qız ürəyinin dərinliklərində heyfsiləndi. Cavan tacirin geyimi də, ağırbaşlı hərəkəti də qıza indi birdən-birə xoş gəlmədi. Ancaq, necə deyərlər, iş-işdən keçmişdi.

Həsən bəy axşam iftardan sonra üçatlı faytonunu qoşduraraq qazı ağa ilə birlikdə əyləşib getdilər Qarabulağa, Bayram bəyin evinə. Bayram bəy o saat başa düşdü ki, bunlar nəyə gəlib. O biri otaqda Fatma xanım bildi ki, Həsən bəylə qazı ağa nəyə gəlib. Ancaq iki dünya bir olub, biri də heç olsa, Bağdad bəyin nəvəsi Fatma xanımın ürəyi heç zaman bu işlə barışmayacaq. Qoz satan Güney Güzdəkli gədəsi pristav Bayram bəyin kürəkəni olsun?! Qızın əvvəlki nişanlısının atası Hacı Hüseyn rəiyyət də olsa, adlı-sanlı tərəkəmə idi. Vurub-tutan, sayılan adam idi, qoyun sürülərinin, at ilxılarının, bir ucu buradaydı, bir ucu harada... Güney Güzdəkli gədəsi kimdir?! Tərəzi gözünə baxan bir çərçi, (Fatma xanımın ticarət əhlindən zəhləsi getdiyi üçün hamısını "tərəzi gözünə baxan çərçi" adlandırırdı), özü də irtməkli sünnü. Ancaq Bayram bəy başqa cür fikirləşirdi, Bayram bəy uzaqgörən adam idi, baxıb gördü ki, indi dünya ticarətindir. Abdulla da insafən, çox ağıllı, zirək tacirdir. Az vaxtda əməlli-başlı mağaza sahibi olub, hör-

mət, etibar qazanıb, Moskva, Kiyev, Xarkov kimi şəhərlərlə ticarət edir. Qaldı sünnü olmağı... Bayram bəy heylə şeylərə fikir verən döyül. Nə sünnü-şiəbazlıqdı? Bunlar bəy hamısı lotu-potu mollaların uydurmalarıdır.

Bütün bunlara görə də, qazı ağa ilə Həsən bəy barışıq məsələsini açanda Bayram bəy çox ustalıqla özünü tox tutub dedi:

– Vaxta ki, siz gəlmisiniz, nə deyə bilərəm?

Qazı ağa dedi:

– Allah xeyir versin!

Həsən bəy dedi:

– Gərək bu xeyir işin sağlığına bir qədər qırmızı Hadrut şərabı vuraq.

Bayram bəy də gülümsəyib dedi:

– Qazı ağa icazə versə, vurmaq olar.

Həsən bəy dedi:

– Qazı ağa ilə sövdalaşmışıq, biz onun arvadbazlığının üstünü vurmuruq, o da bizim şərab istemal eləməyimizin.

Bayram bəy gülüb Bünyadı çağırıb əmr verdi ki, o biri otaqda süfrə açıb, zirzəmidən də şərab çıxarsınlar.

Bayram bəyin razılığını alandan sonra Güney Güzdəkdən cavan tacirin əmisi Abdulla Əfəndi, başqa qohum-qardaşı gəldi. Qızın kəbini kəsildi, sonra da oğlanla qızı gətirib, Bayram bəylə barışdırdılar.

Fatma xanım nə qızının üzündən öpdü, nə də kürəkəninin üzünə baxdı, ancaq Bayram bəy razılıq verəndən sonra nə eləyə bilərdi?

Cavan tacir külfətini apardı Məşədi Cəlilin mülkündə kirayə tutduğu evə...

...Yazda sənin dayın Nuru ilə Haramıda, alaçığın qabağında, söhbət edirdik. Xaynamaz Qarabulaqdan gəlib xəbər gətirdi ki:

– Yaqutun bir gilasgöz oğlu oldu, yəni, sən dünyaya gəldin, ay Murad! Nuru dayın ona üç manat muştuluq verdi. Sənin babalarının, nənələrinin əhvalatları belə olub, əlbəttə ki, mən ancaq yadıma düşənləri danışdım, kim bilir, onların həyatında daha nə qədər əhvalatlar olub... Neyləmək?.. Bu dünyada igid babalardan, nənələrdən yadımıza düşənlərdən başqa nə qalır ki?..

Möhnət qoca qəlyanından bir nəfəs alıb, üfüqdə gümüş bir xətt kimi parıldayan Araza baxdı...

## MURADIN SÖYLƏDİKLƏRİ

Madam ki, körpəlikdə məni "əllamə" adlandırırdılar, qoy indi də bu əsərdə yaşımdan əvvəl danışmaqda oxucu məni qınamasın. Düzünü deyim ki, lap iki-üç yaşında görüb-duyduqlarımı elə aydın xatırlayıram ki, elə bil, bu zaman mənim on üç-on dörd yaşım varmış... Və bu, məni həmişə əsəbləşdirirdi, çünki mən keçmişləri xatırlamaq istəmirdim. Ancaq bu keçmişlər hər yaşda məni təəccüblü bir aydınlıqla təqib edib, məndən əl çəkmirdi, o qəribə uşaqlıq haqqında bir adama danışmaq ehtiyacı Makedoniyalı İskəndərin dəlləyi kimi məni rahat buraxmırdı.

İndi soruşa bilərsiniz ki, nəyə görə mən, babalarım, qocalarım, atam-anam, dayım haqqındakı bu nağılları özüm haqqında yazdığım bu kədərli hekayətə daxil edirəm? Ona görə ki, mən nə üçünsə öz həyatımı onlardan təcrid olunmuş halda təsəvvür eləyə bilmirdim. Mən qapalı, daxili aləmimdə eyzən onları görürdüm və mənə elə gəlirdi ki, Kərbəlayı İbixanın, Səkinə qocanın, Xanım nənənin, Bayram babamın yaşamış olduqları hissləri, həyəcanları olduğu kimi duyuram və xüsusən kədərli vaxtlarımda bu mənə anlaşılmaz, şirin bir təskinlik olurdu. Mənə elə gəlirdi ki, onların hamısını daim görürəm, onların əhvalatları daim mənimlə yaşayır. Mən atamla anamın bir-birilə tez-tez dalaşmalarını, aylarla bir-birilə küsülü qalmalarını gördükdə, onların qoşulub qaçdıqları yollarda keçirdikləri xoşbəxt anları təəccüblü bir aydınlıqla xatırladıqda, həyatın nə üçün belə olduğuna, nə üçün Bayram babamın bir zaman aşiq olduğu alagözlü, qələmqaşlı Fatma nənəmi indi aylarla dindirmədiyinə cavab tapa bilmirdim və bu, mənimçün gizli bir qüssəyə çevrilirdi.

Hətta indi, yəni, yaşlı vaxtımda dönüb keçmişə baxmaq istəyəndə, elə bil ki, içəridən bir səs təşvişlə mənə deyir: "Geriyə baxma, qoca!" Lakin mən baxmaq istəyirəm. Mən bu keçmişin çox əzablı, çox kədərli olduğunu bilirəm, ancaq yenə də ona təkrar-təkrar tamaşa etmək, nəyisə anlamaq istəyirəm. Bəlkə də bu, mənim "nə isə"ni o zaman babamla nənəmin, atamla anamın bir zamanlar yaşadıqları, xoşbəxt olduqları gözəl hissləri əzaba, kədərə, kinə, nifrətə döndərən qəddar səbəbi bilmək arzum idi ki, indi də məndən əl çəkmirdi...

Mən indi də keçmişsiz yaşaya bilmirdim. Bu keçmiş daim mənimlə idi, zehnim hal-hazırın ən mürəkkəb hadisələrilə çox aydın tərzdə uğraşanda da mənimlə idi. Bəzən ağlım çaşırdı və mənə elə gəlirdi ki,

həyat ancaq bu xatirələrin intəhasız davamından ibarətdir, elə bil ki, bu xatirələr özləri daim yaşayan qəribə bir aləmdir, elə bil ki, hər şey ancaq mənim zehnimdən gəlib-keçən xəyallar silsiləsidir və mən, əgər, əzab, kədər doğuran əhvalatları görməsəm, hər şey gözəl olar. Ancaq təəssüf ki, mən bu əhvalatları görürdüm və adamın əli oda toxunanda diksinib şirin yuxudan ayıldığı kimi, bu əhvalatlar da məni günlərin, illərin adi... çox adi təfərrüatına qaytarırdı.

## ELƏ İSƏ GÖRƏK YAQUT XANIMIN GİLASGÖZ OĞLU İLƏ ADİ GÖRÜNƏN BU HƏYAT NECƏ ƏLBƏYAXA OLDU...

Güclə, yadıma divarları firuzə rəngində kürsülü bir ev gəlir. Biz bu evin iki balaca otağında olurduq. Evin geniş artırması, firuzə rəngli məhəccəri var idi. Məhəccərin üstünə içində qırmızı, sarı qərənfil bitmiş güldanlar qoyulmuşdu və bu qərənfillər mənim yadıma gələn ilk gördüyüm çiçəklər idi, bunlar təbiətin gözəlliyi ilə mənim ilk təmasım idi; bəlkə buna görə idi ki, sonralar da mənim ən çox sevdiyim çiçək qərənfil idi.

Bizim Maral adlı on altı-on yeddi yaşlı bir qulluqçumuz vardı. Göyçək, şən bir qız idi, mən də, demək olar ki, anamdan çox mehrimi ona salmışdım. Bir gün başında tüklü, basma papaq, əynində köhnə yamaqlı çuxa, ayaqlarında çarıq bir kişi gəlib Maralı apardı. Mən gözlədim, Maral gəlmədi, gözlədim, gəlmədi. Sonra: "Maralı istəyirəm!" deyə ağlamağa başladım. Atamla anam məni ovutmağa çalışaraq dedilər:

– Dilənçi gəlib Maralı apardı.

Beləliklə, mən yeni qədəm basdığım bu dünyada ilk dəfə olaraq ayrılıq acısını duydum və bu, mənim ürəyimi uzun zaman kövrəldən ilk kədərim oldu.

Mən bir az böyüyəndə bildim ki, bu "dilənçi" Maralın atası imiş və atamgilin onu "dilənçi" adlandırmaları ürəyimdə mənə toxundu.

...Anam ya əl maşınında tikiş tikər, ya xörək hazırlayar, mən də yerə döşənmiş xalının üstündə oturub, özüm-özümlə oynayardım. Anam iş görəndə astadan zümzümə edərdi. Bekar vaxtlarında isə, içində atlı-qılınclı pəhləvan şəkilləri olan kitablar oxuyardı. Ya da qonşu otaqda yaşayan Bəyim xala ilə söhbət edərdi. Bəyim xala saçları kömür kimi qapqara, arıq, ortaboylu, nəzakətli, zərif bir qadın idi. Evdə də həmişə bütün qızıl zinətlərini taxıb, elə geyinərdi ki, elə bil, toya gedəcəkdi.

Bəyim xala da, əri Daşdəmir əmi də cavanlıqda Xan qızı Natəvanın sarayında xidmət edərmişlər, orada aşiq-məşuq olub, qoşulub qaçıblar. Ona görə qoşulub qaçıblar ki, Xan qızı Bəyimi çox istəyirmiş, fikri də bu imiş ki, onu versin bəy oğlanlarından birinə. Amma Bəyim də vurulub Daşdəmirə. Daşdəmir əmi kök, qırmızı bir kişi idi, özünün də baqqal dükanı var idi. Bəyimlə evlənəndən sonra Şuşada Bayram babamın köməyi ilə Daşdəmir əmi əvvəl uryadnik olub, uzunboğaz çəkmə geyib, furajka qoyub, qılınc asıb, paqon taxıb. Bir az maya düzəldəndən sonra keçib ticarətə.

Onların məndən iki-üç yaş böyük bir oğlu vardı. Özü də ağıldan kəm idi. Onunla oynamaq üçün mən tez-tez onlara qaçırdım. Ancaq oğlan mənimlə oynamayıb, qıyıq gözləri ilə eyzən boşluğa baxaraq öz-özünə anlaşılmaz sözlər danışırdı. Məndən iki yaş kiçik olan bacım Mahtab ondan qorxurdu. Bəyim xala oğlu ilə elə danışırdı ki, elə bil, oğlan ağıllı-başlı adam idi. O, nadinclik eləyəndə Bəyim xala sakit, mehriban səslə deyirdi:

– Fazil, ağıllı ol.

Fazili həmişə təmiz, qəşəng geyindirərdilər. Daşdəmir əmi hər gün onun üçün konfet, şəkərçörəyi alıb gətirərdi. Mən dayanıb Fazilin öz-özü ilə oynamağına tamaşa edərdim. O da mənə baxmadan:

– Ay qutu... qutu, – deyə-deyə əlindəki balaca ətir qabını hey o tərəf-bu tərəfə çevirərdi.

Fazil xəstələnəndə Bəyim xala ilə Daşdəmir əmi əldən-ayaqdan gedərdilər. Gecə səhərə qədər uşağın çarpayısının böyründə oturub keşiyini çəkərdilər. Onların, yəni, Daşdəmir əmi ilə Bəyim xalanın Fazili bu qədər əzizləmələri, onunla ağıllı uşaq kimi rəftar etmələri mənim ürəyimi kövrəldirdi, mənim Fazilə daha çox yazığım gəlirdi.

Bu, mənim həyatda insan faciəsi ilə ilk tanışlığım idi.

Atam şəhərin kənarında, səfalı bir yerdə özümüz üçün ikimərtəbə, böyük ev tikdirirdi. Anam da tez-tez üstündə qırmızı güllər olan qanavuz çarşabını örtərək bizi də götürüb təzə evimizə baxmağa gedərdi. Atam bizim gəlişimizlə fərəhlənib evin ayrı-ayrı otaqlarını, mətbəxin necə olacağını anama izah edərdi. Anam da çarşabını açıb, artıq hörgü işi qurtarmaqda olan otaqları, böyük sahəli bağımızda atamın əkdirdiyi meyvə ağaclarını, gülləri həvəslə nəzərdən keçirərdi, artırmanın geniş, pəncərələrin iri olmağını istəyirdi. Mən də balaca bacımla bağda

ora-bura qaçıb, quşların bizdən hürküb pırıltı ilə uçmağından, sağsağanın sevinclə səslənməsindən ləzzət alırdım.

Kirayədə olduğumuz evin dar, yarıqaranlıq həyətindən sonra, elə bil ki, zambaq kimi gömgöy səmanın altındakı bu geniş, cavan bağımızda azadlığa çıxırdıq. Təzə-təzə boy atan alma, armud, gilənar ağacları, yenicə qalxan təzə yoncalıq bizə hədsiz sevinc gətirirdi. Biz nəşə ilə qışqıraraq alabəzək kəpənəklərin ardınca yüyürürdük.

Mən ilk dəfə olaraq təbiətin gözəlliyini, quşların, kəpənəklərin, yeni-yeni yarpaqlayan cavan ağacların, təzə qalxan yoncaların sevincini hiss edirdim. Amma öz təzə bağçamızdan ayrılıb kirayə tutduğumuz evə gələndə ürəyimə məyusluq çökürdü. Hər şey mənə bu balaca, yarıqaranlıq həyət kimi tutqun görünürdü. Bəyim xalanın döşəkcəsinin üstündə əyləşib sükut içində nə isə tikməsi, Fazilin gözlərini boşluğa zilləyərək, "ay qutu, qutu" deyə-deyə əlindəki balaca qutunu oynatmaqdan usanmaması məni kədərləndirirdi, mən heç bir səbəb olmadan ağlamaq istəyirdim. Atamın da öz mədaxilini, məxaricini ciddi ifadə ilə hesablayıb yaşıl karandaşla balaca dəftərçədə səliqə ilə qeydlər eləməsi məni darıxdırırdı. Mən bir guşəyə çəkilərək təzə bağçamız haqqında, zanbaq kimi mavi göy haqqında, nəşə ilə uçuşan quşlar haqqında, bizimlə oynaşan kəpənəklər haqqında xəyallara dalırdım.

Bunlar müəyyən bir əhvalat ətrafında birləşməyərək, müxtəlif boyalarla, müxtəlif sözsüz kadrlarla gözümün qabağından gəlib-keçirdi. Həyatımda birinci dəfə olaraq mən quşların, kəpənəklərin azadlığını və bu azadlığın nəşəsini hiss edirdim. Birinci dəfə olaraq bu azadlığa həsəd aparırdım. Birinci dəfə olaraq mənim qəlbimdə ata-anama məlum olmayan qapalı bir dünya yaranmağa başlayırdı. Birinci dəfə olaraq mən, tez-tez təklənərək, real həyatdan uzaqlaşıb bu xəyal aləminə qapanırdım və bu xəyal aləmi mənə real həyatdan daha şirin, daha gözəl görünürdü. Mənimlə çox az gülüb-danışan və anamla daima öz işləri haqqında söhbət eləyən atamın ciddiliyinə qarşı məndə bir soyuqluq əmələ gəlirdi. Onun geniş alnı mənə həddindən artıq sərt görünürdü. Və mən tez-tez Maralı xatırlayırdım. Onun məni sevməsi, gülüşü, zarafatları, Qaçaq Nəbi haqqında oxuduğu mahnıları artıq geriyəqayıtmaz, xoşbəxt günlərim kimi acı xatirələrə çevrilirdi. İndi içində yaşadığımız otaq mənə həddindən artıq darısqal və boğucu görünürdü. Mən tez-tez gecələr qorxulu röyalar görüb yuxuda ağlayırdım.

## BİZİM TƏZƏ EVİMİZƏ KÖÇMƏYİMİZ VƏ DƏFTƏRXANA KAĞIZLARININ GÖYƏ SOVRULMASI

Nəhayət, atamın tikdirdiyi binanın bir tərəfi hazır olandan sonra biz kirayədə olduğumuz evdən ora köçdük. Hamımız bayram içindəydik. Mən də, bacım da, anam-atam da təzə paltar geyinmişdik. Anam brilyant qaşlı qızıl bilərziklərini, aypara şəklində olan qızıl silsiləsini taxıb ortasında göz kimi iri yaqut olan enli, qızıl kəmərini bağlamışdı, ayaqlarında dikdaban lak tufli var idi və bütün bunlar mənim, onsuz da, gözəl anama fövqəladə bir yaraşıq verirdi. Onun gözəl, duru gözlərində bir sevinc duyulurdu və bu, məni xoşbəxt edirdi. Mən həmişə anamı şən görəndə özümü xoşbəxt hiss edirdim. Həmişə çox ciddi, işgüzar bir adam olan atam da bu gün deyib-gülürdü. Təzə evimizin, bağçamızın barəsində anamın tərifinə məmnuniyyətlə qulaq asırdı. Atamın bu cür şadlığı, tez-tez gülüb zarafat eləməyi məni sevindirirdi.

Bir də gördük ki, adamlar səs-küylə dəftərxanaya sarı yüyürürdülər.

Atam, anam, ustalar söhbətlərini kəsib təəccüblə ora baxdılar. Sonra gördük ki, adamlar dəftərxanaya doluşdular. Sonra daha qəribə bir hadisə oldu: adamlar dəftərxananın kağız-kuğuzunu pəncərədən, qapılardan bayıra tullayırdılar, kağızlar da havada uçuşaraq ətrafa səpələnirdi. Sonra çinovniklər bayıra çıxaraq paqonlarını qoparıb atırdılar.

– Bu nə əhvalatdır? – deyə anam təəccüblə soruşdu.

Atam ona cavab verməyərək, pilləkəni tez-tez düşüb dəftərxanaya tərəf yüyürdü. Sonra gördük bir kişi içəridən gətirdiyi kətilin üstünə çıxıb əllərini ölçə-ölçə nə isə danışmağa başladı. Sonra bütün izdiham birdən-birə hərəkətə gəlib qışqırdı:

– Urra!!!

Pəncərələrdən hey atılan kağızlar havada ağarışırdı.

Nəhayət, atam da, ustalar da qayıdıb gəldilər. Atam həyəcanla anama dedi:

– Nikolayı taxtdan salıblar!

– Heylə şey olmaz, – deyə anam təəccüblə səsləndi.

Binamızın o başında işləyən erməni usta Qara dedi:

– Niyə olmur?! İnqilabçılar çoxdan əlləşirdilər ki, ikibaşlı qartalın boğazını üzsünlər.

Mən ustanın sözünü düzünə başa düşərək: "Qartalın da iki başı olarmı?" deyə təəccüblə düşündüm. Lakin mən bu barədə heç nə soruşmağa cəsarət eləmədim, çünki atam dəfələrlə mənə acıqlanmışdı

ki, böyüklərin söhbətinə qarışmayım, bu tapşırıq da mənimlə böyüklər arasında getdikcə bir səddə çevrilirdi, saysız-hesabsız suallırım ürəyimdə qalırdı.

Atam papiros büküb yandıraraq dedi:

– Yəqin kişi də bu gün-sabah gələr.

Atam Bayram babama həmişə "kişi" deyirdi.

Nikolay taxtdan yıxılanda Bayram babam qonşu qəza rəisinin müavini idi.

Anam qayğı ilə dedi:

– Yəqin ki, yollar qarışıqlıq olacaq.

Atam dedi:

– Kişiyə nə qarışıqlıq, onu aləm tanıyır.

Anam dedi:

– Az düşməni yoxdur ki?..

Atam dedi:

– Heç nə olmaz.

Mən Bayram babamın gələcəyini eşidib sevinclə soruşdum:

– Nə vaxt gələcək babam?

Atam mənə sərt bir nəzər salıb acıqlı-acıqlı dedi:

– Sənə yüz dəfə tapşırmışam ki, böyüklər söhbət eləyəndə dayanıb gözünü onların ağzına dikmə! Uşaqsan, get oyna.

Həmişə atam mənə acıqlananda anam məni müdafiə edirdi, indi də mənim pərt olduğumu görüb atama dedi:

– Uşaq söz soruşur də... Pis şey eləmir ki?..

Mən ağlayacağımı hiss edərək iri daş pilləkəni düşüb bağdakı tut ağacına söykəndim. Burada məni heç kəs görmürdü, mən də heç kəsi görmürdüm. Mən ağaca söykənib ağladım. Hər dəfə atamın danlağına qarşı anamın məni müdafiə eləməsi ürəyimi kövrəldirdi. Sonra mən gözümün yaşını pencəyimin qolu ilə silib bayaq dəftərxananın qabağındakı hadisəni xatırladım. Sonra ikibaşlı qartalın necə olduğunu təsəvvürümə gətirməyə çalışdım və bunun padşaha nə dəxli olduğunu təəccüblə düşündüm. Sonra onu da düşündüm ki, axı, padşahı taxtdan kimlər və necə yıxırlar? Mən elə bilirdim ki, padşah anamın danışdığı "Min bir gecə" nağıllarındakı kimi, tilsimli bir qalada qızıl taxt üstündə əyləşmişdir. Onun o tərəf-bu tərəfində isə bir əlində qalxan, digər əlində uzun nizə tutmuş pəhləvanlar dayanmışdılar və bu pəhləvanlar da Rüstəm Zal kimi güclüdürlər. Ona da təəccüb edirdim ki, adamlar mənim həmişə həsədlə tamaşa elədiyim qızıl zərli paqonları niyə qo-

parıb atırdılar? Nə üçün sevinirdilər? Elə bu zaman altında dayandığım tut ağacına bir sağsağan qonaraq mənə baxıb sevinclə səsləndi. Həmişə sağsağan gəlib Bayram babamgilin bağında elə səslənəndə Fatma nənəm şadlanıb deyirdi:

– Xeyir xəbər sağsağan, oğlunun oğlu olub, qızının da oğlu olacaq.

Tut ağacına qonmuş sağsağan mənə baxıb susur, sonra yenə sevinclə səslənirdi. "Yəqin ki, sağsağan babamın gələcəyini mənə xəbər verir!" deyə mən şadyanalıqla düşündüm.

...Dəftərxananın kağızları cırılıb göyə sovrulandan sonra bizim balaca şəhərin küçələrində silahlı, patrondaşlı adamlar peyda oldular. Mən evimizin küçə qapısında oturub saatlarca onlara tamaşa edirdim. Onlar iri, hündür atlarını ora-bura çapır, bərkdən danışıb-gülüşürdülər. Sonra evimizdə iki tüfəng və çoxlu patron gördüm. Gecələr isə, bizim böyük qonaq otağımız qonaqla dolu olurdu. Bu zamanlar evimiz tamam tikilib qurtarmışdı. Böyük zalı qiymətli xalı-gəbə ilə döşəyərək qonaq otağı eləmişdilər. On dörd-on beş yaşlı nökərimiz Qüdrət balaca armudu stəkanlarda qonaqlara çay, çini boşqablarda cürbəcür xuşgəbər aparırdı. Anam da qonaq otağına bitişik otaqda oturub onların söhbətinə qulaq asır, bizi, yəni, bacım Mahtabla məni səs eləməyə qoymurdu. Mən böyük zalda hey "hürriyyət, Rusiya, məşrutə" sözlərini eşidirdim, axır səbr eləməyib anamdan soruşdum ki, onlar nə barədə danışırlar?

– Sən bilən şeylər deyil, – deyə anam qısa cavab verdi. Nökərimiz Qüdrətdən iki-üç yaş böyük olan qulluqçumuz Zinyət pıçıltı ilə məni başa saldı ki, "onlar padşahın yıxılmağından danışırlar".

Bütün bu işlər isə, mənim zehnimdə tamam bir qarmaqarışıqlıq əmələ gətirmişdi. Mən gecələr yerimə girəndən sonra gündüz görüb eşitdiyim bu həyəcanlı hadisələri dərk etməyə çalışırdım, lakin hər şey məndən uzaq və anlaşılmaz idi, ata-anamın bu əhvalatlar barədə mənə heç nə deməmələri, məni saymamaları ürəyimi ağır hisslərlə sıxırdı, bütün xarici mühiti, hətta, ata-anamı belə, özümə qarşı biganə hiss edirdim.

Sonra evimizdəki söhbətlərdən bilirdim ki, yollarda, kəndlərdə soyğunlar başlayıb, gecə evlərə hücumlar olur, hökumət olmadığı üçün hər kəs bildiyini eləyir.

...Bir gün də atam şəhərdən gəlib, həyəcanla anama xəbər verdi ki, Nikolayın İran sərhəddində olan qoşunları gəlib-gedir Yevlağa ki, oradan da qatarlarla daşınıb getsinlər Rusiyaya.

– Nə üçün? – deyə anam soruşdu.

Atam papiros bükə-bükə dedi:

– Bizimkilər dinc oturmurlar, yolları kəsiblər ki, İran sərhəddindən qayıdan çar qoşununu qırsınlar, yəqin işdir ki, bu asan məsələ deyil, qoşunun topu var, pulemyotu var, onunla bacarmaq olar?!

Atam papirosunu yandırıb əlavə etdi:

– Çarın qisasını qoşundan almaq istəyirlər.

Anam dedi:

– Qoşun özbaşına deyildi ki?.. Yazıq soldatların nə günahı var?

– Onu kimə başa salmaq olar?.. Özü də qoşun gəlib burdan keçəcək! – Atam əli ilə bizim evin yaxınlığından keçib Yevlax stansiyasına gedən şose yola işarə elədi.

– Əgər, qoşunla atışmağa başlasalar, onlar da şəhəri topa tutacaqlar, ona görə də, siz burda qala bilməzsiniz.

– Burada qalmayıb hara gedəcəyik? – deyə anam soruşdu.

– Biz üç-dörd adam qərara almışıq ki, qoşun gəlib-keçənə qədər arvad-uşaq yığılsın Məşədi Qurbanın evinə. Ora daldadır. Yevlax yolundan atılan güllələr oranı tutmaz.

Anam papiros yandırıb dinmədi. Mən hiss elədim ki, anam bu məsələdən narazıdır, görünür, Məşədi Qurbanın evinə sığınmaq onun xoşuna gəlmirdi.

Məşədi Qurban ucaboy, enlikürək, qartalburun bir kişi idi. Özü qəssab olsa da, şəhərdə sayılan adam idi. Qoyun sürüləri, çobanları var idi. Bizlərdə o adama sayılan deyərdilər ki, atıb-vuran olsun, heç kəs onun bir sözünü iki eləyə bilməsin, əlsiz-ayaqsızları müdafiə eləsin.

Məşədi Qurbanın beş-altı otaqdan ibarət birmərtəbəli evinə bizdən başqa qohum-qonşudan da üç-dörd ailə yığılmışdı. Ev qalın bağın içindəydi. Ev sahibi qoyun kəsir, arvadlar da qapıda qalanmış ocaqların üstündə iri mis qazanlarda xörək bişirirdilər. Hamı həyəcan içində idi, kişilər topa dayanıb söhbət edirdilər. Məşədi Qurban hamıdan sakit görünürdü, qısa çubuqlu qəlyanını tüstülədə-tüstülədə adamların söhbətinə qulaq asırdı. O öz sakitliyi ilə mənə əzəmətli görünürdü. Bağın qalınlığında zəncirə bağlanmış atlını atdan salan iri itlər, adamların həyəcanlı üzləri və Məşədi Qurbanın təmkini mənim xəyalımı çəkib Möhnət qocanın söylədiyi nağıllara aparırdı. Mən atamın arxa tərəfində hərlənərək kişilərin söhbətinə qulaq asırdım və atam hərarətlə deyirdi:

– Canım, bizimkilər ağılsız hərəkət eləyirlər, axı. Niyə qoymurlar qoşun çıxıb getsin yerinə-yurduna?! Niyə xalqı qırğına verirlər?!

– Düzdür, canım, – deyə Baqqal Daşdəmir əmi həyəcanla səsləndi, – tutaq ki, üç-dörd yüz soldat qırdılar, nə olacaq?

– Axı, niyə qırasan? Soldat olanda nə olar? – deyə atam həyəcanla dedi. – Onun da ata-anası var, vətəni var. O durub öz xoşu ilə gəlməyib ki, bura.

Qarnı özündən yarım metr qabağa çıxan erməni dərzi Santi təsdiq etdi:

– Elədi, elədi... A balam, yazıq deyillərmi?..

Səhərdən bəri uzaqdan səs-küy, at ayağının tappıltıları eşidilirdi. Sonra bu səslər bir-birinə qarışıb boğuq bir uğultuya çevrildi... Sonra getdikcə yaxınlaşan güllə səsləri eşidildi.

Atam dedi:

– Yəqin ki, qoşun girdi şəhərə!

Məşədi Qurban qəlyanını ağzından götürüb sakit səslə nökərlərinə əmr etdi:

– Tüfənglərinizi götürün çıxın yola.

Sonra bağdan o tərəfdəki hündürlüyü göstərib dedi:

– Yoldan keçən qoşuna güllə atmayın. İşdir, əgər görsəniz, evlərə hücum-zad olur, onda bir təkini də sağ buraxmayın. Heylə olsa, biz də gələcəyik!

Hərəsi iki-üç patrondaş bağlamış beş oğlan tüfənglərini götürüb sevinclə yüyürdülər yala, elə bil ki, toya gedirdilər.

Sonra Məşədi Qurban nə fikirləşdisə, qəlyanının külünü yerə çırpıb, uzun, şal pencəyinin cibinə qoyaraq iti addımlarla evə girib, iki kəmər patron və gödək bir beşatılan götürüb onların ardınca getdi. Atam arxadan səsləndi:

– Məşədi, biz də gələkmi?

– Yox, – deyə kişi cavab verdi, – siz arvad-uşağın yanında olun.

Atışma getdikcə şiddətlənirdi. Dərzi Santi lap dilxor olmuşdu:

– Keçmə siz türklərin də belə işlərindən. Ay canım, qoyun yazıqları çıxıb getsinlər dayna...

Baqqal Məşədi Əlibala yana-yana təsdiq etdi:

– Vallah, düz deyirsən, Santi. Hökumət ki, yıxıldı, gədə-güdənin öhdəsindən gəlmək olar? Hərə bir tüfəng götürüb qalxıb atın belinə, qorxumuzdan dükanımızda oturub çax-çuxumuzu da eləyə bilmirik.

Mənim isə gözüm Məşədi Qurban əmigilin tüfənglənib getdiyi yalda idi, gözləyirdim görək nə vaxt onlar atışmağa başlayacaqlar... Amma onlar atışmırdılar.

Atam dedi:

– Görünür, qoşun atışa-atışa yoluna davam edir, şəhərlə işləri yoxdur.

Dərzi Santi hərarətlə dedi:

– Canım, o yazıqlar öz başlarının hayındadır. Axı, şəhərlə nə işləri var?.. Sizinkilər dinc durmurlar da.

Məşədi Qurbanın Xorasandan alıb gətirdiyi arvadı Zəhra xala da arvad-uşağa ürək-dirək verib deyirdi:

– Qorxmayın, heç nə olmayacaq.

Zəhra xala milliyyətcə fars olub, ucaboylu, qaragözlü, əsmər bir qadın idi, özünün də azərbaycanca qəribə, şirin ləhcə ilə danışmağı hamıya xoş gəlirdi, qonum-qonşu xətrini çox istəyirdi.

Axşama yaxın atışma tamam kəsildi. Məşədi Qurban əmigil yaldan qayıdıb gəldilər.

Həmin günün səhəri dəhşətli bir hadisə oldu. Anam bağın aşağısında, çəpərin yanında durub o biri həyətdə dayanmış özü kimi cavan bir qadınla söhbət edirdi. Böyüklərin hər söhbətini eşitməyə marağım olduğu üçün mən də onların yanında oynayıb nə barədə danışdıqlarını bilmək istəyirdimsə də, heç nə başa düşmürdüm. Birdən elə bir gurultu eşidildi ki, yer titrədi, evin şüşələrindən bir neçəsi sınıb töküldü.

– Ora bax, ora bax! – deyə anam çəpərin o biri üzündəki cavan qadına qışqıraraq, əli ilə göyü göstərdi və mən də baxdım: tüstü basmış şəhərin üstünə daş, torpaq, aydın seçə bilmədiyim cürbəcür şeylər tökülürdü. Anam mənim əlimdən tutub evə tərəf qaçdıqda, indicə düz onun dayandığı yerə gurultu ilə yekə bir daş düşdü. Əgər, anam ikicə saniyə oradan gec aralansaydı, daş düz onun üstünə düşəcəkdi... (Görünür, tale onu daha dəhşətli əzablar üçün saxlayırmış).

Şəhərdən qorxunc səslər eşidilirdi. Bir azdan gördük ki, Məşədi Qurban əminin nökərlərindən kimi çiynində bir yeşik patron, kimi dörd-beş tüfəng, kimi cürbəcür parça topları gətirdi. Nökərlərdən birinin isə qaşları, kirpikləri odda ütülmüşdü, üzündə, əllərində yanıq yerləri vardı. Amma paltarından su axırdı. Atamgil onları dövrəyə alıb sorğu-suala tutmuşdular. Məlum oldu ki, çar zamanından qalmış silah anbarını adamlar dağıtdıqları zaman kiminsə papirosundan dinamit

çəlləyinə od düşüb, anbar partlayıb... Üz-gözü yanıb ütülmüş oğlan deyirdi:

– Camaat anbardakı şeylərin üstünə elə tökülüşmüşdülər ki, ağız deyəni qulaq eşitmirdi. Adamlar bir-birinə macal verməyib, nə bacarırdı, dartışdırıb aparırdı. Bu vaxt birdən elə bir gurultu eşidildi ki, mən əvvəlcə nə olduğunu başa düşmədim. Gördüm ki, od-alov dünyanı bürüdü, sonra elə bil ki, məni bu cəhənnəmin içindən göyə tulladılar. Göydə alovlanan adamlar "Allah, sən saxla! Ya Allah" deyə qışqırırdılar. Hiss eləyirdim ki, mənim də çuxam yanır... Sonra, elə bil, məni yerə çırpdılar. Qalxıb özümü atdım Çərəkənə (həmin hərbi anbar Çərəkən deyilən arxın qırağında tikilmişdi), yoxsa yanacaqdım.

...Sonra atamgil şəhərdən xəbər gətirdilər ki, hərbi anbarın partlaması nəticəsində yüzlərlə adam həlak olub... Sonra həlak olanlar arasındakı tanışları sadalayırdılar...

Sonra biz öz evimizə qayıtdıq. İkinci mərtəbəyə çıxanda gördük ki, artırmaya açılan qapıların yuxarı tərəfləri güllədən dəlmə-deşikdir. Atam qapıları nəzərdən keçirib anama dedi:

– Fikir verirsən, bütün güllələr qapıların yuxarı tərəfinə dəyib, soldatlar gülləni havaya atırmışlar. Demək qoşun bizim adamları vurmaq fikrində olmayıb, başlarının üstündən havaya atırmışlar ki, çıxıb getmələrinə mane olmasınlar.

Mən düşüb bağımızın qalın yerindəki həmin iri tut ağacının yanına qaçaraq onun da xeyli yarpağının dəlik-deşik edildiyini, bəzilərinin qırılıb yerə töküldüyünü gördüm. "Demək, bunları da qoşunun atdığı güllələr qırıb töküb" deyə düşündüm və birdən mənə elə gəldi ki, tut ağacı da sükut içində dayanıb kədərlə mənə baxır. Elə bil ki, məndən soruşur: "Axı, bu nə işdi?" Elə bu gündən də mənimlə bu tut ağacı arasında mehriban ünsiyyət başladı. Mən də heç vəchlə başa düşmürdüm ki, nə üçün o soldatlar uzaq-uzaq yerlərdən gəlib İranla bizim aramızda olurdular. İndi niyə çıxıb gedirdilər? Niyə bizim camaat onları qırmaq istəyirdi? Nə üçün o qədər barıtı, dinamiti, patronu yerin altındakı anbarda gizləyib saxlayırdılar ki, onlar da partlayıb adamları göyə sovursun? Yazıq adamlar... Lakin elə bu anda da mənim həmin həlak olan adamlara acığım tutdu. Axı, onlar nə üçün anbarı dağıdırdılar? Oradakı şeylər ki, onların deyildi. Məşədi Qurban əminin öz nökərlərini anbardan qarət şeyləri daşımağa göndərməsi buradaca yadıma düşdü və bu əhvalat mənim gizli bir maraqla tamaşa elədiyim ucaboylu, enlikürək, qartalburun Məşədi

Qurbanı sanki gözümdən saldı. Sanki onun təmkini, əzəməti yox olub getdi. Mən həyatımda birinci dəfə olaraq adamların daxilində nə isə mənə məlum olmayan yırtıcı – qorxulu bir şeyin varlığını hiss eləyirdim... Və mən bu gərgin hisslərlə yarpaqları güllədən deşik-deşik edilmiş tut ağacına baxırdım. Mənə elə gəlirdi ki, o da mənim fikrimdən keçənləri düşünür... O da təəccüb edir və elə yenə buradaca aşıqların Qaçaq Nəbi haqqında oxuduqları bir mahnı yadıma düşdü:

Nəbinin bığları eşmə-eşmədi,
Papağı güllədən deşmə-deşmədi...

Demək, Nəbinin düşmənləri buradan gəlib-keçən soldatlar kimi, gülləni havaya atırmışlar, düz onun başına atmırmışlar! Sonra da... Sonra da öz yoldaşı Nəbini yatdığı yerdə namərdliklə vurub öldürüb... Namərdliklə! Tez-tez Bayram babamdan eşitdiyim "mərdlik", "namərdlik" sözləri mənim xəyalımda sehrli bir qüvvəyə malik idi. Amma indi, elə bil, o sözləri bürüyən duman yavaş-yavaş çəkilirdi: mən mərdliyin, namərdliyin nə demək olduğunu anlamağa başlayırdım. Nağıllarda eşitdiyim mərd qəhrəmanlar bütün faciəvi çalarları ilə xəyalımda canlanırdı və onlar mənim ürəyimi məhəbbətlə kövrəldirdi.

Qardaşlarının Məlikməmmədi quyuya salmaları məndə onlara qarşı sonsuz bir nifrət doğururdu, zümrüd quşunun Məlikməmmədi zülmət dünyasından belində gətirib işıqlı dünyaya çıxarması məni sevindirirdi. Mən igid Nəbinin də, Məlikməmmədin də çöhrələrini gözümün qabağına çox aydın gətirdiyim halda, Nəbini yatdığı yerdə vuran, paxıllıq ucundan Məlikməmmədi quyuya salan namərdlərin nə şəkildə, nə üzdə adamlar olduqlarını heç vəchlə təsəvvür eləyə bilmirdim. Onlar xəyalımda bəzən əcaib, eybəcər məxluqlar kimi, bəzən buynuzlu divlər şəklində, bəzən də vahiməli bir tüstü içində canlanırdılar, amma mən Məlikməmmədin, Qaçaq Nəbinin, kasıblara əl tutması ilə məşhur olan igid Qaçaq Süleymanın nəinki gözəl çöhrələrini (mənə elə gəlirdi ki, onlar ancaq gözəl ola bilərlər) aydın görürdüm, hətta, mən onları özümə olduqca yaxın adamlar hesab edirdim. Mən saatlarla onlar haqqında düşünüb xəyala dalırdım. Mən bu qəhrəmanları həmişə də, nə isə, fövqəladə bir fədakarlıq göstərdikləri halda, məsələn, divlərin tilsimə salıb dustaq elədikləri halda, gözəl bir qızı, ya xəyanətlə quyuya salınmış cavan oğlanı xilas etmələri şəklində təsəvvür edirdim.

## SUÇU İMAN KİŞİ

Bizim alt otaqlardan birində İman kişi adlı suçumuz olurdu. O, həm bizə, həm də yaxın qonşulara kəhrizdən iri mis sənəkdə su daşıyırdı, bunun da əvəzində ona hər sənəyin suyu neçə qəpiyə isə, pul, ya da xörəkdən-zaddan verirdilər. İman kişi evdə də, çöldə də eyzən öz-özünə danışırdı. Evdə olanda cındır keçə parçasının üstündə əyləşib kürkünü, ya şalvarını yamaya-yamaya hey özü-özü ilə danışırdı, mən də qabağında çömbəlib ona qulaq asırdım. O isə, mənə fikir vermədən deyirdi:

– Yer oğlu bir qıy vurub qalxdı göyə.

Mən soruşurdum:

– İman kişi, kimdir Yer oğlu?

O mənə cavab vermədən bu cür anlaşılmaz şeylər danışır, bəzən gülməkdən qəşş edirdi. Haradansa əlinə keçmiş, vərəqləri saralıb didik-didik olmuş bir kitabı gözünün qabağına tutub, guya, oxuyurdu:

– Quranın Quran olsun...

O, bu kitabı Quran hesab eləyərək həmişə başının altına qoyurdu. İman kişinin başqa qəribə işləri də vardı; məsələn, onun yanında qara daşın adını tutmaq olmazdı. Hirslənib həmişə əlində gəzdirdiyi ağacla adamın baş-gözünü əzərdi. Bunu bilən uşaqlar da küçədə onu görən kimi:

– İman kişi, qara daşa lənət! – deyə qışqırışıb ona sataşardılar.

İman kişi də onları qovub tuta bilmirdi, qara daşı belə müqəddəs hesab elədiyi halda qara toyuqla düşmən idi. Harada qara toyuq görsə idi, selbə ilə vurub qılçını sındırırdı. Ona görə də, adamlar İman kişini görən kimi, qara toyuğu qovub onun gözündən uzaqlaşdırırdılar. Mən bir dəfə soruşdum ki:

– İman kişi, niyə qara toyuqla düşmənsən?

Dedi:

– Qızbəs qara toyuğa cadu eləyib.

Qızbəs xala "harda aş, orda baş" olan, xeyirdə, şərdə həmişə birinci iştirak eləyən, qız-gəlinin qaşını alan, qadın toylarında məzəli sözlər danışıb qaravəlli çıxaran, gəlinlərə yengə olan bir arvad idi.

Bir dəfə biz artırmada oynadığımız zaman küçədə arvad qışqırığı eşidib, dal qapıya yüyürdük. Gördük İman kişi Qızbəs xalanın qolundan yapışıb ağacla budayır, arvad da bağırır. İman kişi qəzəblə deyirdi:

– Köpəkqızı, camaatın toyuqlarına niyə cadu eləyirsən?

Qonşu kişilər yüyürüb Qızbəs xalanı güclə onun əlindən aldılar.

Bizim alt evlərdən birində də Kəklik xala adlı, saçları, kirpikləri, bütün bədəni dümağ, kasıb dul bir qadın olurdu. Kəklik xalanın dörd oğlu vardı. Kiçiyi on bir-on iki, böyüyü isə iyirmi yeddi-iyirmi səkkiz yaşlarında olardı. Arvad özü də, oğlanları da ona-buna günəmuzd işləyərək birtəhər dolanırdılar. İman kişi indi də Kəklik xalanı qaralamışdı. Nə üçünsə kişiyə elə gəlirdi ki, Kəklik xalanın gözləri görmür. Hey öz-özünə danışırdı:

– Zalım qızına deyirəm sən öləsən, öz sidiyindən tök, gözünü sidiklə yu, açılsın. Eləmir ki, eləmir...

İman kişinin xoşu gələn bir məxluq vardısa, o da mənim kiçik bacım Mahtab idi. O zaman Mahtabın üç-dörd yaşı olardı. İman kişi qonşuların suyunu verib evə gələn kimi biz də yüyürürdük onun yanına. Görürdün ki, İman kişi mənim anamın, qonşuların verdikləri xörəklərin hamısını saxsı çanaqda bir-birinə qatıb ağac qaşıqla yeyir. Bacım Mahtabı görən kimi:

– Gəl papılı balam (bu “papılı” İman kişinin özünün icad elədiyi söz idi), gəl otur, – deyirdi.

Mahtab da onun qarşısında, köhnə keçə parçasının üstündə oturandan sonra İman kişi yeməkdən bir qaşıq onun ağzına qoyurdu, birini də öz ağzına. Evdə anamgilin zorla yemək yedirtdikləri Mahtab, İman kişinin bu əcaib xörəyini ləzzətlə yeyirdi. Anam bunu görəndə özündən çıxırdı. Qızı qucağına götürərək qulağını çəkib, İman kişiyə acıqlanırdı:

– Sənə yüz dəfə demişəm, uşağa yemək vermə.

Ancaq İman kişi evə gələn kimi Mahtab yenə də gözdən oğurlanıb onun yanına qaçırdı. Yenə də İman kişi “papılı balam” deyə-deyə öz qaşığı ilə qıza həftəbecər yedirdirdi.

İman kişinin həyatı mənim üçün tamamilə yeni bir aləm idi. Bu aləm məni ona görə o qədər maraqlandırırdı ki, mənim özümün də bu həyatdan xaricdə bir aləmim yaranırdı. İman kişinin heç kəsi yox idi. Heç kəs onun haradan gəldiyini, harada, hansı ölkədə, hansı obada doğulduğunu bilmirdi. Hamı onu dəli hesab eləyirdi. Ancaq İman kişinin hey öz-özünə danışmağı, bəzən gülməyi, bəzən qəzəblənməyi mənə nağıllarda eşitdiyim cadugərlərin hərəkətlərini xatırladırdı. Fikirləşirdim ki, bəlkə bu kişi ayrı, tamam başqa bir dünyadan gəlib? Bəlkə, doğrudan da, qara daşa lənət oxumaq olmaz?! Bəlkə, Qızbəs xala həqiqətən də cadugərdir? Bəlkə, arvad, doğrudan da, qara toyuğa cadu

eləyib? Əlbəttə, mən cadunun nə demək olduğunu bilmirdim. Ancaq bununla belə, o elə öz anlaşılmazlığı ilə məni vahimələndirirdi. Bu vahimələri qulluqçumuz Zinyətin Cin dərəsi haqqında danışdığı şeylər də gücləndirirdi.

Azca çopur, uzunburun bir qız olan Zinyət, Bayram babamgilin obası Kürdobadan idi. Kürdobanın qışlağında "Cin dərəsi" adlanan yiyəsiz bir dərə vardı. Zinyət danışırdı ki, gecələr cinlər o dərəyə yığılıb toy çalıb oynayırdılar. And içirdi ki, qoca Mustafaoğlu Mehdi gecələr Haramılardan qışlağa qayıdanda neçə dəfə onları gözü ilə görüb, cinlər kişini tutub oturdublar ki, qonaq olub onların xörəklərindən yesin. Mustafaoğlu da əlini xörəyə uzadıb, "bismillah" deyən kimi cinlər də, xörəkləri də yox olub. Çünki cinlər Allahın adından qorxurlar.

Zinyət onu da deyirdi ki, cinlər hər adamın gözünə görünməz. Mən də fikirləşirdim ki, bəlkə bizim görmədiyimiz cinlər İman kişinin gözünə görünür və İman kişi eyzən onlarla danışır?

## MƏN VƏ AĞACLAR

Evimizin qabağında atamın saldırdığı və indi hər gün, heç olmasa, bir-iki saat həvəslə qulluq elədiyi, öz əli ilə suvardığı cavan bağla mənim aramda gizli bir ünsiyyət yaranırdı. Buradakı alma, ərik, tut, gilənar, əncir, gavalı, qoz, armud, heyva ağaclarının hərəsinin öz görünüşü vardı və bunların hər biri mənə bir cür təsir eləyirdi. Ərik ağacının çəhrayıya çalan çiçəkləri mənə nə üçünsə əsrarəngsiz təsir bağışlayırdı, gilənar, gavalı ağaclarının ağ çiçəkləri mənə zərif bir şadlıq gətirirdi. Ağ şah tutun günəş işığında zümrüd kimi parıldayan enli, ipək yarpaqları bu şənliyə bir cəsarət, daha qüvvətli bir şadyanalıq çaları verirdi. Qoz yarpağının soyuq ətri məni qüssələndirir və anamın tez-tez xəstələnməsini xatırladırdı. Bəlkə də bu ondan idi ki, bir dəfə anam malyariyadan bərk qızdıranda Zinyətə dedi ki, "get, bir qoz budağı qır gətir". Zinyət budağı gətirib verəndən sonra anam gözlərini yumub onu xeyli qoxladı... və anamı yuxu tutanda mən də balaca qoz budağını götürüb qoxladım və onun enli, tər yarpaqlarından qalxan ətir mənə soyuq və həsrətli göründü.

Anamın xəstələnməsi həmişə mənim üçün son dərəcə qəmgin bir hadisə olurdu. Onun gözəl, şəffaf gözləri qızdırmadan alışıb-yananda mən özümü dünyanın ən bədbəxt adamı sayır və saatlarca yastığının

böyründən uzaqlaşmırdım. Anam xəstəlikdən sağalıb ayağa qalxanda isə ürəyimdəki fərəhin həddi-hesabı olmurdu. Lakin kədərim kimi, fərəhim də həmişə ürəyimdə gizli qalırdı. Yəni, mən onları izhar eləməkdən çəkinirdim. Ona görə çəkinirdim ki, mənim ortaboylu, enlikürək, qaraqaş, qaragöz, gözəl və çox qüvvətli bir oğlan olan atam başqa adamlarla zarafat eləməyi, deyib-gülməyi sevdiyi halda, biz uşaqlarla, xüsusən mənimlə çox sərt rəftar edirdi. Nə üçünsə, mənim zarafatım, deyib-gülməyim həmişə onu acıqlandırırdı. Ona görə də, yavaş-yavaş məndə bir qapalılıq əmələ gəlirdi. Mən heç bir sirrimi, sevinc və kədərimi biruzə verməməyə çalışırdım və atamın yanında öz hərəkətlərim özümə yöndəmsiz görünürdü. Özümə, öz hərəkətlərimə inamım azalırdı, mən, bir növ, fağır, çəkingən olurdum, bu isə, atamı acıqlandırırdı və onun mənə qarşı daha sərt rəftarına səbəb olurdu. Mən üsulsuz bir hərəkət eləyəndə, məsələn, nahar elədiyimiz zaman stəkana toxunub çayı süfrəyə dağıdanda, o, qəzəblənib, məni "maymaq", "filinti", "çolaq" adlandırıb danlayardı. Bu zaman:

– Yaxşı... Dünya dağılmadı ki? – deyə anam məni müdfiə edərdi.

Mən də anamın məni bu cür müdafiə eləməsindən kövrələrək bağımıza qaçıb böyük tut ağacının yanına gələrək ona söykənib o ki var ağlayardım və əgər, hava tutqun, çiskinli idisə, tut ağacının pərişan sükutu mənim dərdimin üstünə dərd artırardı. Əgər, hava buludsuz, çiskinsiz idisə, şah tutun günəş işığında mərdanə bir şadlıqla parıldayan enli, ipək yarpaqlarından sanki qəlbimə anlaşılmaz bir təsəlli, bir sakitlik, məchul bir ümid axıb gözümün yaşını qurudurdu. Ağacların arasından atamın bazara, öz mağazasına getdiyini görəndən sonra mən də qayıdıb evimizə qalxırdım və anamın iri bədənnüma güzgünün qabağında dayanaraq nə isə zümzümə eləyə-eləyə uzun, qara saçlarını hördüyünü görüb şadlanırdım. Atamdan dörd-beş yaş kiçik, boylu-buxunlu bir gəlin olan anamın gözəlliyi, zinəti, paltarı həmişə məni fərəhləndirir, atamın sərt rəftarını, danlaqlarını mənə unutdururdu. Mən anamın üzərində qızıl zərli güllər olan gilənar rəngli uzun məxmər tumanına, qolları enli qanovuz arxalığına, ortasında iri yaqut yanan enli qızıl kəmərinə, boynundan asılmış aypara şəkilli qızıl silsiləyə və bütün bunların ona necə gözəl yaraşdığına heyranlıqla tamaşa edirdim. Lakin belə zamanlarda anamın zümzümə elədiyi qəmli mahnı məni kədərləndirirdi. Mən istəyirdim ki, anam belə qüssəli şeylər oxumasın. O, biş-düşdən, işdən sonra divan yastıqlarına dirsəklənərək Füzulinin, Natəvanın kitablarını, ya da Firdovsinin "Şah-

namə”sindən Rüstəmlə Söhrabın əhvalatını (əlbəttə, bu kitabların kimlərin olduğunu mən yazı-oxu öyrənəndən sonra bildim) ahəstə, lirik bir səslə öz-özünə zümzümə eləyəndə də mən eyni halları keçirirdim. Lakin o, “Ərmənusa”, “Hind racisi”, “Şahnamə”, “Min bir gecə” və sairə kimi kitablardan oxuduğu əhvalatları bizə danışanda mənim xəyalımda heyrətli bir aləm yaranırdı və bu aləmin qəhrəmanları, onların igidlikləri uzun zaman gözümün qabağından getmirdi. Mən onların iztirabları ilə həyəcanlanıb pərişan olur, qələbələrinə sevinirdim və getdikcə xəyalımda yaranan bu aləm mənə real həyatdan, təsadüf elədiyim insanlardan (yalnız anamdan başqa!) daha artıq xoş gəlirdi. O aləm məndə real həyata qarşı bir soyuqluq, bir bədbinlik yaradırdı. O aləm mənə daha şirin, daha cazibədar görünürdü. Ona görə də, mən, getdikcə öz evimizdə daha qaradinməz, adamayovuşmaz olurdum. Mən öz evimizdə deyirəm, çünki Bayram babamgildə dönüb tamam başqa adam olurdum... Öz evimizdə atamın mənimlə həddindən artıq sərt rəftarı mənim öz daxilimə çəkilməyimin, hər şeyin mənə soyuq, yapışıqsız görünməyinin, əlbəttə ki, əsas səbəbi idi.

...Sərhəddəki qoşun çəkilib gedəndən bir neçə gün sonra bir səhər Zinyət sevinə-sevinə yüyürüb anama xəbər verdi ki, Fatma xanım (yəni, anamın anası) indicə gəldi.

Bizim bağın qurtaracağında bir malakanın qalın çəkilliyi vardı. Çəkillikdən o tərəfdə isə Bayram babamgilin üç otaqdan ibarət birmərtəbə evi idi. Evin qabağında böyük bağ var idi. Bayram babam bu evi Nikolay taxtdan düşəndən iki il əvvəl Rusiyaya köçüb gedən bir malakandan almışdı və təzə ev tikdirmək üçün bağa çoxlu hörgü daşı tökdürmüşdü.

Mən və bacım Mahtab anamla getdik babamgilə. Fatma nənəm artırmada qoyulmuş enli taxtın üstündə əyləşib həmişəki kimi uzun müştüyündə papiros çəkirdi. Anamdan qabaq bacımla mən yüyürüb getdik yanına. İkimizin də üzündən öpdü. Nə atam, nə də anam heç bir zaman mənim üzümdən öpməzdilər, bəlkə də buna görə idi ki, başqasının və o cümlədən nənəmin də üzümdən öpməsi xoşuma gəlmirdi.

Fatma nənəm dedi:

– Allaha şükür ki, gəlib sizi sağ-salamat gördüm. Ara yaman qarışıb.

– Bəs, dədəm niyə gəlmədi? – deyə anam soruşdu.

Fatma nənəm müştüyündən dərin bir nəfəs alıb dedi:

– Camaatı başlı-başına buraxıb gəlmək istəmədi. Ağsaqqallar da yığılıb dedilər: "Əşi, sən getsən, burda papaqaldıqaç olacaq". Məni də Qızılbaş oğlu Alı ilə üç atlıya qoşub göndərdi.

Qızılbaşoğlu Alı, yarısı Arazın İran tayında olan qədim Şahsevən obalarından idi. Çox igid bir oğlandı. Həmişə Bayram babamın yanında olardı. Nənəmlə birgə Güllü adlı qulluqçuları və İmaş adlı nökərləri də gəlmişdi. Güllü Kürdobadan Vəli adlı kasıb tərəkəmənin qızı idi. On doqquz-iyirmi yaşlarında, yanaqları lalə kimi alışıb-yanan, sağlam, ətli-canlı bir gəlin idi, uşağı olmadığı üçün toylarından üç il sonra əri boşayıb qovmuşdu. O vaxtdan Fatma nənəm gətirib qulluqçu saxlayırdı. Hamı Güllünün zirəkliyini, təmizkar olmağını, deyib-gülməyini tərifləyirdi, ancaq ondan həmişə əl-üz sabununun iyi gəlirdi ki, mən də bundan bərk dilxor olurdum. Məni qucaqlayıb üzümdən öpəndə "burax" deyə qışqırıb acıqlanırdım. O da qəhqəhə ilə gülüb, zorla təkrar öpürdü.

Babamgilin nökəri İmaş isə Cənubi Azərbaycandan idi. Təxminən Güllü yaşında, nazik, yaraşıqlı bir oğlan idi. Bir il qabaq Şimali Azərbaycana fəhləliyə gələn bir dəstə həmyerlisinə qoşularaq Arazı keçmişdi. Cənubi azərbaycanlıların geydiyi sərdarisi ilə keçə araqçını hələ də başında idi.

Məni görəndə Güllü yenə də qucaqlayıb o üzümdən, bu üzümdən bərk-bərk öpdü. Yenə də mən ondan sabun iyi gəldiyini duyub, dartınaraq qucağından çıxdım. Anam bərkdən güldü. Fatma nənəm də gülümsəyib:

– Ay batmış, – dedi, – sən qızıxmısan, uşağı utandırma.

Güllü qəhqəhə ilə güldü. Fatma nənəm taxta qutusunu açaraq zəfəran kimi sapsarı, saçaqlı tütündən papiros bükə-bükə anamdan soruşdu:

– Nurudan bir xəbər yoxdu ki?

– Məşədi Qara dünən Şuşadan gəlib. Bunların atasına deyirmiş ki, ("bunların" dedikdə, anam mənə işarə elədi. Anam heç bir zaman nə təklikdə, nə də adam yanında atamın adını deməzdi. Həmçinin, atam da anamın adını deməzdi. Bu da mənim üçün qəribə bir sirr olaraq qalırdı.) Nurunu görüb, özünə də qızıl onluq verib.

– Nuru özü istəyib pulu? – nənəm soruşdu.

– Özü istəməyəndə, Məşədi Qara durduğu yerdə ona pul verməyib ki...

Fatma nənəm dedi:

– Kişi ona beş gün bundan qabaq bir at yükü yavanlıq, nə qədər pul göndərib, Allah saxlamış pulu pul kimi xərcləmir ki...

– Hamısını sən eləmisən! – deyə anam acıqlı cavab verdi. – Həmişə bir tərəfdən kişi bəsdi deyincə pul göndərib, bir tərəfdən də sən əlinə düşəni gizlin göndərib onu pis öyrətmisən, xalqın da uşağı oxuyur, kim o qədər pul göndərir?

Nənəm papirosunu müştüyə qoyub dərindən sümürüb susurdu. Mən ona baxıb hiss eləyirdim ki, anamın sözlərinə etiraz eləməsə də, ürəyində oğluna da acıqlanmır.

Anam isə sözünə davam eləyib deyirdi:

– Neçə dəfə ümumxanada görüblər. Onun nə vaxtıdı ki, arvad-qız dalınca düşsün?

Əlbəttə, mən bu söhbətdən heç nə başa düşmürdüm, ancaq nə isə hiss edirdim.

Güllü onların qabağında dayanaraq qəribə bir maraqla anama qulaq asırdı.

Birdən nənəm acıqlı-acıqlı dedi:

– Onsuz da atanın qazandığını qardaşı gülləyəgəlmiş yeyir.

Bu artıq mənə məlum idi. Fatma nənəm Bayram babamın qardaşı Eyvaz əmini nəzərdə tuturdu. Eyvaz əmi Kürdobada adlı-sanlı tərəkəmə idi. Yaşda Bayram babamdan kiçik idi. Fatma nənəmin öz-özü ilə qəzəbli-qəzəbli danışmağından, anamla olan söhbətlərindən bilirdim ki, Bayram babam gah bir dəvə alıb bağışlayır Eyvaz əmiyə, gah at verir, gah pul. Bu da Fatma nənəmi yandırıb-tökürdü.

– Axı, – deyirdi, – kişi fikirləşmir ki, özünün də oğlu var; bu gün-sabah evlənəcək, ona da bir gün ağlamaq lazımdı.

Anam dedi:

– Dədəm qardaşını atmayacaq ki?.. Nə olsun oğlu var?

Anam cavan, gülərüz, yaraşıqlı bir oğlan olan əmisi Eyvazın xətrini çox istəyirdi.

Fatma nənəmi od götürdü:

– Sən dilini farağat qoy! – dedi. – Vələdüzna Eyvazın tərəfini az saxla. Sizi görəndə yağlı dilini salır işə, elə bilirsiniz bir düz-əməlli adamdı. Bayram məni Şuşadan gətirəndə anası Səkinə ilə heç üzümə baxmırdılar, daldada da eyzən kişinin qarasına danışırdılar ki, "gedib Şuşanın gözünü çıxarıb. Dul gəlini alıb, bizə töhfə təbərcehi gətirib".

Anam gülümsəyib dinmədi.

Bir azdan Fatma nənəmi gətirən Qızılbaşoğlu Alı da gəldi. Bu, uzunboylu, xına rəngində saçları boynunun ardına tökülmüş, ayaqlarında uzunboğaz çəkmə, əynində sərdari çuxa, başında gümüş papaq olan bir oğlan idi. Belində ağac qoburlu onatılan tapança var idi.

– Necəsən, bacı? – deyə anamla hal-xoş eləyib Güllünün içəridən gətirdiyi stulda əyləşdi.

Anam ona müraciətlə gülümsəyib dedi:

– Kişini tək qoyub gəlmisiniz?

Qızılbaşoğlu dedi:

– Tək niyə olur? Camaat kişinin başına and içir.

Sonra əlavə etdi:

– Mən indi qayıdıram.

Anam dedi:

– Gecəyə düşəcəksən.

Qızılbaşoğlu sakit cavab verdi:

– Gecə yaxşıdı, Şpartı çölləri indi gündüz isti olur.

Mən təəccüblə soruşdum:

– Tək gedəcəksən?

– Əlbəttə! – deyə o, mənə baxıb gülümsədi.

Mən dedim:

– Bəs, qaçaq-quldurdan qorxmursan?

O, eyni xoş təbəssümlə cavab verdi:

– Qaçaq da adamdı dayna. Qaqaş, niyə qorxum ki?

Anam zarafatyana mənə dedi:

– Bəyəm, Alı dayın özü az qaçaq olub?..

Qızılbaşoğlu qalxıb bağın içi ilə axan arxın qırağındakı yoncalıqda qolbənd elədiyi atını açıb gətirdi.

Nənəm dedi:

– Alı, otur, çörək ye, sonra.

Alı dedi:

– Şəhərdə yemişəm.

Sonra Güllüyə dedi:

– Bacı, içəridən mənim tüfəngimi gətir.

Güllüdən qabaq mən yüyürüb onun gödək beşaçılanını və patronla dolu kəmərini gətirdim.

Alı:

– Salamat qalın! – deyib kəmərlə tüfəngi çiyinlərindən aşıraraq cəld hərəkətlə qalxdı ucaboylu alapaça ürgənin üstünə.

Sonra soruşdu:

– Kişiyə sözünüzdən, sovunuzdan?

Anam dedi:

– Sözümüz odur ki, kişidən muğayat olasan!

Qızılbaşoğlu ciddi cavab verdi:

– Arxayın ol, bacı.

Fatma nənəm Güllüyə dedi:

– Gətir, oğlanın dalınca su at.

Qulluqçu içəri qaçdı. Qızılbaşoğlu isə, ayaqlarını balaca tərpədən kimi at sıçrayıb yola düzəldi, Güllü yüyürüb gələrək suyu onun ardınca atdı.

Qızılbaşoğlu ağacların arasından keçib yox olduqda birdən-birə mənə elə gəldi ki, o bizdən ayrılıb tamam ayrı bir dünyaya getdi. Bir azdan gün batıb gecə düşəcək, Qızılbaşoğlu yiyəsiz çöllərlə tək-tənha gedəcək. Kim bilir, bəlkə birdən qabağına bir dəstə qaçaq çıxacaq?.. Eh, kim bilir, bəlkə qaranlıq dərələrin birində cin yığıncağına rast gələcək...

Deyirlər bir dəfə qaranlıq gecədə Qızılbaşoğlu Alı Haramı ilə atlı gedirmiş. Birdən xapaxap üç qaçaqla çıxır üz-üzə. Qızılbaşoğlu özü ilə silah götürməyibmiş, sapı ceyran ayağından qayrılmış qamçısını qaranlıqda qəfil tapança kimi atlılara tuşlayaraq qışqırır:

– Ə, tökün tüfənglərinizi, yoxsa, onatılanla hamınızı qırdım!

Qaçaqlar bilirdilər ki, Qızılbaşoğlu onatılanın tətiyini çəksə, üçünü də bir anda biçəcək. Ona görə də, tüfənglərini sivirib tullayırlar yerə... Qızılbaşoğlu deyir:

– İndi kənara sürün atlarınızı.

Özü isə, atdan yerə tullanır, tüfənglərdən birini götürüb nəşə ilə atlılara deyir:

– Gedin, amma heç kəsə deməyin ki, Qızılbaşoğlu Alı bir qamçı ilə bizim tüfənglərimizi aldı.

Qaçaqlar mətləbi başa düşürlər, onlardan biri deyir:

– Ə, Qızılbaşoğlu! Deyilmişkən varmışsan, amma igid igidi el içində xar eləməz, mən Əhmədallar Xanalıyam, ver tüfənglərimizi, bu gündən səninlə qardaşam.

Qızılbaşoğlu deyir:

– Düşün, götürün tüfənglərinizi!

Özü isə, alapaça ürgənin üstünə tullanıb bir göz qırpımında yox olur...

Anam qalxaraq mənə dedi:

– Gedək.

Mən bu xəyallarımdan və Fatma nənəmgildən ayrılıb öz evimizə getmək istəmirdim. Mən bilirdim ki, evimizdə məni atamın sərt baxışları, danlaqları gözləyir. Mən heç bir zaman özümü evimizdə babamgildə olduğu kimi sərbəst hiss eləmirdim. Yalvarıb anamdan xahiş elədim ki, qoysun gecəni qalım babamgildə.

Anam dedi:

– Qalırsan, qal, amma dədənin acığı tutacaq.

Nənəm dedi:

– Mağıl dayna... tay dabanıçatdaq Xəlsənin oğlunun acığı tutdu, dünya dağılacaq, uşağın üzünü o qədər danlayır ki, evdən-eşikdən də perikir.

## İMAŞ VƏ GÜLLÜ

Həmişə nənəm, ya anam məni müdafiə eləyəndə ürəyim kövrəlirdi. İndi də Fatma nənəm belə deyəndə gözlərim doldu və mən bağa qaçdım. Gördüm ki, İmaş su arxının qabağında oturub üst köynəyini yamayır, əldə toxunan kobud yun şaldan tikilmiş sərdarisini isə alt köynəyinin üstündən atıb çiyninə. Həmişə olduğu kimi, indi də, məni görəndə gülümsədi. Onun arvad kimi köynək yamaması mənə qəribə göründü, mən ondan soruşdum:

– Niyə köynəyini özün yamayırsan?

– Bəs, kim yamasın, qaqaş? – dedi. – Anam yox, bacım yox.

Onun sözləri məni kədərləndirdi, düşünmədən soruşdum:

– Heç anan-bacın olmayıb?

O gözü tikişində:

– Niyə olmayıb? – dedi, – daş deşiyindən çıxmamışam ki?.. Anam da vardı, atam da... bacım, qardaşım da... Hələ desən, babam, nənəm də vardı. Özləri də məni çox istəyirdilər, necə ki, səni baban, nənələrin çox istəyirlər.

Mən onun yanında yerə çökərək soruşdum:

– Bəs necə oldular?

O, dərindən nəfəs alıb yamağını tikə-tikə dedi:

– Bir qonşu xan bizim kəndi qarət eləyib dağıdanda, qırılan qırıldı, qırılmayan da hərə başını götürüb bir tərəfə qaçdı. Kimi acından, kimi azardan öldü. Mən də qoca bir dayımla qaçqınlara qoşulub bu taya keçəndim. Dayıma da Arazda güllə dəydi.

Mən sükut içində İmaşa tamaşa edirdim. Mən bu qədər dərdə onun necə dözdüyünə təəccüb edirdim. Nəhayət, mən ondan soruşdum:

– O qonşu xan sizin kəndi niyə dağıdırdı?

– Çünki bizim xanla düşmən idi. Qəfil bir-birinin kəndlərinə hücum eləyib çapıb-talayırdılar.

– Bəs, şah niyə qoyurdu?

– Şahın canındandır ki, bizim xanlar bir-birilərini didib-parçalasınlar.

– Niyə axı?

– Eh, qaqaş... sən hələ uşaqsan, belə şeyləri başa düşməzsən.

– Yox, sən danış, başa düşərəm!

– Bilirsənmi, qaqaş, şah farsdır, amma biz də, xanlarımız da azərbaycanlıyıq...

– Nə olsun?

– Şah fars olduğu üçün istəyir bizim Azərbaycan xanları bir-birilərilə boğuşub, başları qarışsın ki, Azərbaycan xalqı şahdan hürriyyət istəməsin.

Mən nəyi isə dumanlı halda dərk etməyə başlayırdım, öz xalqımın taleyi haqqındakı həqiqəti birinci dəfə babamgilin nökəri İmaşdan eşidirdim.

Mən xeyli sükutdan sonra soruşdum:

– Niyə sizin qəhrəmanlarınız gedib şahı öldürmürlər?!

İmaş qüssə ilə gülümsədi:

– Çünki, – dedi, – qoşun, silah şahın əlindədir.

Elə bu zaman Güllü bizim yanımıza gəlib məzəmmətlə İmaşa dedi:

– Ədə, ədə, xarabalıqda-zadda deyilsən ki?.. Köynəyini niyə özün yamayırsan? Biz burada adam döyülük?

İmaş qızardı:

– Sənə əziyyət vermək istəmədim...

Güllü onun yanında yerə çökərək:

– Nə olub, – dedi, – xanım-zad olmamışıq ki?.. Ver bura.

Güllü köynəyi İmaşın əlindən alaraq onun yamadığı yeri nəzərdən keçirib bərkdən güldü.

– Yaman da tikmisən.

Sonra ayağa qalxaraq nə üçünsə pıçıltı ilə dedi:

– Tikib, yuyub gecə gətirərəm...

– Yaxşı, – deyə İmaş da lap yavaşdan cavab verdi.

Güllü gedəndən sonra mən, elə bil, nəyinsə ağırlığı altında İmaşdan soruşdum:

– Niyə özünə təzə köynək almırsan?

İmaş gülümsədi:

– Çünki pulum yoxdu, qaqaş!

Mən dinmədim. Suçlu adamlar kimi, qalxıb səssizcə uzaqlaşdım. Mən nədə isə özümü təqsirkar kimi hiss edirdim. Birdən elə bil ki, zehnim ayazıdı. Həyatımda birinci dəfə olaraq İmaşın bu qədər yoxsul, bizim isə varlı olmağımıza qarşı qəlbimdə xoşagəlməz, ağır hisslər oyandı, elə bil ki, varlı olduğumuz üçün mən İmaşdan xəcalət çəkirdim. Birdən addımlarımı yeyinlədərək gəlib, hələ də taxtın üstündə oturub, papirosu tüstülənən müştüyünü əlində tutaraq öz-özünə danışan nənəmin böyründən keçib evə girdim. Mən bilirdim ki, Fatma nənəm həmişə pullarını döşəyin altına qoyur. Mən əsl oğru kimi ehtiyatla o yan-bu yana baxa-baxa döşəyi qaldırıb iri bir kağız pul götürərək qaçdım bağa. İmaş üzüqoylu uzanıb əllərini alnının altında çarpazlamışdı. Mən əyilib onun üzünə baxdım ki, görüm yatıb, yoxsa, oyaqdı? O, gözlərini açaraq soruşdu:

– Nə var, qaqaş?

Mən iri kağız pulu onun gözünün qabağına tutdum. O, pula bir an nəzər salaraq dikəlib oturdu:

– Bu pul səndə nə gəzir, qaqaş?

Mən dedim:

– Sənin üçün gətirmişəm, al, get, özün üçün təzə paltar al.

O pulu alıb o tərəf-bu tərəfinə baxaraq soruşdu:

– Bunu sənə kim verib, qaqaş?

– Heç kəs... özüm götürmüşəm.

– Haradan?

– Fatma nənəmin pullarının içindən, istəyirsən yenə gətirim.

İmaş pulu fikirli-fikirli bir də nəzərdən keçirərək mənə qaytarıb, dedi:

– Apar, haradan götürmüsənsə, qoy yerinə, mənə oğurluq pul lazım deyil!

Mən özümü pis hiss edərək dedim:
– Oğurluq niyə olur, nənəmin puludur də...
O gülümsədi. (O gülləndə dümağ dişlərinin görünüşü xoşuma gəlirdi.)
– Nənən bilir ki, sən bunu götürmüsən?
– Yox.
– Demək, oğurlamısan! Tez apar, necə götürmüsənsə, heylə də qoy yerinə.
Sonra dərindən nəfəs alaraq əlavə etdi:
– Sən yaxşı oğlansan, qaqaş, ancaq onu bil ki, kasıb da olsaq, bizim nəslimizdə oğru-əyri olmayıb. Mənim atam da, babam da kişi adamlardı!
O ayağa qalxıb, iki qolumdan tutaraq, çevik hərəkətlə məni qaldırıb ayaq üstə qoydu:
– Tərpən, qaqaş! Bax, yerinə qoymasan, Fatma xanıma deyəcəyəm.
Mən özümü alçaldılmış hiss edərək gəlib pulu yerinə qoymaq istəyəndə, nənəm içəri girib gördü.
– Nə qayırırsan, ədə? – deyə təəccüblə soruşdu. – O pulu niyə götürmüsən?
– Baxırdım.
– Yalan danışma! De görüm, səni kim öyrətmişdi?
– Heç kim.
– Qələt eləmə. İmaş öyrətmişdi?
– Yox! – deyə mən həyəcanla səsləndim.
Nənəm bu dəfə məni dilə tutdu:
– Bəs, kim dedi, get pul gətir? Güllü?
– Yox! – deyə mən qışqırdım.
– İmaş?
– Yox! Yox!
– Yalan danışma! Sünnünün küçüyü. O həmşəri köpəkoğlu öyrədib səni! (Bizim tərəflərdə Arazın o tayında yaşayan azərbaycanlılara "həmşəri" deyirdilər.)
Mən pəncərədən gördüm ki, İmaş dəhlizdə sütuna söykənib bizə qulaq asır. Mən bərkdən ağlayaraq nənəmə qışqırdım:
– Dedim ki, heç kəs öyrətməyib!
Nənəm dedi:
– Yaxşı, ağlama, get otur, çörək ye.

Mən gözümün yaşını əlimin dalı ilə silərək:

– İstəmirəm! – dedim.

– Yaxşı, dəli olma, səhərdən heç nə yeməmisən.

– İstəmirəm.

Nənəm hirsləndi:

– Ay irtməkli oğlu! Tay dünya dağılmadı ki, bir söz soruşduq.

(Nənəm həmişə atamın qarasına acıqlananda onu “irtməkli sünnü” adlandırırdı. Mən də bir dəfə Güllüdən soruşdum ki, doğrudan sünnülərin irtməyi olur? O da qəhqəhə ilə gülərək:

– Əlbəttə, – dedi... keçi kimi irtməkləri olur.)

Həmişə nənəm mənə acıqlanıb “irtməkli oğlu” deyəndə yanıb-tökülərək ya çeşməyini, ya müştüyünü, ya da yaylıqdan-zaddan bir şeyini götürüb gizləyərdim və nənəmin hirslənə-hirslənə axtarışından ləzzət alıb qəhqəhə ilə gülərdim. Bu dəfə də göz-göz eləyib müştüyünü gizlədim. Bir azdan nənəm başladı müştüyünü axtarmağa və tapmayıb qışqırdı:

– Ağız, Güllü! Gəl gör bu zəhrimar necə oldu?

Güllü içəri yüyürüb gülüşünü güclə saxlayaraq soruşdu:

– Hansı zəhrimar, xanım? Müştük, ya çeşmək?

– Müştük! – deyə nənəm qəzəblə cavab verdi. – Allah lənət eləmiş cinlərin işidi. Eyzən mənə sataşırlar.

Məni gülmək tutdu. Çöpəgülən Güllü də mənə baxıb qaqqıldadı, nənəm yana-yana dedi:

– Ay qızıxmış qancıq, uşaqdı gülür, sən nəyə gülürsən?

Güllü səsini içinə salıb xısın-xısın gülərək, nəhayət, müştüyü tapıb verdi.

Nənəm papiros qayırıb çəkəndən sonra mənə dedi:

– İndi ki, yemək istəmirsən, çıx get evinizə! Mən irtməkli sünnünün nazıyla oynaya bilmərəm.

Güllü mənim tərəfimi saxladı:

– Xanım, bu yaxşı oğlandı, bunun irtməyi yoxdu, anası şiə olanın irtməyi olmur ha...

Mən dinməz-söyləməz gedib dəhlizdəki taxtın üstünə salınmış süfrənin yanında oturdum, nənəm də Güllünün gətirib qoyduğu qazandan bir boşqab mənə, bir boşqab da özünə yarpaq dolması çəkəndən sonra Güllüyə dedi:

– Götür qazanı apar, İmaşa da ver, özün də ye.

Güllü qazanı götürüb apardı. Nənəm mənim dolmamın üstünə sarımsaqlı qatıq töküb mehriban səslə dedi:

– Bismillah elə, ye!

Mən nə üçünsə həmişə nənəmin dediyi duaları bərkdən deməyə utanaraq, ürəyimdə təkrar edirdim, mən bu duaların mənasını başa düşmürdüm. Nənəm deyirdi ki:

– Bismillah deyəndə cinlər qaçır.

Mən xörəyimi tələm-tələsik yeyib qurtaran kimi, qalxıb yüyürdüm İmaş olan otağa. O, torpaq döşəməyə salınmış keçənin üstündə oturub Güllünün gətirdiyi dolmanı yeyirdi. Güllü ağ qalaylı mis parçla bir su gətirib, İmaşın qabağına qoyaraq dedi:

– İç, təzə sudu.

Sonra oğlanın boşqabına işarə ilə soruşdu:

– İstəyirsən yenə gətirim, qazanda var.

İmaş mənə qəribə gələn bir cür asta, mülayim səslə dedi:

– Bəsdi, sən get, çörəyini ye.

Gözləri eyzən oğlanda olan Güllü, onda birinci dəfə gördüyüm ciddi, hətta, bir az da qəmgin ifadə ilə dərindən nəfəs alaraq dinməz-söyləməz qayıdıb getdi.

İmaş da xörəyini yeyib qurtarandan sonra parçdakı suyu götürüb içdi.

Mən dedim:

– Güllü yaxşı qızdı, heyləmi?

O, təəccüblə mənə baxıb soruşdu:

– Necə bəyəm?

– Səni çox istəyir.

– Nə bildin, qaqaş, xanımlar deyirdi?

– Yox. Özüm deyirəm... Güllü yaxşı gəlindi, amma üzündən, əlindən eyzən sabun iyi gəlir.

İmaş güldü:

– Neyləsin, qaqaş, – dedi, – qulluqçu adamdı, sənin anan kimi bahalı ətirləri haradan alsın?

Mən tutuldum, yenə də səbəbini bilmədiyim halda xəcalət çəkdim, sonra çəkinə-çəkinə dedim:

– Hamı dövlətli olsaydı, yaxşı olardı, heyləmi?

İmaş dərindən nəfəs alıb dedi:

– Nə qədər ki, padşahlar var, hamı dövlətli ola bilməz, qaqaş!

– Nə üçün? Padşahlar neyləyir ki?

– Padşahlar dövlətliləri, bəyləri, xanları əzizləyirlər, amma yazıq rəiyyətin qanını sorurlar.

– Nə üçün? – dedim. – Rəiyyət padşaha neyləyir ki?

– Rəiyyət heç nə eləmir, qaqaş, hər nə eləyir, padşahlar eləyir!

İmaş bir qədər susub sonra öz-özü ilə danışırmış kimi, kinli-kinli əlavə etdi:

– Rus fəhlələri, kəndliləri öz padşahlarını yıxdılar, bir gün gələr, bizimkilər də İran padşahını çəkib taxtdan salarlar, onda biz də öz qisasımızı alarıq.

– Kimlərdən?

– Bizi əsir-yesir eləyənlərdən. Eh, qaqaş! Sən belə şeyləri sonra başa düşəcəksən, – deyib qalxdı. – Gedək, sərin düşdü. Mən gərək ağacları suvarım.

İmaş bağın ortasından keçən böyük arxdan bel ilə xırda arxlar ayıraraq ağacları suvarır, mən də tamaşa eləyirdim. Mən hələ də padşahlar haqqında, onların rəiyyətin qanını necə sormaqları barədə düşünürdüm. Mən Fatma nənəmdən eşitmişdim ki, adamlar xəstələnəndə bəzən onlara zəli qoyurlar ki, artıq qanı sorub çəksinlər. Sonra Kürdobadan babamgilə gətirilən bir xəstəni həkim müalicə elədiyi zaman zəlini görüb iyrəndim, çox murdar heyvana oxşayırdı...

Mən təzə göyərib qalxmış göy otların arası ilə ağacların dibinə axan dumduru suyun incə parıltılarıyla bu düşüncələrim arasında qəribə bir ziddiyyət hiss edirdim və bilmirəm, anamın söylədiyi hansı nağıldansa yadımda qalmış Zöhhak padşah dəhşətli bir qiyafədə xəyalımda canlanırdı. Deyir, Zöhhak ilana sitayiş edirmiş və ilanların mərhəmətini qazanmaq üçün onlara körpə uşaq beyni yedirdirmiş. Mən anamın söylədiyi nağıllarda yaxşı padşahlar haqqında da eşitmişdim, ona görə də, İmaşa dedim:

– Yəqin sizin padşah pis padşahdı?..

O, sakit şırıltı ilə axan suyu bir ağacın dibindən o birinin dibinə bağlaya-bağlaya dedi:

– İlanın ağına da lənət, qarasına da, qaqaş, hamısı bir köpəkoğludu, hamısı!

Doğrusu, İmaşın bütün şahlar haqqında bu cür deməsi mənə xoş gəlmədi. Mən əlimdəki çubuqla, dizə qədər qalxmış yaşıl keşnişi vura-vura gəldim Fatma nənəmin yanına. Nənəm yenə də uzun müştüyü əlində tüstüləyə-tüstüləyə gözlərini bir nöqtəyə zilləyərək qaynı Eyvazın qarasına deyinirdi:

– Kişinin boş damarından yapışıb qazandığını çəkir kamına, nə Allahdan qorxur, nə də bəndədən utanır.

Mən bir qədər ona qulaq asandan sonra dedim:

– Padşahlar da rəiyyətin qanını sorur! Amma sən deyirdin padşah Allahın dostudur, Allahın dostu da qan sorar?

Nənəm təəccüblə üzümə baxıb soruşdu:

– Nə bildin, padşah rəiyyətin qanını sorur?

– Odur ey, İmaş deyir... Deyir ki, padşahların hamısı köpəkoğludur.

Nənəm kənar bir adama müraciət edirmiş kimi, acıqlı-acıqlı dedi:

– Görürsən, bu həmşəri vələdüzinanı?! Yaxşı deyiblər ki, yetimin fağırı olmaz.

Nənəm, ağacları suvara-suvara bəri gəlmiş İmaşa qışqırdı:

– Ədə ey! Qələtini elə, sarsaq-sarsaq danışıb uşağın başını doldurma! Sənin padşahla nə işin var?!

İmaş nənəmə heç bir söz deməyərək mənə baxıb xəfifcə gülümsədi, ancaq onun bu güclə sezilən gülüşü məni pərt elədi. Mən öz qəbahətimi hiss eləyərək ağlamsınmış səslə nənəmə qışqırdım:

– İmaş düz deyir də! Bəs, niyə rus fəhlələri Nikolay padşahı taxtdan yıxdılar?

– Kəs səsini! – deyə nənəm qışqırdı. – Padşahı yıxdılar ki, indi olub papaqaldıqaç də... Padşahın üzünə ağ olan Allahın üzünə ağ olur!

Bu zaman babamgilin Qumaş adlı, palıdı rəngli ov tulası gəlib qabağımda dayanaraq mehriban-mehriban üzümə baxıb, ətəyimi, əllərimi qoxladı, pərtliyim dərhal sovuşdu. Güllü yuyub sərdiyi paltarları ipdən yığıb gedəndə qulağıma tərəf əyilib pıçıldadı:

– Adam xəbərçi olmaz.

Mən yenə öz hərəkətimdən xəcalət çəkərək bilmədim Güllüyə nə cavab verim. O gündən sonra İmaş mənimlə daha əvvəlki kimi həmsöhbət olmadı. “Hə”, “yox” deyə, ancaq suallarıma qısaca cavab verirdi. Hətta, mənə əvvəlki kimi “qaqaş” da demirdi, lazım olanda, soyuq ifadə ilə adımı çağırırdı. Bu da məni pərt edirdi. Fikirləşdim, neyləyim ki, İmaş yenə də əvvəlki kimi mənimlə həvəslə söhbət eləsin.

...Biz ikilikdə olanda da Fatma nənəm eyzən Bayram babamın qardaşı Eyvaz və onun ailəsi haqqında, bəzən də atam haqqında öz-özünə danışırdı. Həmişə mənə elə gəlirdi ki, nənəm kimi isə görür, kimə isə müraciət edir. Bu gecə yenə də nənəm öz-özü ilə danışanda mən soruşdum:

– Nənə, sən cinlərlə danışırsan?

Nənəm diksinərək:

– Bismillah!.. Bismillah! – dedi.

Sonra: – Ay irtməkli oğlu, – dedi, – gecə vaxtı o Allah lənət eləmişlərin adını niyə tutursan?!

Mən təkrar soruşdum:

– Nənə, sən onları görürsən?

Nənəm yenə də "Bismillah" deyib yanındakı sap əyirən iylə qoluma vurdu. Sonra İmaşa dedi:

– Dur, bu irtməkli oğlunu apar evlərinə.

Mən qışqırdım:

– Getmirəm!

Fatma nənəm mənimlə nə qədər dalaşsa da, lap hirslənib vursa da, yenə də onlarda olmaq öz evimizdə olmaqdan mənə xoş gəlirdi. Çünki mən hiss edirdim ki, nənəm nə qədər acıqlansa da, yenə məni çox istəyir. Ancaq mənə elə gəlirdi ki, Bayram babam məni hamıdan çox istəyir. Mən onlarda özümü son dərəcə sərbəst, azad hiss edirdim, onlarda heç kəs məni atam kimi hər şeyin üstündə danlamırdı, heç kəs atam kimi məni "küt" adlandırmırdı. Əksinə, Bayram babam həmişə mənim "ağıllı oğlan" olduğumu söyləyirdi.

...Biz gecədən xeyli keçənə qədər dəhlizdə nənəmin taxtının üstündə oturduq. Güllü də taxtın qabağına salınmış palazın üstündə əyləşərək, Kürdobadakı əhvalatlardan nənəmə söhbət eləyirdi: kimin qızını kimin oğluna nişanlayıblar, kim neçə ildir ki, əriylə danışmır, on min qoyunu olan Hacı Qaranın qızı üçün kimlər elçi gəlib...

İmaş isə səhər çox tez durduğu üçün gedib erkən yatmışdı. Şəhərimizin şimal tərəfindən axan Quruçay bərk daşmışdı, onun qıjıltısı bağın ilıq qaranlığında mənə əsrarəngiz təsir bağışlayırdı. Elə bil ki, hər şeydə, hər əşyada mənim anlamadığım uzaq, lakin gözəl bir sirr var idi və bu sirdəki məchul fərəh – cazibədarlıq məni həyəcanlandırırdı, mən bu fərəhi öz evimizdə hiss eləyə bilmirdim.

Həmişə babam evdə olmayanda mən onun çarpayısında yatırdım. Bu dəfə də elə oldu. Güllü kəllayı otaqda, nənəmlə mən də babamgilin yataq otağında yatmalı olduq. Nənəm qapını bağlayandan sonra əyilib çarpayıların altına baxdı, mən də təəccüblə soruşdum:

– Nənə, taxtların altına niyə baxırsan?

Cavab verdi ki:

– Kişinin nə çox düşməni!.. Gəlib taxtın altında gizlənib gecə başımızı kəsərlər.

Əlbəttə ki, bu mənim özümü də qorxutdu və mən soyunub babamın çarpayısına çıxaraq soruşdum:

– Yəni, nə cür düşmən, nənə?

Nənəm də soyunub işığı söndürərək çarpayısına girib dedi:

– Mən nə bilim nə cür?.. O qədər bic, haramzada var ki, dünyada.

Sonra nənəm pıçıltı ilə dua oxudu, sonra Şuşa qalasında realnı məktəbdə oxuyan oğlu Nuruya dua elədi.

– Allah, – deyirdi, – sən mənim oğlumu yerin-göyün bəlasından, mərdimazardan, yolkəsəndən uzaq elə.

Mən bilirdim ki, bu dualarında nənəm "oğlum" dedikdə ancaq dayım Nurunu nəzərdə tuturdu. Nənəmin qabaqkı ərindən də bir oğlu var idi və onun harda olduğu mənə məlum deyildi. Nənəm öz dualarında nə onun adını çəkərdi, nə də anamın, ancaq dualarında bəzən "Allah, sən mənim balalarımı..." deyirdi. Yəqin ki, buna anam da, nənəmin o biri oğlu da, hətta, biz nəvələri də daxil olurduq. Mən yanı üstə çevrilərək pəncərə pərdəsinin yanından bağa tamaşa edirdim. Hər şey sükut içində idi, hərdən Qumaş görünüb, sonra yenə ağacların arasında yox olurdu. Quruçayın şırıltısı, elə bil, indi bu aydınlıq içində daha uzaqdan gəlirdi. Nənəm astadan xoruldamağa başladı, həmişə anamla, ya da nənəmlə bir otaqda yatanda onların məndən qabaq yuxuya getmələri nə üçünsə ürəyimdə həzin, kövrək bir yalqızlıq hissi doğururdu, mənə elə gəlirdi ki, hamıdan, bütün dünyadan ayrı düşmüşəm.

Mən pəncərədən çölə baxarkən, bir də gördüm ki, Güllü əlində ağ bir şey o yana-bu yana baxa-baxa iti addımlarla getdi girdi İmaş qalan otağa, yəqin ki, əlindəki İmaşın köynəyi idi.

Mən Güllünün oğru kimi belə xəlvəti getməyinə təəccüb eləyərək gözlədim ki, görüm Güllü oradan nə vaxt çıxacaq, ancaq Güllü çıxmırdı ki, çıxmırdı, nəhayət, məni yuxu apardı.

Səhər oyananda ilk yadıma düşən əhvalat gecə Güllünün İmaş yatan otağa xəlvətcə getməsi oldu və yerimin içində xeyli bu barədə fikirləşdim, işin mahiyyəti mənə aydın deyildisə də, qadının yad kişinin yataq otağına xəlvəti gedib girməsinin yaxşı şey olmadığını hiss edirdim. Ona görə də, bu hadisə əllərindən, üzündən eyzən sabun iyi gələn, çöpəgülən, qırmızıyanaq Güllüyə qarşı məndə bir düşmənçilik hissi oyatdı.

Güllü səhər kəhrizdən doldurub gətirdiyi iri mis səhəngi çiynindən yerə qoyanda mənə elə gəldi ki, o dünəndən bəri daha gözəlləşmişdir. Yanaqları lalə kimi parıldayır, gözləri alışıb-yanırdı. O mənə baxaraq həmişəki tək gülümsəyib:

– Gəl, qaqaş, – dedi, – təzə su töküm əl-üzünü yu.

– Lazım deyil! – deyə mən qəzəblə cavab verdim.

O qəhqəhəylə gülüb dedi:

– Qaqaş yuxuda şeytan görüb.

– Şeytanı yuxuda sən görmüsən! – Acıqlı cavab verdim.

– Mən mələk görmüşəm, qaqaş! – deyib o təkrar qəhqəhə ilə güldü.

Onun lalə kimi qızarmış yanaqlarına baxaraq yanıb-töküldüm, mən özümü saxlaya bilməyərək yerdən bir daş götürüb onun qılçına atdım, o keçi kimi kənara sıçradı və yüyürüb məni qucaqlayaraq o üzümdən, bu üzümdən bərk-bərk öpdü.

– Ay ölmüş, uşağı ayı kimi basmarlama, – deyə dəhlizə çıxan Fatma nənəm zarafat elədi.

– Yeyəcəm onu! – deyə Güllü təkrar məni öpmək istəyəndə əlindən çıxıb kənara qaçdım.

...Mən nənəmlə oturub çay-çörək yeyəndən sonra bostan suvaran İmaşın yanına getdim. O mənə soyuq bir nəzər salıb:

– Qaqaş, – dedi, – adam arvad xeylağına daş atar?

Mən dedim:

– Güllü pis qızdı.

– Nə üçün? – deyə o, görünür, mənim qiymətimə o qədər də əhəmiyyət verməyərək soruşdu: – Sabun iyi gəlir, ona görə?

– Sabun iyi də gəlir, özü də adamı ayı kimi qucaqlayıb marçhamarç öpür.

İmaş xəfif gülümsədi:

– Nə olar, öpmək pis şey deyil ki...

– İstəmirəm.

Mən onun suyu, sarı çiçək açmış xiyar tağlarının arasına bağladığına tamaşa eləyə-eləyə soruşdum:

– Nə üçün Güllü gəlib gecə səni yuxudan oyadırdı?

O dərhal dikəlib təəccüblə üzümə baxdı:

– Nə bildin?

– Pəncərədən gördüm. Gördüm ki, tələsik getdi girdi sən yatan evə.

– Nənən də gördü?

– Yox. Nənəm xoruldayırdı.
– Sən ona dedin?
O bu sualları qorxmuş kimi verirdi, mən onun nə üçün qorxduğunu, rənginin niyə saraldığını anlamayaraq dedim:
– Yox, nənəmə deməmişəm.
Nənəmə deməmiş olduğuma görə ürəyimdə sevindim. İmaş dərindən nəfəs alaraq suyu indi də yaşıl pamidor kolları olan ləkə döndərə-döndərə dedi:
– Güllü mənim köynəyimi yuyub qurutmuşdu, onu gətirib verirdi.
– Bəs, nə üçün adamlar yatandan sonra?.. Özü də oğru kimi xəlvəti, ora-bura baxa-baxa?
İmaş dikəlib mənə uzun bir nəzər salaraq dedi:
– Qaqaş, mən burada kimsəsiz, qərib bir oğlanam, xahiş eləyirəm, onu heç kəsə deməyəsən.
– Deyəndə nə olar?
– Pis olar, qaqaş, demə, yaxşımı?
Onun özünü kimsəsiz, qərib adlandırması, üzündə zahir olan qorxu ürəyimi kövrəltdi və mən böyüklər kimi ciddi ifadə ilə dedim:
– Arxayın ol, heç kəsə demərəm.
– Çox sağ ol. Bostanı suvarım qurtarım, sənə tüfəng qayıracam, ancaq qaqaş, gərək kişi sözünün üstündə dursun.
İmaşın məni kişi sayması qürurumu artırdı.
...Günorta naharından sonra Fatma nənəm, adəti üzrə, dəhlizdəki taxtın üstündə uzanıb yuxuladı, mən də İmaşın qarğıdan hazırladığı atımı minib, “tüfəngimi” çiynimə salaraq ağacların arasıyla ora-bura çapırdım. Qumaş da mənim yanımca yüyürürdü. Mən gah Qaçaq Nəbi, gah Qaçaq Süleyman olurdum. Sonra da coşaraq atımı çapdım bağın lap qaranlıq yerinə. Qumaş da mənimlə getdi. Birdən yarıqaranlıqda gilənarlıqda pıçıltı eşidib, bərk qorxaraq atımın başını çəkib dayandım, sonra dönüb qaçmaq istədim, ancaq birdən yadıma düşdü ki, qəhrəmanlar qorxub qaçmazlar, mən qılıncımı siyirib pıçıltı gələn kolluğa işarə ilə Qumaşı qısqırtdım.
Başqa vaxt yad adamın hənirtisini belə, duyanda qəzəblə hürüb ora tərəf atılan Qumaş bu dəfə mənim qılıncımla işarə elədiyim gilənarlığa tərəf biganə bir nəzər salıb, qısqırtmağıma əhəmiyyət vermədi. Mən ürəklənib yavaş-yavaş bir az da irəlilədim, aşağı əyilərək ağacların arasından baxdım. İmaşla Güllü qalın kolluqda yanaşı otur-

muşdular. Güllü İmaşın əlini tutub köynəyinin arasından sinəsinə yapışdırmışdı. Birdən İmaş nə isə pıçıldadı. Güllü də üzünü onun üzünə yapışdıraraq bərk-bərk öpüb qalxdı. İmaşla Güllü qalın kolluqda yanaşı oturmuşdular. Güllü ucaboylu idi, amma İmaş ondan da uca idi. Birdən mən "ehey!" deyə qışqıraraq atımı onlara tərəf çapdım və ağacların arasından zahir olduqda qəhrəmanlar kimi soruşdum:

– Deyin görüm, nə cəsarət eləyib pərilər padşahının bağına girmisiniz?!

Güllü qəhqəhə ilə gülərək məni qaldırıb marçıltı ilə öpdü.

– Burax! – deyə qışqırıb çabaladım. – Gərək sabun iyi verə-verə hamının üzündən öpəsən?

O məni yerə qoyaraq:

– Ay şərəşür, dedi, – səndən başqa kimin üzündən öpmüşəm ki...

– Odey, İmaşın! Yazığı basmarlayıb öpmürdün?!

Güllü məni dilə tutdu:

– Qaqaş, qurban olum, nə olar öpəndə? İmaş qərib, yetim oğlandı, anası yox, bacısı yox... Bəs, mən də öpməyim kim öpsün onu?

Doğrusu, Güllüdən nə qədər zəhləm getsə də, bu sözləri ürəyimi birtəhər elədi. Atımı çapıb qaçdım.

## NURU DAYIMIN GƏLİŞİ VƏ ANAMIN XALASI OĞLU ƏHMƏDİN ÜÇ ARVADI ÖLDÜRMƏYİ

Səhəri gün Nuru dayım Çarvadar Həbibin üçatlı faytonunda gəldi. Çarvadar Həbib dayımın çamadanlarını faytonun dalından götürüb yerə qoydu. İmaş yüyürüb dayıma "xoş gəldin, ağa" deyərək çamadanları qaldırıb apardı evə. Çarvadar Həbib Fatma nənəmə:

– Xoş gördük, xanım! – deyib mənə baxaraq gülümsədi (Güləndə onun uzunburunlu, bir az da pərtdəgözlü üzü çox gülməli görünürdü, elə bil ki, bu saat, nə isə, komik bir hərəkət eləyəcəkdi).

– Necəsən, ə, bacıoğlu?

Cibindən saçaqlı bir konfet çıxarıb mənə verərək dayıma dedi:

– Bəy, mən mürəxxəs olum?

Dayım laklı portmanatını açıb, ona pul verdi. Çarvadar Həbib pulu saymadan cibinə qoydu:

– Allah bərəkət versin! – deyərək faytona qalxıb getdi.

Nuru dayım ucaboylu, nazikbelli, qıvrımsaçlı, alagöz, sarıbəniz, olduqca gözəl bir oğlan idi. Bu dəfə gələndə daha məktəbli libası geyməmişdi, başında bahalı buxara dərisindən təpəsi gen gümüşü papaq, ayaqlarında nazik xromdan uzunboğaz çəkmə var idi. Zərif yun parçadan tikilmiş köynəyinin üstündən belinə qızıl körpülü nazik Qafqaz kəməri bağlamışdı. Beli o qədər incə idi ki, elə bil, heç çörək-zad yemirdi. O, heç birimizlə görüşməyərək gülümsəyib mənə dedi:

– Tay yekə oğlan olmusan... Yaqut necədir?

– Yaxşıdı, – deyə mən ona tamaşa eləyə-eləyə cavab verdim.

Onun parlaq görünüşü, gözəlliyi məni heyran edirdi, mən ürəyimdə onunla qürrələnirdim: "Görün mənim necə dayım var!"

Sonra o dəhlizdə papağını çıxarıb taxtın üstünə tullayaraq, soyuq ifadə ilə nənəmdən soruşdu:

– Kişi gəlib?

– Yox. Camaat qoymadı, – deyə, Fatma nənəm cavab verdi. – Dedilər, sən getsən, papaqaldıqaç olacaq.

Mən birinci dəfə olaraq Fatma nənəmdə dayıma qarşı, nə isə, qeyri-adi bir münasibət hiss edirdim: elə bil ki, gecə-gündüz oğlunun salamatlığı üçün Allaha dua eləyən nənəm ondan qorxub çəkinirdi. Mən, eyni zamanda, dayımda da nənəmə qarşı qəribə, qəddar bir hal duyurdum, onun gəlişilə nənəmin sərbəstliyi, təbiiliyi, elə bil ki, bir anda yox olub getmişdi. Nənəmə yazığım gəldi, birinci dəfə olaraq məndə dayıma qarşı soyuq bir hiss yarandı. Onun zühuru ilə İmaş da tutqun olmuşdu. Güllü isə, köynəyinin altından qabaran iri döşlərini yırğalaya-yırğalaya ora-bura qaçır, gah çay hazırlayır, gah həyəti süpürürdü. Hiss edirdim ki, dayıma xoş gəlmək üçün canfəşanlıq eləyir. Bu da məni acıqlandırır, ona qarşı kinimi artırırdı.

– Yeməyə nə var? – deyə dayım nənəmdən soruşdu.

– Bozbaş asmışıq, – deyə nənəm çəkinə-çəkinə cavab verdi. – İstəyirsən, ayrı bir şey bişirək...

– Hə... Denən, gədə bir-iki çolpa tutub kəssin, tez çığırtma eləyin, yumurtasız.

Sonra o qonaq otağına girdi, pəncərədən onun neylədiyinə mən maraqla tamaşa edirdim. Toqqasını açıb üst köynəyini çıxartdı, sonra güzgünün qabağında dayanıb diqqətlə özünə baxdı. Balaca qayçı ilə nazik bığlarının artıq tüklərini kəsdi. Sonra gözlərini güzgüdən çəkməyərək bərkdən səsləndi:

– Güllü, su hazırla, üzümü yuyacam!

– Su hazırdı, qağa! – Güllü cavab verdi. – İndicə kəhrizdən gətirmişəm!

Həyətdə, böyük iydə ağacının altında Güllü ağ qalaylı mis parçla su tökür, dayım da sabunu köpükləndirə-köpükləndirə üzünü, boyun-boğazını yuyurdu.

İmaş həyətdə toyuqları qovub iki çolpa tutaraq kəsdi. Dayım da üzünü silib qurulayandan sonra məhrəbanı xəfif təbəssümlə Güllünün çiyninə tulladı. Güllü də gülümsədi və mən bir sövq-təbiilə Güllünün bu təbəssümünü İmaşa qarşı xoşagəlməz bir hal kimi hiss elədim və Güllünün qırmızı yanaqlarını bıçaqla kəsmək üçün özümdə amansız bir arzu duydum.

Elə bu zaman anam, bacım Mahtabın əlindən tutaraq gəldi və hələ bizə çatmamış gülümsəyib dayıma dedi:

– Xoş gəlmisən!

Dayım gülə-gülə onların qabağına yeriyib, bacımın saçlarını qarışdırdı, anama baxıb dedi:

– Gözüm dəyməsin, Yaqut, çox yaxşısan.

Sonra onlar İmaşın çıxarıb dəhlizə qoyduğu və Güllünün üzərinə ağ süfrə saldığı stolun ətrafında əyləşərək çarın taxtdan salınmağından, böyük hərbi anbarın partladılmasından, Fatma nənəmgilin Şuşa qalasındakı qohumlarından söhbət etdilər. Dayım nənəmin kürd qohumlarından (Fatma nənəmgilə "kürd" deyirdilər) olan Ağakişinin qalın Alyanlı meşələri arasından çıxıb, Şuşaya – onun görüşünə gəlməsi haqqında məzəli şeylər danışıb anamı bərkdən güldürürdü. Ağakişini mən də görmüşdüm: ucaboylu, gözləri çəpə mayil, həddindən artıq iri burnu olan və həmişə gülümsəyən bir oğlan idi. Dayım nağıl eləyirdi ki, öz paltarımdan bir dəst geyindirdim Ağakişiyə, boynuna bant bağladım, başına şlyapa qoyub dostum gürcü balası İlya ilə apardım gecə klublarından birinə. Ordakı tanış qızlardan birini öyrətdik Ağakişiyə mehribanlıq eləsin, yarıçılpaq qız Ağakişinin qabağında əzilib-büzüldükcə Ağakişi də irişə-irişə bilmirdi neyləsin. Birdən qız Ağakişinin dizinin üstündə oturub boynunu qucaqladı, başladı burnundan öpməyə. Ağakişi qızın əlindən zorla çıxıb vəhşi buğa kimi qaçanda zaldakılar qəhqəhə ilə gülüb əl çaldılar.

Anam qəhqəhə ilə gülürdü. Fatma nənəm isə həyətdə qalanmış ocağın üstündə xörək bişirirdi, dayımın söhbətini yəqin ki, eşidirdi,

ancaq elə görünürdü, elə bil, eşitmir, axı, Ağakişi onun qohumu idi... Nənəmin yanında ayaq üstə durub dayımın söhbətinə qulaq asan Güllü də gülürdü. Ancaq Fatma nənəm kimi mən də gülmürdüm. Mən Ağakişinin o anlardakı vəziyyətini gözümün qabağına gətirib özümü nə üçünsə pis hiss edirdim.

Güllü stolun üstünə nazik yuxa, motal pendiri, kərə yağı, göy-göyərti düzdü, sonra Fatma nənəmin boşqablara çəkdiyi xörəyi gətirdi. Dayım:

– İrəli oturun! – deyə bizi də dəvət elədi. Amma anamla mən yemək istəmədik. Fatma nənəm bacım Mahtabı yanında oturdub yedirdirdi. Beli üzükdən keçən dayım yemək yeməkdə möhkəm idi, ac olanda iki-üç adam qədər yeyirdi. Yaxşı xörəklərdən dərin zövq alırdı. Özü də elə tez-tez yeyirdi ki, deyirdin, bəs, hara isə bərk tələsir.

Anam onun necə iştaha ilə yeməyinə tamaşa eləyə-eləyə soruşdu:

– Xanım nənəmgili Əhməd vuranda sən Şuşadaydın?

Nuru dayım toyuğun budunu dişinə çəkib dedi:

– Bəs hardaydım?

Sonra gülümsəyib, yəqin ki, Fatma nənəm eşitməsin deyə astadan əlavə etdi:

– Xanım nənəmgili Əhməd elə mənim tapançamla vurmuşdu dayna.

Anam qorxmuş kimi təəccüblə soruşdu:

– Doğru deyirsən?

Nuru dayım eyni nəşəli təbəssümlə yeyə-yeyə "hə" mənasında başını tərpədib dedi:

– O əhvalatdan bir gün qabaq mən tapançamı satmışdım Əhmədə, o da arvadları həmin tapança ilə vurmuşdu.

Əhməd, Fatma nənəmin bacısı Bəyaz xanımın kiçik oğlu idi. Özü də Nuru dayımla oxuyurdu. Fatma nənəmin qardaşı Mehdi bəyin qızı Minaya aşiq olmuşdu. Arıq, əsəbi bir oğlan idi. Bir dəfə acıqlanıb özündən böyük qardaşı Mirzə Məhəmmədi güllə ilə vurmuşdu. Ancaq güllə qardaşının ürəyinin yanından keçdiyi üçün sağ qalmışdı. Bir gün Əhməd, Mehdi dayısıgilə gəlib bağçadan görür ki, Fatma nənəmin anası Xanım nənə, Hacı Axundun böyük arvadı – yüz yetmiş kilo ağırlığında Yasəmən Xanım, bir də Minanın anası Sənəm xala şüşəbənd artırmada əyləşib yarpaq dolması bükə-bükə söhbət edirlər. Əhməd, Minanın adını eşidərək pilləkəndə ayaq saxlayır, eşidir ki, Xanım nənə deyir:

– Əhməd dəli şeydi, Minanı ona vermək olmaz.

O biri arvadlar da, Xanım nənəmin sözlərini təsdiq edib deyirlər ki, Əhməd, onsuz da, özümüzünküdür. Minanı vermək lazımdı sövdəgər Hacı Bəşirin oğluna, ağıllı oğlandı, dövləti də başından aşıb-daşır.

Əhməd bunu eşidən kimi artırmaya qalxaraq tapançanı çıxarıb arvadların üçünü də necə vurursa, yerlərindəcə qalırlar. Deyirlər ki, Bəyaz xalamın günüsü Yasəmən xanım çox gödək olduğu üçün elə oturduğu halda qalıbmış.

Anam qaşqabaqla soruşdu:

– Sən niyə tapançanı ona satırdın? Bilirdin ki, əsəbi oğlandı.

Nuru dayım ildırım sürətilə yeyə-yeyə kefi kök halda cavab verdi:

– Özü istədi, mənim də pulum qurtarmışdı, dedim satıram.

Anam narazı halda dedi:

– Səndə də pul dayanmır ki...

Nuru dayım iki çolpanın çığırtmasını yeyib qurtararaq, ağzını təmiz, ağ dəsmalla silib nəşə ilə dedi:

– Eh, ay Yaqut, bilsən ki, Cavad ağanın, Soltan bəyin oğlanları nələr xərcləyirlər, nə keflər eləyirlər, məni qınamazsan.

Sonra dayım taxtda uzanaraq Güllüyə dedi:

– O gədəni çağır, gəlsin çəkmələrimi çəksin.

Mən bilirdim ki, dayım "gədə" dedikdə İmaşı nəzərdə tutur. Əlbəttə, bizdə də atam-anam nökərə "gədə" deyirdilər. Lakin indi dayımın İmaşa "gədə" deməyi mənə pis təsir bağışladı.

Güllü dedi:

– Qağa, qoy mən çəkim.

– Yeri onu çağır! – deyə dayım sərt təkrar etdi.

Güllü bağa yüyürdü.

İmaş gəlib heç kəsin üzünə baxmadan dinməz-söyləməz dayımın uzunboğaz çəkmələrini zorla çəkib çıxardı (qəşəng görünsün deyə dayım həmişə ayağına güclə pərçim olan uzunboğaz çəkmə geyirdi), sonra çəkmələri aparıb tərtəmiz sildi, gətirib dayım uzanan taxtın böyrünə qoyub getdi. Dayım onun ardınca soyuq bir nəzər salıb dedi:

– Bu həmşəri gədəsindən gözüm heç su içmir.

Anam dedi:

– Niyə, pis oğlan deyil.

Dayım dedi:

– Adamın yerə baxanından düz əməl baş verməz.

Mən başa düşmürdüm ki, nə üçün dayımın İmaşdan xoşu gəlmir? İmaş bu cür dinməz-söyləməz onun qulluğunda durur, dayım taxtda uzanır, İmaş onun uzunboğaz çəkmələrini zorla çəkib çıxarır, aparıb silir, amma İmaşın özünün isə ayaqlarında dabanları əyilmiş cırıq bir çust var.

Əhmədin, arvadları necə öldürdüyünü danışdığı zaman dayımın üzündəki təbəssüm gözümün qabağından getmirdi. Axı, Əhməd onları dayımın tapançasıyla, özü də lap nahaqdan öldürmüşdü. Axı, onlardan biri dayımın da, mənim də qoca nənəmiz idi. İndi anamın da, hətta, Fatma nənəmin də bu söhbətə tamamilə sakit qulaq asmaları dayımın bu təbəssümündən dəhşətə gəlməmələri məni təəccübləndirirdi. "Təəccübləndirirdi" demək mənim o anlarda keçirdiyim sarsıntını ifadə etmək üçün çox zəif sözdür. Mən bir-birilərilə ən yaxın qohum olan bu insanların əslində bir-birilərindən nə qədər uzaq olduqlarını, birinci dəfə, təhtəlşüurla da olsa, hiss edirdim. Bayaq İmaş çolpaları qışqırda-qışqırda kəsdiyi zaman da dayım belə xoşhal ifadə ilə baxırdı. Bütün bunlar məni üşəndirirdi, zehnimdə bir xaos yaradırdı, dumanlı meşədə azan adam kimi mən gedib hara çıxacağımı, nə görəcəyimi, nədən şadlanacağımı, hiss elədiklərimi kimə deyəcəyimi bilmirdim.

Dayım gələndən sonra gecə babamgildə qalmaq istəməyərək anamla qayıtdım evimizə. Bağı keçib enli daş pilləkənlərlə yuxarı qalxanda mən özümü anlaşılmaz, cansıxıcı bir ümidsizlik içində hiss edirdim.

## ƏFƏNDİ BABA VƏ BEŞAÇILAN TÜFƏNG

Biz evə gələndə Zinyət xəbər verdi ki, Abdulla Əfəndi nökərilə gəlib, atlarını tövlədə qoyub, ağa ilə (yəni, mənim atamla) çıxıblar şəhərə. Atamın əmisi Abdulla Əfəndi İstambulda təhsil almışdı. Qar kimi ağ, uzunsaqqallı, nurlu bir kişi idi. Qarabağın cənub tərəfindəki sünnülərin çox hörmətli ruhanisi idi.

Artırmada qırmızı güllü bir xurcun, yanında da divara söykənmiş gödək bir beşaçılan tüfəng vardı. Mən bilirdim ki, xurcun Əfəndi babanındır.

Zinyətdən soruşdum:

– Bəs bu tüfəng kimindir? Əfəndi babanın nökərinindir?

Yox, – dedi, – Əfəndi babanın özününküdü.

Mən təəccüblə anamdan soruşdum:

– Əfəndi baba tüfəng niyə götürür?

Anam dedi:

– Çünki dədəngilin kəndində Əfəndi uşağıyla Hacı Vəli uşağının arasında qanlılıq var. Əfəndi baban yoldan ehtiyat eləyir.

– Məgər, düşmənləri ilə qabaqlaşsalar, Əfəndi baba da atışacaq?!

– Əlbəttə!

– O cür qoca adam?..

– Qocalığına nə baxırsan? Zirək kişidi baba.

Bir azdan, əynində tünd şal parçadan tikilmiş çuxanın altında tünd rəngli, zərif parçadan uzun arxalıq, arxalığın üstündən ağ ipək qurşaq, başında qaragül dəridən uzun papaq, ayaqlarında şibilit çəkmə olan Əfəndi baba cavan nökərinin və atamın müşayiətilə yaşının səksəni adlamasına baxmayaraq, çevik hərəkətlə pilləkəni qalxıb, anama:

– Xoş gördük bala, – deyərək mənim və bacımın üzündən öpdü.

Onun nökəri dərhal mis aftafanı su ilə doldurub pilləkənin başında hazır durdu, Əfəndi baba da çuxasını, corablarını çıxarıb, ayaqlarını yuyub dəstəmaz alandan sonra bizim qonaq otağımıza gedib xalının üstündə namaza başladı. Anam mənə və bacıma tapşırdı ki, səs salmayaq. Mən pəncərənin qabağında dayanıb babamın namaz qılmağına tamaşa eləyirdim, onun pıçıltı ilə nələr dediyi mənə məlum olmasa da, bəzən yarıqapalı, bəzən tavana zillənən gözlərində, uzun, ağsaqqallı üzündə duyduğum sakit, işıqlı ifadə mənim üçün sirli bir aləm idi. Mən öz-özümə deyirdim: “Baba Allahla danışır...” Fatma nənəm deyir ki, Allah gözəgörünməzdir. Bəs, nə üçün Əfəndi baba tez-tez göyə baxaraq danışır? Orada nə görür?

Mən onu da başa düşmürdüm ki, nə üçün şiə olan Fatma nənəm namaz qılarkən əllərini yanına salır, amma sünnü olan Əfəndi baba əllərini döşündə bir-birinin üstünə qoyur? Bunların mənası nədir? Və nə üçün yaşı səksəni keçmiş Əfəndi baba hər namazda bu qədər əyilib-qalxır? Əlləriylə bu cür hərəkətlər eləyir?

Sonra Əfəndi baba sakit, xoş bir avazla Quran oxudu, sonra salavat çevirərək qalxıb ipək döşəkçənin üstündə əyləşdi. Atam da gəlib onun yanında, döşəkcənin üstündə oturdu. Cavan nökər o saat xurcundan balaca, ağ bir süfrə çıxararaq gətirib babamın qabağına saldı, sonra yenə oradan armudu bir stəkan çıxarıb, aşağı başda dızıldayan samovardan tünd çay tökərək gətirib qoydu babanın qabağına. Əfəndi baba

atamla söhbət eləyə-eləyə iki stəkan çay içəndən sonra həmin oğlan heç nə soruşmadan xurcundan acıtmalı çörək, soyutma toyuq, yumurta, pendir çıxararaq gətirib düzdü babanın qabağına.

Əfəndi babanın qabaqkı gəlişlərindən mənə məlum idi ki, anam şiə olduğu üçün o bizdə xörək yemir.

Mənim anam vasvasılıq dərəcəsində təmizlik sevən bir qadın idi. Niyə, hansı səbəbə görə Əfəndi baba onun əli dəyən xörəyi yeməyi günah hesab edirdi? Və bu günah nədən ibarət idi? Madam ki, anamı da, Əfəndi babanı da bir Allah yaradıb, bəs, bu ayrı-seçkilik nə üçündür? Orası da qəribə idi ki, Əfəndi babanın bu hərəkəti anamın xətrinə dəymirdi, elə bil ki, o bunu təbii şey hesab edirdi. Mənim üçün bir də o çox maraqlı idi ki, atam, Əfəndi babanın yanında özünü xalis bir xidmətçi kimi aparırdı, onun yanında papiros da çəkmirdi, onunla ehtiyatla danışırdı.

Əfəndi baba ilə atamın söhbətindən başa düşürdüm ki, kəndimizdəki ədavət padşah hökumətinin yıxılması ilə indi hökm sürən "hürriyyətliklə" əlaqədar olaraq daha da qorxulu olmuşdur. Tez-tez tayfalar arasında atışmalar olur, kəndin bu tərəfindən o biri tərəfinə keçmək mümkün deyil. Əfəndi baba neçə dəfə barışıq eləmək istəyibsə də, bir nəticəsi olmayıb. Yenə də açıq və ya gizlin şəkildə adam vurmaq davam edir. İş o dərəcəyə çatıb ki, qənd-çay, ayın-oyun almaq üçün Əfəndi baba özü gəlməyə məcbur olub, oğlanlarını göndərməyə ürək eləməyib.

Sonra Əfəndi baba atama tapşırdı ki, o da sərvaxt olsun. Gecə artırmada çıraq işığında oturmasın.

Səhər atam, Əfəndi babanın bazara getməsinə razı olmayaraq, özü gedib hər nə lazımdısa aldı. Əfəndi baba anama razılıq eləyərək nökərilə yola düşüb getdi. Mən də babamgilə qaçdım. Fatma nənəm artırmada, taxtın üstündə bikef-bikef oturub qarşısına baxırdı. Müştüyü əlində tüstülənirdi. Mən təəccüb edirdim ki, dayım Şuşada olanda nənəm gecə-gündüz ona dua elədiyi halda, bəs, niyə indi onun gəlişinə sevinmir? Əgər, sevinirsə, niyə bunu izhar eləyə bilmir? Niyə ondan çəkinir? Elə bil ki, arvad eyzən bir xof içindəydi.

Mən onlara gedəndə dayım evdə yox idi. İmaş bağda, bostanda işləyirdi. Güllü evləri silib yığışdırırdı. Birdən dayım tələsik gəlib mənə də əhəmiyyət vermədən nənəmdən pul istədi. Arvad da evdən iki kağız pul gətirib verdi. Dayım pulları alıb dedi:

– Bu azdır, yeri yenə gətir.

Nənəm gedib bir kağız pul da gətirdi. Dayım bu pulu da alıb arvadın üstünə qışqırdı:

– Niyə qəpik-qəpik gətirirsən? Qıymırsan mənə? Yeri, yenə gətir!

Nənəm and içdi ki:

– Ta yoxdu.

Dayım arvada acı sözlər deyərək iti addımlarla getdi və bu hadisə mənə o qədər pis təsir elədi ki, uzun zaman nənəmin gözlərinə baxa bilmədim, ancaq arvad taxtın üstündə oturararq müştüyünü tez-tez dərindən sümürürdü, üzündə də elə bir ifadə vardı ki, elə bil, heç nə olmamışdı. Mən ona bir söz deməyərək qaçdım bağa, İmaşın yanına. İmaş ağacların dibini belləyir, balaca arxların içini təmizləyirdi. Dayım gələndən bəri o da tutqun olmuşdu. Mənə soyuq bir nəzər salıb soruşdu:

– Nə olub, qaqaş, dayın niyə acıqlanırdı?

Nə üçünsə mən özümü günahkar hiss edərək yavaş səslə dedim:

– Pul istəyirdi.

İmaş daha heç nə demədi. Birdən mən ondan soruşdum:

– Axı, dayım pulu neyləyir? Evdə yeməyə hər şeyi var, pal-paltarı da bəsdi deyincədi.

İmaş gözləri işində olduğu halda dərindən nəfəs alıb:

– Necə neyləyir, qaqaş? – dedi, – cavan ağadı, şəhərdə gözəl malakan qızları var, gözəl restoranlar var...

Mən hərarətlə soruşdum:

– Qızlara niyə pul verir?

Deyəsən, İmaş dediyinə peşman oldu:

– Zarafat eləyirəm, qaqaş... Sən uşaqsan, böyüklərin işinə qarışma, yaxşısı budu atana de, sənə dəftər-karandaş alsın, gətir sənə oxuyub-yazmaq öyrədim.

Mən, İmaşa cavab verməyərək uzaqlaşdım. Dayımın nənəmə acıqlanmağı mənə o qədər ağır gəlirdi ki, qayıdıb arvadın yanına gedə bilmirdim. Həyətdə veyllənir və aralıdan gözaltı nənəmə tamaşa edirdim, o, hey papiros çəkir və öz-özünə danışırdı.

Sonra nənəm mənə dedi:

– Get evinizə, axşam düşür.

Nənəm mənə heç vaxt deməzdi "get evinizə", ancaq indi deməyinə də pərt olmadım. Mən dərk edirdim ki, arvad bunu məhz Nuru dayım burada olduğu üçün deyir. Nənəm hiss edir ki, dayımın gəlişilə burada yaranan ab-hava məni sıxır.

Mən evimizə gələrək dayımın nənəmə acıqlandığını anama danışdım. Anam əsəbiləşdi:

– Təqsir arvadın özündədir, – dedi, – niyə onun törətdiyi işləri kişiyə demir? Niyə gizlədir? Nə qədər deyirdim, – bunu az ərköyün elə, elədiyi işləri dədəmə de, qoy qabağını alsın, – hesabı içəri verirdi.

Mən dedim:

– Fatma nənəm dayımdan qorxur.

Anam dedi:

– İndi, əlbəttə, qorxar, gərək uşağın vaxtında qabağını alasan.

Birdən fikrimə gəldi ki, bəlkə atam buna görə mənimlə həmişə sərt rəftar edir, hər şeydən ötrü məni danlayır? Ancaq mən heç bir pis iş görmürdüm. Mən onu da heç cürə təsəvvür eləyə bilmirdim ki, bir zamanlar mən də anamı söyə bilərəm. Anam heç zaman məni öpüb-oxşamazdı, məni nazlandırmazdı. Ancaq, bununla bərabər, ürəyimin dərinliklərində mənim üçün ondan əziz adam yox idi. Mən bir də Bayram babamı çox istəyirdim. Lakin Bayram babamsız aylarla qalırdım, anamdan dörd-beş gün ayrı qalmağı ağlıma gətirə bilmirdim. Son vaxtlar anam tez-tez xəstələnirdi, bu da mənə gizli bir dərd olmuşdu. Anamın titrətməsi, Zinyətin yorğanları onun üstünə tökməsi, sonra qızdırmaya düşüb gözlərinin alışıb-yanması, üzünün qızarıb pörtməsi, bəzən sayıqlaması mənim həyatımın ən qüssəli, ən sıxıntılı anları idi. Mən bir küncdə qısılıb anamın qızdırmadan necə əzab çəkdiyinə tamaşa eləyə-eləyə göz yaşı tökürdüm və çalışırdım ki, bu göz yaşlarımı heç kəs, birinci növbədə, atam görməsin.

## DOKTOR İVAN SERGEYEVİÇ QULİYEV

Ən çox xətrini istədiyim adamlardan biri də doktor İvan Sergeyeviç Quliyev idi. Ona görə ki, anamı həmişə o müalicə edirdi. Özünün də, deyirdilər ki, ayağı sayalıdır. Doğrudan da, o, müalicəyə başlayan kimi anam sağalırdı. Ortaboylu, çənəsində balaca saqqalı olan, həmişə yaxşı geyinən, xoşsifət bir kişi idi, hələ mən bu dünyaya gəlməmiş Bayram babamın dostu imiş. Anamı, Nuru dayımı lap uşaqlıqdan o müalicə edərmiş. Ona görə də, anam, hətta, Fatma nənəm də ona ev adamı kimi baxırdılar. O, Qarabulaqda çoxdan yaşadığı üçün azərbaycanca təmiz bilirdi. Həmişə bizə gələndə, mənə də, bacıma da, ya balaca oyuncaq, ya konfet gətirərdi. Bizim bayramımızda anam da hə-

mişə öz bişirdiyi şirin şeylərdən doktora göndərərdi. Kürdobadan, ya babam naçalnik olduğu yerdən bizə ceyran, kəklik, turac gələndə, anam mütləq doktor üçün də pay göndərərdi...

Anam bərk xəstə olanda doktor Quliyev gəlib mənimlə, bacımla zarafatlaşa-zarafatlaşa anamı müayinə eləyib deyərdi:

– Bir şey yoxdur, bir az soyuq dəyib... Dörd-beş günəcən keçib gedər.

Onda, elə bil, mən dünyaya təzədən gəlirdim. Mən inanırdım ki, anam sağalacaq. Bir də doktor Quliyevi mən ona görə ürəyimdə çox istəyirdim ki, həmişə bizə gələndə qızıl eynəyi ardından mənə baxıb, gülümsəyərək:

– Yaqut xanım, – deyirdi, sizin bu oğlunuzun necə ağıllı gözləri var.

Həmişə də doktorun bu sözü ürəyimi kövrəldirdi, çünki mənə elə gəlirdi ki, atam məni səfeh hesab eləyir. Anamın ən yaxın rəfiqəsi Məhbub xanım da həmişə anama deyərdi ki, "Muradın gözləri elə bil səninkidir". Həmişə atam "fərsiz, heç zadın otu" deyib məni danlayanda, mən, doktor Quliyevin və Məhbub xanımın sözlərini xatırlayardım və bu da mənə gizlin bir təsəlli olardı.

Nikolay padşahın taxtdan salındığı günlərdə doktor Quliyev həyəcanla bizə gəlib atamgilə dedi:

– Bəlkə siz mənə kömək eləyəsiniz, çıxım gedim Rusiyaya.

Atam soruşdu:

– Nə üçün, doktor?

Həkim dedi:

– Cizin camaat çarın əlindən çox acıqlıdır, mən də ki, rus, qorxuram...

Atam onun sözünü yarımçıq kəsib dedi:

– Nə danışırsınız, doktor? Siz hara, çarın çinovnikləri hara?.. Bəyəm çarı taxtdan yıxan elə rusların özü döyül?!

Anam da əlavə etdi ki:

– Nə üçün ürəyinizə heylə şey gəlir, doktor? Bizim camaat sizə öz doğma adamı kimi baxır, sizin xətrinizi istəyir.

Atam dedi:

– İstəyirsiniz, köçün bizim evlərin birinə...

Doktor dərindən nəfəs alıb dedi:

– Mən özüm də bilirəm ki, xalq məni sevir, ancaq dedim... birdən...

Atam dedi:
– O barədə ürəyiniz buz kimi olsun, doktor, sizə toxunmaq heç kəsin ağlına da gəlməz.
Anam dedi:
– Siz heç kasıblardan pul-zad almırsınız.
Doktor dedi:
– Mən sizin xalqınızı sevirəm.
Anam dedi:
– Buna heç kəsin şübhəsi olmaz, özünüz görürsünüz ki, burada olan malakanlara heç qaçaq-quldur da toxunmur, çünki biz onlardan pislik görməmişik, camaata hər nə eləyib naçalniklər, pristavlar eləyib.

Doktoru mən özümüzə o qədər yaxın bilirdim ki, indi onun bizim adamlar sarıdan təşvişə düşməsini anlaya bilmirdim. Mən dilimizin, dinimizin ayrı olduğunu bilsəm də, xalqların – azərbaycanlıların, rusların, gürcülərin, daha nə bilim, kimlərin bir-birindən tamam ayrı olduqları barədə heç zaman düşünməmişdim.

Mən heç vəchlə bizim camaat arasında doktor İvan Sergeyeviçi incidəcək adam təsəvvür eləyə bilmirdim. Mən "sizin xalq", "bizim xalq" sözlərini birinci dəfə eşidirdim. Zehnimdəki bu qarmaqarışıqlığa baxmayaraq, atamgillə söhbətindən sonra doktorun rahat nəfəs aldığını hiss eləyib çox sevindim. Doktor gedəndə atam ona təkrar dedi:
– İvan Sergeyeviç, ürəyiniz lap arxayın olsun. Heç kəsin sizinlə işi olmaz.

Atamın bu sözləri məni fərəhləndirdi. Atamın bu sözləri möhkəm inamla, doktoru ürəkdən istəyərək dediyini mən hiss edirdim.

Doktor arxayın halda qalxıb getdi.

## İMAŞLA GÜLLÜ NECƏ QAÇDILAR...

Dayım şəhərdən fışdırıq çala-çala kefi kök gəldi, hətta, mənə baxıb gülümsədi də. Sonra artırmada, stulda oturub:
– Güllü, su gətir, – deyə çağırdı.

Deyəsən, Güllü eşitmədi, dayım bir də çağırdı. Bu dəfə Güllü, İmaş yatan evdən çıxaraq, hövlnak yüyürüb gəldi, dayım ona diqqətlə baxıb soruşdu:
– Orada nə qayırırdın?
Güllü qorxmuş halda cavab verdi:
– Heç nə.

Dayım yenə soruşdu:
– O gədə də oradadı?
Birdən, elə bil ki, Güllüyə bir cəsarət gəldi, dayımın düz gözünün içinə baxıb dedi:
– Oradadı.
Onsuz da sarıbəniz adam olan dayımın rəngi qaçdı.
– Yeri çağır bura.
Güllü dayıma baxmaqda davam edərək yerindən tərpənmədi.
– Səninlə deyiləm? – deyə dayım qəzəblə səsləndi.
Güllü iti addımlarla İmaş olan otağa gedəndə Fatma nənəm də taxtın üstündən düşdü. Dayım qalxıb yun çırpmaq üçün qayrılmış zoğal çubuğunu bucaqdan götürdü. İmaş ağır addımlarla irəli gəldi. O üç-dörd gün idi ki, titrədib qızdırırdı. Ancaq xəstəliyini elə ayaq üstündə keçirirdi. Neçə dəfə nənəm demişdi ki, uzan yat. Amma İmaş yatmırdı. Qızdırması düşən kimi yenə də durub bağda-bostanda işlərini görürdü. Fatma nənəm də dayımdan xəlvət ona kinə, çay, xörək verirdi.
O, yaxınlaşan kimi dayım qabağına yeriyib bətbənizi qaçmış halda dedi:
– Ə, köpəkoğlu, İrandan bura eşqbazlığa gəlmisən?
Və onun ağzını açmağını gözləməyib saldı ağacın altına, Fatma nənəm vahimə ilə pıçıldadı:
– Allah, sən saxla.
İmaş qırpımsız nəzərlərlə dayıma baxır, o da oğlanın harası gəldi, budayırdı. Evin divarına söykənib tamaşa eləyən Güllü birdən özünü irəli ataraq İmaşla dayımın arasına girib qışqırdı:
– Niyə öldürürsən yazığı?!
Dayım əl saxlayıb təəccüblə Güllüyə baxanda, İmaş eyni sakitliklə:
– Sən o yana get, Güllü! – dedi. – Qoy ağa ürəyini soyutsun.
– Yox! – deyə Güllü qışqırdı.
Bu dəfə dayım çox pis söyüşlə Güllünü saldı zoğal çubuğunun altına. İmaş irəli soxulub görünməmiş bir qüvvətlə çubuğu tutub dayımın əlindən alaraq:
– Ağa, dedi, – məni şil-küt elədin, dinmədim, axı, bu zənən xeylağıdır.
Dayım evə yüyürərək mauzer tapançasını götürüb ayağa çəkəndə Fatma nənəm yaylığını başından sivirib onun qabağına ataraq dəhşətlə qışqırdı:

– Allahdan qorx, ay bala!

Dayım sanki donaraq bir an dayandı və elə bu anda anam gəlib çıxmasaydı, kim bilir, neyləyəcəkdi... Anam qorxmuş halda soruşdu:

– Nə olub, Nuru?

Dayım ona cavab vermədən tapançanı qaytarıb qoydu yerinə, mən daha orada dayana bilməyərək qaçdım bağa. Gördüm ki, İmaş arxın qırağında oturub, gözlərini zilləyib suya. Mən ona yaxınlaşa bilmədim. Mənə elə gəlirdi ki, onun yanında mən də günahkaram. Onun üsyanla ağacı tutub dayımın əlindən alması məndə mərdanə bir əhval yaratmışdı, indi ayrı vaxtlarda olduğu kimi, mənim İmaşa yazığım gəlmirdi, indi o mənim nəzərimdə böyüyüb, hətta, dayımdan da cəsarətli, qoçaq olmuşdu. Onun qızdırmadan saralıb-solmuş arıq üzü indi mənə bir igid çöhrəsi kimi görünürdü. O, Qaçaq Nəbi, Qaçaq Süleyman haqqında eşitdiklərimi yadıma salırdı: onlar da əvvəllər İmaş kimi kasıb, sakit oğlanlarmış. Ancaq bu anlarda mənim Fatma nənəmə yazığım gəlirdi, arvadın ağ saçlarını açaraq vahimə içində oğluna: “Allahdan qorx!” deməsi hey xəyalımda dolanırdı. Əgər, nənəm bu sözləri başqa, kənar bir a”larını düşündükcə az qalırdım ağlayım. Hey fikirləşirdim ki, görəsən, onlar necə oldular? Hara getdilər? Mən həyatımda ilk dəfə olaraq yoxsul insanların üsyanını görürdüm. Elə bil ki, bu üsyan mənim varlığımda da nəyinsə qaynayıb-coşmasına səbəb olmuşdu. Mən ürəyimdə, Güllü kimi İmaşın tərəfini saxlayaraq dayımın qarasına qəzəblənirdim. Həyatımda birinci dəfə olaraq varlıların ədalətsizliyini hiss edərək məzlumların müdafiəsinə qalxırdım. Əlbəttə, bunlar hamısı mənim ürəyimdə idi və bunlardan heç kəsin xəbəri yox idi. Mən İmaşın yanında özümü Fatma nənəmin yanında olduğu kimi sərbəst, yüngül hiss edirdim. Dayımın təhqirini, danlağını nənəmin dinməz-söyləməz qəbul etməsi mənim izzəti-nəfsimə toxunurdu. Amma anam, nənəm kimi deyildi, atam birini deyəndə, anam ikisini deyirdi və bu da mənim ürəyimdən olurdu. Mən istəyirdim ki, nənəm də dayıma qarşı anam kimi olsun.

Belə vaxtlarda, özümdən asılı olmayaraq, böyüklərin keçmiş həyatlarında baş vermiş keçmiş hadisələr daim xəyalımda, özü də necə deyərlər, arxa planda baş qaldırır, sonra mən tamamilə, o aləmə dalırdım, o aləm mənim üçün qəribə nağıllara çevrilirdi və mən o aləmdə nəyə isə heyran olurdum, nəyə isə təəssüf edirdim. İndi atamın mənimlə sərt rəftarına, anamın həmişə atama qarşı məni müdafiə elə-

məsinə fikir verəndə bilaixtiyar onların keçmişinə gedirdim, düşünürdüm ki, görəsən, anam əvvəlki nişanlısına getsəydi, bizim günümüz necə olardı? O atam mənimlə necə rəftar edərdi?

### BİZİM YAYLAĞA KÖÇMƏYİMİZ, OTAYLI QAÇAQLAR... CAVAN ƏHMƏDALININ BİR TOĞLUNU TƏK YEMƏYİ, NURU DAYIMIN TÖRƏTDİYİ İŞLƏR VƏ ONUN ACIQ ELƏYİB ARANA QAYITMAĞI

Yay isti gəldiyindən anam təkid edirdi ki, biz də Kürdoba yaylağına gedək. El çoxdan köçmüşdü yaylağa, demək, bizim ailə tək getməli idi. Fatma nənəm razı deyildi, "yollar doludur qaçaqla" deyirdi, anam da cavab verirdi ki, "bir ucu Kolqarabağı, bir ucu da Zəngəzur mahalı, hər yerdə kişini tanıyırlar, neyləyəcəklər bizə". Ancaq Fatma nənəm öz təşvişi barədə Nuru dayımın yanında bir kəlmə də danışmırdı, nənəm bilirdi ki, əgər, danışsa, dayımın cini qalxacaq. Mən onu da hiss edirdim ki, nənəm yolların qorxulu olduğunu dedikdə, ən çox, Nuru dayım sarıdan ehtiyat edir, bilir ki, əgər, bir şey olsa, dayım dinc durmayacaq.

Qarabulaqla Kürdoba yaylaqlarının arası üç yüz kilometrdən çox olardı. El köçü bu yolu qoyun-quzu, mal-qara otara-otara on-on iki günə gedib çıxırdı, ancaq biz üçatlı faytonla gedirdik. Atamla Nuru dayım isə faytonun yanınca atlı gedirdilər. Dayımın atı kürən, atamınkı isə boz idi. İkisi də cavan, qaçağan atlar idi. Dayım uzunboğaz çəkmə geyib, belinə üç patrondaş çəkərək zağlı, gödək beşaçılan, taxta beşaçılan, taxta qoburlu onatılan tapança götürmüşdü. Atam isə elə öz tacir paltarında idi, ancaq belində tapançası var idi. Atamın bu cür həşəri – boz ata minib tapança bağlaması mənə uyğunsuz görünürdü, çünki mən heç bir zaman onu Nuru dayım kimi at çapan, güllə atan görməmişdim.

Biz gün çıxanda yola düşüb, axşama yaxın Dədələr adlı kəndə çataraq, Bayram babamın köhnə dostlarından olan Hacı Fərhadın evinə düşdük. Hacı Fərhad neçə min qoyunu, at ilxısı olan bir tərəkəmə idi. Özü bütün ailəsilə çoxdan yaylaqda idi. Evdə qapı-bacaya baxan qoca bir kişi ilə onun qoca qarısı qalmışdı. Onlar babamgillə Hacının dostluğundan xəbərdar olduqları üçün bizə olmazın hörmət elədilər, neçə çolpa kəsib çığırtma bişirdilər, neçə dəfə samovar qaynatdılar, gecə

birmərtəbəli evin meydan kimi geniş artırmasında hamımız üçün ipək yorğan-döşək açdılar. Səhər çay-çörəkdən sonra düzəldik yola. Obadan bir xeyli aralanmışdıq ki, hansı yolla getmək üstündə atamla dayımın arasında mübahisə düşdü. Dayım deyirdi ki, Gəyən yolu ilə gedək, çünki kəsədi, şose yolla otuz-qırx verst təfavütü var, mənzərəli yerlərdən keçir.

Atam deyirdi: "Yayın bu isti vaxtında Gəyən düzü yəqin ki, cəhənnəm kimi od tutub yanır, özü də bu qarmaqarışıqlıqda qaçaqsız-quldursuz olmaz".

Dayım istehza ilə güldü:

– Denən qorxuram, vəssalam.

Atam bərk tutuldu:

– Sənin də elə bir igidliyini görməmişik.

Dayımın göy gözləri qəzəblə parladı:

– Sənin kimi tərəzi dibi kəsdirənin tapança bağlamağını görəndə adamın gülməyi tutur.

Sonra o, faytonçu Cümşüdə əmr etdi:

– Gəyənlə get!

Cümşüd Qarabulağın yaxınlığındakı kəndlərdən idi. Çəkinə-çəkinə dayıma dedi:

– Abdulla doğru deyir, Gəyənlə getmək bu saat qorxuludu.

Dayımı cin götürdü:

– Axmaq oğlu, axmaq! – deyə faytonçuya qışqırdı. – Sür, Gəyən yoluna! Siz kəndlilərin qorxaqlığı aləmdə məşhurdu.

Dayımın axırıncı sözlərində atamın da payı var idi. Bizim tərəflərdə köçəri tərəkəmə camaatının oturaq kənd əhli ilə arası olmazdı, tərəkəmələr oturaq kəndliləri qorxaq, aciz-avara hesab edərdilər.

Faytonçu yəqin ki, dayımın xasiyyətini bilirdi, ona görə də, dinməz-söyləməz atların ağzını döndərdi Gəyən düzünə tərəf.

O zaman atam da atını şose yolla dördəmə çaparaq, bizdən uzaqlaşdı. Qarabağın cənub tərəfindən ta Araza qədər uzanan Gəyən düzü, atam deyən kimi, od tutub yanırdı. Günəş işığında qızıl kimi parıldayan ilanlar faytonun qabağında o tərəf-bu tərəfə şütüyüb keçirdilər. Daşlıqlarda istidən ağızlarını ayırıb baxan boz kəkliklər görürdük. Dayımın deməyinə görə, gərək biz bu yolla Kürdoba yaylaqlarının yaxınlığındakı şəhərə – Gorusa daha tez çataydıq, ancaq hey gedirdik, heç bir kənd, şəhər əlaməti görünmürdü. Susuzluqdan dilimiz ağzımızda yanırdı. Bacım Mahtab "su!" deyə qışqırırdı. Dayım binoklla hər tərəfi

nəzərdən keçirirdisə də, heç nə görmürdü, məlum oldu ki, azmışıq. Dayım tez-tez alnının tərini silərək faytonçunu söyüb danlayırdı ki, nə üçün azıb? O da hirsini udaraq heç bir söz deməyib, istidən, susuzluqdan yorulub taqətdən düşən atları şallaqlayırdı. Bacım Mahtab susuzluqdan tamam bihal olmuşdu. Fatma nənəm hey müştüyünü tüstülədib susurdu. Anam da tez-tez papiros çəkirdi, mən bərk susasam da, səsimi çıxarmırdım. Bu qızmar gün işığında ancaq cırcıramaların aramsız, yeknəsəq səsi eşidilirdi. İndi fayton atları da, dayımın atı da addım-addım gedirdi, birdən dayım diqqətlə üfüqə baxaraq, faytonçuya dedi:

– Bir saxla görək, ə!

Cümşüd atların cilovunu çəkib dayandırdı. Anam da, mən də dayımın gözləri zillənən istiqamətə baxaraq güclə seçdik ki, toz qopara-qopara o yandan bəri bir topa qaraltı gəlir.

Dayım toz qopara-qopara irəliləyən qaraltını binoklla bir neçə saniyə nəzərdən keçirib, sakit, quru səslə dedi:

– İran atlılarıdır!

Sonra əlavə etdi:

– Səkkiz nəfərdilər.

Fatma nənəm pıçıldadı:

– Allah, sən saxla!

Dayım tələsik atdan düşərək faytonçuya əmr etdi:

– Düş, fərməşi, çamadanları aç yığ bura.

Fatma nənəm çəkinə-çəkinə dayıma dedi:

– Bala, güllə atarsan, tökülüb bizi qırarlar.

Dayım acıqlı-acıqlı cavab verdi:

– Yoxsa ki, güllə atmasam, bizə rəhm eləyəcək İran qaçaqları? Tez! – deyə faytonçuya qışqırdı.

Cümşüd faytonun arxasından iri fərməşi, iki çamadanı düşürən kimi dayım yenə əmr etdi:

– Faytonu döndər, atları qov geri!

Özü isə, faytondan düşürülən şeyləri səngər kimi düzəldərək arxasına yıxılıb indi artıq açıq seçilən atları basdı gülləyə. Cümşüd isə, atları döndərib geriyə çapdı. Dayımın atı bir qədər faytonun böyrüncə dörddəmə gedib birdən geri döndü. Dayanıb dayıma tərəf baxaraq kişnədi. Biz dayımdan təxminən bir kilometr aralananda anam faytonçuya qışqırdı:

– Saxla!

Deyəsən, faytonçu qəsdən özünü eşitməməzliyə vurub atları qovmağa davam etdikdə, anam cəld hərəkətlə faytonun içində ayağa qalxıb arxadan Cümşüdün pencəyindən dartaraq qəzəblə səsləndi:

– Demirəm saxla? Nurunu qoyub hara qaçırsan?

Cümşüd atların cilovunu çəkib faytonu dayandırdı. Anam da, mən də faytondan düşüb geri baxdıq! Dayım güllələyir, atlılar isə, buna əhəmiyyət verməyərək toz qopara-qopara o yandan bəri çapırdılar. Güllə mənzilinə çatanda lap qabaqda gələn at şahə qalxaraq yıxıldı. O biri atlılar da ona çatıb dayandılar. Neylədiklərini aydın seçə bilmirdik. Ancaq görürdük ki, dayıma tərəf üç dəfə yaylım atəşi açdılar. Dayımın ətrafında toz qalxıb, bir an onu görünməz etdi.

Fatma nənəm hey deyirdi:

– Allah, sən saxla! Allah, sən saxla!

Deyəsən, quldurlar dayımı vurulmuş hesab edərək yenə də üzübəri çapdılar, indi onların ağ keçə araqçınlarını da aydınca görürdük. Yenə də dayım pulemyot kimi dalbadal atəş açdı. Onlar yenə də bir an dayanaraq, bir yerə toplaşdılar. Sonra bir-birindən aralanaraq seyrəklənib yenə də dayıma tərəf çapdılar. Elə bu anlarda bir də gördük ki, bizdən təxminən üç yüz metr sağ tərəfdəki təpənin dalından bir dəstə tüfəngli atlı çıxaraq atlarının başını çəkib atışma gedən tərəfə baxdılar. Anam qabaqdakı qırmızı çuxalı boz atlıya diqqətlə baxıb faytonçuya qışqırdı:

– Səslə onları! Bizim tərəfin adamlarıdı!

Faytonçu bir anda dəsmalını şallağın başına keçirib təpənin üstünə qalxan atlılara tərəf yelləyərək qışqırdı:

– Ayə, kömək eləyin, İran qaçaqlarıdı qabağımızı kəsən. Onlarla atışan Kürdobalı Bayram bəyin oğludur!

Təpənin üstündəki atlılar güllə ata-ata iranlılara tərəf çapdılar. Bunu belə görən Nuru dayım da qalxdı, yüyürərək atına minib onların dəstəsinə qoşuldu, iranlılar atlarının başını döndərib geriyə çapdılar, bəlkə də bu ondan oldu ki, İran qaçaqları bu yerlərə nabələd idilər. Bəlkə də qorxdular ki, hansı tərəfdənsə yenə də dayımgilə kömək gələr.

Bütün bu müddətdə Fatma nənəm bir dəqiqə də ara verməyib, hey dayıma dua eləyirdi. Dayımgil iranlı qaçaqların dalınca çapa-çapa gözdən itəndə anam qızıl suyuna çəkilmiş və ağzında iri yaqut olan qutusunu açdı, bir papiros çıxarıb yandıraraq faytonçuya əmr etdi:

– Sür şeylərin yanına!

Fayton, dayım səngər eləyən yerə çatıb dayandı. Biz faytondan düşüb şeylərə baxdıq: çamadanlar, fərməş deşik-deşik olmuşdu. Fatma nənəm heç bir şeyə əhəmiyyət verməyərək hey bizim atlılar gözdən itənədək üfüqə baxıb dua edirdi.

Faytonçu anama dedi:

– Siz beş-on dəqiqə burada dayansaydınız, mən o təpəyə çıxıb baxardım, bəlkə bir yol-riz göründü.

Anam dedi:

– Yaxşı, get.

Qorxu sovuşduğu üçün susuzluq, isti yenidən bizə divan tutmağa başladı. Bacım Mahtab bihuş halda faytonda uzanmışdı. Fatma nənəm gözlərini üfüqə zilləyib hey dodağının altında nə isə pıçıldayırdı. Nə istini hiss edirdi, nə də susuzluğu.

Faytonçu təpəni yüyürə-yüyürə enib yanımıza gələrək dedi:

– O biri tərəfdə bir bina görünür, yəqin çayxanadı, gedək ora. Fatma nənəm bayaqdan bəri birinci dəfə dillənib dedi:

– Bəs, Nuru nə biləcək biz ordayıq?

Faytonçu cavab verdi ki, "yəqin o atlılar həmin evi tanıyırlar. Görsələr burada yoxuq, ora dəyməmiş olmazlar". Biz qızmar günəş altında zəbanə çəkən düzün ortasında torpaq yolun üstündəki balaca kərpic çayxanaya çataraq faytondan tökülüşüb girdik içəri. Şüşələri hisdən saralmış tək pəncərədən işıq güclə sızdığı üçün içəri yarıqaranlıq da olsa, sərin idi. Torpaq döşəməyə təzəcə su çiləmişdilər, başlarında tüklü qoyun dərisindən basma papaq, əyinlərində şal çuxa, ayaqlarında yun corabla çarıq olan iki kəndli skamyanın üstündə oturub tər tökə-tökə çay içirdi. Bu istidə onların bu cür geyinməyi məni heyrətləndirirdi. Bacım Mahtaba su içirdib özünə gətirəndə qız iri su parçını qucaqlayıb heç kəsə vermirdi.

Biz doyunca su içib sərinləyəndən sonra döşəndik çaya. Bu zaman dayımgil girdilər içəri.

Dayıma kömək eləyənlərin başçısı anama dedi:

– Xoş gördük, bacı.

– Xoş günün olsun, Xanmurad, Allah səni lap vaxtında yetirdi, yoxsa iranlılar bizi qıracağdılar.

Hiss basmış pəncərədən sızan zəif işıqda Qaçaq Xanmuradın yaraşıqlı sifəti çox solğun görünürdü. O, xəfifcə gülümsəyib dedi:

– Nuru kimi oğul olan yerdə onlar bir qələt eləyə bilməzdi.

Sonra qaşlarını çatıb əlavə etdi:

– Sizə görə qayıtdıq, yoxsa, onların birini də sağ buraxmazdıq.

Nuru dayım mis parç dolusu su içib nəşə ilə dedi:

– Mən vurduğum, deyəsən, başçıları idi, amma bilmədim sağ qaldı, yoxsa...

Qaçaq Xanmurad dedi:

– Deyəsən, sağ idi, çünki yoldaşlarının tərkində iki adam oturmuşdu: biri atı vurulan, biri də yəqin güllə dəyən...

Nuru dayım eyni nəşə ilə əlavə etdi:

– Qəsdən adama atmırdım... Yoxsa, bir-bir hamısını dənləyərdim.

Çay içən kəndlilərdən biri dayıma dedi:

– Adama atmamaqda yaxşı eləmisən, bala, axı, onlar da bizim kimi türkdülər dayna.

Qaçaq Xanmurad dedi:

– Nə təhər türkdürlər ki, keçib bu taya çapavulçuluğa gəlirlər?

Kişi:

– Ay Xanmurad, – dedi, keflərindən gəlmirlər ha. Odey, biri sən özün, bəyəm, durduğun yerdə qaçaq olmusan?!

Qaçaq Xanmurad qaşqabaqlı cavab verdi:

– Mən padşahın ucbatından qaçaq olmuşam.

Kişi dedi:

– Onlar da İran şahının ucbatından dərələrə düşürlər.

Qaçaq Xanmurad dedi:

– Mən heç vaxt kasıb-kusuba, arvad xeylağına dəyməmişəm...

Kişi dərindən nəfəs alıb dedi:

– Hər yerdə mərd də var, namərd də...

Elə bu zaman bayırda at ayağının tappıltıları eşidildi, sonra atam içəri girib salam verdi. Qaçaq Xanmurad onu tanıyıb gülümsədi:

– Bu necə işdi qardaşlıq, sən niyə köçdən ayrı düşmüşdün?

Atam dedi:

– Mənim bir balaca işim var idi.

Sonra Qaçaq Xanmurad qalxaraq anama dedi:

– Bacı, tay biz mürəxxəs olaq. Buradan o yana ehtiyat eləməyin, Gorusa az qalıb.

Fatma nənəm dedi:

– Sağ ol, Xanmurad, ömrün uzun olsun.

Qaçaq Xanmurad atlanıb yoldaşları ilə getdi, lakin mən bütün yolboyu onun haqqında düşünürdüm. Anam atama qoşulub qaçanda Pirağbulaq dərəsində ona necə rast gəldiklərini və Qaçaq Xanmuradın

anama boygörüncəyi üzük də bağışladığını Möhnət qarı danışmışdı, bunu anam rəfiqələrinə nağıl eləyəndə də eşitmişdim. Həmin üzük indi də anamın barmağında idi. Qaçaq Xanmuradın həyatı mənim üçün bir müəmma idi. Özü də cazibədar müəmma idi. İndi bizdən ayrılanda da mənə elə gəlirdi ki, o, hara isə əfsanəvi bir aləmə gedir və o aləmdə onu, kim bilir, nələr gözləyir... Qaçaqların ardınca biz də çayxanadan çıxıb yolumuza davam etdik. İndi atam da atını faytonun yanınca sürürdü, özü də heç kiminlə kəlmə də kəsmirdi. Faytonçu Cümşüd iranlılarla olan əhvalatı, bizim azmağımızı ona danışanda, atamın üzündə istehzalı bir təbəssüm yarandı. Bu, o demək idi ki, əgər, dayım tərslik eləməyib onun sözünə baxsaydı və biz ümumi köç yolu ilə getsəydik, başımıza bu əhvalatlar gəlməzdi.

Çəkdiyimiz əziyyətlərə baxmayaraq, köç yolu ilə gəlmədiyimizə mən təəssüf eləmirdim. Od tutub yanan Gəyən düzü ilə gəlməyimiz də, iranlı quldurlarla rastlaşmağımız da, dayımın onlarla o cür atışması da, sonra Qaçaq Xanmuradın öz dəstəsilə gəlib bizim harayımıza çatması da məndə qəribə bir qürur hissi doğururdu. Elə bil ki, bütün bu hadisələrdə mən özüm də mühüm bir rol oynamışdım, elə bil ki, Qaçaq Xanmuradda, nə isə, mənə yaxın, doğma olan bir şey var idi. Onun yaraşıqlı üzünün solğunluğu, gülərkən görünən ağappaq dişləri, gilənar rəngli dioqonal çuxası, qırmızı ağac qoburlu onatılan tapançası məndə söz ilə ifadə edə bilmədiyim şairanə hisslər yaradırdı. Qaçaq Xanmurad gedəndən sonra atam da, dayım da mənə soyuq, yapışıqsız, hətta, yad kimi görünürdülər. Mən istəyirdim ki, anam eyzən onun haqqında danışsın. Hiss edirdim ki, anam onun xətrini istəyir. Mənim duyğularımı anam da duyur. Əlbəttə, mən bütün bunları təhtəlşüur hiss edirdim, yəni, bu hisslərim barədə aydın heç nə deyə bilməzdim.

Biz dağlar arasındakı balaca Gorus şəhərinə çatdıqda, Cümşüd şəhərin girəcəyində qolbənd edilib otlağa buraxılan bir neçə yəhərli at görüb faytonu dayandırdı. Yəhərli atların yanında uzanan iki oğlan qalxıb bizə tərəf yüyürdü. Dayım ortaboylu, enlikürək, qumral bığlı oğlandan soruşdu:

– Əhmədalı, çoxdan burdasınız?

Əhmədalı dedi:

– Çoxdan, bir az da gec gəlsəydiniz, gedəcəydik qabağınıza, dedik görən nə olub.

O biri qarabığ, qarasaç, nazik oğlan dayımdan soruşdu:

– Qağa, patrondaşların niyə qabaqdan boşalıb?
Dayım dedi:
– İran qaçaqları ilə davaya düşmüşdüm, Hacı.
Hacı dedi:
– Gərək lap aranacan gələydik qabağınıza.
Dayım nəşə ilə dedi:
– Onsuz da, vaylarını verdik, əvvəl tək özüm bir saat vuruşub qabaqlarını saxlamışdım. Ancaq qəfil Qaçaq Xanmurad dəstəsilə gəlib çıxdı. Mən başçılarını, birinin də atını vurmuşdum.
Hacının gözləri parladı:
– Deməli, qağa, möhkəm atışmısınız...
– Möhkəm. Başıkəsik günbəzəcən qovmuşuq. Uşaqlar günün qabağında qalmasaydı, əl çəkən deyildik.
Əhmədalı soruşdu:
– Neçə nəfər idilər?
Dayım dedi:
– Səkkiz.
Hacı dedi:
– Heyf, orada olmamışıq.
Əhmədalı da, Hacı da tüfəngli, patrondaşlı idilər, iksinin də ayaqlarında uzunboğaz çəkmə, əyinlərində tərəkəmə arvadlarının əldə toxuduqları yun şaldan pencək, şalvar, başlarında buxara papaq vardı. İkisinin də yaşı iyirmi beşdən artıq olmazdı.
Daha Gorusdan Kürdoba yaylağına, ümumiyyətlə, yaylaqlara fayton yolu yox idi, ona görə də, Bayram babamın qardaşı Eyvaz əmi qabağımıza at göndərmişdi.
Atam faytonçu Cümşüdün haqqını verəndən sonra fayton Gorusa getdi ki, gecəni karvansarada qalıb səhər qayıtsın geri.
Biz çəmənlikdə bir qədər dincələndən sonra qalxdıq. Əhmədalı, üstündə yumşaq yastıqlı qazağı yəhər olan kəhər madyanı Fatma nənəmin yanına çəkərək bir əli ilə cilovdan, digər əli ilə üzəngidən yapışıb dedi:
– Gəl, bibi!
(Əhmədalı, Bayram babamın uzaq qohumu idi. Ona görə nənəmə “xanım” əvəzinə “bibi” deyirdi.) Fatma nənəmin ata minməyi həmişə mənə maraqlı görünürdü, elə bil ki, arvadın hey öz-özü ilə danışmağı,

dayımdan qorxmağı bu anda yox olub gedirdi, elə bil ki, birdən-birə cavanlaşırdı, zirək olurdu.

Nənəm ayağının birini üzəngiyə qoyub, ondan gözlənilməyən yüngüllüklə qalxdı atın belinə.

Hacı da belində təzə ingilis yəhəri olan ürgəni anamın yanına çəkərək dedi:

– Gəl, bacı!

(Hacı da Bayram babamgilin qohumlarından idi. Ona görə "Yaqut xanım" əvəzinə "bacı" deyirdi.)

Sonra Əhmədalı atını minib, məni aldı qucağına. Hacı da bacım Mahtabı götürdü və biz Gorusun qabağındakı qəlbi dağın dolaylarını qalxmağa başladıq.

Biz bu dağı qalxdıqca, Möhnət qocanın "Gorusun qaşı" haqqında, Qaçaq Nəbi haqqında danışdığı əhvalatı xatırlayırdım.

Mən Əyriqayanın üstündə dayanıb, aynalı tüfəngi əlində silkələyərək üzüaşağı Gorusa tərəf qışqırıb naçalniki hədələyən, qara bığları eşmə-eşmə olan Qaçaq Nəbini görürdüm! Əyriqayadan bir qartal qalxıb Gorusun üzərində dövrə vurdu, mən qartalı göstərib, Əhmədalıdan soruşdum:

– Sən onu buradan güllə ilə vura bilərsən?

Əhmədalı ağ buludların altında dövrə vuran quşa bir neçə saniyə baxıb dedi:

– Mən qartala güllə atmaram, qaqaş!

– Niyə?

– İgid quşdur. İgidə güllə atmağa adamın əli gəlmir.

Mən dedim:

– Nəbi də igid idi, amma Möhnət qoca deyirdi ki, yoldaşı onu yatdığı yerdə vurub.

Əhmədalı kinli-kinli dedi:

– Çünki yoldaşı tülkü kimi qorxaq, mərdimazar köpəkoğlunun biri idi.

Biz dolayları çıxa-çıxa mən soruşdum:

– Nəbinin heç basıldığı vaxt olmayıb?

Əhmədalı dedi:

– Olub... Niyə olmayıb?.. Ancaq igid elə basılanda da igiddi!

Sonra Əhmədalı əvvəl "Qaçaq Nəbi" havasını fışdırıqda çaldı, sonra papağının dalını qaldırıb oxudu:

Boz at, səni sər tövlədə bağlaram,
And içirəm, səni məxmər çullaram.
Qızıldan, gümüşdən səni nallaram,
Əgər, məni bu davadan qurtarsan.

Mən gözümü Əyriqayadan çəkmirdim. Mənə elə gəlirdi ki, bir zamanlar igid Nəbinin səngər elədiyi bu qaya əsrarəngiz, canlı bir məxluqdur, elə bil ki, o axşamın toranında əbədi susmağa məhkum edilmişdir.

Mən Əhmədalıdan soruşdum:

– Sən heç adam öldürmüsən?

Əhmədalı güldü:

– Neyləyirsən, qaqaş?

– Elə-belə soruşuram, öldürmüsən?

– Öldürməmişəm, amma yaralamışam.

– Güllə ilə?

– Yox, xəncərlə.

– Bu belindəki xəncərlə?

– Hə, – deyə Əhmədalı güldü.

– Nə cür? – Mən əl çəkmədim.

Əhmədalı dedi:

– Nə cür olacaq?.. Zarafatlaşırdıq, sözümüz çəp gəldi, xəncəri çıxarıb yeritdim böyrünə. Amma ölmədi.

– Bəs, sonra oğlan necə oldu?

– Odur ey, kürən dayın üstündə gedir!

Mən təəccüblə dedim:

– Hacı?!

– Hə... – deyib Əhmədalı gülümsəyərək ayaqlarını usdufca tərpətdi.

Sonra atını Hacının atına yaxınlaşdıraraq zarafatyana mənə dedi:

– İnanmırsan, özündən soruş.

Mən dedim:

– Hacı dayı, o düzdür ki, Əhmədalı dayı xəncəri soxub sənin böyrünə?

Hacı gülümsəyib dedi:

– O düzdü, amma sən ondan soruş ki, bəs, Hacı sənin böyrünə neçə güllə ilişdirdi?

Mən qanrılıb təəccüblə Əhmədalıya baxdım. O gülümsəyib dedi:

– Səfeh güllələr idi, qaqaş, üçü də dərini üzdən deşib keçmişdi.

Hava qaralmışdı. Biz dolayları çıxıb dağın döşündən keçən dar cığırla bir-birmizin ardınca gedirdik. Cığırın alt tərəfi qaranlıq uçurum idi. Sonra çiskin başladığından bir addım qabağı görmək olmurdu. Ancaq atlar rahatca gedirdilər. Biz dağı dolanıb düzənliyə çıxanda, anam atını yorğaladaraq bizə yaxınlaşdı, qaranlıqda üzümə diqqətlə baxıb soruşdu:

– Yuxulamırsan ki?

Mən bu çiskinli qaranlıqda onun səsindəki mehribanlıqdan fərəhlənərək:

– Yox, – dedim.

Anam atının tərkinə bağlanmış keçə xurcundan mənim gödəkçəmi çıxarıb Əhmədalıya verərək dedi:

– Al bunu, geyindir Murada.

Əhmədalı gödəkçəni mənə geyindirdi.

Biz bir qədər gedəndən sonra çiskin kəsdi, qara buludlar arasından Ayın bir parçası görünüb, yanlarından keçdiyimiz sıldırımlı qayaları, təpələri işıqlandırdı. Havada kəklikotu, yabanı nanə ətri duyulurdu. Biz qabaqda gedirdik, arxadan bəzən dayımla atamın, anamın danışıqlarını eşidirdim, yalnız Fatma nənəmin səsi çıxmırdı. Mən, aydınlıq içində olan bu dağlara baxdıqca, anamgilin mülayim söhbətində, nə isə, anlaşılmaz bir ümid, sevinc və şirin qayğı duyurdum və bu duyğu, elə bil, ağ ipək kəlağayı kimi üzümə toxunaraq məni xoşallandırırdı. Mən Əhmədalının qolumdan yapışan əlində etibarlı, doğma bir qüvvət hiss edirdim. Mənə elə gəlirdi ki, biz nə zamandan bərisə elə hey belə gedirik... gedirik...

– Qaqaş, yatma, az qalıb, indi çatırıq.

Mən diksinib gözlərimi açdım, Ay yenə də buluda girmişdi. Elə qaranlıq idi ki, göz-gözü görmürdü. Birdən üzümə yağış çiləyərək məni tamam ayıltdı. Bizdən xeyli yuxarıda tək-tək işıqlar göründü. Elə bil ki, bu işıqlar göyün bir parçasına səpələnmişdi və biz də eyzən onlara tərəf qalxırdıq; mən atların yoxuşa dikləndiklərini hiss edirdim. Və mənə elə gəlirdi ki, dünya bu intəhasız qaranlıqdan, bir də ucalıqda görünən o işıqlardan, bir də mənim hiss elədiyim xoş duyğulardan ibarətdir. Sonra, sanki o işıqlar göydən yerə enib bizimlə bərabərləşdilər. Sonra uzaqdan itlərin səsini eşitdim, elə bil ki, bu səslər hardansa tamam ayrı bir aləmdən, naməlum, gözəl bir aləmdən gəlirdi. Ancaq biz irəlilədikcə, o səslər də güclənib reallaşırdı və reallaşdıqca

bayaqdan bəri ağ ipək kəlağayı kimi üzümü, bütün varlığımı oxşayan duyğular da sanki uçub gedirdi və mən anlaşılmaz bir məyusluq hiss edirdim...

Nəhayət, biz alaçıqlara yaxınlaşanda iri qoyun itləri qəzəblə hürə-hürə bizi dövrəyə alıb az qalırdı atların üstünə tullansınlar.

– Ə, kimsiniz?

Bu səsin ardınca tüfəng çaxmaqlarının şaqqıltısı eşidildi.

Əhmədalı sakit səslə dilləndi:

– Bizik, ə! İtlərin qabağına durun!

Həmin səs qaranlıqdan soruşdu:

– Əhmədalı, sizsiniz?

Əhmədalı dedi:

– Ay tanrısız, itin qabağına dur!

Kişilər itlərə acıqlandılar. Atamla dayım qabaqca düşdülər. Eyvaz əminin arvadı Gülzar, bacımı Hacının qucağından alıb üzündən öpərək alaçığa apardı, Əhmədalı məni yəhərdən qaldırıb yerə qoyaraq özü də düşdü.

Bir oğlan yüyürüb anamın, digəri isə, nənəmin atının başını tutaraq üzəngisini basdılar, anamgil də atdan düşdülər.

Sonra hamımız ortasında ocaq alovlanan iri keçə alaçığa girdik. Alaçığın çubuğundan zəif işıqlı fənər asılmışdı. Bayram babamın anası Səkinə qarı Fatma nənəmlə anamdan başqa hamımızın üzündən öpdü. Ucaboylu, enlikürək, ağ üzündə qoşa xalı olan göyçək bir arvad idi. Yaşı səksəni çoxdan keçməsinə baxmayaraq, qəddi dümdüz, dişləri ağappaq idi. Əynində tünd parçadan uzun tuman, arxalıq var idi. Kişi kimi bərkdən və dolğun səslə danışırdı. Mənə gülümsəyə-gülümsəyə baxıb deyirdi:

– Gözləri lap Yaqutun gözləridi.

Bayram babamın qardaşı Eyvaz əmi də kişilərlə əl tutuşdu. Onun arvadı Gülzar ocağın qırağında keçənin üstünə güllü döşəkçələr saldı, hava soyuq olduğu üçün ocağın istisi bizə ləzzət verirdi. “Yəqin indi aranda Zinyət tər tökür” deyə mən düşündüm və onu qoyub gəldiyimizə heyfsiləndim.

Bizə dərhal çay gətirdilər.

Eyvaz əmi bardaşqurma oturub, üzərində ceyran şəkli olan qara rəngli taxta qutusundan papiros bükə-bükə dedi:

– Səhərdən qoymamışıq samovarın odu sönsün ki, indi gələrsiniz, bir hovurdan gələrsiniz...

Nuru dayım yoldakı əhvalatı danışdı. O danışdıqca, Eyvaz əminin üzü ciddi bir ifadə alırdı. Kişi, Nuru dayıma diqqətlə baxaraq, sanki onun nə dərəcədə düzgün hərəkət eləmiş olduğunu təyin eləmək istəyirdi. Bu vaxt Hacı ilə Əhmədalı da bayırda alaçığın qapısından düşən işıqda yekə bir erkək kəsib soyurdular. Hər biri, az qala, bir öküz boyda olan itlər bir qədər aralıda dayanıb gözlərini soyulmaqda olan erkəyə zilləmişdilər. Əhmədalı hərdən ətin orasından-burasından kəsib onlara atır və itlər tikəni havada qapıb yedikcə bacım Mahtab qəhqəhə ilə gülürdü. Səkinə nənə də “başına dönüm...” deyə onu sevib oxşayırdı. Eyvaz əminin təxminən mən yaşda olan ərköyün oğlu Güloğlan da qızın itlərə belə gülməyinə təəccüblə tamaşa edirdi.

Sonra Hacı ilə Əhmədalı biş-düş üçün qurulmuş o biri komadan dalbadal kabab, bozartma bişirib gətirdilər...

Yeməkdən, söhbətdən sonra atam, anam, mən, bir də bacım bu alaçıqda yatdıq, Fatma nənəmlə Nuru dayım o biri alaçığa keçdilər, Eyvaz əmigil də komada yatdılar.

Biz yerimizə girəndə atam arxa tərəfdən alaçıq keçəsinin böyrünü azca yuxarı atdı ki, hava gəlsin, sonra atam asma fənəri söndürdü. Mən yenicə huşa getmişdim ki, alaçığın lap böyründə, bayırdan xışıltıya bənzər bir səs eşidib:

– O nə səsdi? – deyə böyrümdə yatmış anamdan soruşdum.

– Dəvədi, – deyə anam yuxulu cavab verdi, – gövşəyir.

Atam da mənə dedi:

– Gözünü yum, yat.

Mən gözümü yumdumsa da, uzun zaman yuxuya gedə bilmədim. Yadıma gələn zamandan bu ana qədər görüb eşitdiklərim mənə nağıl kimi görünürdü. Və mənə elə gəlirdi ki, hansı zamandasa mən bütün bu hadisələrin iştirakçısı olmuşam. Elə bil ki, hansı vaxtdasa içində yatdığım bu alaçıqda yatmışam.

Mən alaçıq keçəsinin açıq yerindən buludsuz göyü və Ayı görürdüm və yenə də mənə elə gəlirdi ki, bəlkə də, yüz ya min il bundan qabaq alaçıq keçəsinin açıq yerindən göyü və Ayı elə beləcə görmüşəm və indi nəyəsə hürən itlərin səsini eşitmişəm.

...Səhər mən geyinib alaçıqdan bayıra çıxanda gömgöy səmaya qalxan Günəşin almaz kimi iti işığında bütün çölü bürüyən qıpqırmızı lalələri meh tərpədirdi. Qoruqda çidarlanmış erkək at başını dik tutaraq uzaqda otlayan çılpaq madyanlara baxırdı. Boz qayalı dağın döşünə yayılmış qoyun sürüləri görünürdü. Ayaqyalın oba uşaqları şehli

otun içində səs-küylə ora-bura qaçışıb oynaşırdılar. Bir az böyükləri, analarının sağdıqları inəkləri aparıb dağın döşündə otlayan heyvanlara qatır, ya da çılpaq atları minib aşağı dərədən çıxan bulağa suvarmağa aparırdılar.

Eyvaz əmigilin ağ alaçıqlarının ətrafında qara keçələrdən qurulmuş komalar düzülmüşdü. Bunlar kasıbların idi. Bunlar alaçıq kimi uca və geniş deyildi. Kürdoba bir neçə oymaqdan ibarət idi. Hər oymağın öz yurdu və öz başbiləni var idi. Başbilən isə, sayılan adam hesab olunurdu və bütün oymağın təəssübünü çəkirdi. Eşşək bulağının üstündəki dağın döşünə düşən bu oymaq Kərbəlayı İbixanlıların idi. Bir qədər aralıda "Əyri qar" deyilən dağın döşündə görünən Karlar oymağı idi. Kürdobanın Uzunhəsənlilər, Hacıqulular adlanan oymaqları dağın o biri üzünə düşdükləri üçün görünmürdülər.

Səkinə nənə alaçıqdan çıxaraq mənə dedi:

– Qadan alım, itlər səni tanıyanacan uzağa getmə.

Conra Səkinə nənə üzünü komalardan birinə tərəf tutub çağırdı:

– Qaraca, ay Qaraca!

On bir-on iki yaşında qarabəniz, ayaqyalın, əynində əldətoxuma kobud şaldan köhnə şalvar-pencək olan bir oğlan komadan çıxıb, mismar deşiklərinə bənzəyən xırda gözlərini ovuşdura-ovuşdura batqın səslə soruşdu:

– Nədi, əşi?

Səkinə nənəm ona mehriban bir nəzər salıb dedi:

– İndiyəcən niyə yatmısan, ay tanrısız?

Sonra məni göstərib əlavə etdi:

– Murad qağanı apar, sapand hör, şaqqıldayan sapand... alabəzək...

Qaracanın burnu uzun və yana tərəf əyri idi. Ona görə də, yandan baxanda, burnu qılınc kimi görünürdü. Mənə qıyqacı bir nəzər salıb, Səkinə nənəyə dedi:

– İpim hardaydı?..

Səkinə nənə dedi:

– Gəl bəri, ip verim.

Qaraca, Səkinə nənə ilə alaçığa girərək əlində qırmızı, sarı, narıncı ip bayıra çıxıb mənə bir söz demədən getdi öz komalarına, mən də onun ardınca getdim. Komada torpağın üstünə köhnə bir keçə salınmışdı, ortalıq ocağında qoyun qığı tüstüləyirdi, komanın bir bucağında bir neçə mis qab-qacaq, o biri bucağında isə, üstünə köhnə kilim çəkilmiş yük yığılmışdı.

Qaraca (sonra bildim ki, onun əsl adı Yusifdir) keçənin üstündə oturub ipləri tökdü qabağına, sonra altdan yuxarı mənə qıyğacı baxıb dedi:

– Ay tanrısız, niyə durmusan, otur dayna.

Sonra o ipləri komanın çubuğuna keçirib, cəld hörməyə başladı, mən də çömbəltmə oturub ona baxırdım. Sonra ucaboylu, çox yaraşıqlı, sağlam bir gəlin olan anası Qızyetər his basmış mis qazanda süd gətirib, ocağın ətrafında düzülmüş daşların üstünə qoydu və gülümsəyib mənə dedi:

– Sən bizim bu kasıb komamıza xoş gəlmisən, qadan alım.

Sonra Qaracaya dedi:

– Bacın gələndə süd töküb çörəklə içərsiniz.

Qızyetər yaxasındakı gümüş pulları cingildədə-cingildədə iti addımlarla komadan çıxdıqda mən Qaracadan soruşdum:

– Hara gedir anan?

O, gözünü işindən çəkməyərək quru tərzdə cavab verdi:

– Əmimgilə nehrə çalxalamağa gedir.

Qaraca, Bayram babamın neçə il qabaq vəfat eləmiş qardaşının oğlu idi, ancaq mən lap ilk görüşdən hiss eləmişdim ki, onlarla babamgilin, Eyvaz əmimgilin həyatları bir deyil, yəni, Qaracagil çox kasıbdılar. Qaracanın əlinin iki axırıncı barmağı bükülmür, ancaq bu, onun sürətlə sapand hörməyinə mane olmurdu.

Sonra anam məni səhər yeməyinə səslədi. Mən durub böyük alaçığa getdim. Fatma nənəm, Nuru dayım, atam, anam, Eyvaz əmi və onun ərköyün oğlu Güloğlan böyük süfrənin ətrafında əyləşmişdilər. Eyvaz əminin arvadı Gülzar samovarın böyründə oturub çay tökürdü. Süfrədə sarı buğda unundan papiros kağızı kimi nazik ağ yuxa, qaymaq, beçə balı, üzlü motal pendiri, nehrədən təzə çıxmış kərə yağı var idi.

Mən bu yeməklərə baxdıqca, Qaracagilin kasıb komaları gözümün qabağından getmirdi və Eyvaz əmimin şənliyi, zarafatları məni acıqlandırırdı. Axı, Eyvaz əmi Qaracanın doğma əmisi idi. Bəs, onun ürəyi necə dözürdü ki, özləri belə yeyib-içdikləri halda, vəfat etmiş qardaşının uşaqları o cür olsunlar? Elə həmin bu andan da mən Eyvaz əminin ərköyün oğlu Güloğlanı sevmədim, onun totuq, qırmızı yanaqları məni əsəbiləşdirirdi, yanıma gələndə xəlvətcə acıqlanıb qovurdum. Uşaq da (o məndən bir yaş kiçik idi) həmişə mənim onunla bu cür rəftarıma təəccüb edirdi.

Mən könülsüz yeyib-içirdim, gözümü alaçığın açıq qapısından Qaracagilin komasına zilləyirdim, mənə elə gəlirdi ki, onların balaca, kasıb komalarının qabağında bizim bu cür yeyib-içməyimiz ayıb işdir. Qaracanın mənə sapand toxuması da indi məni əvvəlki kimi sevindirmirdi.

Birdən Qaraca bayıra çıxaraq bizə tərəf qıyqacı bir nəzər salıb, alabəzək sapandı mənə göstərdi və süfrədəki yeməklərə bir dəfə də olsun baxmadı. Onun bu hərəkəti, elə bil ki, bizim aramızda birdənbirə lal bir ünsiyyət yaratdı. Süfrə ətrafında əyləşənlər Qaracanı gördülər, amma əhəmiyyət vermədilər. Mən südü tələsik içərək qalxıb onun yanına yüyürdüm.

– Gəl bəri! – deyə o, qabağa düşdü.

Biz obadan bir qədər aralanıb, boz qayalığa qalxdıq, daşların aralarında bitmiş kəklikotunun, yabanı nanənin ətri indi səhərin bu təravətli havasında daha kəskin duyulurdu. Qaraca, sapanda bir daş qoyaraq hərləyib atdı dərənin o biri üzünə, sapandın şaqqıltısı qayalıqda əkssəda verdi. Sonra Qaraca, sapanda bir daş qoyub verdi mənə:

– Al, at!

Mən onun kimi uzağa ata bilmədim, sapand da şaqqıldamadı. Qaraca mənə məzəmmətlə baxıb:

– Ay tanrısız, – dedi, heylə niyə atırsan, çolaq-zad döyülsən ki?..

Yenə də özü lap dərənin o tərəfinə daş atıb sapandı şaqqıldatdı:

– Gördün?! Al, mənim kimi at.

Mən yenə də daşı nə uzağa ata bildim, nə də sapandı şaqqıldatdım.

Qaraca mənə sərt, qıyqacı bir nəzər salıb, dağ yuxarı qaçaraq gedib quzu otaran uşaqlara qoşuldu, mən də özüm-özümə aciz-avaranın biri kimi görünərək qayıtdım alaçığın qabağına.

Qız-gəlin yığılmışdı anamın başına. Babamın ətli-canlı, döşlərinin hər biri balaca bir qarpız boyda, zarafatcıl bacısı qızı Güləndam, nə isə, məzəli bir əhvalat danışır, anamgil də gülüşürdü. Onlardan bir az aralı güneydə Səkinə nənə, atam, bir də Eyvaz əmi oturub söhbət edirdilər. Fatma nənəm isə, alaçığın ağzında təkcə oturub, bir əlində papirosu tüstülənən müştüyü, uzaq üfüqdəki dumanlı dağlara baxırdı. Hiss olunurdu ki, arvadın fikri də uzaqlardadır. “Kim bilir... Bəlkə nənəm, Kirs meşələri arasındakı bacı-qardaşlarını, qohum-əqrəbalarını xatırlayır”. Ürəyimi anlaşılmaz qəm-qüssə bürüdü, nə üçünsə “yazıq nənə...” deyə düşündüm. Bəlkə də, bu ondan idi ki, Fatma nənəm bu obada qərib görünürdü, hiss edirdim ki, hamı arvada yad kimi baxır,

bunu büruzə verməsələr də, mən hiss edirdim. Fatma nənəm də söhbətlərə qoşulmağa, adamlarla qaynayıb-qarışmağa can atmırdı.

Eşşək bulağının üstündəki qayanın kölgəsində oba cavanları Nuru dayımın başına yığışmışdı, bərkdən danışıb gülürdülər. Mən Fatma nənəmə, nə isə, mehriban bir söz demək istədim, amma bir söz tapmadım, bəlkə tapsam da deyə bilməzdim. Çünki atam-anam (xüsusən atam) heç bir zaman mənimlə mehriban danışmadıqları üçün, məni sevib oxşamadıqları üçün mən də başqasına mehriban bir söz deməkdən çəkinirdim. Elə bil ki, bunu həqarət hesab edirdim. Mən insanlar haqqında yaxşı hisslərimi qeyri-şüuri olaraq gizləməyə çalışırdım. (Bu hal məndə çox-çox sonralar da davam elədiyi üçün kişi tayfası məni “yekəxana”, “eqoist”, qadın tayfası isə “daşürəkli”, “qəddar” daha nə bilim nə adlandırırdı.)

Mən Fatma nənəmin yanında darıxaraq qaçdım dayımgilin yanına, ona görə ki, mənim xoşuma gələn Əhmədalı oradaydı, Hacı oradaydı, onların hərəkəti, danışığı məni maraqlandırırdı, məndə isti, səmimi duyğular oyadırdı.

Nuru dayım başına toplaşan cavanlardan soruşdu:

– Kim üçaylıq toğlunu təkbaşına yeyə bilər?

Araya ani bir sükut çökdü, sonra Əhmədalı qabarıq döşünü irəli verərək dedi:

– Mən!

Dayım onu qızışdırmaq üçün dedi:

– Yeyə bilməzsən!

Əhmədalı əlini ona uzadıb dedi:

– Gəl, mərcləşək!

– Mərcləşək! – deyə dayım onun əlindən tutdu. – Nədən?

Əhmədalı dedi:

– Sən durbindən. (Dayımın binoklu obada ən maraqlı şey hesab olunurdu...)

– Sən də boz ürgədən! – deyə dayım, Əhmədalının çidarlanmış atını göstərdi.

Boz ürgə obanın ən qaçağan cins atlarından hesab olunurdu.

Əhmədalı bir az fikirləşib:

– Yaxşı, – deyə dayımın əlini qüvvətlə sıxdı.

Dayım iki cavan oğlana dedi:

– Yüyürün, əmimgilin sürüsündən bir toğlu gətirin.

...Beş dəqiqənin içində toğlunu Əhmədalı özü kəsdi, soyub, doğradı. Sonra böyük bir ocaq çatdılar. Mərcin şərtinə görə, toğlunun baş-ayağından başqa heç nəyi qalmamalı idi. Əhmədalı əvvəlcə toğlunun budlarını şişə çəkib qoydu təll atmış közün üstünə, sonra üzünü öz komalarına tərəf tutub bərkdən dedi:

– Az! Oradan bir parç ayran gətir!

Əhmədalının belində enli gümüş kəmər, əynində güllü çitdən tuman-kofta olan on altı-on yeddi yaşlı gəlini, mis parç dolusu ayran gətirib verərək, heç kəsin üzünə baxmadan qayıdıb getdi. O, iti addımlarla yeridikcə, yaxasına düzülmüş gümüş pulların cingiltisi eşidilirdi.

Əhmədalı kabab olmuş budları balta kimi sağlam, ağappaq dişlərinə çəkəndən sonra sacı tərsinə ocağın üstünə qoyub, doğranmış əti tökdü içinə, başladı qovurduqca yeməyə.

Qərəz, Əhmədalı ayrandan içə-içə toğlunu axırıncı tikəsinəcən yedi, sonra ayağa qalxaraq boz ürgəsini cidardan açıb üstünə tullanaraq üzüaşağı çapdı və çapa-çapa tapançasını qoburdan çıxarıb dalbadal havaya üç güllə sıxdı. Güllələr qayalarda "şaraqq-şaraqq" əks-səda verdi. Komanın ağzında dayanmış qoca Mustafaoğlu Mehdi uzunçubuqlu demisini ağzından götürüb dərindən nəfəs alaraq dedi:

– Atası Tanrıqulu da belə igid idi.

Haçandan-haçana Əhmədalı qayıdıb yerə tullanaraq boz ürgəni yenə də cidarladı. Mən heyrətlə ona baxırdım, elə bil ki, o heç nə yeməmişdi. Dayım mənə dedi:

– Yüyür, alaçıqdan mənim durbinimi gətir.

Mən də həvəslə yüyürüb durbini gətirdim və dayım onu Əhmədalıya uzadaraq dedi:

– Halal malındı.

Əhmədalı durbini alıb gözünə tutaraq dedi:

– Bundan ötrü lap iki toğlu da aşırmaq olar.

Mən ona da təəccüb edirdim ki, Əhmədalının cavan arvadı komalarının qapısında qurulmuş əl dəzgahında şal toxuduğu halda, bir dəfə də olsun, başını qaldırıb ərinin bir toğlunu necə yediyinə fikir vermədi. Yalnız Əhmədalı çılpaq ürgəni sıldırımlı dağdan üzü enişə çapdıqda, gəlin əl saxlayıb bir neçə saniyə onun ardınca baxaraq, sonra yenə də işinə davam elədi.

Sonra Əhmədalı oradakı adamlara dedi:

– Ə, bu heç yaxşı olmadı ki, siz durub baxdınız, mən yedim.

Sonra orada olan kiçik qardaşı Qaçaya dedi:

– Yüyür, bizim sürüdən bir toğlu gətir!

Nuru dayım nəşə ilə dedi:

– Hə, bax buna varam!

Təzədən ocaq çatdılar. Bu dəfə qoyunu Hacı kəsib soydu. Əhmədalının gəlini yuxa, pendir, ayran gətirdi. Xırman kimi yastı qayanın üstündə halay vurub oturdular.

## QARACA

Mən Qaracanı görüb, onun yanına yüyürdüm, biz dərənin qırağına gedib sapandla daş atdıqda, mən ona dedim:

– Gördün, Əhmədalı çılpaq-cilovsuz atı üzüaşağı çapanda heç yıxılmadı.

Qaraca mənə təəccüblə baxaraq dedi:

– Niyə yıxılır?

Mən soruşdum:

– Sən də yıxılmazdın?

– Yox.

– Yalan demə!

– Yalan niyə deyirəm, ay tanrısız. İstəyirsən, gedək çapım.

– Gedək!

Biz daş atdığımız dərəni keçib Dəvəuçan dağının döşündə otlayan ilxının yanına qalxdıq.

Qaraca, atlardan birinə yaxınlaşaraq yalından tutdu.

At başını qaçırmaq istəyəndə Qaraca bir anda tullandı onun belinə. At bir-iki dəfə yerində o yana-bu yana sıçrayaraq birdən üzü enişə – Əhmədalının çapdığı Altıntaxta düzünə tərəf götürüldü. Qaraca əyilib hər iki əli ilə atın yalından yapışmışdı. At, Altıntaxtaya çatmamış uca qayanın dalına buruları görünməz oldu. İlxının qabağında otlayan ayqır başını dik tutaraq Qaracanın minib çapdığı atın dalınca baxırdı. Birdən məni vahimə basdı, mənə elə gəldi ki, ayqır indicə başını döndərib mənim üstümə cumacaq. Mən çevrilib obaya tərəf qaçmaq istədikdə, dağın bu biri tərəfindən Qaraca atın üstündə yoxuşu qalxaraq ilxıya çatıb yerə tullandı. Bu vaxt, Qaracadan bir az böyük bir oğlanın bizə tərəf yüyürdüyünü gördüm. O, bizim otuz-qırx addımlığımıza çatdıqda:

– Ə, qancıq oğlu, – dedi, – niyə bizim atı minib qaranəfəs eləyirsən?!

Qaraca dedi:

– Qancıq oğlusan da, köpək oğlusan da.

Oğlan əlindəki sapanda daş qoyub atdı. Sapand tapança kimi şaqqıldadı, daş Qaracanın lap qulağının dibindən keçdi. Qaraca da yerdən daş götürüb ona tərəf cumdu. Oğlan yerindən tərpənməyib yenə də sapandla Qaracanın başını tuşlayıb atdı və bu dəfə daş tappıltı ilə Qaracanın alnına dəyib yerə düşdü. Qaracanın üz-gözünü qan bürüdü, bunu görən oğlan çevrilib qaçdı. Qaraca qanı axa-axa onun ardınca yüyürüb iki daş atdısa da, heç biri oğlana çatmadı. Qaraca dayanıb bir xışma at peyini götürərək yarasına basdı, sonra yerə çömbəlib bir dəstə ot qopararaq üzünün qanını sildi.

Mən ona dedim:

– Nahaq yaranın üstünə peyin basdın, gedək anam yod vursun.

Qaraca qıyqacı baxıb soruşdu:

– Yod nədi?

– Dərmandı.

– Lazım deyil. Sən heç kəsə demə.

– Nə üçün?

– Ay tanrısız, dedim, demə dayna!

Sonra biz qayaların arası ilə enib getdik Eşşək bulağına. Bulağın səhər işığında şəfəq saçan soyuq suyu qayadan çıxıb, muncuq kimi rəngbərəng xırda daşların üzərinə tökülərək yabanı yarpızların, nanələrin, baldırğanların arası ilə axıb gedirdi. Qaraca yarasının üstündəki peyini götürüb tullayaraq üz-gözünün qanını yudu, sonra biz balaca cığırla obaya tərəf qalxdıq. Qaraca yolda quzuqulağı, yemlik yığıb mənə də verirdi, özü də yeyirdi.

Biz obaya çatanda mən komanın açıq qapısından gördüm ki, Əhmədalı içəridə oturub tapançasını təmizləyir, Qaracadan ayrılıb onlara getdim. Xaynamaz da komada oturub Əhmədalı ilə zarafatlaşa-zarafatlaşa öküz gönündən çarıq tikirdi.

Əhmədalı məni görəndə gülümsəyib dedi:

– Hə, qaqaş, gördün ki, dayının durbinini necə uddum?

Mən soruşdum:

– Sən bu gün yenə xörək yeyəcəksən?

Əhmədalı da, Xaynamaz da bərkdən güldülər.

Əhmədalı dedi:

– Niyə yemirəm, qaqaş.

Sonra bayırda şal toxuyan gəlinini səsləyib dedi:

– Az, gəl uşağa qaymaq qoy!

Lakin elə bu zaman onun əlindəki tapança açıldı, barıtın tüstüsü komaya dolduğu üçün mən bir neçə saniyə heç nə görmədim.

– Ə, mənə güllə dəydi! – deyə Xaynamazın heç də həyəcanlı olmayan səsi eşidildi və tüstü çəkilən kimi gördüm ki, o, iki əli ilə qarnından yapışıb çıxdı bayıra.

Adamlar yüyürüb yığıldılar onun başına. Eyvaz əmim Xaynamaza yaxınlaşıb, heç nə olmamış kimi, sakit halda dedi:

– Əlini qarnından çək görüm!

Sonra yaranı nəzərdən keçirib dedi:

– Bekara şeydi, güllə dərini üzdən deşib keçib...

Obada ən kasıb adam olan Xaynamaz ortaboylu, sarıbəniz, qumralbığlı bir adam idi. “Xay” sözünün nə demək olduğunu heç kəs bilmirdi. Hamı da Xaynamazla zarafat edirdi, məni də Əhmədalı qaldırıb, Namazın eyzən aralıqda otlayan kor atının üstünə qoyurdu, kor at da mənim onun üstündə olub-olmadığıma əhəmiyyət verməyərək gəzə-gəzə otlayırdı. İndi də cavanlar zarafatla Namaza sataşırdılar:

– Ə, Əhmədalı, kişinin qarnını dəlik-deşik eləmisən, su-zad dayanmayacaq.

Amma Namaz da qorxaq adam deyilmiş, arvadına dedi:

– Aaz, yeri, Ballı qarını çağır, gəlsin bu yaraya məlhəmdən-zaddan qoysun.

Bunu deyib Namaz getdi öz komalarına, birdən anam mənim yaxasıaçıq pencəyimə baxıb, həyəcanla dedi:

– Bura baxın! Bura baxın, güllə uşağın pencəyinin yaxasından keçib.

Atam qəzəblə mənə dedi:

– Axı, sən niyə gedib xalqın komasına dürtülmüşdün?

Səkinə nənə atama dedi:

– Danlama uşağı, Allaha şükür ki, salamat qurtarıb.

Sonra qarı mənim üzümdən öpüb dedi:

– Səkinə nənən sənə qurban kəsəcək!

İndi hamı mənim başıma yığılmışdı. Qarnına güllə dəyən oğlan yaddan çıxmışdı.

Fatma nənəm əlindəki gümüş pulları mənim başıma dolandırıb dodağının altında nə isə pıçıldadı.

Doğrusu, bütün bunlar məni sıxırdı. Hamının güllə dəyən adamı kənarda qoyub mənimlə maraqlanması məni heç də şad eləmirdi. Hətta, mən öz-özümdən utanırdım, ona görə də, adamların arasından çıxıb komaların dövrəsinə balaca qarım çəkən Qaracanın yanına qaçdım. (Belə qarımı ona görə çəkirlər ki, yağış yağanda sel komaya dolmasın.)

Mən pencəyimin güllə deşən yerini Qaracaya göstərib dedim:

– Bura bax, Qaraca, gör güllə haradan keçib?

Qaraca güllə deşən yerə çəpəki bir nəzər salıb:

– Nə olsun, – dedi, – verərsən, anan gözüyər.

Onun bu işə təəccüb eləməməsi məni pərt elədi. Sonra o pıçıltı ilə məndən soruşdu:

– Anangilin qayçısı var?

– Var, neyləyirsən?

O mənim sualıma cavab verməyib dedi:

– Get, qayçını xəlvətcə gətir, sonra aparıb qoyarsan yerinə.

Mən soruşdum:

– Axı, neyləyirsən qayçını?

– Ay tanrısız, – dedi, – görəcəksən dayna neyləyirəm, yeri gətir.

Mən yüyürüb anamın iynə-sap qutusundan qayçını xəlvətcə götürüb gəldim.

Biz obadan çıxıb, dar cığırla bir xeyli gedərək dağın o biri üzündə otlayan ilxıya çatdıq. Qaraca diqqətlə o yana-bu yana baxandan sonra arxadan atlardan birinə yaxınlaşıb ehtiyatla quyruğundan bir çəngə tük kəsərək üzü geri götürüldü, mən də onun ardınca qaçmağa başladım. Biz dağı hərlənib uzaqlaşandan sonra Qaraca daşlıq bir yerdə dayanıb yerə oturdu, mən də onun yanında yerə çöküb təngnəfəs soruşdum:

– Niyə qaçırdın?

– Bəs, qaçmayıb neyləyəydim? At İmamverdinindi, görsə, güllə ilə vurardı, quduz adamdı.

– Axı, niyə kəsirdin atın quyruğunu?

O, tükləri üçbir, dördbir ayıraraq dedi:

– Cələ qayıracağam.

– Neyləyirsən cələni?

O mənə qıyqacı baxıb dedi:

– Cələni neyləyərlər?

Sonra xoş ifadə ilə əlavə etdi:

– Sənin üçün kəklik tutacağam, burda çox olur.

Mən sevinclə soruşdum:

– Doğru deyirsən?

Qaraca bu dəfə mənə cavab verməyərək dörd-beş halqadan ibarət bir cələ qayırıb, yerə iki balaca ağac basdıraraq hər ucunu birinə bağladı, sonra cibindən bir ovuc çörək qırıntısı çıxarıb səpdi halqaların arasına. Elə bu zaman uzaqdan atamın məni çağırdığını eşitdik. Qaraca atama tərəf qaşqabaqlı baxıb dinmədi, mən qalxıb yüyürdüm.

Atam qulağımdan yapışıb elə dartdı ki, mən qışqırdım, sonra məni elə qulağımdan darta-darta alaçığa aparıb qəzəblə dedi:

– Vejələnin biri vejələ, çolaq Qaraca sənin tayın-tuşundu?

Qulağımın dibində atamın silləsi tapança kimi səsləndi, gözümdən od parladı, anam əsəbi halda məni tutub kənara çəkərək atama qışqırdı:

– Az döy-danla uşağı! Qaraca yetim olanda nə olar?! Onun atası səndən əskik adam deyildi!

Anamın məni və Qaracanı müdafiə eləməsi mənə təsir elədi, mən yana-yana ağladım; axı, Qaraca mənə şaqqıldayan sapand hörmüşdü, mənim üçün kəklik tutmaqdan ötrü xalxın atının quyruğundan tük kəsərək cələ qurmuşdu!

Eyvaz əminin oğlu Güloğlanı yaxşı geyindirib-kecindirirdilər, ancaq o mənə yapışmırdı ki, yapışmırdı, duzsuzun biri idi. Ona görə də yanıma gələndə xəlvətə salıb qırmızı yanaqlarını çimdikləyirdim, o, gözləri yaşarsa da, ağlamırdı, təəccüblə mənə baxırdı.

Anam mənim üstümdə atamla dalaşandan sonra alaçıqdan çıxıb, yastı qayanın üstündə Nuru dayımın başına toplaşmış oba cavanlarının yanına getdi, mən də onun ardınca. Anam deyib-gülməyi, zarafatı, qonaq gedib-gəlməyi xoşlayırdı, oba cavanları ilə açıq-saçıq zarafatlaşır, gülüşür, saatlarca söhbət edirdi. Belə vaxtlarda atam da qaşqabaqlı halda ya alaçıqda əyləşib papiros çəkir, ya da yaşca özündən xeyli böyük kişilərin yanına gedib onların söhbətinə qulaq asırdı, özünün cavan olmasına baxmayaraq, obanın bu şən gəncləri ilə qaynayıb-qarışmırdı, gənclər də atamın onlarla uyuşmamasına, kənar gəzməsinə əhəmiyyət vermirdilər.

Qaraca onunla oynamağımın üstündə atamın məni danlayıb döyməsini görəndən sonra mənimlə heç danışmaq da istəmirdi, məni görəndə soyuq, məğrur bir görkəm alıb uzaqlaşırdı. Amma mən də ondan əl çəkmirdim. Onun bu hərəkəti də, mənim həmişə təzə paltar

geyinməyimə, yaxşı yeyib-içməyimə, obada hamının məni əzizləməyinə zərrə qədər əhəmiyyət verməməsi də ona olan marağımı artırır, onu mənim nəzərimdə, nə isə, əsrarəngiz bir məxluqa döndərirdi, məndə ona qarşı qəribə bir ehtiram hissi doğururdu. Mən onda yazıqlıq, yetimlik deyil, möhkəm qurur hiss edirdim. Bir dəfə mən ona konfet vermək istədim, o mənim uzatdığım konfetə ani, soyuq bir nəzər salıb dedi:

– Bəbə döyüləm ki, şirni yeyim?

Mən görürdüm ki, heç kəs Qaracaya əhəmiyyət vermir, heç kəs ona xoş bir söz demir, heç kəs onun nə yeyib-içdiyi ilə maraqlanmır, sanki o da bunların hamısına tüpürüb heç nəyi vecinə almırdı, heç kəsdən heç nə ummurdu, heç kəsdən kömək, mərhəmət gözləmirdi. Sözün düzü, mən yaxşı şeylər yeməyi, həmişə təzə paltar geyməyi xoşlayırdım, mən istəyirdim ki, hamı məni sevsin, amma Qaracanın bütün bunlara bir qəpiklik əhəmiyyət verməməsi mənə toxunurdu, məni öz gözümdə kiçildirdi, mən özüm-özümə zəif bir məxluq kimi görünürdüm.

## QAÇAQ XANMURAD VƏ SELBASARLILARIN OBAMIZA BASQINI

Yastı qayanın üstündə cavanlar dayımın öz qohumu Ağakişi haqqındakı məzəli söhbətinə qulaq asıb, qəhqəhə ilə gülürdülər. Bir də gördük dağın dalından bir dəstə atlı çıxıb obaya girdi. Qabaqda da Qaçaq Xanmurad. Dayımgil qalxıb onların qabağına yeridilər, Qaçaq Xanmuradın rəngi ağappaq idi, havanın isti olmasına baxmayaraq, çiynində yapıncı var idi. O atdan düşən kimi dayım soruşdu:

– Nə olub, Xanmurad, birtəhər görünürsən?

Qaçaq Xanmurad başını bulayıb cavab verdi ki:

– Qızdırma əhədimi kəsib.

Dayım soruşdu:

– Soyuq dəyib?

Qaçaq Xanmurad dedi:

– Bilmirəm. Neçə gündür titrədib-qızdırıram.

Dayım dedi:

– Malyariyadır.

Qaçaqlardan nisbətən yaşlı bir kişi dedi:

– Gətirdik, beş-altı gün yatıb dava-dərman eləsin. Cavanların hamısı qaçaqların gəlişinə sevindi. Əhmədalı Qaçaq Xanmuradın

qoluna girib apardı öz komalarına. Mən sonra bildim ki, o, Qaçaq Xanmuradın dostudur.

Obanın başbiləni Eyvaz əmi dərhal öz sürüsündən bir toğlu gətirdib kəsdirərək qaçaqları qonaq elədi, sonra həmin yaşlı qaçaq Eyvaz əmiyə dedi:

– Tapşır, uşaqlar Qaçaq Xanmuradın burada yatdığını qonşu obalara deməsinlər, yüz düşməni var.

Eyvaz əmi dedi:

– Düşmən köpəkoğlu bir qələt eliyə bilməz, arxayın olun.

Sonra qaçaqlar üç-dörd gündən sonra gəlib Xanmurada baş çəkəcəklərini söyləyərək, atlanıb getdilər.

Anam çox malyariya keçirmişdi, ona görə də, özü ilə ehtiyat üçün kinə-filan götürmüşdü, ümumiyyətlə, anamın çox xəstəliklərdən başı çıxırdı, dostumuz doktor Quliyev zavrafatla deyərdi ki:

– Yaqut xanım yarıdoktordur.

Anam hər gün səhər-axşam Qaçaq Xanmurada kinə, daha bilmirəm, hansı dərmanlar isə verir, onun üçün toyuqdan, dana ətindən yüngül xörəklər bişirirdi. Anamın bu hərəkəti obada hamının – qocaların da, cavanların da, qohumların da, yadların da xoşuna gəlirdi, hamı qaçağa bacardıqca hörmət eləmək istəyirdi. Eyvaz əmim, hətta, Nuru dayım da saatlarla onun yanında olurdular. Anamın xəstə qaçağa bu cür görüm-baxım eləməyi yalnız atamın xoşuna gəlmirdi. O, qaşqabaqla anama deyirdi:

– Axı, sənə nə düşüb, bu qaçağın qulluğundan əl çəkmirsən? O, sənin qardaşın deyil, əmin oğlu deyil?!

Anam da cavab verirdi ki:

– Nə olsun əmim oğlu deyil? Bəs, o bizi ölümdən qurtaranda yaxşı idi?

Anamın Qaçaq Xanmurada göstərdiyi xidmət məni fərəhləndirirdi, ürəyimdə mən anamı tamam haqlı bilib, onunla fəxr edirdim. Bir dəfə Qaçaq Xanmurad mənə işarə ilə anama dedi:

– Yaqut bacı, o vaxt Pirağbulaq dərəsində səni tutub Abdullanın əlindən alsaydıq, indi bu gözəl oğlan da olmazdı.

İkisi də güldü.

Gündə bir neçə dəfə atamın gözündən oğurlanaraq, Qaçaq Xanmuradın yatdığı komaya gedirdim. Anamın verdiyi dava-dərman öz təsirini göstərirdi. Qaçaq Xanmurad indi əvvəlki kimi şiddətli titrədib-

qızdırmırdı, qızdırması günaşırı, özü də yüngül gəlirdi. Oba cavanları tez-tez onun başına toplaşırdılar, söhbət... zarafat.

...Nuru dayım da onun üçün Gorus şəhərindən həkim gətirtdi. Əlbəttə, Qaçaq Xanmuradın kim olduğunu həkim bilmədi, yəni, indi bilməyinin də bir əhəmiyyəti yox idi, çünki "hürriyyətlik"di. Yəni, rəsmi hökumət yox idi. (Camaat hökumətsizliyi belə adlandırırdı.)

...Mən komaya girəndə Qaçaq Xanmurad gülümsəyib dedi:

– Hə, qaqaş, gəl otur, söhbət elə görək.

Mən Bayram babamla, Fatma nənəmlə olduğu kimi, onun da yanında özümü çox sərbəst hiss edirdim, elə bil ki, biz lap çoxdan dost imişik.

Qaçaq Xanmurad arxası üstə, əllərini başının altında çarpazlayaraq uzanmışdı. Mən ondan soruşdum:

– Sən nə üçün qaçaq olmuşdun?

O komanın qapısından görünən və zirvəsində həmişə qar olan Qızılboğaz dağına baxaraq sakit halda dedi:

– Adam öldürmüşdüm.

Mən təəccüblə soruşdum:

– Kim idi o adam?

O gözlərini Qızılboğazdan çəkməyərək dedi:

– Bir səfeh naçalnik idi.

– Niyə öldürdün onu?

O, qaşqabaqlı dedi:

– Murdar adam idi.

– Yəni, neyləmişdi, axı?

O, dərindən nəfəs alıb dedi:

– Mənim atam kasıb bir kişi idi, qaqaş, gözümüzün ağı-qarası bir atımız var idi, ancaq yaxşı at idi, bütün mahalda adla deyilirdi. Bilirsən, biz nəsillikcə at həvəslisi olmuşuq, dədə-babadan həmişə yaxşı at saxlamışıq. Mən atamın təkcə oğlu idim, amma kişi o atı məndən az istəmirdi. Bizdə məsəl var, deyərlər: "Arvadı əriylə, kişini atıyla sayarlar". Həmin dediyim naçalnik bir gün kəndə gələndə gözü düşdü ata. Nə qədər atamı dilə tutdu ki, atı sat mənə, atam razı olmadı. Dedi: "O atsız mən nəyə lazımam?" Bir gün atamla mən qonşu kənddə muzduna zəmi biçdiyimiz zaman naçalnikin yasavulları gəlirlər, anam da nə qədər haray-həşir salır, olmur – atı çəkib aparırlar. Biz axşam biçinindən yorğun-arğın evə qayıdıb əhvalatı biləndə, elə bil ki, atamı qəfil güllə ilə vurdular, kişinin danışmağa nitqi olmadı. Kişi elə sarsıl-

dı ki, səhər biçinə də gedə bilmədi. Amma mən biçin adı ilə getdim şəhərə, atın yerini öyrənib gecənin bir aləmi qara oğurluqla yeridim tövləyə, kilidi sındırıb atı apardım.

Qaçaq Xanmurad bura çatanda dərindən nəfəs alıb, bir az susdu, sonra:

– Eh, qaqaş, – dedi, – sən uşaqsan, başa düşməzsən, dünyada çox nainsaf köpəkoğlular var.

Mən yenə də səbr eləməyib soruşdum:

– Bəs, sonra nə oldu?

– Atam dedi ki, Xanmurad, bala, naçalnik əl çəkməyəcək, qorxuram, üstəlik, səni də tutub göndərə Sibirə.

Mən dedim:

– Tapsa, tutub göndərsin!

Atam dedi:

– Neyləmək fikrindəsən?

Kirs meşəsinin lap dərin yerində olan Alyanlı obalarında bizim dədə-baba qonağımız var idi. Dedim:

– Atı aparacağam Alyanlıya, hələlik qoyarıq qalar orada, görək sonra nə olur.

Atam dedi:

– Hamısı birdi, yenə naçalnik bizdən yapışacaq.

Mən dedim:

– Deyərsən bizim xəbərimiz yoxdur.

Kişi qalmışdı naəlac, nə atdan keçə bilirdi, nə də mənim cəncələ düşməyimə razı olurdu.

Mən dedim:

– Əşi, ölsəm də, atı o it oğluna verməyəcəyəm.

Mən Qaçaq Xanmuraddan soruşdum:

– İndi mindiyin at həmin atdı?

Qaçaq Xanmurad yenə də dərindən nəfəs alıb dedi:

– Həmin atdı, onda lap cavan ürgə idi.

Mən yenə soruşdum:

– Sonra nə oldu?

– Sonra da belə oldu ki, anam heybəmə çörəkdən-zaddan qoydu, atama dedim ki, məni soruşanda deyərsən gedib Bakıya, fəhləliyə. O vaxt bizim kəndlərdən Bakıya çox adam gedirdi fəhləliyə. Qərəz, qaqaş, elə gecə ikən kənddən çıxıb, çöl yolu ilə gedib gün günorta yerinə qalxanda girdim Kirs meşələrinə...

Mən yenə də səbr eləməyib soruşdum:

– Sənin onda neçə yaşın olardı?

– On səkkiz, on doqquz...

– Tüfəngin vardı?

– Yox.

– Bəs ayıdan, canavardan qorxmurdun? Deyirlər, Kirs meşələrində yaman ayı olur.

Qaçaq Xanmurad təbəssümlə dedi:

– Yox, qaqaş, onlardan qorxmaq heç ağlıma da gəlmirdi, çünki çarın naçalnikləri onlardan da quduz idi.

– Demək, gedib qaldın Alyanlıda?

– Yox, çox qala bilmədim. Əmim oğlu xəbər gətirdi ki, məndən sonra naçalnik kəndə gəlib günün günorta çağı camaatın gözü qabağında atamı meydanda yıxdırıb döydürüb, özünün də dilindən kağız alıb ki, gərək oğlunu üç günəcən gətirdəsən. Bunu eşidəndə ağlım başımdan çıxdı. Dost-düşmənin gözü qabağında atamı o cür bihörmət eləmişdilər. Alyanlıdakı qonağımızın elə mən yaşda dəliqanlı bir oğlu vardı, indi də durur. Ona dedim: "Ə, Məhər, mənə bir tapança tap, meşə yeridi, ora-bura gedirik..." Əsl fikrimi demədim. Məhər də Şuşa qalasına satmağa erkək aparanda mənə bir naqan alıb gətirdi, mən də qaşqa dayı minib düz getdim Qarabulağa, atı qapıda bağlayıb qalxdım naçalnikin idarəsinə. Qapıda duran yasavul istədi məni buraxmasın, dedim "məni naçalnik özü çağırıb". Girdim içəri, naçalnikin başına üç güllə çaxıb, pəncərədən tullandım, ha eləyib yasavullar əl tərpədincə qaşqa day məni aradan çıxartdı. Beləliklə də oldum qaçaq.

Bu söhbət zamanı Səkinə nənə komaya girib:

– Qadan alım, Xanmurad, necəsən? – dedi.

– İndi babatam, nənə, – dedi. – Yaqut bacının dərmanları, deyəsən, harayıma çatır.

Səkinə nənə dedi:

– Allaha şükür. Mən də Bayramdan yaman nayranam. Sifariş göndərib ki, bu günlərdə gələsidi... Yollar da ki, qarmaqarışıq....

Qaçaq Xanmurad dedi:

– Əşi, Bayram dayını aləm tanıyır, nədən narahat olursan?..

Səkinə nənə dedi:

– Orası heylədi, amma düşmən də düşməndi.

Sonra Qaçaq Xanmurad gülümsəyərək mənə işarə ilə dedi:

– Nəvən (əslində mən Səkinə nənənin nəticəsi idim) qaçaqlarla, atıb-tutmaqla yaman maraqlanır.

Səkinə nənəm bərkdən güldü:

– Amma heç öz dədəsindən soruşmur ki, güllə ata bilir?

Nənəmin atam haqqında belə zarafatı xətrimə dəydi, çünki mənim atamın da Qaçaq Xanmurad kimi, bu oba cavanları kimi atıb-vuran olmaması sarıdan həmişə xəcalət çəkirdim, istəyirdim ki, mənim atam da, lazım olanda, Bayram babam kimi, Nuru dayım kimi, üç patrondaş bağlayıb, beşaçılan götürsün, qaçaqlarla vuruşsun, nişana atsın.

Qaçaq Xanmurad mənim pərtliyimi hiss eləyib, zarafatyana dedi:

– Güllə atmaq atasının nəyinə lazımdır, tacir adamdı!

Ancaq qaçağın sözü mənə daha bərk toxundu. Mən görürdüm ki, oba cavanları tacirlər, alverçilər haqqında eyzən rişxəndlə danışırlar, onları "tərəzi dibində oturan", "yumurtadan yun qırxan", "kölgəsindən qorxan", daha bilmirəm nə adlandırırdılar. Ona görə də mən "tərəzi dibində oturan" alverçilərə nifrət edirdim. Məlum idi ki, mənim atamın böyük mağazası var və o, "tərəzi dibində oturan" baqqallardan, əllaflardan deyil, amma kimə deyirsən?.. Hiss eləyirdim ki, bu oba cavanları mənim atama da Qarabulaqdakı baqqal Məşədi Əlibala kimi baxırlar.

Səkinə nənə dedi:

– Yox, Xanmurad dayısı, mənim bu qəşəng nəticəm Bayram babasına, Nuru dayısına oxşayacaq. At minən, güllə atan olacaq, sünnülərə çəkməyəcək.

Bilirdim ki, nənəm "sünnülər" dedikdə, mənim ata tərəfimi nəzərdə tutur, ona görə də üsyanla dedim:

– Bəyəm sünnülər tüfəng ata bilmirlər? Odur ey, Əfəndi babam bizə gələndə özü ilə tüfəng də götürmüşdü.

Səkinə nənə bərkdən güldü, Qaçaq Xanmurad da gülüb dedi:

– Səkinə nənə zarafat eləyir, sünnülərin içində də o qədər igid oğlanlar var ki.

Səkinə nənə dedi:

– Amma, dayısı, sünnülərin bir pis işləri var ki, keçi kimi irtməklidirlər, ona görə də, höcət olurlar.

Mən lap ağlamaq dərəcəsinə gələrək həyəcanla dedim:

– Yalandı, sünnülərin irtməyi-zadı yoxdur!

– Özünə baxma, axı, sənin anan şiədi, qadan alım, ona görə, sənin irtməyin yoxdu.

Mən yenə də üsyanla nə isə demək istəyirdim, elə bu zaman bayırda səs-küy qalxdı, arvadlardan kimsə həyəcanla qışqırdı:

– Selbasar atlıları qoyunları aparırlar!

Səkinə nənə yaşına uyuşmayan bir cəldliklə qalxıb bayıra çıxdı. Mən də onun ardınca qaçıb gördüm ki, Eşşək bulağından o yana Altıntaxta deyilən düzənlikdə dörd-beş atlı-tüfəngli adam çobanları şallaqla döyüb qovaraq, sürüdən bir dəstə qoyunu atdöşü eləyib aparırlar.

Dayım burda yox idi – cavanları başına yığıb Qaradolaqlar obasına toya getmişdi, yoxsa, selbasarlıların qabağında durardı.

Səkinə nənə kişi kimi gurultulu səslə onlara tərəf qışqırdı:

– Ehey, ey selbasarlılar, cahıllar obada yoxdur deyin kişiləşmisiz? O qoyunların birinin əvəzinə onunu verəcəksiniz!

Qaçaq Xanmurad gilənar rəngli çuxasını çiyninə ataraq bayıra çıxıb, diqqətlə atlılara baxdı, sonra çuxasını cəld əyninə geyərək təkrar komaya girib, bir əlində tüfəng, o biri əli ilə patrondaşı çiyninə aşıra-aşıra bayıra çıxıb Yastıqayaya tərəf yüyürdü və ayağının birini daşa dirəyərək atlılara sarı bir güllə atdı.

Yarım güllə mənzilində olan atlılar çevrilib güllə atılan tərəfə baxdıqda, Qaçaq Xanmurad qışqırdı:

– Ə, binamus iş tutmayın! Çıxın qoyundan!

O zaman atlılardan ikisi Qaçaq Xanmurada tərəf iki güllə atdı.

Anam bayıra yüyürüb mənə qışqırdı:

– Gir selava! Güllə dəyər.

Mən yurdun böyründən keçən selava girərək xəlvətcə oradan başımı çıxarıb tamaşa eləməyə başladım, oba uşaqları da yüyürüb doldular selava.

Atlılar qoyunu qovurdular. Qaçaq Xanmurad nişan alıb atdı. Bu dəfə atlılardan üçü qanrılıb Qaçaq Xanmurada tərəf atəş açdı.

Qaçaq Xanmurad onlara qışqırdı:

– Ə, mən qan tökmək istəmirəm, rədd olun, gedin!

Ancaq atlılar onu veclərinə almadılar, Qaçaq Xanmurad yenə də nişan alıb atdı. Atlılardan biri aşdı, ancaq həmin dəqiqə də durdu. Sonra da məlum oldu ki, güllə onun qoltuğundan dəyib, yenə atın belinə qalxdı. Qaçaq Xanmurad yenə də atdı, bu dəfə onlardan bir atlı da yıxıldı, adam dərhal qalxdı, amma at tərpənmədi. Qaçaq Xanmurad yenə də onlara qışqırdı:

– Ə, zalım uşağı, özünüzü qoyundan ötrü qırğına verməyin, Qaçaq Xanmuradın gülləsi yayınan döyül, çıxın qoyundan! Sizə dedim ki, qan tökmək istəmirəm.

Atlılardan biri yerində aram tutmayan atın başını geri döndərib bərkdən səsləndi:

– Qaçaq Xanmurad, qurban olsun sənə o qoyunlar! Güllə atma, özün bilirsən ki, selbasarlı Hüseynin də gülləsi havayı gedən döyül. Bilsəydik sən obadasan, gəlməzdik.

Atı vurulan adam mindi yoldaşlarından birinin tərkinə və atlılar qoyun sürüsündən çıxıb dolaylanaraq dağın dalında görünməz oldular. Qaçaq Xanmurad komaya girib yenə də arxası üstə uzanaraq əllərini başının altında çarpazladı, mən dedim:

– O atlılar səndən qorxub getdilər?

Qaçaq Xanmurad dedi:

– Yox, qaqaş, o Hüseyn deyilən qorxan canavar döyül, ancaq gördülər ki, girəvə məndədi, mən səngərdəyəm, onları açıqda bir-bir dənləyə bilərəm.

Qaçaq Xanmurad bir az susub, sonra asta səslə, lap öz-özü ilə danışırmış kimi, əlavə etdi:

– Ola bilsin ki, Hüseyn qəsdən davaya girmək istəmədi.

Səkinə nənə bayırda obanı başına götürüb selbasarlıların qarasına deyirdi:

– Namərd köpəkuşağı. Biliblər ki, kişilər obada yoxdu, əllərinə girəvə düşüb!

...Axşamçağı oba kişiləri toydan qayıdanda, Səkinə nənə onlara əhvalatı danışıb dedi:

– Qeyrətiniz varsa, gərək bu acığı yerdə qoymuyasınız! Günün günorta çağı selbasarlılar Kərbəlayı İbixanın obasına basqın eləsinlər?!

Eyvaz əmi taxta qutusundan papiros bükə-bükə dedi:

– Darıxma, ay ana...

Səkinə nənə dedi:

– Gərək Qaçaq Xanmurad o binamusların birini də sağ buraxmayaydı.

Sarısaqqal Mustafaoğlu dedi:

– Elə onların o cür əliboş qovulmaları onlar üçün ölümdü. Qaçaq Xanmurad istəməyib qoyundan ötrü it uşağının qanını töksün.

Bu zaman həmin yastı qayanın üstündə Nuru dayım başına yığılan cavanlara həvəslə nə isə deyirdi. Mən onlara yaxınlaşanda sözünü kəsib mənə acıqlandı:

– İtil, get o yana!

Əhmədalı da gülüb dedi:

– Qaqaşın xətrinə dəymə.
Sonra məni yanına çağırdı:
– Gəl bura, qaqaş.

Getmədim. Adamların yanında dayımın mənə elə deməyindən bərk inciyərək qayalığın obadan görünməyən tərəfinə qaçdım. Mən həmişə inciyəndə tək qalmaq istəyirdim. Bu vaxt dağdan enən duman ətrafı elə bürüdü ki, heç nə görünmədi. Mənə elə gəlirdi ki, bütün dünyada öz pərtliyimlə yalqızam, elə bil ki, bir an qabaq gördüyüm dayım da, onun başına yığılan oba adamları da, Qaçaq Xanmurad da, Əhmədalı da ayrı dünyadadırlar. Ancaq heç mən özüm də bilmirdim ki, nə istəyirəm? Nə üçün özümü, hətta, deyib-gülən, şən adamların da yanında yalqız hiss eləyirəm? Elə bil ki, üzlərinə baxdığım, söhbətlərinə qulaq asdığım adamlar məni görmürdülər. Hətta, bəzən mənə elə gəlirdi ki, anam özü də məndən xəbərsizdir, əlbəttə, mən bu xəbərsizliyin nədən ibarət olduğuna aydın cavab verə bilməzdim, mən ancaq bunu hiss edirdim və bu hiss mənim daxilimdə həmişə mənimlə olan bir kədər idi.

Belə böhranlı anlarımda atamın Qaçaq Xanmurad kimi, Nuru dayım kimi, Əhmədalı kimi tüfəng-tapança gəzdirməməsi də, onun "tərəzi dibində oturan tacir" olması da, bu obada hamının Fatma nənəmə qarşı biganəliyi də qəribə bir ağırlıq kimi, qüssəli bir şey kimi mənim ürəyimə çökürdü. Qaracanın şikəst barmaqları, həddindən artıq uzun, əyri burnu, mismarla açılmış xırda deşiklərə bənzəyən gözləri, yoxsulluqları, heç kəsin onunla maraqlanmaması onun mənə soyuq bir şübhə ilə qıyqacı baxması mənim kədərimi artırırdı. Son vaxtlar, yəni, mənim dünyada bir şey başa düşməyə başladığım zamandan bəri atamla anamın tez-tez dalaşıb küsülü qalmaları mənim kədərimi artırırdı! (Özü də bu dalaşmalar, küsülülüklər həmişə boş şeylər üstündə olurdu.) Mən gülləri, çiçəkləri çox xoşlayırdım, amma sarı güllər, sarı çiçəklər mənə soyuq, qüssəli hisslər təlqin edib, həmişə mənimlə olan kədərimi artırırdı! Ona görə də, mən Qarabulaqda, bağçamızda atamın əkmiş olduğu, sarı qızılgüllərdən nəinki dərməzdim, heç yaxınlarına da getməzdim.

Qaraca məni kənara çəkib pıçıltı ilə dedi:
– Bu gecə Nuru əmigil Selbasar obasına basqın eləyəcəklər.
Mən soruşdum:
– Nə bildin?
– Daşlıqda danışırdılar, mən də aşağıda sapand atırdım. Amma sən heç kimə demə ha.

Mən də heç kəsə deməyərək səbrsizliklə gecənin düşməsini gözləyirdim. Bilmək istəyirdim ki, dayımgil basqına necə gedəcəklər?

Günortaya yaxın Qaçaq Xanmuradın qaçaq yoldaşları gəldilər.

Onlardan biri Qaçaq Xanmuradın üzünü isti su ilə isladıb, qatlama ülgüclə qırxdı. Qaçaq Xanmurad üz-gözünü yuyub başını daradı. Uzunboğaz çəkmələrini, gümüşü atlas arxalığını geyib patrondaşlarını bağladı, ağac qoburlu onatılanı böyründən asdı, gilənar rəngli çuxasını geyib gümüşü papağını qoydu. Bənizi əvvəlki kimi solğun idi. O hamı ilə görüşdü, mənimlə də əl tutuşaraq gülümsəyib zarafatla dedi:

– Yəqin sən də qız götürüb qaçanda Xanmurad dayın dəstəsi ilə çıxacaq qabağına.

Anam, hətta, atam da gülümsədi. Bu, Pirağbulaq dərəsindəki əhvalata işarə idi.

Sonra qaçaqlar atlanıb getdilər. Elə bil, ürəyimdə boşluq açıldı. Onlar obadan çıxıb Qızılboğaz dağına dikləndilər, sonra yana burulub uçurumlu dağın döşündən keçən dar cığıra düşərək təklənib sıralandılar və getdikcə uzaqlaşaraq dağı dolanıb bir-bir gözdən itdilər, elə bil ki, onlar dərin, mavi fəzaya dalbadal düşüb yox oldular.

Mən ürəyimdə qüvvətli bir ağrı hiss edərək Möhnət qocanın “Ovçu Pirimlə qızıl quş” haqqındakı nağılını xatırladım.

Bütün quşların dilini bilən ovçu Pirim, Camal qalasının uçurumlu qayalarının arasında yaralı bir qızılquş görüb soruşdu:

– Nə olub sana?

Qızılquş “ah” çəkib:

– Məni bir namərd ovçu vurdu, – dedi.

Ovçu Pirim qızılquşu öz komasına gətirdi, cürbəcür otlardan dərman qayırıb yarasını sağaldıb özünə ov quşu elədi. Qızılquş ovçu Pirimə sədaqətlə qullluq eləyirdi, onun ürküdüb havaya qaldırdığı kəklikləri, qırqovulları ildırım kimi şığıyıb caynağına alaraq gətirirdi, ovçu Pirim də ona doyunca təzə ət yedirdirdi, amma görürdü ki, heç qızılquşun kefi açılmır...

Ovçu Pirim bir gün ondan soruşdu:

– İndi nəyin dərdini çəkirsən?

Qızılquş yenə də “ah” çəkib dedi:

– Qəlbi dağlar, dibindən qıjıltı ilə çaylar axan dərin dərələr yadıma düşür...

Ovçu Pirim təəccüblə soruşdu:

– Məgər, hər dəfə biz ova gedəndə sən yenə də o dağları, dərələri görmürsən?

Qızılquş dedi:

– Görürəm... ancaq...

Qızılquş sözünün gerisini demədi, amma ovçu Pirim hər şeyi başa düşdü. Qızılquşu əlinə götürüb dedi:

– Get, əzizim, uç istədiyin yerlərə, bu gündən azadsan!

Qızılquş getmək istəmədi:

– Mən, – dedi, – sənin yaxşılığını necə əvəzsiz qoyub gedə bilərəm?!

– Mən elədiyim yaxşılığı sənə halal edirəm, uç istədiyin yerlərə!

Qızılquş qanadlarını çırparaq havaya qalxıb uzaqlarda zirvəsi ağaran qarlı dağlara tərəf uçaraq əlvan buludlar arasında gözdən itdi...

Sonra mən qaçaqlar gedən tərəfə işarə ilə anamdan soruşdum:

– İndi onlar hara gedirlər?

Anamın əvəzinə atam cavab verdi:

– Hara gedəcəklər, soyğunçuluq etməyə, yol kəsməyə.

Mən atamın səsində gizli bir acıq hiss edərək bu dəfə onun qabağında cəsarət göstərib dedim:

– Xanmurad dayı kasıblara, arvadlara dəymir ha. Özü də, anama, hələ üzük də bağışlayıb.

Atam mənə soyuq nəzər salıb dedi:

– Yaşından böyük danışma, uşaqsan, get uşaq işinə.

Anam gülümsəyib dedi:

– Doğru deyir də...

Mən onlardan aralanıb eynilə, dalbadal dayanmış dəvələrə oxşayan qayaların yanına gedərək fikirləşdim: "Atam başqasına nişanlı olan anamı götürüb qaçanda Qaçaq Xanmurad həmin Pirağbulaq dərəsində onları soya da bilərdi, hətta, faytonun atlarını alıb onları şenlikdən uzaq dərədə piyada da qoya bilərdi, bəlkə lap ayrı adamın nişanlısını qaçırdığı üçün acıqlanıb atamı öldürə də bilərdi. Amma o, bunların heç birini eləməyib. Hələ üstəlik, anama qiymətli üzük də bağışlayıb. Demək, Qaçaq Xanmurad atamgilə yaxşılıq eləyib. Bəs, niyə atam onun haqqında belə kinli danışır? Amma anam onu müdafiə eləyir... Obanın Əhmədalı kimi, Hacı kimi qoçaq oğulları da onu çox istəyir..."

Belə düşüncələr atama qarşı məndə olan gizli soyuqluğu artırırdı. Mən onun haqlı olduğunu heç vəchlə qəbul eləyə bilmirdim. Mənim

təhtəlşüurum heç bir fənalığı Qaçaq Xanmurada yaxın qoymaq istəmirdi.

Bu dəfə Qaraca ilə mən qılınc kimi uçurumdan qalxan sivri qaya üstündə iri bir qartal gördük. Onun boyun-boğazı, ayaqlarının bükümləri cadar-cadar olub eybəcər bir hala düşmüşdü, o, qayanın lap sivri ucunda qanadlarını sallayaraq oturub aşağıdakı dərələri dəhşətli bir acgözlüklə nəzərdən keçirirdi. Gözləri sanki od tutub yanırdı, hiss olunurdu ki, acdır, elə bil ki, bədəninin ora-burasından tükünü də yolmuşdular. Onun bu çirkin görünüşü məndə xoşagəlməz hiss doğurdu. Mən Qaracadan soruşdum:

– Bu necə qartaldı?

Qaraca quşa əhəmiyyətsiz bir nəzər salıb dedi:

– Necə olacaq, qaraquşdu dayna.

(Bizim tərəflərdə qartala qaraquş deyirlər.) Mən gərgin əhvali-ruhiyyə ilə soruşdum:

– Axı, o niyə belə pis olub?

Qaraca dedi:

– Ay tanrısız, üçtoqqa Vəli kişi kimi qocalıb dayna.

Mən çox məyus oldum. Qartalı həmişə gümrah, məğrur, gözəl, cavan təsəvvür edirdim. Mən qartalın, qızılquşun timsalında cəsurluqla gözəlliyi bir-birindən ayrılmaz bilirdim. İgid qartalın da bu cür ac, eybəcər hala düşə biləcəyi heç ağlıma da gəlməzdi...

Gecə Nuru dayımgilin basqına necə getdiklərini görə bilmədim. Səhəri gün obada bir canlanma var idi. Əhmədalı, Hacı komalarının qabağında oturub tüfənglərini silib təmizləyirdilər. Gəlinlər bir-biriləri ilə pıçıldaşıb gülüşürdülər. Yalnız Fatma nənəm alaçığın dalında oturub gözlərini bir nöqtəyə zilləyərək öz-özünə həyəcanla danışırdı. Həmişə olduğu kimi, indi də mən nənəmin nə barədə deyinməyi ilə maraqlanıb, guya, oynayırmışam kimi, əlimdəki çomağı çobansayağı tovlaya-tovlaya onun arxasında dayanaraq qulaq asırdım. Nənəm Nuru dayımın qarasına deyinirdi:

– Ay sağ olmuş, obanın cahıl-cuhulunu başına yığıb, gecə gedib xalqın obasını gülləyə basırsınız? Heyvanını yedəkləyib gətirirsiniz... Demirsən, iraq olsun, iraq olsun, güllə dəyər sana. Selbasarlılar da quduz tayfadır, gecənin birində qəfil gəlib bizi qırarlar?! Axı, sən cavan uşaqsan, elm oxumusan, rusun dilini bilirsən, niyə o güllə dəymiş Eyvazın fitnəsinə uyursan? Eyvaz, atanın qazandığını kamına çəkir,

doymur, indi istəyirsən səni də biləyinə dolasın, niyə başa düşmürsən axı?! Gedib xalqın qoyun-quzusunu, atlarını gətirib verirsən Eyvaza?!

Nuru dayım isə yastı qayanın üstündə ətrafına toplaşan oba cavanlarına, nə isə, hərarətlə deyirdi... Eyvaz əmi papiros çəkə-çəkə yaşlı kişilərlə danışırdı, Səkinə nənə də bu gün həmişəkindən kefi kök və gümrah görünürdü.

...Qaraca mənə dedi:

– Bu gecə obada atışma olacaq.

– Nə atışma? – deyə mən soruşdum.

Qaraca mənə çəpəki baxaraq məzəmmətlə dedi:

– Ay tanrısız, xalq malından əl çəkəcək? Bizimkilər keçən gecə selbasarlıların bir heylə heyvanını gətiriblər...

Mən soruşdum:

– Haradadı o heyvanlar?

– Mən nə bilim?.. Yəqin gecə ikən pay-püş eləyiblər.

...Lakin üç gün heç bir hadisə baş vermədi. Qaracaya dedim:

– Bəs, niyə atışma olmadı?

– Eyvaz əmim hər gün oba cahıllarına tapşırır ki, sərvaxt olun, onlar bizi ala qoyurlar ki, arxayın salıb, qəfil hücum eləsinlər.

Amma Eyvaz əmi özünü elə tuturdu ki, elə bil, bu işlərin heç birindən xəbəri yox idi. Həmişəki kimi, üstündə ceyran şəkli olan qutudan papiros bükə-bükə, alaçığın qabağında oturub ağsaqqallarla tamam ayrı şeylər haqqında – arandan gələn xəbərlər haqqında, yollarda, o biri obalarda olan soyğunlar, basqınlar haqqında söhbət edib deyirdi:

– Dünyada düzlükdən yaxşı şey yoxdu.

Fatma nənəm havayı yerə mənə "əllamə" demirdi, mən Eyvaz əmidən soruşdum:

– Bəs, siz nə üçün selbasarlıların heyvanlarını gətirmisiniz?

Eyvaz əmi gülümsəyib dedi:

– Ona görə ki, onlar da fürsət tapanda bizimkini aparırlar, o günü gördün ki...

Mən təslim olmayıb dedim:

– Oğurluq da əvəzə əvəzdi?

Eyvaz əmi eyni təbəssümlə yanındakı kişilərə dedi:

– Görürsünüz... Əyyam uşağıdı də...

Sonra mənə cavab verib dedi:

– Peyğəmbər əvəzə əvəz deyib!

Mən yenə də əllaməlik eləyib dedim:

– Peyğəmbər bəlkə yaxşılıq barədə əvəzə əvəz deyib?

Eyvaz əmi bu dəfə ciddi ifadə ilə:

– Yox, qaqaş, sən uşaqsan, bilmirsən ki, əgər, biz bu üzümüzə sillə vurulanda o biri üzümüzü çevirsək, torpağımızı at torbasında daşıyarlar. Buynuzlu qoçun qabağına gərək buynuzlu qoç çıxarasan!

Mən nə qədər əllamə də olsam, burda fikrim dolaşdı, nəyin düz olub-olmadığını təyin eləyə bilmədim. Uzaqda, dağın döşündə Qaracanı görüb onun yanına qaçdım. O, quşəppəyi yığıb yeyirdi, dedim:

– Gəl "gizlənqaç" oynayaq.

O, mənə cavab vermədi, mən təkrar etdikdə, əlində dəstə ilə tutduğu yemliyin torpağını çırparaq acıqla dedi:

– Ay tanrısız, oynamıram dayna!

Qaraca mənə yemlik vermədi, çünki keçən dəfə atam bizim çöldən quzuqulağı yığıb yediyimizi görərək, Qaracaya bərk acıqlanıb demişdi: "Uşağı öyrətmə belə zir-zibil yığıb yeməyə."

Hər gecə Nuru dayım cavanlardan obanın ucqarlarına tüfəngli qarovulçular qoyurdu. Mən onu da hiss edirdim ki, atam Nuru dayımın bu işlərindən bərk dilxor olub, bizim yaylağa gəlməyimizə peşmandır, anamın isə, vecinə deyildi, hətta, mənə elə gəlirdi ki, anam bu basqınlardan, atışmalardan zövq alır. Dayımın selbasarlılara etdikləri gecə basqını haqqındakı söhbətinə həvəslə qulaq asırdı. Onu da deyim ki, bir əhvalatı şirin nağıl eləməkdə heç kəs Nuru dayıma çatmazdı.

Eyvaz əminin sözü düz çıxdı, qaranlıq, çiskin gecədə selbasarlılar bizim obanı basdılar gülləyə, ancaq bizimkilər əvvəlcədən hazır dayandıqları üçün selbasarlılar heç nə apara bilmədilər, heç kəsə də güllə dəymədi.

Bu atışma zamanı atamın da o adamların arasında olmamağı, qaranlıq alaçıqda bizim yanımızda oturmağı məni səhəri gün utandırdı. Əhmədalı, Hacı, Nuru dayım gecəki əhvalatdan həvəslə danışdıqları zaman mən ürəyimdə xəcalət çəkirdim. Halbuki belə basqınların heç də yaxşı iş olmadığını mən ürəyimin dərinliklərində hiss edirdim... Selbasarlıların yenə də əliboş qayıtmağı oba adamlarına ləzzət verirdi. Səkinə nənə qürurla, bərkdən deyirdi:

– Köpəkuşağı... Kişilər olmayanda gəlib qoyunu dəstələyirdilər, elə bilirdilər bir də eləyə bilərlər!

Kürdobalıların həyatında baş verən bu hadisələr atamla anamın münasibətinə, dediyim kimi, pis təsir eləyirdi, onlar demək olar ki, bir-biriləri ilə heç danışmırdılar. Mən də bunun səbəbini heç başa düşə bilmirdim.

## BAYRAM BABAMIN OBAYA GƏLMƏSİ VƏ QIZYETƏRİN ƏHVALATI

Səhəri gün heç gözlənilmədən Bayram babam Qızılbaşoğlu Alı ilə gəldi. Babam qaçarağı və nəcib cinsdən olmağı ilə məşhur kəhər atını minmişdi. Belində onatılan tapança, ayaqlarında zərif xromdan tikilmiş uzunboğaz çəkmə var idi. Babam həmişə yaxşı geyinərdi, uzun təpəsi gen papağı ən bahalı dəridən olardı.

O, atdan düşən kimi birinci mənim üzümdən öpdü və onun çallaşmış, qumral bığlarından gələn papiros iyi məndə sevincli bir hiss oyatdı. Babam bacım Mahtabı qucağına götürüb üzündən öpdü. Atamın, anamın kefini soruşdu. Ancaq nə Fatma nənəmlə salamlaşdı, nə də dayımla... Babamın gəlişi az qala bütün obada bayram şənliyi əmələ gətirdi, kişilər onun başına toplaşdılar.

Səkinə nənə:

– Qabağında ölüm, ay Bayram, – dedi, nə yaxşı gəldin.

Obadakı bütün ahıl arvadlar da, kişilər kimi, gəlib Bayram babamla görüşdülər.

Eyvaz əmi dərhal sürüdən bir erkək gətirdib kəsdirdi. Sacı tərsinə qoyub, tərəkəmə camaatının ləzzətli xörəyi olan saciçi bişirdilər. Obanın ağsaqqalları da, Bayram babamla bir məclisdə əyləşib yedilər, çay içdilər, arandakı hadisələr barədə sorğu-suallar verdilər. Sonra selbasarlıların obanın qoyununu çəkib aparmaq istədiklərindən söhbət düşdü. Səkinə nənə selbasarlıları qəzəblə söyüb deyirdi:

– Binamus köpəkuşağı, arvad-uşaq üstünə gəlmişdilər, qadasın aldığım Qaçaq Xanmurad azarlı-azarlı təkbaşına onları it sürüsü kimi qovub qoyundan çıxartdı, ölsəydilər, ondan yaxşı idi. Demirdilər ki, axı, bu, Kərbəlayı İbixan tayfasının, Bayramın, Eyvazın obasıdı! Heylə köpəkuşağının gərək nəfəsini kəsəsən!

Bayram babam dedi:

– Ay ana, axı, Kərbəlayı İbixan tayfası da dinc oturmur.

Səkinə nənə kinli-kinli dedi:

– Kərbəlayı İbixan tayfası heylə namərdlik eləyib arvad-uşaq üstünə getməz, kişisiz obaya girməz!

Mən hiss elədim ki, məclisdəki kişilər Cəkinə nənənin sözlərini ürəklərində təsdiq edirlər.

Birdən Əhmədalı dedi:

– Əşi! Dayı sənin hüzurunda boynumuz tükdür, tükdən də nazikdi. Lap başımıza güllə vursan da, ixtiyarın var, amma, axı, selbasarlılar, bizi nə yerinə qoyurlar ki, günün günorta çağı gəlib arvad-uşağın gözü qabağında obanın qoyun-quzusunu yığırlar?! Bəyəm bizim başımızdakı papaq döyül? Sabah elatın qabağına nə üzlə çıxarıq?!

Babam bu dəfə bir qədər yumşaq tərzdə dedi:

– Yaxşı, selbasarlılar bir axmaqlıq elədilər, Qaçaq Xanmurad da heyvanı saldırdı, tay nə istəyirsiniz?

Əhmədalı qaşqabaqla cavab verdi:

– Qaçaq Xanmurad Əhmədalılardandı, dayı, Kürdobadan döyül.

Bayram babam onun nə demək istədiyini başa düşərək əsəbiləşdi:

– Əl çəkin bu işlərdən! Arazın o tayındakılara İran şahı divan tutur, bu tayında da siz çarın əlindən dünən qurtarmısınız! Didməyin bir-birinizi! Yolda mənə dedilər ki, siz də selbasarlılara basqın eləmisiniz, nə vaxtacan davam eləyəcək bu avam işlər?!

Heç kəs dinmədi. Bayram babam Mustafaoğluna dedi:

– Bunlar selbasarlılardan nə qədər heyvan gətiriblərsə, hamısını qatarsan bir çobanın qabağına, aparıb verərsən özlərinə!

Mustafaoğlu toxtaq səslə dedi:

– İxtiyar sahibisən, apar deyirsən, aparıb verərik.

Səkinə nənə dedi:

– Heylə şey eləmə, Bayram, selbasarlılar nanəcib adamlardı, deyəcəklər, bizdən qorxdular.

Eyvaz əmi gözü bükməkdə olduğu papirosda, əlavə etdi:

– Onlar bizim heyvanı aparsaydılar, qaytarmazdılar.

Bayram babam dedi:

– Siz qaytarın, qoyun onlara da dərs olsun. O vaxt bizimkilər onlardan adam vurmasaydı, bu ədavət də ortaya düşməzdi.

Səkinə nənə dedi:

– Adamları dinc oturaydı, vurulmayaydı, bilmirdi ki, Kürdobaya sataşanın anasını ağlar qoyarlar?!

Adamlar dağılışandan sonra Bayram babam Fatma nənəmi alaçığa çağırıb acıqlı-acıqlı tapşırdı:

– Oğluna deyərsən, bir də mənim gözümə görünməsin! Cəhənnəm olsun, lap günü sabah getsin arana!

Bir xeyli sükutdan sonra Fatma nənəm təəccüblü bir cəsarətlə dedi:

– Getmək lazımdı, niyə qardaşın Eyvaza demirsən?! Nuru uşaqdı, niyə yoldan çıxarıb obanın cahılları ilə basqına göndərirdi?! Niyə fikirləşmirdi ki, Bayramın gözünün ağı-qarası bircə oğlu var, gedər, – uzaq olsun, uzaq olsun, – güllə-zad dəyər?! Yoxsa, canından idi?

Babam acıqlandı:

– Sən atanın goru, sarsaq-sarsaq danışma, sənə dedim ki, tapşır çıxıb getsin arana.

Mən Bayram babamı nə qədər çox istəsəm də, onun Fatma nənəmlə belə rəftarı ürəyimə toxundu, onsuz da, obada heç kim Fatma nənəmi istəmirdi. Hətta, mənə elə gəlirdi ki, heç anam da onu istəmir.

...Nuru dayım ayaqlarında son dəbdə tikilmiş uzunboğaz, belində patronla dolu iki kəmər, əlində beşaçılan, başında qabardin gümüşü papaq, şən halda alaçıqdan çıxıb öz atına yaxınlaşaraq, cilovu geri qaytarıb, qəsdən ayağını üzəngiyə qoymadan sıçradı yəhərə. Əhmədalı ilə Hacı da tüfəngli, patrondaşlı atlandılar, Fatma nənəm əlində su ilə dolu parç tutaraq vahimə və həyəcanla dayıma baxırdı, dayım isə bir dəfə olsun ona tərəf baxmadı.

– Qoy Əhmədalı ilə Hacı səni lap Qarabulağacan ötürsün.

Nuru dayım cavab verməyərək və heç kəslə xudahafizləşməyərək kefi kök halda ayaqlarını yavaşca tərpətdi, at bunu gözləyirmiş kimi, dörddəmə götürüldü. Fatma nənəm dodağının altında dua oxuya-oxuya suyu onun ardınca atdı. Əhmədalı ilə Hacı da dayımın dalınca çapdılar. Oraya toplaşmış oba adamları öz komalarına getdilər, yalnız Fatma nənəm bütün dünyadan ayrılmış kimi, dayanaraq oğlunun ardınca baxırdı. Mən, nə isə, nənəmə təsəlliverici bir söz demək istədim, amma tapa bilmədim. Dayımgil dağın dalında gözdən itdikdə Fatma nənəm heç kəsin üzünə baxmadan gedib girdi alaçığa, Bayram babam isə, saçaqlı yapıncısı çiynində, yuxarı – Qızılboğaza tərəf gəzməyə çıxmışdı. Dayımın həmişə mənimlə soyuq rəftarına və mənim də onu istəməməyimə baxmayaraq, onun indi bu cür çıxıb getməsi məni qüssələndirirdi. Elə bil ki, Fatma nənəmin dərdi mənə də sirayət edirdi. O da mənə təsir edirdi ki, dayım bir dəfə olsun anasına tərəf baxmadı və atını eynilə cıdırlarda olduğu kimi nəşə ilə çapıb getdi.

Mən alaçığa girəndə gördüm ki, Fatma nənəm oğluna dua eləyir. O ağlamırdı, ancaq mən onun ala gözlərinə baxaraq, içərisindəki yan-

ğını hiss edirdim. O, sanki mənim gəlişimi hiss etməyərək öz-özünə deyirdi:

– Allah, sən mənim oğlumu yerin-göyün bəlasından uzaq elə! Allah, sən quldurun, biinsafın yolunu bağla!

Mən daha alaçıqda dayana bilməyərək bayıra qaçıb dəvə karvanı kimi dal-dala düzülmüş qayaların dalında ağladım. Elə bu vaxt gecədən bəri göyü qaplamış buludlar parçalandı, gün çıxaraq çiçəkli yaşıl çölləri, yosunlu qayaları, Altıntaxtada otlayan çılpaq atları, uzaqda – dağın döşünə səpələnmiş, göbələk tək görünən qoyun sürülərini sevincli işığa qərq etdi. Yosunlu daşların çalalarında axşamkı yağışdan qalmış sular güzgütək parladı. Mən gözümün yaşını pencəyimin qolu ilə silərək indi dərin, mavi dəniz kimi görünən göyə baxıb fikirləşdim ki, “görəsən, bu saat Allah harada əyləşib? Fatma nənəmin yalvarışlarını eşidirmi? Əgər, eşidirsə, nənəmin mətləbini hasil eləyəcəkmi?” Mən ürəyimdə Allaha qarşı kövrəlmiş bir məhəbbət hiss edərək göyə elə məzlum-məzlum baxırdım ki, əgər, Allah mənim bu baxışlarımı görsəydi, yəqin ki, nənəmə rəhm eləyib onun iltimasına əməl edərdi. Birdən yadıma düşdü ki, Fatma nənəm həmişə deyir: “Allah ərrəhmanirrəhimdir”, yəni, rəhm eləyəndir.

Mən, ürəyimdə bir toxtaqlıq hiss eləyərək, günəş istisindən qızmış daş “dəvələrdən” birinin belinə mindim. Bu vaxt Qaraca məni görərək ocaq üçün çöldən yığdığı təzəkləri komalarının qapısına qoyub, yanıma gəldi. Mən ona dedim:

– Qaraca, min daldakı dəvəyə.

Qaraca təəccüblə soruşdu:

– Hanı dəvə?

Mən dedim:

– Bəs, bu dal-dala düzülən dəvələri görmürsən?

Mən tərəkəmələr kimi “Hey! Hey!” deyə-deyə, guya, dəvələri yeyin getməyə səsləyərək nəşə ilə dedim:

– Bu mənim dəvə karvanımdır, gedirik Naxçıvandan duz gətirməyə.

(Kürdobalılar dəvələrlə gedib Naxçıvandakı böyük duz mədənindən duz və quru ərik gətirərdilər.) Qaraca altdan yuxarı mənə qıyqacı baxıb gülümsədi. O, çox nadir hallarda gülümsəyərdi.

Mən dedim:

– Yaxşı, indi ki, dəvəyə minmirsən, sarvan ol, keç qabaqdakı nərin ovsarından yapış.

Lakin Qaraca irişə-irişə altdan yuxarı mənə baxıb dururdu.

– Hey! Hey! – deyə mən "dəvələri" səsləyib, eyni zamanda, fikirləşirdim ki, Fatma nənəm gecə-gündüz namaz qılıb dayıma dua edir, özü də elindən-obasından ayrı düşmüş yazıq bir arvaddır, yəqin ki, Allah onun yalvarışlarını eşidəcək, çünki Allah ərrəhmanirrəhimdir!

Əslinə baxsan, mən bu düşüncənin məzmununu hiss edirdim, yəni, o dəqiqələrdə bir adam məndən soruşsaydı ki, nə fikirləşirsən, əlbəttə ki, nə düşündüyümü belə, aydın ifadə eləyə bilməzdim.

Nəhayət, mən, "dəvələri" haylamaqdan yorularaq, düşüb Qaracanın yanına gəldim. O, məni inandırmışdı ki, neçə dəfə sapandla kəklik vurub, neçə dəfə onun cələsinə kəklik düşüb... Mən dedim:

– Gedək, sənin qurduğun cələyə baxaq. Bəlkə kəklik düşüb.

Biz dağın o tərəfindəki qayalığa getdik, cələnin içindəki çörək qırıntıları yox olmuşdu, amma cələ özü olduğu kimi dururdu, kəklik-zad yox idi.

Qaraca dedi:

– Yaman bicləşib buranın kəklikləri.

O cələni qurduğu yerdən çıxarıb dedi:

– Aparaq bu dəfə Dəvəuçanda quraq. Orada kəklik buradan çox olur.

Biz dolayı cığırla, Dəvəuçan dağına tərəf bir qədər yüyürmüşdük ki, birdən qabaqda gedən Qaraca dayandı. Mən də ona çatıb gördüm ki, Qaracanın anası Qızyetər, çoban Mahmudla bir çökəkdə oturub danışırlar... Onlar bizi görmürdülər. Qaraca mənə bir söz demədən geri döndü, onun rəngi qaçmış, üzündə, nə isə, yazıq bir ifadə əmələ gəlmişdi.

Mən soruşdum:

– Bəs, niyə geri qayıdırsan?

O, cavab vermədi. Mən təkrar çoban Mahmudla Qaracanın anasına baxdım. Gəlin gülə-gülə çobana nə isə deyirdi. Qaracanın birdənbirə bikefləməsi məni mütəəssir elədi. Bilirdim ki, bu qırmızısifət, qarabığ, cavan çoban Qaracanın atası deyil. Heç bir zaman onun Qaraca ilə danışdığını da görməmişdim. Məndən savayı Qaraca ilə heç kəs danışmırdı. Özündən böyük bacısı, qardaşı olmasına, anası, əmiləri olmasına baxmayaraq, Qaraca yalqız idi, yəni, mən belə hiss edirdim. Mən onun yalqızlığını indi daha təsirli hiss edirdim... Onun özündən dörd-beş yaş böyük qardaşı Qulu, Eyvaz əminin çobanlarından biri idi. Dan yeri sökülməmiş qoyuna gedir, bir də gecə gəlirdi. Əgər, qoyun sürüləri uzaqda otarılırdısa, Qulu bəzən heç gecə də gəlmirdi, "cürcünəsinə" bürünüb qoyunun içində yatırdı. Özündən böyük bacısı Firuzə

də gecə-gündüz Eyvaz əmigildə işləyirdi, nehrə çalxalayırdı, itlərə yal bişirirdi, bulaqdan gündə azı dörd-beş səhəng su gətirirdi. Bulaq isə, dediyim kimi, aşağı dərədə idi. Mis səhəng də otuz-otuz beş litr su tuturdu. Amma bütün bunlar Firuzənin halına təfavüt eləmirdi. Yanaqları lalə kimi qıpqırmızı idi. Özü də Qaraca kimi eybəcər deyildi, gözəllikdə o da, böyük qardaşı Qulu da analarına oxşamışdılar. Mən Firuzənin bir dəfə də olsun bikef olduğunu görməmişdim. Bulağa gedəndə qız-gəlinlərlə zarafatlaşa-zarafatlaşa, bir-birini çimdikləyə-çimdikləyə, yaxalarındakı gümüş pullar cingildəyə-cingildəyə dağı üzüaşağı uçurlanardılar. Bulaqdan qayıdanda hansı qızın kimə gedəcəyi barədə, hansı nişanlı oğlanın daha qoçaq olması barədə şirin söhbət eləyə-eləyə gələrdilər. Amma Qaracanın üzü gülməzdi.

Biz Qaracanın anasıgilin gizlin söhbət elədiyi yerdən xeyli uzaqlaşandan sonra mən təkrar soruşdum:

– Axı, niyə geri qayıtdın?

O yenə də dinmədi. Mən elə burdaca xatırladım ki, Qaraca mənə neçə dəfə sapand toxuyub, mən onları itirmişəm, neçə dəfə Nuru dayım onun öz sapandını tutub alıb mənə verib, amma mən ona heç nə verməmişəm. Mənim pencəyimin yaxasında, ulduz şəklində balaca gümüş bir sancaq vardı, onu mənə anamın rəfiqələrindən biri bağışlamışdı. Qaraca da həmişə ulduza böyük maraqla baxırdı. Mən həmin ulduzu çıxarıb Qaracanın əldə toxunan şaldan tikilmiş köhnə pencəyinin yaxasına taxdım. O, təəccüblə soruşdu:

– Belə niyə eləyirsən?

Mən qürurla dedim.

– Sənə bağışlayıram.

Onun mismar deşiklərinə oxşayan gözləri işıqlandı, məndən soruşdu:

– Doğru sözündü?

Dedim:

– Hə, bağışlayıram sənə.

O, bir qədər susdu. Sonra pencəyinin cibindən bərk şaqqıldayan, alabəzək sapandını çıxarıb mənə uzadaraq dedi:

– Al, mən də bunu bağışlayırm sənə.

Mən böyük adamlar kimi özümü çəkib dedim:

– Yox, istəmirəm.

Həqiqətdə isə, istəyirdim, amma əvəz-əvəz eləməyi şənimə sığışdırmadım. Qaraca dedi:

– A tanrısız, götür dayna.

Mən sapandı aldım, biz obanın qənşərinə çatanda gördük ki, Bayram babam çiynində yapıncı Qızılboğazdan enib gəlir. Babam indi də gözəl idi, üzünün sağ tərəfindəki qoşa, qara xal və bozarmaqda olan qumral bığı, qonur gözləri indi də qəşəng görünürdü. Uca qədd-qaməti indi də yaraşıqlı idi.

O, bizi görüb gülümsədi:

– Üşümürsən ki? – deyə məndən soruşdu.

– Yox, üşümürəm, – dedim.

Qaracanın əyni mənimkindən də nazik, çarığı, patavaları tamam su içində olmasına baxmayaraq, babam ondan üşüyüb-üşümədiyini soruşmadı. Ancaq onun da üzünə gülümsədi.

Mən alabəzək sapandı göstərib həvəslə dedim:

– Baba, Qaraca verdi!

– O... – deyə babam sapandı təriflədi. – Bəs, sən Qaracaya nə verdin?

– Mən də gümüş ulduz, – deyə Qaracanın köhnə pencəyinin yaxasındakı nişana işarə etdim. – Qaraca mənim üçün kəklik də tutacaq.

Babam dedi:

– Qaraca yaxşı oğlandı.

Sonra babam Qaracadan soruşdu:

– Eyvaz əmingil sizə yavanlıq-zad verirmi?

Qaraca gözünü babamdan çəkib yerə baxaraq yavaş səslə dedi:

– Verirlər.

Mən həyəcanla dedim:

– Baba, bunlar çox kasıbdırlar, heç bişmiş-zad bişirmirlər.

Babam dərindən nəfəs alıb mehriban səslə dedi:

– Eybi yoxdur, Qaraca da, qardaşı da böyüyüb qazanc gətirərlər, onda işləri də yaxşı olar.

Mən hiss elədim ki, babamın sözləri Qaracada bir canlanma əmələ gətirdi. Bayram babam pul çıxarıb Qaracaya verərək dedi:

– Anana denən, getsin Qarakilsə bazarından sizə ayın-oyun alsın.

Mən dedim:

– Baba, qoy Qaracaya təzə paltar da alsın.

Babam dedi:

– Qaracaya təzə paltar almağa da çatar.

– Yox, baba, birdən çatmaz, yenə ver.

Babam çıxarıb bir pul da verdi.

Babam yeganə adam idi ki, mən onun yanında ərköyünlük eləyirdim. Yəqin məsələdir ki, mən heç bir zaman atamdan Qaraca üçün, ya lap özüm üçün pul istəyə bilməzdim. Kim bilir, bəlkə istəsəydim, atam mənə acıqlanmazdı, ancaq mən atamla öz aramda, elə bil ki, həmişə soyuq, lal bir divar hiss edirdim.

Babam bizdən aralanıb alaçığa gedəndən sonra mən Qaracadan soruşdum:

– Bayram babamı sən də çox istəyirsənmi?

Qaraca cavab verdi:

– Niyə istəmirəm, ay tanrısız?

Sonra Qaracanın anası iti addımlarla gəldi. Onun üzü qızarıb pörtmüşdü, gözlərində elə həyəcanlı ifadə vardı ki, elə bil, heç nəyi, heç kəsi görmürdü. Qaraca da onu görəndə üzünə baxmayıb gözlərini yerə dikdi, mən Qaracaya dedim:

– Apar, pulları ver anana də...

O, dinməz getdi komalarına, mən də onun ardınca getdim. Qızyetər balaca, dəyirmi əl güzgüsündə üzünü diqqətlə nəzərdən keçirirdi. Onun tər yanaqları lalətək qızarırdı. Qaraca pulları cibindən çıxararaq, altdan-yuxarı anasına qıyqacı baxıb, soyuq ifadə ilə dedi:

– Bayram əmim verdi.

Qızyetər tez balaca güzgünü arxalığının cibinə qoyub, pulları Qaracadan aldı. Gördüm ki, Qaraca daha bir söz demir, ona görə də mən dedim:

– Qızyetər xala, Bayram babam ayrı pul da verdi ki, Qaracaya paltar alasan.

Qızyetər gülümsədi və onun qar kimi ağ dişləri mənim xoşuma gəldi. Qızyetər xala dedi:

– Bayram babanın ömrü uzun olsun, ancaq qadan alım, Qaracadan qabaq ərgən bacısı var, əvvəl gərək onun əyin-başını düzəldək.

Gördüm Qaraca da anasının bu sözünün üstündən bir söz demir. Ona görə mən də dinmədim. Mən görürdüm ki, Qaracanın anası kimi gözəl, boy-buxunlu bacısı həmişə ayaqyalın gəzir. "Gəzir" demək də düz deyildi. Firuzənin gəzməyə bir dəqiqə də vaxtı yox idi. Eyvaz əmigilin işləri qoymurdu ki, o, gözünü açsın. Amma Firuzənin həmişə kefi kök olurdu, həmişə məni görəndə gülümsəyirdi. Bəzən də əyilib o üzümdən-bu üzümdən bərk-bərk öpürdü və onun öpməyi məni, İmaşa qoşulub qaçan Güllünün öpüşü kimi acıqlandırmırdı, onun öp-

məyi mənim xoşuma gəlirdi. Onun ağzından yemlik qoxusu gəlirdi. Yemlik dağların döşündə bitirdi və onu yeməyi mənə Qaraca öyrətmişdi. Mən onu da görmüşdüm ki, Firuzə Nuru dayıma necə baxır və onun qabağından neçə dəfə belədən-belə gəlib keçir, dayım isə, elə bil, heç Firuzəni görmürdü. Amma bir dəfə məzəli bir iş oldu.

Nuru dayım gəzməkdən gəlib alaçıqda ayaqlarını soyunmaq istəyirdi, ancaq uzunboğaz çəkmələri şehdən islandığı üçün ayağından çıxmırdı, alaçıqda da məndən başqa heç kəs yox idi. Bu vaxt Firuzə içəri girib dayımın əlləşdiyini görəndə dedi:

– Qağa, qoy gəlim çəkim çəkmələrini.

Dayım da dedi:

– Gəl çək.

Firuzə çəkmənin ikinci tayını daha bərk çəkib çıxaranda özünü saxlaya bilməyib arxası üstə yıxıldı və tumanı geri çirmənəndə ağ, qəşəng qılçaları göründü. Firuzə qəhqəhə ilə gülərək dikəldikdə dayım onun biləyindən yapışıb özünə tərəf çəkərək yanağından öpdü və bir də öpmək istəyəndə:

– Oy, qağa! – deyə Firuzə qəribə bir səs çıxardı.

Bu vaxt alaçığa girən Fatma nənəm bu əhvalatı gördü. Dayım da fıştırıq çala-çala zər qotazlı mütəkkəni başının altına çəkib, təzə, ağ keçənin üstündə uzanaraq yarımçıq qoyduğu rus kitabını götürüb tutdu gözünün qabağına. Mən də bayıra çıxıb gördüm ki, alaçığın böyründə Fatma nənəm qəzəblə Firuzəyə deyir:

– Ay ləçər, görürəm sən də anan kimi qızıxmısan, uşağı yoldan çıxarma!

Firuzə də and içir ki:

– Bibi, vallah, mən heç nə eləmirdim...

Fatma nənəmin dayıma uşaq deməyi mənə gülməli göründü və eyni zamanda, nənəmin Firuzəni bu cür danlamağı da mənə pis təsir elədi, axı, doğrudan da, Firuzə heç nə eləməmişdi. Sonra nənəmin Qızyetərin haqqında dediyi "qızıxmaq" sözü də mənə qəribə göründü. Mən bilirdim ki, nər dəvə yazdamı, ya payızdamı qızır, ağzından köpük daşlanır. Yad adam bu zaman onun həndəvərinə hərlənə bilmir. Əgər, vaxtilə lap sahibi belə onu vurubsa, qızdığı zaman qarşısına çıxsa, nər onu alıb dizinin altına qoyub əzər. Birinin haqqında kim kimə deyər ki, "filankəsdə dəvə kini var..." Amma arvadın "qızmağını" birinci dəfə eşidirdim və bu "qızmağın" nədən ibarət olduğunu anlaya bilmirdim. Elə həmin günün səhəri Qızılboğazdan duman yeriyib bü-

tün obanı bürümüşdü, bir addım irəlini görmək olmurdu. Qızyetər xala Eyvaz əmigildə nehrə çalxalayırdı, mən ondan soruşdum ki:

– Haradadı Qaraca?

Dedi:

– Yəqin komada olar, ölüm qabağında.

Mən onların komasına yaxınlaşanda, içəridə danışıq eşidib dayandım, gördüm Firuzə deyir:

– Qağa, başına dönüm, burax, gəlib görən olar, sonra bibim öldürər məni.

Nuru dayım da deyirdi:

– Dəli olma az, heç kəs sənə bir söz deyə bilməz.

Mən heç özüm də bilmirəm, nədənsə, utanaraq, qapıdan aralanmaq istəyirdim ki, qucağında bir xəlbir təzək, dumanın içindən çıxan Qaraca ilə qarşılaşdım. O dedi:

– Təzəyi komaya atıb gəlirəm. Gedək, çələyə baxaq, belə havada olsun ki, kəklik düşər.

Elə Qaraca bu sözü deyib qurtarmamışdı ki, Firuzə komadan hövlnak çıxıb yanımızdan yel kimi keçərək qaçdı, sonra da dayım çıxaraq mənə acıqlandı:

– Bu dumanda obadan uzaqlaşmaq olmaz, itil alaçığa.

Sonra da Qaracaya acıqlanıb dedi:

– Demirsən, canavar-zad düşər üstünüzə? Uşağı da öyrədib aparırsan!

...Mən alaçığa girəndə atam diqqətlə məni nəzərdən keçirib soruşdu:

– Bəs ulduzun hanı?

O, sərt soruşduğu üçün mən susurdum. O, təkrar soruşdu:

– İtirmisən?

Dedim:

– Yox.

– Bəs hanı?

Dedim:

– Vermişəm Qaracaya.

– Niyə vermisən? Dəli olmuşdun?

Mən dedim:

– O mənə bəzəkli sapand verib.

Atam dedi:

– Yerə soxum sənin kimi maymaq uşağı, gümüş şeyi aparıb bir qəpiklik sapanda dəyişirsən?!

Anam dedi:

– Nə olsun, dəyişib dəyişib də. Üç misqal gümüşdən ötrü uşağı niyə danlayırsan?

Mən ağladım, atam qəzəblə anama dedi:

– Belə danışa-danışa sən də bunu heç nəyin otu eləyəcəksən, uşaq gərək öz şeyinin qədrini bilsin. Maymaq olmasın, onsuz da, bu acizin biridi...

Anam mənə dedi:

– Ağlama, get üzünü yu, şəhərə qayıdanda zərgər Stepana deyərəm, sənə ondan da yaxşısını qayırar.

Atam əsəbi hərəkətlə papiros yandıraraq qalxıb alaçıqdan çıxdı. Xüsusən biz Kürdoba yaylağına gələndən bəri atamla anamın münasibətində anlaşılmaz bir gərginlik hiss edirdim. Nuru dayım gedəndən sonra da anam oba cavanları ilə alaçığın qabağında, ya da yastı qayanın üstündə söhbət edir, zarafatlaşırdı. Atam isə, heç vaxt onlara yaxınlaşmırdı. Anamla-atam gündüz bir yerdə az olurdular. Bayram babam da gündüzlər obada az görünürdü. Qızılbaşoğlu ilə gedib o biri obalara da baş çəkirdilər. Evdə olanda da kənar ellərdən beli qurşaqlı hacılar, ağsaqqallar görüşünə gəlirdilər, oturub saatlarca söhbət edirdilər. Onlar üçün qoyun kəsilirdi, çay qoyulurdu və onların bütün məclislərində Səkinə nənə də iştirak edirdi, bu da Fatma nənəmə acıq gedirdi, amma bu barədə bir söz demirdi. Yeganə adam idim ki, Fatma nənəm dərdsərini məndən gizlətmirdi. Mən qəsdən tez-tez onun uzaq Kürdüstan meşələrində qalan qardaşları, bacıları haqqında soruşurdum, nənəm də "ah" çəkib onlardan şirin həsrətlə danışırdı və elə bil ki, bu zaman arvadın dərdi dağılıb onu yüngülləşdirirdi. Nuru dayım gedəndən sonra arvadın ürəyi lap kövrək olmuşdu. Mən kədərlə düşünürdüm ki, Nuru dayım gedəndə heç bir dəfə də olsun başını döndərib anasına tərəf baxmadı, amma Fatma nənəm saatlarla alaçığın böyründə oturub o gedən yollara baxırdı. Elə bil ki, yollar oğlunun ardınca onun da ürəyini çəkib, dumana qarışan uzaqlara aparırdı. Görəsən, nə üçün dünya bu qədər qüssəlidir? Nə üçün Qaraca bircə dəfə də olsa, atasını xatırlamır? Bir dəfə də olsa, onun haqqında danışmır? Nə üçün Qızyetər uşaqlarının atası olmayan çoban Mahmudla heylə şirin-şirin deyib-gülür? Nə üçün onların belə gizlində görüşünün Qaracanı necə qəmgin etdiyini Qaracanın anası hiss eləmir? Nə üçün anam bir dəfə də olsun, öz ana-

sının, yəni, Fatma nənəmin dərdini-sərini soruşmur? Heç onlar diz-dizə oturub ürəkdən söhbət eləmir? Bütün bu suallar dumanlı halda mənim zehnimdən gəlib keçir və məni qüssələndirirdi.

...Sonra qəribə bir əhvalat oldu... Dedilər ki, Qızyetər gecə obanı yuxuya verib, çoban Mahmudla qaçıb.

Eyvaz əmi qəzəbindən dünyanı dağıdırdı. Səkinə nənənin üstünə qışqırıb deyirdi:

– Vaxtında sən qoymadın o qancığı mən öldürüm! Bizi binamus elədi!

Eyvaz əmi hər dərəyə bir od vurdu. Bacısı oğlu Gəməndi bir tərəfə göndərdi, maması oğlu Dadaşı bir tərəfə, Əhmədalını bir tərəfə, Hacını bir tərəfə, özlərinə də tapşırdı ki, "harda tapdınız, hərəsinin təpəsinə bir güllə vurun, it kimi murdar olsunlar!" Ancaq ikisi də yağlı əppək olub göyə çəkildi. Kimi xəbər gətirdi ki, deyirlər Təhlə yaylağına tərəf getdiklərini görüblər, kimi xəbər gətirdi ki, arana sarı gedirmişlər, kimi də xəbər gətirdi ki, Arazbasara yollanıblar.

Mən key kimi oturmuşdum. Qaracanın üzünə baxa bilmirdim. O özünü elə aparırdı ki, elə bil, nədəsə müqəssirdi. Heç kəsə, hətta, mənə də yaxın gəlmirdi, biz olan alaçığa tərəf də çıxmırdı.

Eyvaz əmi qışqırıb deyirdi:

– O qancığın uşaqları da özü kimi olacaq! Qovun, çıxıb getsinlər!

Eyvaz əmi bu sözləri deyəndə, gördüm ki, Firuzə öz komalarının dalında ağlayır. Qaraca da o tərəfdə qayanın böyrünə qısılıb durub. Sonra da Eyvaz əminin arvadı, Firuzənin yanına gəlib dedi:

– Niyə gözünün yaşını tökürsən, ay qaragün, yeri səhəngi götür, su gətir.

Elə bil ki, qız arvadın bu buyruğuna sevindi, güllü yaylığının ucu ilə cəld gözünün yaşını silərək iti addımlarla gedib iri mis səhəngi götürüb yollandı bulağa.

Ananın uşaqlarını bu cür qoyub qaçmağı mənə ağlasığmaz bir iş kimi görünürdü və eyzən düşünürdüm ki, bu yazıq Qaraca anasız neyləyəcək? Ana belə işi necə bacardı? Səkinə nənə də acığından bilmirdi neyləsin. İndi o, mənim gözümdə dağ kimi olmuşdu. İndi mənə elə gəlirdi ki, o da, onun oğulları da dünyanın ən xoşbəxt adamlarıdır, çünki o, ərindən sonra Qızyetər kimi heç kəsə qoşulub qaçmayıb, oturub uşaqlarını böyüdüb. O, alaçığın qapısında dayanıb gurultulu səslə deyirdi:

– Binamus köpəkqızı! Mən iyirmi beş-iyirmi altı yaşımdan dünyanın zövq-səfasından nəfsimi çəkib beş uşaq böyütdüm. Bayram kimi, Eyvaz kimi oğul anası oldum, amma bu qancıq üç il ərsiz dayana bilmədi!

Sarısaqqal Mustafaoğlu da öz komasının qabağında dayanıb deyirdi:

– Ay Səkinə, sən Kərbəlayı İbixanın qızısan! Halal süd əmmisən, amma o, bic Gülmalının belindən gəlib... Kimi kimə tay tutursan?!

Arvad yana-yana əlavə elədi:

– Mənə də Səkinə deyərlər, ömrümə bir gün də qalsa, onu, qoşulub qaçdığı binamusla qarın-qarına bağlatdırıb Dəvəboynundan atdırmasam, dədəmin qızı deyiləm.

Bütün bu sözləri qayanın daldasına qısılmış Qaraca eşidirdi. Mən onun yanına gedib dinməz dayandım. O da mismar deşiklərinə oxşayan gözləri ilə üzümə baxıb heç bir söz demədi. Biz xeyli dinməz-söyləməz dayandıq. Sonra atam alaçığın qabağına çıxıb məni səslədi:

– Gəl, xörəyin soyuyur.

Bilirdim ki, bizdə bu gün nahara kəklikli plovla dağ pencərindən dovğa bişirilib. Mən Qaracaya baxıb susurdum, xəcalət çəkirdim. Mənə elə gəlirdi ki, Qaracanı burada çiskinləşməyə başlayan yağışın altında ac qoyub, kəklikli plov yeməyə getsəm, çox ayıb bir iş görmüş olaram. Qaracanın uzun, əyri burunlu üzü sakit və tutqun idi. Mənə elə gəlirdi ki, onun mismar deşiklərinə bənzəyən balaca gözlərinin dərinliyində mənə məlum olmayan qorxulu bir aləm var. O ağlamırdı, ona görə də, o, mənə yazıq görünmürdü, amma sirli görünürdü, ha baxırdımsa, ondan bir şey başa düşmürdüm.

– Səni nahara çağırmırlar? – deyə atam məni acıqlı-acıqlı səslədi.

Qaraca dönüb bərk çiskinləyən yağışın altında uzaqlaşdı, yaylaqda tez-tez yağış-çiskin olduğu üçün və Qaraca da eyzən çöldə-bayırda olduğu üçün köhnə şal pencəyi, tumansız geydiyi köhnə şalvarı həmişə nəm olardı və onun bu yaş paltarda heç bir zaman xəstələnməməyi məni təəccübləndirirdi.

Axşamçağı anam Firuzəni xəlvətcə çağırıb, iri bir kasanı nahardan qalmış plovla dolduraraq ona verib dedi:

– Apar, Qaraca ilə yeyin.

Firuzə də kasanı yaylığının altında tutaraq apardı öz komalarına.

Yağış yağdığı üçün anam məni bayıra buraxmırdı. Mən qapının ağzında dayanıb gözümü dikmişdim Qaracagilin komasına. Qaranlıq

düşəndə gördüm ki, Qaraca o yan-bu yana baxa-baxa oğru kimi gəlib girdi öz komalarına. (Sonralar da, biz yaylaqda olduğumuz müddətdə bişən xörəklərdən anam həmişə bir qab dolusu verirdi Firuzəyə, o da xəlvətcə aparırdı öz komalarına.)

Səhəri gün Bayram babam Qızılbaşoğlu Alı ilə elatı gəzməkdən qayıdıb gəldi.

– Qancıq bizim papağımızı yerə vurdu, – deyə Eyvaz əmi əhvalatı ona danışdı.

Səkinə nənə də qəzəblə dedi:

– Aləm səni tanıyır, Bayram! Hər dərəyə bir od vur, bic Gülmalının qızını tapdır, çarmıxa çəkdir!

Amma Bayram babam heç bir söz deməyib papiros yandıraraq çıxdı bayıra.

Mən təəccüb edirdim ki, nə üçün Eyvaz əminin, Səkinə nənənin Qaracaya yazıqları gəlmir? Mən həyatımda birinci dəfə olaraq adamların qəddarlığını vahimə ilə hiss edirdim və bunun səbəbini anlamırdım.

## MÖHNƏT QOCANIN SÖYLƏDİKLƏRİ. QIZYETƏRLƏ ÇOBAN MAHMUDUN ƏHVALATI NECƏ NAĞIL OLDU?..

Möhnət qoca uzun demisindən dərin nəfəs alıb dedi:

– Sarıyataqlı Dəlisoy Gülmalının altı qızı olmuşdu. Yeddinci qızı olanda Gülmalı arvadını o ki var kötəkləyib dedi:

– Köpəyin qızı, tay doğma! Qız yetər!

O gündən də yeddinci qızın adı qaldı Qızyetər. Allah Qızyetərə bir gözəllik vermişdi: böyüyüb ərgən yaşa çatanda Aya deyirdi sən çıxma, mən çıxıram, günə deyirdi sən çıxma, mən çıxıram. Qarılar ona rast gələndə deyərdilər: "ay batmış, laləni niyə yanaqlarına sürtüb qızartmısan?!" Amma Qızyetərin yanaqları elə qüdrətdən lalətək alışıb-yanırdı, boyu təzə pöhrələnmiş sərv ağacı idi. El Qızılboğaz yaylağına qalxanda, Qızyetər səhəng götürdü, Eşşək bulağına enəndə deyirdin, bəs, o yandan bəri maral gəlir.

Elçilər bir-birinin dalına düzülürdü, amma anası heç kəsə "hə" demirdi. "Mənim qızım xanlara, bəylərə layiqdi" deyirdi. Axırda Dəlisoy Gülmalı arvadını o ki var əzişdirib dedi:

– Köpək qızı, görmürsən qız yetişib, hədə-qadağadan çıxıb? Nəyi gözləyirsən?

Dəlisoy Gülmalı bunu deyib qızın "hə"sini verdi dövlətli qardaşı oğluna. Gülmalının evinə bir dəvə yükü sarı buğda unu, bir dəvə yükü akula düyüsü, yeddi erkək gəldi. Qızyetəri nişanladılar əmisi oğluna. El yaylağa köçəndə əmisi oğlu əkin-biçini yığıb-yığışdırmaq üçün aranda qalıb, nişanlısına söz verdi ki, "peşqurd qurtaran kimi gələcəm yaylağa, sənə zərxara paltarlıq, Ay-ulduzlu çarqat alıb gətirəcəyəm!"

Amma ala yaylaqda, güllər-çiçəklər arasında Qızyetər hey gözlədi, əmisi oğlu gəlmədi. O vaxt Qızyetər bir namə yazıb göndərdi nişanlısına; aşıqlar da o naməyə hava qoşub oxudular:

Əmim oğlu məndən heç utanmadın?
Üç ay keçdi, bir yaylağa gəlmədin!
Yüz min cəfa ilə köks ötürdüm mən,
Ordan endik Ağbulağa, gəlmədin?!
Mən səni istədim hamıdan əziz,
Neyləyim, yanında oldum bir kəniz.
Ətir can bəslədim, güllərdən təmiz,
Namərd oğlu, kef-damağa gəlmədin!

Sonra Qızyetər xəbər tutdu ki, əmisi oğlu aranda dəyirmançı Şirinin qızı qısır Narıngüllə bərk alışıb. Qızyetər yandı töküldü, ürəyində dedi: "Ay gədə xislət! Mənə də Qızyetər deyərlər! Səndən də yaxşı oğlana getməsəm, dədəmin qızı deyiləm!"

Qızyetər belə qərar verəndən sonra, günlərin birində Kərbəlayı İbixan nəvəsi Alməmmədə qoşulub qaçdı. Üç gün, üç gecə toy vuruldu, otuz erkək, yeddi böngə kəsildi. Cəmi elat axışıb Məşədi Gülməhəmməd oğlu Alməmmədin toyuna gəldi. Amma Qızyetərin əmisi oğlu da qabağından yeyən oğlanlardan deyildi, and içdi ki, "mən bu qisası yerdə qoymuyacağam! Alməmməd, Kərbəlayı İbixanın nəvəsidirsə, mən də tayqulaq Həsənin törəməsiyəm!"

Günlərin birində aranda Qızyetərin əmisi oğlu ilə Alməmməd çöldə qəfil rastlaşdılar. İkisi də atlı-tüfəngli idi. Qızyetərin əmisi oğlu Alməmməddən cəld tərpənib ona üç güllə vurdu. Çox çəkmədi ki, Alməmmədin maması oğlu Dadaş da Qızyetərin əmisi oğluna üç güllə vurdu. Sonra ağsaqqallar tökülüşüb barışıq elədilər. Amma kin-küdurət qaldı. Obada Qızyetərin günü göy əsgiyə düyüldü. Qarımış qarılar ona baxıb deyirdilər: "Bu qızıxmış qancığın üstündə iki igid güdaza getdi". Qaynı Eyvaz onu dindirmirdi. Qayınanası Səkinə onun qanını içərdi.

Amma Qızyetərə də Qızyetər deyərdilər. Ərinin qohum-əqrəbası onu söyüb-danladıqca, o da gündən-günə lalətək qızarıb gözəlləşirdi. Çoxdan doğmayan madyan kimi qızışıb ərsəyə gəlirdi. Yeriyəndə yer tərpənirdi. Təhlə – Muğan elindən olan çoban Mahmud, Qızılboğaz yaylağında onu görüb bir könüldən min könülə aşiq oldu. Qızyetər, Eşşək bulağından səhəngini doldurub çıxanda gördü ki, çoban Mahmud qayanın üstündə dayanıb ona baxır. Qızyetər neçə dəfə onun belə baxdığını görmüşdü, ona görə də, qız-gəlindən ayrılıb təkləndi ki, görsün bu qəşəng oğlanın mətləbi nədi. O zaman çoban da o yan-bu yana baxıb, ona yan aldı:

– Ay gəlin, – dedi, – bilirəm, dulsan, amma aşiqəm sana, mana gələrsənmi?

Qızyetər gülümsünüb dedi:

– Buy, başıma xeyir, oğlanın yalanına bax...

Çoban dedi:

– Yalanı yoxdu, düz sözümdü.

Qızyetər dedi:

– Sən belə cavan, gözəl oğlansan, üç uşağın anasına necə aşiq ola bilərsən?

Çoban dedi:

– Lap doqquz uşağın da olsa, keçməyəcəyəm səndən.

Çoban bunu deyib, iri səhəngi Qızyetərin çiynindən alıb qoydu yerə, Qızyetər gülüb dedi:

– Buy, oğlanın üzünə bax ey...

Çoban onun ağ biləklərindən yapışıb özünə tərəf çəkdi. Qızyetər gülə-gülə dedi:

– Yavaş, görən olar...

Amma o yan-bu yana baxıb gördü ki, heç kəs yoxdu, o zaman neçə vaxt ərsiz qalmış gəlin özü cavan çobana girişdi, nə girişdi.

Hə... aşıq da burada vəcdə gəlib dedi:

Gözəl, səndə nə qaydadır,
Gedəni yoldan eylərsən?

O gündən ala yaylaqların daldalarında, soyuq bulaqların baldırğanlıqlarında Qızyetərlə çoban Mahmud gecə demədilər, gündüz demədi-

lər, hey bir-birilərinə sarılıb kam aldılar. El ağzı, çuval ağzı. Elin gözü, tərlan gözü. Aşiqlər nə qədər pünhan görüşürdülərsə də, yenə də aləmə car olurdu, qarımış qarılar yenə də içlərini çəkib deyirdilər:

– Bu qızıxmış qancıq yenə də dünyanı qana çalxayacaq!

Ərgən qızlar çoban Mahmudun qarasına qəzəblənib deyirdilər:

– Bu tanrısız gözəl oğlan, anası yerində qatırda nə görüb?

Amma çoban Mahmud da Qızyetəri yüz ərgən qıza dəyişməzdi.

Qızyetərin qaynı Eyvazın el içində bir sözü iki deyildi, gülləsi havayı getməzdi. Onun arvadı Qızyetəri daldaya çəkib dedi:

– Ay tanrısız, əl çək o çobandan! Qaynın bilər, səni tikə-tikə doğrayar.

Səhəri gün Dəvəuçan dağın pünhan yerində Qızyetər sevgilisinə baxıb yanıqlı-yanıqlı dedi:

Dağların üstündə qar nişanası,
Gül üstə görünür xar nişanası,
Ölürəm, qəlbimdə yar nişanası,
Gözüm yolda, intizara yetmədin...

Çoban Mahmud gördü ki, nəsə, Qızyetərin dərdi tərpənib, dedi:

– Nə olub? Niyə yaralı-yaralı danışırsan?

Qızyetər dedi:

– Fələk bizi bir-birimizdən ayıracaq!

Çoban dedi:

– Fələklərin gücü aciz-avaralara çatar.

Qızyetər “ah” çəkib dedi:

– Yox, canım-ciyərim, məni aparmasan, biz bir də görüşməyəcəyik, sən tək oğlan Kərbəlayı İbixan tayfasına neyləyə bilərsən?

Çoban dedi:

– Yaxşı, hara aparım səni?

Qızyetər yanıqlı-yanıqlı dedi:

Şamamanın gülü sarı,
Üzməmişəm, gülü sarı.
Apar məni, canım çoban,
Gün çıxmamış aran sarı.

Çoban dedi:
– Sənin sözün sınınca qoy düşmənin boynu sınsın.
Birdən Qızyetər şübhəyə düşüb soruşdu:
– Bəlkə, – dedi, – sən getmək istəmirsən?
Çoban dedi:
– Sən daş qoyan yerə, mən baş qoyaram.
Gündüz Qızyetər uşaqlarını çimizdirdi, paltarlarını yuyub-yamadı, iki teşt çörək bişirib yanlarına qoydu. Gecə el yatandan sonra qalxıb, şirin yuxuda olan uşaqlarına baxıb ağladı, ürəyini boşaldandan sonra onları Allaha tapşırıb çiskinli qaranlıqda komadan çıxdı.
...Gündüzlər daşda-qayada, kol-kosda gizlənib, gecələr yol getdilər. Az getdilər, çox getdilər, axır gəlib çıxdılar Arazın kənarına. Tanrıya tabe olmayan Xan Araz göylə gedib "qan-qan" deyirdi. Çoban Mahmud iki qoyun dağarcığı götürmüşdü, paltarlarını onların içinə yığdılar, sonra üfürüb hava ilə doldurub bağladılar bellərinə.
Çoban dedi:
– Suda məndən aralanma.
Qızyetər dedi:
– Məndən arxayın ol.
Qərəz, Arazı keçib çıxdılar o taya. Yenə də xeyli yol gedib, Aslandüz mahalında çatdılar bir xanın mülkünə. Eşikağası soruşdu:
– Nə istəyirsiniz?
Çoban Mahmud dedi:
– Əgər, iş olsa, xana qulluq edərdik.
Xan ahıl adam olub günlərini ovda, eyş-işrətdə keçirirdi. Amma arvadı şorgöz, cavan bir fars qızı idi. Xanın başına ip salıb oynadırdı. Çoban Mahmudu görən kimi ağzının suyu axdı. Amma özünü onda qoymayıb, eşikağasına tapşırdı ki, gəlin sağıcı olsun, oğlan da evdə xidmətçi.
Çoban Mahmud dedi:
– Xanım, mən çobanam, ev işi bacarmaram.
Cavan xanım işvə ilə gülümsəyib dedi:
– Öyrədərlər, bacararsan.
Xanımın gülüşünü, işvəsini görəndə Qızyetərin dalağı sancdı, amma bu barədə sevgilisinə bir söz demədi. Bir günün içində Mahmudu bəy balası kimi elə geyindirib-kecindirdilər ki, Qızyetər məəttəl qaldı. Bu təzə libasda çoban Mahmud, Həzrət Yusif kimi gözəl görünürdü, özünün də kefi daha bu sözdən deyildi.

...Onlar sarayın nökər-naib olan hissəsində balaca bir otaqda olurdular, bayır nökərlərinin də, Qızyetərin də xanla arvadı yaşayan hissəyə girməyə ixtiyarı yox idi, amma Mahmud bütün günü orada olurdu. Qızyetər məğrur gəlin idi, ona görə də, Mahmuddan soruşmurdu ki, "sarayda, eyzən xanımın hüzurunda neyləyirsən?"

Mahmud da bir söz demirdi, özü də Qızyetərə əvvəlki kimi sarılmırdı. Qızyetər için-için yanırdı, amma yenə üzə vurmurdu.

Günlərin birində Xan, ovçularını, itlərini götürüb Savalan dağının ətəklərinə ova getdi. Xanın belə ovu neçə gün çəkirdi.

Xan gedəndən sonra Mahmud, Qızyetərə dedi ki:

– Mən gecə sarayda qalacağam.

Qızyetər soruşdu:

– Niyə?

Mahmud dedi:

– Xanım yatan otağın qapısında dayanacam.

Qızyetər soruşdu:

– Bəyəm, səndən başqa ayrı xidmətçi yoxdu?

Mahmud acıqlanıb dedi:

– Ay tanrısız, nə məni sorğu-suala tutursan? Görünür, xanım ancaq mənə etibar eləyir, dayna.

Qızyetər hesabı içəri verib dedi:

– Neynək, vaxta ki, xanım sənə etibar eləyir, get.

Düzdür, Qızyetər belə dedi, amma bütün bədəni uçunurdu. Gecə ilan vuran yatdı, Qızyetər yatmadı; gördü xeyr, dayana bilmir. Durub geyindi, çıxdı bayıra. Hamı qəflət yuxusundaydı. Qızyetər, xanım olan evə qalxıb gördü ki, otaqların hamısı qaranlıqdı, içəridən içəriyə bir neçə otaq keçib, çatdı xanım yatan otağa, dayanıb nəfəsini dərdi. Sonra qapını usdufca aralayıb nə gördü? Xanımla Mahmud qol-boyun olub şirin-şirin yatırlar. Qızyetər bir xeyli baxdı. Sonra dinməz-söyləməz öz qaldıqları otaqdan çoban Mahmudun xəncərini götürüb geri qayıtdı. İstədi əvvəl xanımı vursun. Amma fikirləşdi ki, birdən Mahmud oyanar, qoymaz, ona görə də əvvəl xəncəri var gücü ilə sancdı sevgilisinin ürəyinə. Mahmud gözünü açıb pəncərədən düşən Ay işığında onu gördü, nə isə demək istədi, amma nitqi olmadı. Sonra Qızyetər xəncəri çəkib sancdı xanımın sinəsinə, sonra da qapıdan çıxıb düşdü bağa. Bağın dəmir darvazası gecələr qıfıllı olurdu. Qızyetər bağbanın nərdivanını barıya söykəyib aşdı o biri üzə. Aydınlıq çöllərlə getdi, hey getdi... O gecədən sonra Qızyetəri bir bəni-insan görmədi. Amma

izin verin, Möhnət qoca desin, bəs, o yiyəsiz çöllərdə Qızyetərin başına nə gəldi?

Möhnət qoca uzun demisindən bir-iki qullab vurandan sonra nağılına davam etdi:

– Qızyetər özü də bilmirdi ki, hara gedir. Birdən dünya durduqca yaşayan Xızır peyğəmbər çıxdı onun qabağına, dedi ki, "ay gəlin, bu yiyəsiz çöllərdə səni qurd-quş basıb yeyər. Yum gözünü, açanda, özünü obada görərsən."

Qızyetər dedi:

– Mən nə üzlə obama qayıdım?

O zaman Xızır peyğəmbər dedi:

– İndi ki, öz obana getmirsən, ayrı obaya apararam səni.

Qızyetər dedi:

– Yox, mən tay insan üzü görmək istəmirəm.

– Onda babalın öz boynuna.

Xızır peyğəmbər bunu deyib yox oldu. Qızyetər bir qədər getmişdi ki, qabağına bir toy məclisi çıxdı. Gördü, vallah, burada bir dəsgahdır ki, gəl görəsən. Məleykə kimi bir qız əyləşib qızıl taxtın üstündə, sazəndələr çalır, qızlar oynayır... Ortalıqdakı süfrənin üstündə də dünyanın hər cürə naz-neməti var. Taxt-rəvanda əyləşən qız onu görüb soruşdu:

– Ey bəni-adəm, necə olub ki, sən bura gəlib çıxmısan?

Qızyetər soruşdu:

– Sən kimsən?

Qız dedi:

– Mən pərilər padşahıyam.

Qızyetər başına gələn əhvalatı, zalım sevgilisinin vəfasızlığını açıb pərilər padşahına nağıl elədi, pərilər padşahı olan o gözəl qız soruşdu:

– İntiqamını alandan sonra ürəyin soyudumu?

Qızyetər dedi:

– Nə qədər bu dünyada sevgililərinə xəyanət eləyən oğlanlar var, ürəyim soyumaz. Dünya durduqca, mən onlardan intiqam almaq istərdim.

Pərilər padşahı olan o gözəl qız, Kor Şeytanı çağırtdırıb dedi:

– Bu gündən sən bu arvadın ixtiyarındasan, nə əmr etsə, yerinə yetirərsən!

İndi o vaxtdan bəri Qızyetər dəmir çarıq geyib, dünyanı gəzir, sevgililərinə xəyanət eləyən namərd oğlanlardan intiqam alır!

Möhnət qoca dağlara baxıb ağır-ağır dedi:

Dərdim çoxdur, dindirməyin, həzarat,
Məni bir alagöz ceyran öldürür.
Qılıncsız, tüfəngsiz alır canımı,
Kimsə bilmir, pünhan-pünhan öldürür.

Heç bilmirəm neyləmişəm, neyləyim,
Xəncər alım, qara bağrım teyləyim.
Bir canım var, yara qurban eyləyim,
El də desin, aşiq qurban öldürür...

## MURADIN SÖYLƏDİKLƏRİ

Möhnət qocanın söylədiyi bu misraların "Qızyetərlə çoban Mahmud" nağılına nə dəxli vardı? Nə üçün Möhnət qoca bu misraları heylə ürəkdən, heylə dərdli-dərdli deyirdi? Və bu sözləri söylərkən tamaşa elədiyi dağlarda nə görürdü? Kimləri görürdü? Yoxsa, dağlardakı dumanda yox olub gedən cavanlığını, cavan sevgilisini görürdü?

Mən birinci dəfə olaraq Möhnət qocanın və dumanlı dağların nisgilini duyurdum, amma anlaya bilmirdim ki, bu nisgil, bu qəribə kədər nədən ibarətdir? Sonralar da bu nisgil, bu kədər həmişə mənimlə idi. Sonralar da mən uzaq dağlara baxanda, aşıqların sazına, xanəndələrin muğamına qulaq asanda o kədəri, o nisgili hiss edirdim, amma mənasını anlaya bilmirdim, doğrusu, heç anlamağa da cəhd eləmirdim. Axşamlar gün batıb çıraqlar yananda da, el bir yurddan o biri yurda köçəndə də mən eyni kədəri, eyni nisgili hiss edirdim.

Səhər gün çıxanda Altıntaxtanın lalələri sevinclə parıldaşırdı, gün batanda isə onlar sanki hər şeyə qarşı biganə olub, çox uzaq xatirəyə dalırdı, axşamın alatoranında dağlara duman gələndə sanki Yer üzünə qəm-qüssə çökürdü. Bəzən mənə elə gəlirdi ki, o dağlarda Altıntaxtanı bürüyən o qırmızı lalələr də, yosunlu qayadan çıxıb mərcan kimi rəngbərəng xırda daşların üzərilə axan Eşşək bulağı da canlıdırlar və nə üçünsə dinib danışmırlar. Xaynamazın, otlaya-otlaya, sakit halda məni üstündə gəzdirən kor madyanı da heç kəsə, heç nəyə fikir verməyən ən biganə məxluq idi. Onun heç bir qüssəsi, heç bir xatirəsi yox idi. Sanki igid oğlanlar, igid atlar görmüş dağlar ona acı bir kədərlə baxırdı. Və mənə elə gəlirdi ki, Qaracanın dərdini insanlar yox, dağlar,

ayaqyalın gəzdiyi şehli çiçəkli otlaqlar, bir də axşam kədərlə qürub eləyən günəş hiss edir. Və bəlkə Qaracanın xəbəri yoxdur ki, onun insanlardan incimiş anası o uzaq dağlarla, o yiyəsiz çöllərlə ünsiyyət bağlayıb. Həqiqətən də, dünya durduqca yaşayıb, çoban Mahmud kimi namərd sevgililərdən intiqam alacaq?! Kaş bircə dəfə də olsa, o, xəlvətcə gəlib Qaracanı görəydi. Qaraca da inanaydı ki, anası sağdır və dünya durduqca yaşayacaqdır! Yəqin ki, onda Qaraca heç nəyin dərdini çəkməzdi və indiki kimi, adamlardan uzaq olmağa çalışmazdı.

Qaracanın anası qaçandan sonra dünya mənim gözümdə, elə bil, sarı, soyuq bir rəngə bürünmüşdü. Mən artıq nə sapand atmaqla maraqlanırdım, nə də cələ qurub quş tutmaqla.

...Daha dağların başından çən-duman çəkilmirdi. Çobanların cürcənəsi, igidlərin yapıncısı çiyinlərindən düşmürdü. Axşamlar alaçıqlarda, komalarda ocaq qalanırdı. Hər səhər otların üstünə şeh-qırov düşürdü. Nəhayət, bir axşam alaçıqlar, komalar söküldü. Keçələr, alaçıq çubuqları, dolu fərməşlər, motallar, yağ çirişləri dəvələrə yükləndi. Atlar yəhərlənib dayandılar. Ay doğanda el tərpəndi arana.

Mən axşamdan anama yalvardım ki, qoysun dəvəyə minim. Əhmədalı da anama dedi:

– Qoy gəlinlə otursun bizim dəvənin üstündə.

Əhmədalının gəlini mindiyi dəvə balaca güzgülərlə, əlvan qotazlı gözlüklərlə, mis zınqırovlarla bəzənmişdi, sinəbəndinə qırmızı, firuzə rəngli muncuqlar düzülmüşdü. Babam, atam, anam yəhərlənmiş atlarda gedirdilər. Dəvələr yırğalana-yırğalana yeridikcə boyunlarındakı zınqırovların səsləri, elə bil, Ayla, ulduzlarla işıqlanmış çöllərin sükutu içində uzaqlardan gələn, mənə məlum olmayan bir musiqiyə çevrilirdi. Əhmədalı tez-tez atını bizim dəvənin yanına sürüb məndən soruşurdu:

– Qaqaş, üşümürsən ki?

Cavan gəlin də Ay işığında gülümsəyib deyirdi:

– Xalasının qucağında niyə üşüyür.

Çox cavan olduğu üçün onun özünü xala adlandırması mənə gülməli görünürdü. Ondan təzə süd qoxusu gəlirdi.

Köç hündür dağın döşündən salınmış el yolu ilə getdikcə mənə elə gəlirdi ki, ulduzlu göyün bir parçası da aşağı dərədədir. Qaranlıq dərədə görünən işıqlar, elə bil, ulduzlar idi. Zınqırovların səsi, bizdən aşağıda görünən ulduzlu göy parçası, dəvənin yırğalana-yırğalana getməsi, fərməşin üstündə uzanıb başımı dizinin üstünə qoyduğum

gəlindən gələn təzə süd qoxusu mənə yuxu gətirirdi, yarımürgü içində mənə elə gəlirdi ki, elə həmişə bu cür gedirik. Haradan gəlirik?.. Hara gedirik?.. Bilinmirdi... Biz elə hey gedirik... Həmişə də gedəcəyik... Həmişə də zınqırovlar belə eyni ahənglə səslənəcək. Bizdən aşağıdakı ulduzlar da göydəki ulduzlar kimi həmişə uzaqdan, qaranlıqdan işıq verəcək. Biz həmişə belə gedəcəyik.

Birdən köçün qabağınca nərin üstündə gedən Səkinə nənə bu ulduzlu göyün altında, bu ulduzlu dərənin üstündə uca səslə bayatı çağırdı:

Aşıq gecələr gələr,
Yatıb dincələr, gələr.
İllər mübah keçəndə,
Karvan gecələr gələr...

Səkinə nənə ilə yaşıd olan Mustafaoğlu da köçün arxa tərəfindən başqa bir bayatı çağırdı:

Ay doğdu pərli-pərli,
Qapılar qoşa nərli.
Girəydim yar qoynuna,
Çıxaydım tərli-tərli.

Sonra dərin sükut içində zınqırov səsləri sanki asta-asta Çahargah muğamına çevrilərək mənim xəyalımı çəkib dərk eləmədiyim, ancaq əsrarlı şirinliyini hiss elədiyim uzaqlara aparırdı və bu naməlum uzaqlarda, eynilə belə Aylı-ulduzlu qaranlıqda gah çöllərlə gedən Qızyetəri, gah qızıl taxtda əyləşən, özü də mənim anam kimi gözəl olan pərilər padşahını və onun qabağında rəqs eləyən çılpaq qızları görürdüm. Mən Qızyetərin öz sevgilisi ilə həmşəri Xan arvadını necə öldürdüyünü xəyalıma gətirmək istəmirdim, daha doğrusu, gətirməkdən qorxurdum, ancaq o dəhşətli mənzərə lap zehnimin yan-yörəsində hərlənirdi... Birdən gözümün qarşısında Qaraca dayandı və mən hövlnak başımı qaldırıb gəlindən soruşdum:

– Haradadı Qaraca?

Cavan gəlin Ay-ulduz işığında gülümsəyib yavaş səslə dedi:

– Qaraca qoyunla gəlir.

Mən eyni həyəcanla soruşdum:

– Piyada?

Gəlin arxayın, təbii bir ifadə ilə təsdiq etdi:

– Hə, əmisigilin çobanlarına kömək eləyir, inəkləri, buzovları gözləyir. Sən başını qoy yat, qaqaş!

Mən indi başımı onun dizinə deyil, fərməşin üstünə qoydum və Qızyetərin xəncəri öz namərd sevgilisinin sinəsinə necə endirdiyi bütün aydınlığı ilə xəyalımda zahir oldu və mən bu mənzərəyə tamaşa etdikcə elə bilirdim ki, Qaracanın dərdi azalır, elə bil ki, Qaraca yazıqlıqdan çıxıb güclü, zirək olur... Və birinci dəfə olaraq mən intiqamın ürək soyutmağını hiss edirdim, mühakiməsiz, təhtəlşüur olaraq hiss edirdim.

Qozlu çay dərəsində biz köçdən ayrılıb, atamgilin kəndi Güney Güzdəyə getdik. Anam getmək istəmirdi. Atam təkid elədi. Bayram babamla Fatma nənəm isə köçlə Kürdobaya getdilər. Qızılbaşoğlu da onlarla idi.

Atamgilin daşdan tikilmiş, üstü qırmızı dəmirli ikimərtəbə evlərinin geniş artırmasına çıxanda məni qabıqdan çıxmış təzə qoz iyi vurdu və bu iy məndə indiyəcən duymadığım xoş bir təsir doğurdu. Elə bil ki, mən tamam təzə bir aləmə daxil oldum.

Yaşı çoxdan səksəni keçmiş Xəlsə nənəm yel kimi artırmaya çıxıb:

– Ay qadanızı alım, nə yaxşı gəldiniz, – deyə mənimlə bacımın üzündən öpdü.

Xəlsə nənəmin həmişə quş kimi qıvraq olması, heç bir zaman ayaqqabı geyinməməsi, dabanlarının dərisinin gön kimi bərk olması, səhər ha eləyib biz durana qədər kəndin ayağından girərək başından çıxıb bütün xəbərləri toplayıb gətirməsi məni ən çox maraqlandıran işlərdəndi. Mən təəccüb edirdim ki, "niyə Xəlsə nənəmin ayağına tikan batmır?"

Xəlsə nənəmin əynində həmişə tünd parçadan uzun tuman, arxalıq, uzun döşlük olardı. Qış-yay başına qalın şal dolayardı. Mən ondan soruşdum ki:

– Nənə, niyə ayaqqabı geymirsən?

– Ay qadan alım, – dedi, – ayaqqabı geyəndə hövsələm daralır.

Sonra yaşca atamdan böyük olan Qubad əmim, onun arvadı Şahxanım gəlib bizə "xoş gəldin" elədilər. Şahxanım, əmimin ikinci arvadı idi. Onun birinci arvadından olan oğlu Bəhlul da təxminən mən yaşda idi. Qubad əmimgil aşağı mərtəbədə olurdular. Üst mərtəbədəki evləri də döşəyib qonaq üçün saxlayırdılar. Üst mərtəbədə böyük bir zalı da barama qurutmaq üçün düzəltmişdilər ki, kənd arasında buna

“barama maşını” deyirdilər. Qubad əmim ucaboylu, enlikürək, ayağı çarıqlı bir kəndli idi. Xəlsə nənəmin əri rəhmətə gedəndə uşaqları balaca imiş. Ancaq arvad mənim atamı bizim kənddən səkkiz kilometr aralıda, Qarğabazar kəndindəki beşillik rus-tatar məktəbində oxuda bilmişdi. Atam da çox zehinli imiş. Cəmi beş il oxusa da, rus dilini yaxşı öyrənə bilmişdi. Anamın, qayınları ilə o qədər də arası yox idi, amma Xəlsə nənəmlə dost idi. Arvadın diribala olması, xüsusi əda ilə tez-tez danışması, bir saatın içində kəndin ayağından girib başından çıxması anamın xoşuna gəlirdi. Anam həmişə onunla danışanda gülümsəyirdi. Xəlsə nənə yeməklərin içində ən çox kələm dolmasını xoşladığı üçün bizə gələndə həmişə anam kələm dolması bişirərdi. Atamın, anamın ona çox hörmət eləmələrinə baxmayaraq, bizdə az qalardı. Üç-dörd gündən sonra deyərdi:

– Mənciyəz tay gedim.

Atam da ona paltarlıq parça, ayaqqabı alardı. Özünə də tapşırardı ki:

– Əşi, ana, bax, bu ayaqqabılarını geyin!

Nənəm də söz verərdi ki, “geyəcəyəm”, amma geyməzdi. Xəlsə nənəm Fatma nənəm kimi nağıl-zad bilən deyildi. Keçib-keçəcəkdən də danışmazdı. Onu kənddə olan gündəlik hadisələr, əhvalatlar maraqlandırardı.

## GÖDƏK NİSƏ QIRX ADAMI BİR-BİRİNƏ NECƏ QIRDIRDI...

Güney güzdəklilər Qayaburnu bağlarından dördtəkərli öküz arabalarında hey üzüm daşıyırdılar. Qayaburnu bağları uzun yalın o biri üzündə olub, kənddən bir kilometr aralıda idi. Bu bağlarda demək olardı ki, Güney güzdəklilərin hamısının yeri vardı və bu yerlərin arasında çağ-çəpər qoyulmamışdı. Mən də həmişə təəccüb edirdim ki, meşə kimi qalın olan bu bağlarda hər kəs öz yerini necə tanıyır? Ancaq elə tanıyırlar ki, heç kəs heç kəsin bir ağacını belə səhv salmırdı. Qocaların danışdığına görə, Güney Güzdəyi də, burdakı bağları da atamgilin ulu babası Əhməd xoca salıb. Ona görə də, bağların çoxu Əhməd xocanın törəmələri olan Əfəndi uşağına mənsub idi, yəni, bizim tayfaya. Əhməd xoca əslən Ərzurumdan imiş. Necə olub ki, heylə uzaq məmləkətdən gəlib çıxmışdı bura? Heç kəs bilmirdi.

Yəqin ki, bu bağlar bu dağdan burun kimi irəli uzanan qayanın qabağında olduğu üçün ona Qayaburnu bağları deyiblər.

Qayaburnu bağlarının əsas meyvəsi üzüm idi. Qol yoğunluğunda tənəklər, uca ərik, alma-gavalı ağaclarına sarılıb yuxarı qalxaraq, enli yarpaqlı qol-budaqları ilə bir-birilərinə elə sarılmışdılar ki, torpağa gün düşmürdü. Ağacların dibi tər otlarla örtülü olurdu. Mənə o da təəccüb gəlirdi ki, mən yaşda olan əmim oğlu Bəhlul o meşə kimi bağda heç zaman azmırdı. Öz bağlarının sərhədlərini heç vaxt dəyişik salmırdı.

Əmimgil uzun, nazik ağac budaqlarından ucu haça koxa qayıraraq ağaclara çıxıb onun köməyilə üzümü dərib özləri toxuduqları cəvərənlərə dolduraraq iplə aşağı sallayırdılar. Yerdəki arvadlar da cəvərənləri böyük səbətlərə boşaldırdılar. Səbətlərsə arabalara yüklənib kəndə daşınırdı. Mənim üçün ən maraqlı tamaşalardan biri də Qubad əmimin şalvarını çırmayıb ayaqlarını tərtəmiz yuduqdan sonra çardağın üstünə qalxıb çubuqlardan toxunmuş çətənlərə yığılan üzümü ayaqlayıb şirəsini çıxarmağı idi. Qubad əmim üzümü ayaqladıqca şirəsi tökülürdü çardağın altında qoyulmuş iri tiyanlara. Bu tiyanlar dolduqda aparıb qoyurdular ocağın üstünə ki, bişib bəhməz olsun. Sonra təzə qozun ləpəsini sapa düzüb salırdılar bəhməzin içinə, bəhməzin içində bişən ləpələr çox ləzzətli oldurdu. Sonra bəhməzin bir hissəsinə gavalı, ya tut, ya ərik salıb irçal da bişirirdilər. Bu da bizim mürəbbələrə oxşayırdı. Üzüm yığılması, bəhməz bişirilməsi kənddə bayrama çevrilirdi. Hamı məmnun görünürdü.

Lakin birdən xəbər çıxdı ki, Vəli uşağından olan Vəliş, Əfəndi uşağından olan Cəbini Qayaburnu bağlarında doğrayıb öldürüb. Həmin saat aləm dəydi bir-birinə. Bizim qohum-qəbələdən olan kişilər – kimi xəncər, kimi tapança götürüb çıxdılar Yal deyilən meydana. Qubad əmim də işini yarımçıq qoyaraq, ayağını yuyub, geyinib getdi meydana. Axşamçağı məlum oldu ki, əhvalat Aynanın üstündə olub. Ayna Güney Güzdəkdə birinci gözəl idi. Mən əmim oğlu Bəhlulla tez-tez Şahbulaq adlanan kəhrizə gedərdim və burada su doldurmağa gələnlər arasında Aynanı görəndə ağzımı əngəldib heyran-heyran ona tamaşa edərdim. Əmimgilin qonşusu zarafatcıl gəlin Xasa da mənə sataşıb deyirdi:

– Ayna, vallah, Xəlsə qarının bu şəhərli nəvəsi sana aşiq olub.

Mən də utanıb qaçırdım. Amma səhər yenə də əmim oğlu ilə kəhrizin üstünə gəlib Aynanı görməyincə getməzdim. Əlbəttə, mən aşiqliyin nə demək olduğunu bilmirdim. Amma Aynanın gözəlliyinə tamaşa eləmək mənim xoşuma gəlirdi. Əri Pullu Fəttahı Bəhlul mənə

göstərmişdi. Gödək, fındıqburun bir kişi idi. Əmimgilin evinin yaxınlığında olan ikimərtəbə evinin altında dükanı vardı. Papiros, kibrit, qənd, saçaqlı konfet, nöyüt satardı. Mənim ondan zəhləm gedərdi. Bəhlulu da öyrədərdim, xəlvətcə dükanına daş atıb qaçardıq. Kişi də məni görəndə gülə-gülə deyərdi:

– Başına dönüm, adam əmisinin dükanına daş atmaz.

Kənd arvadlarının anamgillə danışıqlarından eşitdim ki, Cəbi boy-lu-buxunlu gözəl bir oğlan imiş. Özü də hələ Ayna ərə getməmişdən ona bənd imiş. Amma Aynanın ata-anası qızı ona deyil, Pullu Fəttaha veriblər. Deyirlər, Aynanın da gözü Cəbidə imiş. Kənd arasında söz çıxarıblar ki, "Ayna Cəbi ilə oynayır". Axırda Vəli uşağının ağbirçəyi gödək Nisə, Fəttahın əmisi oğlanları olan Murtuza ilə Vəlişə deyir:

– Siz də adınızı kişi qoyub ortada gəzin, əminiz oğlunun arvadı da saman mərəklərində, Qayaburnu bağlarında Cəbi ilə kef çəksin. Əfəndi uşağı da sizi lağa qoyub gülsün. Əminiz oğlu biqeyrətdir, hər şeyi vurur boynunun ardına, siz də durub baxırsınız!

Vəliş bağda Cəbiyə rast gəlib onu ovxarlanmış dəhrə ilə doğradı.

Bu əhvalatdan üç gün sonra Əfəndi uşağından olan Ağgöz Cabbar gecə bacadan Vəlişi güllə ilə vurub öldürdü. Ağgöz Cabbar ucaboylu, arıq, enlikürək bir adam idi. Adama, xüsusən də, arası olmadığı, ya kin bəslədiyi adama baxanda gözünün ağı həddindən artıq böyük görünüb, onun sərt üzünə qorxunc bir ifadə verirdi. Ağgöz Cabbara kənd arasında "adamcıl"da deyirdilər. Mən eşitmişdim ki, "adamcıl" canavara deyərlər. Danışırdılar ki, bəzən elə canavarlar olur ki, onlar ən çox insan əti xoşlayırlar. Ona görə də, Ağgöz Cabbarın "adamcıl" olması mənə çox dəhşətli görünürdü. Mən qapı-bacada ona rast gəlməkdən qorxurdum. Heç bir zaman onun gülümsədiyini görməmişdim. O, atamgilin qohumlarından olduğu üçün hərdən əmimgilin evlərinin həndəvərində də görünərdi. Atam da həmişə ona "xalaoğlu" deyib zarafat edərdi. Bu zaman Ağgöz Cabbarın üzündəki qorxunc ifadə bir qədər yumşalsa da, atamın zarafatlarına heç vaxt zarafatla cavab verməzdi.

Vəlişin xalasıoğlu Bəşir gecə tövlədə heyvana ot verdiyi yerdə, Ağgöz Cabbar, əmisi oğlu Şahmarla qəfil girib onu da doğradılar. Sonra Vəlişin qohumları Şahmarı öz qapısında uzaqdan sərrast güllə ilə vurub öldürdülər. Daha heç kəs, hətta, biz də gecə çıraq yandırmırdıq.

Sonra günəşli bir gün idi, bir dəstə qız-gəlin çöldən pencər yığmaqdan gəlirdi, mən də uzun, enli artırmada dayanıb onlara tamaşa

edirdim. Gözəl Ayna da onların arasında idi. Onlar çöl pencəri ilə dolu torbalarını qoltuqlarına vurub gəlirdilər. O ili taxıl yaxşı olmadığından çörək qıtlaşmışdı. Ona görə də, kənd əhli çöl pencərinə-zada güc verirdilər. Bir də gördüm ucaboylu, cavan bir oğlan olan Murtuza əlində tüfəng kənddən çıxıb, pencərdən qayıdan qız-gəlinə tərəf gedir və bir də gördüm o, tüfəngini üzünə götürüb, Aynanı tuşlayaraq atdı. Ayna ağacda vurulmuş quş kimi səssizcə düşdü torpağa. Murtuza tüfəngin gilizini çıxararaq tələsmədən yoluna davam etdi və yerlərində quruyub qalmış qız-gəlin birdən hərəkətə gələrək, Aynanı otların üzərinə sərilmiş qoyub kəndə qaçdılar və Murtuza, yalın o biri üzünə aşmamış Aynanın dayısı oğlu Sərdar kənddən çıxıb yüyürərək, dizini yerə qoyub dalbadal Murtuzaya iki güllə atdı. Murtuza da ayaq üstə çevrilib ona güllə ata-ata aşdı yalın o biri üzünə və bu zaman kəndin kişiləri qasırğa kimi töküldülər meydana.

Sonra Əfəndi uşağı ilə Vəli uşağının arasında dəhşətli bir dava düşdü. Kimi xəncərlə, kimi yaba ilə, kimi daşla, kimi tapança ilə birbirinin harası gəldi, vururdu. Qan su yerinə axırdı. Atamgilin əmizadələrindən olan Əziz tapança ilə üç adam vurub öldürmüş, dördüncüsünü də yaralamışdı. Heç üç gün keçmədi ki, Əziz gecə dostları ilə damda kart oynadığı zaman Vəli uşağından oğurluqda ad çıxarmış Vahid bacadan güllə ilə onu vurub öldürdü. Hökumət olmadığından bu qırğının qabağı alınmırdı. Artıq bizim də kənddə qalmağımız qorxulu idi, yəni, mən bunu atamla anamın söhbətindən hiss edirdim. Atam demək olardı ki, evdən bayıra tək çıxmırdı. Həmişə də özü ilə tapança gəzdirirdi. Bir də gördük Bayram babamgil əhvalatı eşidib bizi şəhərə köçürmək üçün Qızılbaşoğlu Alı ilə birlikdə beş tüfəngli atlı göndərib. Mən Əhmədalı ilə Hacını da onların arasında görüb xeyli sevindim. Əhmədalı ilə Hacı əvvəlki kimi kefi kök olub, anamla zarafatlaşıb gülüşürdülər, elə bil ki, Güney Güzdəkdəki bu dəhşətli hadisə onlar üçün tamam adi bir iş idi. Yalnız Qızılbaşoğlu qırğın barədə, kimin kimi öldürməyi barədə atamın dediklərinə diqqətlə qulaq asırdı. Əhmədalı ilə Hacı isə, "doşab satan güzdəklilər" deyə kənd camaatını lağa qoyurdular. Mən hiss elədim ki, tərəkəmələr oturaq kəndlilərə yuxarıdan aşağı baxırlar, onları atıb-vurmaqda, igidlikdə əli olmayan adamlar hesab edirlər. Buna görədir ki, hərəsinin döşündə üç kəmər patron, böyürlərində də tapança olan Əhmədalı ilə Hacı özlərini kəndin arasında elə tuturdular ki, elə bil, yüz kənd əhlini bir qoz hesab eləmirdilər, kənd cavanları da onlara kinli-kinli baxırdılar.

## BAĞÇAMIZDAKI PAYIZ MEYVƏLƏRİNİN MƏNƏ DİKİLƏN XOŞHAL BAXIŞLARI...

Biz, babamın dostu olan Hacı Yüzbaşının faytonunda Qızılbaşoğlu Alıgilin müşayiətilə getdik şəhərə. Evimizdə ilk qabağımıza çıxan adam, çiynində hansı qonşununsa səhəngi kəhrizdən gələn İman kişi oldu. O gülüb dedi:

– Xoş gəldiniz!

Sonra aşağı evdən paltarı da, özü də, saçı-kirpikləri də dümağ Kəklik xala çıxıb, mənimlə bacımın üzündən öpdü:

– A başınıza dönüm, – dedi, – Allaha şükür ki, sağ-salamat gəlib çıxdınız.

Evimiz, bağımız mənə elə təzə göründü ki, elə bil, birinci dəfə görürdüm. Mən bacım Mahtabla bağa qaçdım. Cavan alma, heyva, gavalı ağaclarının tər yarpaqları arasında təzə yetişmiş meyvələr görünürdü. Əncir ağacının üstündəki əncirlərin hər biri bir nəlbəki boyda olmuşdu. Partlamış əncirlərin qırmızı içi görünürdü.

Çəpərlərin dibində bitən böyürtkən kollarının meyvəsi yetişib şəvə kimi qaralmışdı. Mənə elə gəlirdi ki, bağımızdakı bu tər payız meyvələri xoş bir sükut içində mənə baxır. Elə bil ki, mən onların xəfif təbəssümünü də görürdüm.

Ağacların dibindən yaşıl otlar qalxmışdı. Atam bağçanı diqqətlə nəzərdən keçirərək dedi:

– Sağ ol, Kəklik. Uşaqlar bağa yaxşı baxıblar.

Kəklik xala da, adəti üzrə, bərkdən danışaraq cavab verdi ki:

– Amanata xəyanət olmaz, başına dönüm! Uşaqlar bağın suyunu bir həftə də gecikdirməyiblər. Yay bərk isti keçirdi. Ağacları hər gün suvarırdıq, səhərisi dibi mismar kimi bərkiyirdi.

Qabaq dediyim kimi, Kəklik xala dörd oğlu ilə bizim altdakı evlərdən birində olurdu. Özləri də çox yoxsul idilər. Ancaq onların həyatında mən qəribə bir cazibə hiss edirdim. Mən baxıb görürdüm ki, yoxsulluq nə Kəklik xalanı, nə də onun oğlanlarını kədərləndirir, əksinə, Kəklik xala həmişə bərkdən, gümrah danışır. Oğlanlarının hərəsi şəhərdə bir işdən yapışırdı. Kimi orada-burada yer belləyirdi, kimi gedib bağlardan-bostanlardan ucuz qiymətə meyvə, tərəvəz alıb bazarda bir-iki qəpik artığına sataraq pul qazanırdı, o biri də nə bilim, nə iş görürdü, axşamlar da hamısı təmiz torpaq döşəməyə salınmış köhnə palazın üstündə oturaraq Kəklik xalanın çəkib qabaqlarına qoyduğu dov-

ğanı, ya əriştəni böyük bir iştaha ilə yeyirdilər. Mən bir dəfə də olsun onların üzündə, bizim naz-nemət içində yaşamağımıza həsəd nişanəsi hiss eləmirdim. Elə bil, onlar heç bu barədə düşünmürdülər də. Bu da onlarla rəftarımda məni ürəkləndirirdi, görünür, bu ona görə idi ki, mən onlarla öz aramızda mənəvi bir sədd duymurdum. Onların lap kiçiyi olan Kazım məndən üç-dörd yaş böyük olduğundan hərdən mənimlə oynayırdı, qarpız qabığından mənə araba qayırırdı, mən də heç bir zaman ona yekəxanalıq satmırdım. Onların həyatı mənə öz həyatımızdan şirin görünürdü.

İman kişi də öz aləmində idi, hər gün qonşulara su verəndən sonra Ayı Temirin çörəkxanasından yumurtalı, xaşxaşlı bir təndir çörəyi alıb gələrdi evinə. Ya qonşuların, ya bizim verdiyimiz payı yeyəndən sonra vərəqləri cırıq-cırıq olub saralmış kitabını balaca pəncərədən düşən zəif işığa tutub başlayardı mütaliəyə:

"Quranın quran olsun... Yer oğlu qıy vurdu, çıxdı göyə... Gülbəs qara toyuqlara cadu eləyib..."

Bacım Mahtab yenə də tez-tez anamın gözündən oğurlanıb qaçırdı İman kişinin yanına. İman kişi də onu dizinin üstündə oturdub:

– Papılı balam, ye! – deyə saxsı çanağındakı xörəkdən ona da yedirdirdi.

## EVİMİZDƏKİ GECƏ MƏCLİSLƏRİ

"Hürriyyətlik" davam edirdi. Lap şəhərin ortasında, günün-günorta çağında soyğunlar olurdu. Sayılan adamların hərəsinin başında bir dəstə atlı-tüfəngli adam hərlənirdi.

Sonra Bayram babamgil də gəldi şəhərə. Anamla mən getdim onlara. Gördük Bayram babam əsəbi halda otaqda var-gəl edir, Fatma nənəm də bayırda taxtın üstündə oturub dərd içində papiros çəkir. Məlum oldu ki, Nuru dayım yaylaqdan gələn kimi evlərində olan xalı-gəbəni, bütün qiymətli şeylərin hamısını satıb-sovub, özü də harasa əkilib gedib.

Bayram babam heç bir söz deməyib, hey əsəbi halda var-gəl eləyirdi. Nuru dayımın belə şuluq çıxmasının təqsirini anam yenə də Fatma nənəmdə görürdü.

– Sən, – deyirdi, – onun bütün hərəkətlərini kişidən gizləyirdin, kişinin göndərdiyi puldan əlavə, hər ay sən də Şuşaya ona xəlvətcə

pul göndərirdin, o da Şuşanın həllə-huşlarına qoşulub gününü eyzən ümumxanalarda, klublarda keçirirdi...

Anam bu cür danladıqca, Fatma nənəm də müştüyü əlində tüstülənə-tüstülənə, vaxtilə igidləri yoldan eləyən ala gözlərilə key kimi tamaşa eləyirdi, üzündə heç bir ifadə hiss olunmurdu.

Atamgil nə qədər soraqlaşsalar da, dayımı "gördüm" deyən olmadı. Bayram babam atamgilə acıqlanırdı ki, axtarmasınlar dayımı.

Fatma nənəmsə bu əhvalatdan sonra hər gün namaz qılıb gecə-gündüz oğluna dua eləyirdi, şəhərdəki seyidlərə nəzir verirdi.

Atam böyük həvəslə öz ticarət işlərinə başlamışdı, Hadrutda yaşayan böyük keşiş köçüb getdiyi üçün onun xaricdən gətirilmiş qiymətli mebellərini, çoxlu gümüş-qızıl qablarını satın alıb, otaqların hamısını Avropa qaydasında döşətdirirdi. Bizim tərəflərdə olan qaçaqların, dəstələrlə gəzən dərəbəylərin hamısı Bayram babamı tanıdıqları üçün atama toxunmurdular. Ona görə də, atam öz tacir dostları olan Ədil bəylə, Nərimanla sərbəstcə Arazı keçib, İrandakı həmkarları ilə ticarət edirdi. Bizim yerdən ipək aparıb, oradan cürbəcür parça-filan gətirirdilər. Bizim şəhərdə yaşayan malakanlardan bəziləri ölkədəki qarmaqarışıqlığa görə köçüb gedirdilər. Atam onlardan birinin neçə otaqdan ibarət firuzə rəngli kürsülü evini də böyük bağı ilə birlikdə satın aldı... Tikinti və kənd təsərrüfatı mallarından ibarət mağazasını böyüdüb, yanına bir parça dükanı da əlavə edərək, Rüstəm adlı bir oğlanı satıcı təyin etdi.

Son günlərdə bizim böyük zalımıza gecələr şəhərin hörmətli adamlarından tez-tez qonaqlar gəlirdi. Bayram babam, mahal qazısı Mirzəli, qəssab Məşədi Qurban da onların arasında olurdu. Mən onların Bakıda qurulan təzə müsavat adlı hökumət barədəki söhbətlərini eşidirdim. Bayram babam izah edirdi ki, nə üçün bu təzə hökumət adını müsavat qoyub?

– Ona görə ki, – dedi, – bu hökumət istəyir bərabərlik olsun. Hökumətin seçilməsində, işində hamı bərabər hüquqda iştirak eləsin, özü də bu hökumət müstəqil olsun. Azərbaycan ayrı bir hökumətə tabe olmasın.

Həmin məclislərdə atamın dostu, məşhur dəyirman ustası Mahmud da iştirak edirdi. O, şübhə ilə dedi:

– Yəni, siz inanırsınız ki, divan-dərədə, məsələn, Cavad ağa ilə dəmirçi Musanın hörməti bir olsun?

– Niyə inanmaq olmaz? – deyə qəssab Məşədi Qurban ötkəm cavab verdi, – Cavad ağa göydən-zaddan düşməyib ki?

Usta Mahmud dedi:

– Düzdü, Məşədi Qurban, bizim nə varımız Cavad ağanınkından əskikdi, nə də camaat arasındakı hörmətimiz. Amma divan-dərədə yenə görəcəksən bəyləri keçirdilər yuxarı başa, rəiyyət də qaldı rəiyyətliyində...

Babam etiraz elədi:

– Bəlkə əvvəllər heylə oldu, çünki böyük dəyişiklikləri birdən eləmək çətindir. Amma vaxta ki, bu firqənin məramı bərabərlikdir, deməк gərəkdi əvvəl-axır belə olsun.

Qazı Mirzəli də qırmızı tubulklu ağacından qayrılmış müştüyünə dalbadal papiros qoyub deyirdi:

– Peyğəmbər özü də bərabərlik tərəfdarı idi. Həzrət Əlinin bir arıq dəvəsindən başqa heç nəyi yox idi.

Atam da əlavə elədi ki:

– Peyğəmbər ticarəti halal sənət hesab elədiyi üçün özü də ticarətlə məşğul olurdu.

Böyük sövdəgər Məşədi Qara da inamla təsdiq elədi ki:

– Bəyliyin bayatısı çağrılıb... Gələcək ticarətindir!

Bizdə olan məclislərdə əsl bəylər iştirak eləmirdilər. Lakin mən anamda onlara qarşı böyük bir maraq hiss edirdim. Anam şəhər pristavı İsmayıl bəyin arvadı Zəhra xanımla, Cavad ağanın qızı Bikə xanımla, hamamçı Məşədi Həbibin qızı Məhbub xanımla dost idi. Bunların hərəsi bir cür gözəl idi. Özləri də tez-tez bizə qonaq gəlirdilər. Anam da tez-tez onlara qonaq gedirdi və çox vaxt məni də özü ilə aparırdı. Bəylərin ev-eşikləri heç də bizimkindən artıq zinətli deyildi, qonaqlıqları da bizimkindən yaxşı olmurdu. Amma, bununla bərabər, bəylər və onların xanımları da, uşaqları da tacirlərə, adi peşə sahiblərinə qarşı özlərini çox yekəxana aparırdılar. Onların mənimlə yaşıd uşaqları bir-birinə "bəy" deyirdi. Buna görə də, mən onlarla oynamırdım. Məsələn, bizim alt evimizdə yaşayan kasıb Kəklik xalanın oğlu Kazımla və ya qonşumuz çörəkçi Ayı Temirin qardaşı oğlu Əyyubla oynamaq mənə daha çox xoş gəlirdi, nəinki Cavad ağanın oğlu Davudla oynamaq. Anam da bunun üstündə məni danlayıb deyirdi:

– Zor deyil ki, çəkir atası tərəfə. Nənəsi Xəlsənin ayaqları ömründə tufli üzü görməyib. Əmisi Qubadın da ayağından çarıq çıxmır.

Anam bilmirdi ki, bəy uşaqlarının yekəxana hərəkətləri mənim izzəti-nəfsimə toxunur.

Bir gün atam bazardan həyəcanla gəlib dedi:

– Təzə hökumət qurulub, adına da “müsavat hökuməti” deyirlər.

Anam soruşdu:

– Nə deməkdi müsavat hökuməti?

Atam dedi:

– Yəni, bu hökumətdə hamı bərabər hüquqda olacaq.

Anam soruşdu:

– Nə cür yəni bərabər hüquqda?

Atam gülümsədi:

– Daha bəyləri yuxarı başa keçirməyəcəklər. Rəiyyət necə, onlar da heylə.

Anam kəskin istehza ilə soruşdu:

– Deməli, cındırından cin ürkən keçəl Şirinlə İbrahim bəyə hökumətdə fərq qoyulmayacaq?

Atam eyni məmnun ifadə ilə dedi:

– Yox.

Mən həyəcanla soruşdum:

– Daha bəy uşaqlarına “bəy” deməyəcəklər?

Atam mənə qəribə bir maraqla baxıb dedi:

– Bəy desələr də, daha əvvəlki forsları olmayacaq.

Ancaq açıq hiss edirdim ki, “müsavat hökuməti”nin qurulması xəbərini, hamının bərabər hüquqda olacağı xəbərini anam şadlıqla qarşılamır, nəyə isə şübhə edir, ancaq bu narazılığının səbəbi heç özünə də məlum deyil.

Sonra Bayram babamı Gəncə qubernatorunun yanına çağırdılar. O vaxt bizim yerlər Gəncə mahalına daxil imiş.

Bayram babam bir neçə gündən sonra gəlib xəbər verdi ki, yeni hökumət onu bizim Qarabulaq qəzasının “N” nahiyəsinə pristav təyin etmişdir.

Qubernator babama deyib ki: “Biz, sizi daha böyük vəzifə üçün nəzərdə tutmuşuq. Güney Güzdəkdəki qanlılığın qabağını siz ala bilərsiniz. Araz qırağında hörmətiniz çoxdur. Ona görə də, hələlik gedin oranı düzəldin”.

Özü də Bayram babamın pristav təyin edildiyi nahiyə, mahalda ən böyük nahiyə hesab olunurdu. Başqa nahiyələrdə olan dələduz kəndlər də həmin nahiyəyə əlavə olunmuşdu. Babama ixtiyar verilmişdi ki, strajniklərini özü seçib qəbul eləsin.

Babam da Qızılbaşoğlu Alıdan başqa öz elatından bir neçə qoçaq oğlan seçib, özünə strajnik götürdü.

Sonra Fatma nənəmlə babam getdilər Güney Güzdəyə. Nahiyənin mərkəzi əslində Güney Güzdək deyildi, ancaq Bayram babam hələlik orda oturmağı qərara almışdı. Yəqin bunun da səbəbi o kənddə düşmənçiliyi yatırtmaq idi. Kişi gecə-gündüz onların içində olmaq istəyirdi.

Nikolay taxtdan yıxılandan sonrakı "hürriyyətlik"də köçüb gedən dövlətli malakan, sarısaqqal Vasilinin şəhərin mərkəzində olan böyük evini kənd mülkədarı Nəcəf bəy almışdı. Bu, uca, yoğun, enlikürək, qarabığlı bir kişi idi. Özünün də zoğal ağacından başı dəmir toppuzlu qırmızı bir çomağı var idi. Camaat arasında "Nəcəf bəyin çomağı" məşhur idi. Hətta, bu çomağın haqqında cürbəcür nağıllar da düzəltməyə başlamışdılar. Bakıda qoçu Nəcəfqulunun keçisi necə ərköyün idisə, Qarabulaqda da Nəcəf bəyin çomağı heylə ərköyün idi. Bəy şəhərə gəzməyə çıxanda çomağını hansı dükana qoysaydı, o dükanın sahibi toxunulmaz hesab olunurdu. Nəcəf bəy hökumətsizlik zamanı şəhərin bir neçə təzə ağasından biri idi. Bu ağalardan hər birinin dalında bütöv bir elatın dəliqanlı atlıları dayanırdı. Yəni, onlardan hər biri bir ağa idi. Müsavat hökuməti qurulandan sonra da bu cür ağalar qətiyyən ipə-sapa yatmırdılar. Deyəsən, müsavat hökuməti də heç bununla maraqlanmırdı. Atamgil danışırdılar ki, Nəcəf bəy malakandan aldığı evinin eyvanında var-gəl edərək, acıqlı-acıqlı deyirmiş: "Ə, bu nə Azərbaycandı? Sən öləsən ona bir çomaq vuraram, darmadağın olar".

Belə görünür ki, qırmızıçomaq Nəcəf bəy "Azərbaycanın", "Azərbaycan hökuməti"nin nə demək olduğunu heç bilmirmiş. Əlahəzrət çar hökumətinin siyasəti nəticəsində, demək olar ki, "Azərbaycan" sözü heç işlənmirmiş. Əlahəzrət çar üsuli-idarəsi tərəfindən edilmiş inzibati bölgü əsasında Azərbaycan ölkəsi mahallarının adı ilə adlanırmış. "Gəncə quberniyası", "Qazax", "Şəmkir quberniyası"... Ona görə də, Nəcəf bəy kimi bisavad, qırmızıçomaq sahiblər öz vətənlərinin adını belə, unutmuşdular.

Atamgilin söhbətlərindən onu da hiss edirdim ki, bu yeni hökumət atamda və onun məclisində iştirak eləyənlərdə, nəsə, yeni bir əhvali-ruhiyyə doğurmuşdur. Birinci dəfə olaraq mən onların söhbətlərindən tez-tez "milli azadlıq", "milli Azərbaycan hökuməti" kimi ifadələr eşidirdim. Mən birinci dəfə olaraq atamın dilindən "vətən" sözü eşidirdim. Mənə elə gəlirdi ki, bu söz indiyə qədər haradasa unudulub

qalmışdı və yalnız indi çıxırdı meydana, mənim anam indi, yalnız indi bu sözün mənasını başa düşürdü. Mən sonralar, ağlım bir şey kəsən vaxtlarda təkrar-təkrar bu xatirələrə qayıdırdım, başa düşürdüm ki, xarici istilaların hakimiyyəti: ölkənin ayrı-ayrı xanlıqlara parçalanması, xüsusən Arazın o tayında İran şahlarının, bu tayında isə, çarizmin qəddar siyasəti nəticəsində mənim həmvətənlərim, hətta, öz vətənlərinin adını, hansı millətə mənsub olduqlarını belə, unutmuşlar. Təsadüfi deyildi ki, o zaman hər hansı bir kəndlidən soruşsaydılar: hansı millətdənsən? Cavab verərdi ki: “müsəlmanam”.

Müsavat hökuməti qurulandan sonra uşaqlardan dəstələr düzəldib, onlara milli mahnılar öyrədirdilər. Mən böyük bir maraqla həmin dəstələrdə iştirak edirdim. Yaşca bizdən böyük oğlanlardan bizə başçılar təyin edirdilər və biz onların köməyi ilə əsgər kimi sıraya düzülüb, addımlaya-addımlaya mahnı oxumağı öyrənirdik. Lakin mən uşaq da olsam, görürdüm ki, bizim dəstələrdə bəy uşaqları daha hörmətli, daha əziz tutulur. Mənim kimilər isə, atamız nə qədər varlı olsa da, yenə rəiyyət hesab olunurdu. Bu da mənim izzəti-nəfsimə toxunurdu. Mən bəy uşaqlarının lovğalıqlarını hiss edirdim və ürəyimdə onlara kin bəsləyirdim. Demək, müsavat hökumətində də onlar əziz-xələf idilər.

## BAYRAM BABAMA GÜLLƏ ATILMASI VƏ QOCA QAÇAQ

Atamın ticarət işləri də gündən-günə tərəqqi etməkdəydi. O, mal gətirmək və ya mal aparmaq üçün tez-tez Bakıya gedib-gəlirdi.

Həmin bu dövrdə anamın malyariyası yenə də başlamışdı. Hər gün bərk titrədib-qızdırırdı. Vurulan iynələrin yerləri də çirk eləmişdi. Həmin yaralar sağalandan sonra doktor Quliyev məsləhət gördü ki, anam bir-iki ay kəndə gedib havasını dəyişsin. Bizim kənd də havası, suyu yaxşı olan, yaylaqsayaq bir yer idi.

Ona görə də, anam, mən, bacım Mahtab, bir də qulluqçumuz Zinyət faytona əyləşib getdik Güney Güzdəyə.

Bayram babamgil yenə də bizim kənddəki evdə qalırdılar. Babamın idarəsi isə, Nikolay vaxtında tikilmiş, üstü qırmızı dəmirli “dəftərxana”da (camaat binanı belə adlandırırdı) yerləşmişdi.

Əlbəttə, mən yenə hiss edirdim ki, Vəli uşağından olan əmim arvadı bizim gəlişimizdən və babamgilin də onların binasında olmasından heç də xoşhal deyil. Ancaq şübhəsiz ki, o, bunu üzə vurmağa cəsarət

eləmirdi. Anam da həmişə qulluqçumuz Ziniyətə bərk-bərk tapşırırdı ki, sərvaxt olsun, əmim arvadı suyun, bişmişin içinə zəhər atar.

Babam işə çox kəskin başlamışdı, bütün ağsaqqalların dilindən kağız almışdı ki, hər kəs öz tayfasına cavabdeh olsun, lakin ədavət, kin o qədər şiddətli idi ki, adamların orada-burada gizlənib, bir-birilərini vurub-doğramalarının qabağını almaq mümkün olmurdu. Babamın adsanına baxmayaraq, strajnikləri əsaslı bir iş görə bilmirdilər.

Sonra bir gecə qəribə hadisə oldu. Bayram babam kəndin sayılan, saytal adamlarından hesab olunan yüz əlli-yüz altmış kilo, bəlkə də, bundan artıq, ağırlığı olan Hacıoğlu Alməmmədlə qonaq otağında, stol ətrafında əyləşib söhbət edirdi. Ortada otuzluq neft çırağı yanırdı, mən də xalının üstündə oturub onların söhbətinə qulaq asa-asa oynayırdım. Birdən yaxında güllə səsi gurladı və eyni anda da çırağın şüşəsi çiliklənib yerə töküldü, babam cəld qalxıb açıq qapının qabağından geri çəkildi, Fatma nənəm, anam o biri otaqdan hövlnak gəldilər.

Bayram babam sakit səslə dedi:

– Yaxşı, səs-küy salmayın, çırağı yandırın.

Anam stolu daldaya çəkərək təzə şüşə gətirib çırağı yandırandan sonra Hacıoğlu Alməmməd babama dedi:

– Çıraq düz sənin qabağında idi, demək, açıq qapıdan düz səni nişan alıb atıblar.

Babam papiros yandıraraq kişinin sözünü təsdiq elədi:

– Elədir.

Alməmməd dedi:

– Vəli uşağının işidir.

Fatma nənəm qəzəblə əlavə etdi:

– O gödək ilanın hiyləsidi!

Mən bilirdim ki, Fatma nənəm “gödək ilan” dedikdə, mamamın əri Əbdüləzizi nəzərdə tutur.

Bayram babam dinmədi.

Alməmməd, babama dedi:

– Arvadın sözünü qəribliyə salma.

Bu zaman iribığlı uryadniklə strajniklər tələsik gəldilər.

Uryadnik əlini gözünün üstünə qoyub dedi:

– Cənab pristav, kəndin arasını gəzib nəzarət edirdik. Güllə səsi eşidib yüyürdük.

Hacıoğlu Alməmməd uryadnikdən soruşdu:

– Damın üstündən düşüb qaçan adam görmədiniz ki?

Uryadnik cavab verdi:

– Ora baxmaq ağlımıza gəlməyib.

Atamgilin həmin böyük daş evlərindən savayı həyətdə çox qədimdən qalmış və indi də içində barama becərilən bir damları var idi, belə damların üstü gümbəz kimi yumru olurdu.

Alməmməd dedi:

– Gülləni damın üstündən atıblar. Damın üstündən baxanda açıq qapıdan otağın içi aydın görünür.

...Bu əhvalatdan iki gün sonra Qaçaq Xanmurad bütün dəstəsilə Bayram babamgilə qonaq gəldi. Qoyun kəsildi. Böyük artırmaya salınmış xalının üstündə oturub yeyib-içdilər.

Sonra anam, Qaçaq Xanmuraddan soruşdu:

– Niyə daha üzə çıxmırsan?

Qaçaq Xanmurad da gülümsəyib zarafatyana dedi:

– Ay Yaqut bacı, qartal dağda-daşda hərlənməyə adət eləyib. Onu gətirib əhliləşdirmək uzun işdir.

Əgər, bir ayrı adam özünü, mənim ən çox sevdiyim igid qartala bənzətsəydi, bu, mənə lovğalıq kimi görünərdi, amma Qaçaq Xanmuradın belə deməsi, elə bil ki, mənim xəyalımı çəkib qartallar oylağı olan yuxarı Qızılboğaz, Salvartı dağlarına apardı və sanki Qaçaq Xanmurad da həmin alapaça ürgənin üstündə o dağlara qalxıb çən-duman içində yox oldu.

Vəli uşağından olan adamlar uzaqda dayanıb, Əfəndi uşağı ilə qohum olan pristavla qaçaqların bu yaxınlığına kinli-kinli tamaşa eləyirdilər.

...Qaçaq Xanmuradın dəstəsi getməmişdi ki, Qaçaq Məşədi Təhməzin dəstəsi gəldi. Bu, uzunsaqqallı, ortaboylu bir qoca idi. Saqqalı, bığı, yəqin ki, xınadan qırmızı idi. Başı azca əsirdi, dioqonal çuxasının altından iki patrondaş bağlamışdı. Amma tüfəngini atlılarından biri götürmüşdü. Ayaqlarında qısaboğazlı çəkmə, başında iri tüklü papaq vardı. O gələn kimi Qaçaq Xanmurad və yoldaşları ayağa durdular, yalnız kişi keçib döşəkcənin üstündə əyləşəndən sonra oturdular. Bayram babam evdə olmadığı üçün Fatma nənəm gəlib ehtiramla dedi:

– Xoş gəlmisən, Məşədi Təhməz.
Kişi də təmkinlə cavab verdi:
– Xoş günün olsun, Fatma xanım.

Sonra Bayram babam gəldi. O içəri girəndə Məşədi Təhməz ayağa durmaq istədi, babam cəld irəliləyib, çiyinlərindən yapışaraq onu qalxmağa qoymayıb, hörmətlə dedi:

– Məşədi Təhməz, xoş gəlmisən.

Qoca qaçaq başını xəfifcə tərpədib dinmədi. Bayram babam həmişə stulda oturardı. Amma bu dəfə yəqin ki, qoca qaçağa hörmət əlaməti olaraq onun yanında, döşəkcənin üstündə əyləşdi. Qaçaq Məşədi Təhməzin haqqında çox eşitmişdim. Kürdobalılar onu "xoşbəxt qaçaq" adlandırırdılar, çünki əlli ilə yaxın idi ki, qaçaqlıq edirdi, nağıllara çevrilən atışmalarda, vuruşmalarda olmuşdu, neçə dəfə güllə dəymişdi, amma hamısından da sağ-salamat qurtarmışdı. İki oğlu da özü ilə qaçaqlıq edirdi.

Babam qonaq yanında dayanmağıma acıqlanmadığı üçün pəncərəyə söykənib qoca qaçağa tamaşa edirdim. Onun bu yaşda necə at çapdığına, başı əsə-əsə necə güllə atdığına təəccüb edirdim. Onun igidlikləri haqqında eşitdiklərim indi məni heyrətə salırdı. Elə bil ki, belində qoşa patrondaş olan uzunsaqqallı, başı əsən bu qoca təəccüblü bir əfsanədən çıxıb zahir olmuşdu. Mən, cavan Qaçaq Xanmuradın da, hökumət adamı olan babamın da ona necə ehtiram etdiklərini görürdüm. O, qabağındakı çaydan elə qaynar-qaynar götürüb bir qurtum alaraq:

– Bayram, – dedi (mən birinci dəfə olaraq babama "Bayram bəy" deyil, "Bayram" deyə müraciət edildiyini eşidirdim) -, sən bizi üzə çıxmağa çağırırsan, yəni, bu təzə hökumətdən əqlin bir şey kəsir?

– Nə barədə, Məşədi? – deyə babam soruşdu.

Qoca qaçaq dedi:

– Yəni, bu axıracan duruş gətirib dayana biləcək?

Bayram babam bir qədər fikirləşib dedi:

– Əgər, xaric kömək eləsə, duruş gətirər.

Qoca qaçaq çayını arxayın içib, stəkanı nəlbəkiyə qoyaraq soruşdu:

– Axı, bu təzə hökumətin məramı nədi?

Babam bu sualı gözləyirmiş kimi dərhal cavab verdi:

– Bərabərlik!

– Nə cür bərabərlik?

– Yəni dövlətlinin də, kasıbın da, bəyin də, rəiyyətin də hüququ bərabər olacaq.

Qaçaq Xanmurad qızğın şəkildə dedi:

– Ay dayı (o, babama "dayı" deyirdi), yenə də bəy bəydi, rəiyyət də rəiyyət.

Qaçaq Xanmuradın bu sözləri məndə qəribə bir ruh düşgünlüyü yaradırdı. Doğrudanmı, bəy uşaqları yenə də əvvəlki iddialarında olacaqlar?

Sonralar mən o günləri xatırlayanda başa düşdüm ki, Qaçaq Xanmurad haqlı imiş. Məsələ onda idi ki, müsavat hökumətinin bərabərlik ideyası əslində mücərrəd bir şey imiş və onun real fəaliyyətində bu "bərabərlik" hiss olunmurmuş. Onlar zəhmətkeş xalqın gözüaçıq, qabaqcıl adamlarını dövlət işlərinə nəinki cəlb etməmiş, hətta, bu barədə heç düşünməmişlər. Müsavat partiyasının üzvü olan mülkədarların heç biri öz mülkündən əl çəkməmişdi. Əksinə, Qaçaq Xanmurad deyən kimi, bəylər yenə də öz bəyliklərində qalıb, adi camaata yuxarıdan aşağı baxırdılar. "Müsavat", "bərabərlik" sözləri kağız üzərində qalmışdı.

Qoca qaçaq soruşdu:

– Yaxşı, onda, bununla Rusiyada qurulan təzə hökumətin nə fərqi var? Deyir, onların da məramı bərabərlikdir.

Bayram babam dedi:

– Rusiyada qurulan bolşevik hökumətinin məramnaməsi bəylərin, dövlətlilərin qəti ziddinədir.

Qoca qaçaq qəribə bir gümrahlıqla soruşdu:

– Bəs, onda bu necə bərabərlik oldu?

Babam dedi:

– Onlar bərabərliyi ancaq yoxsul kəndlilərlə fəhlələrin birliyində görürlər.

Qoca qaçaq soruşdu:

– Bəs, dövlətlilər, tacirlər, bəylər nə olsun?

Babam dedi:

– O quruluşda dövlətli, bəy, ağa olmamalıdır.

Qaçaq Xanmurad babama dedi:

– Dayı, canınçün o elə əsl mənim kimilərinin hökumətidir. Bizi düzlərə salan bəylər, ağalar olmayıb?!

Məşədi Təhməz dinmədi. Babam dedi:

– Məsləhətdir ki, siz daha qaçaqlığı yerə qoyasınız.

Uzun bir sükut keçdi. Nəhayət, Məşədi Təhməz soruşdu:

– Yaxşı, bəs, Arazın o tayındakıların işi necə olacaq?

Babam dedi:

– Hələlik, o barədə bir söz demək olmaz, Məşədi! Ancaq, əgər, biz bu yeni hökumətimizi möhkəmləndirib saxlaya bilsək, bəlkə gələcəkdə elə bir vəziyyət yarandı ki, birləşə bildik.

Mən, Fatma nənəmdən eşitmişdim ki, Qaçaq Məşədi Təhməzin arvadı otaylı qızıdır, yəni, Cənubi Azərbaycandandır. Ümumiyyətlə, Araz boyunda yaşayan Şimali azərbaycanlıların çoxu o taydakı azərbaycanlılarla qohum-qardaş idi.

Yenə də araya uzun sürən sükut çökdü. Qoca qaçaq təmkinlə dedi:

– Bayram, sən daş qoyan yerə biz baş qoyarıq. Ancaq izin ver, bir az gözləyək. Sular durulsun, görək dünya nə cür olur...

Bu sözləri deyəndə, mən, qoca qaçağın gözlərində bir parıltı gördüm. Babam daha bir söz demədi.

Yeyib-içəndən sonra Qaçaq Xanmurad ilə yoldaşları artırmanın baş tərəfinə gələrək gözəl Aynanın vurulduğu yerdə nişana qoydurub atmağa başladılar. Mən böyük bir təəccüblə gördüm ki, Qaçaq Xanmuradın atlıları arasında ondan da sərrast atanlar var və Qaçaq Xanmurad bundan heç də pərt olmur. Mən elə güman edirdim ki, dünyada Qaçaq Xanmuraddan yaxşı güllə atan olmaz.

Bayram babamla Qaçaq Məşədi Təhməz evdən çıxıb gəldilər. Qoca qaçaq nişanaya baxıb, öz adamlarından birinə dedi:

– Mənim tüfəngimi gətir.

Mən lap irəli yeriyərək gözümü dikmişdim onun üzünə. O, ayaq üstündə tüfəngi üzünə götürüb, başı və əlləri əsə-əsə atdı. Birinci nişana göyə sovruldu. Tüfəngin gilizlərini çıxarıb, yenə də atdı. İkinci nişana da göyə qalxdı. Sonra tüfəngi yanında dayanmış cavan qaçağa vermək istəyəndə, Qaçaq Xanmurad zarafatyana dedi:

– Ərənlər üçəcən deyib, əmi!

Qoca qaçaq tüfəngi təkrar üzünə götürüb atdı və üçüncü nişananı vurandan sonra Qaçaq Xanmurada tərəf dönüb dedi:

– Təhməzin başı əssə də, gözləri hələ işıqlıdır.

Qaçaq Xanmurad dedi:

– Əmi, Allah sənə bundan sonra da yüz il ömür versin, yüzündə də belə atasan!

Kişi gözlərini göyə tikərək, salavat çevirirmiş kimi, əlini üzünə çəkib, qəribə bir inamla səsləndi:

– Amin!

Sonra Qaçaq Xanmurad aşağıda qaçaqların toplaşıb nişana atmasına tamaşa eləyən adamlar eşitsin deyə bərkdən dedi:

– Əşi, Bayram dayı, deyirlər Güney güzdəklilər gecə qaranlıqda gizlənib sənə güllə atıblar. İzin ver, biz də aşkarda onlarla haqq-hesab çəkək.

Bayram babam da bərkdən dedi:

– Elə şey olmaz, güllə atan bir qələtdi eləyib.

Qaçaq Xanmurad dedi:

– Dayı, vallah, bir də heylə şey eşitsək, heç sənin xəbərin olmadan gəlib güllə atan tayfanın "məmə" deyəndən "pəpə" yeyənə – hamısını güllədən keçirəcəyik!

Atamgil əbəs yerə mənə "əllamə" demirdilər, mən çox balaca olsam da, hiss edirdim ki, müsavat hökumətinin pristavı olan Bayram babam öz strajniklərindən, öz hökumətindən daha çox qaçaq dostlarının gücünə arxalanır. Öz yaxın adamları olan Əhmədalıya, Hacıya, Qızılbaşoğlu Alıya arxalanır, onlara ürək qızdırır. Babama güllə atılandan sonra onlar gecə səhərə qədər növbə ilə keşik çəkdilər. Sonra Bayram babam bundan xəbər tutub qadağan elədi.

Sonra qaçaqlar atlanıb getdilər. Onların babama güllə atılandan sonra bu cür dəstə ilə gəlib-getmələri, görünür, yeni hökumətin bir nümayəndəsi olan babamın mövqeyini bütün rayonda möhkəmləndirdi, babam əmr verdi ki, kənddə gecə bütün evlərdə çıraqlar yansın. Onu da bildirdi ki, bütün evlər nəzarət altında olacaq. Qaranlıq düşəndə Güney Güzdəyin bütün evlərində dalbadal çıraqlar yandı. Lakin Bayram babamın strajnikləri xəbər gətirdilər ki, dörd evdə çıraq yandırmaqdan boyun qaçırırlar. Babam da əmr etdi ki, əgər, çıraq yandırmasalar, ev sahiblərini gətirib dama salsınlar. Bundan sonra onların da çırağı yandı.

...Bunların hamısı mənim üçün anlaşılmaz əhvalatlar idi. Mən işığı sevirdim. Parlaq günəş işığı məndə sevinc doğururdu. On beş günlük qaranlıqdan sonra təzə çıxan oraq şəkilli Ay da məndə sevinc doğururdu. Dağları, çölləri süd kimi aydınlıq eləyən on beş günlük Ay mənə xoş mürgü gətirirdi. Şəhərdəki evimizin zalında yanan böyük qaz çırağı məni fərəhləndirirdi. Amma indi Güney güzdəklilər çıraq yandırmağa cürət etmirdilər. Çünki hərə öz düşməninin bu işıqdan istifadə edərək qaranlıqda güllə atıb onu öldürəcəyindən qorxurdu. İndi babamgilin yandırdığı otuzluq lampanın işığı məni də qorxudurdu, çünki mən babamı çox istəyirdim...

Mən ürəyimin dərinliklərində Qaçaq Xanmurad kimi bir qəhrəman olmağı arzulayırdım. Gecələr yerimə girəndən sonra da bu barədə uzun xəyallara dalırdım. Özümü, neçə atlı-tüfəngli adamı təkbaşına qoyun sürüsünün içindən çıxmağa məcbur eləyən Qaçaq Xanmurad kimi bir igid təsəvvür edirdim. Lakin, Qaçaq Xanmuradın bu dəfə anama danışdığı bir əhvalat mənim bu şirin xəyallarımı alt-üst elədi. Qaçaq Xanmurad o tayda (yəni, Arazın o tayında) bir düşmənindən necə qisas aldığını nağıl edirdi. O, nəşə ilə danışırdı ki, çiskinli, qaranlıq bir gecədə öz dəstəsilə qəfildən həmin düşməninin alaçığını mühasirəyə alaraq, uşaqdan böyüyə hamını necə güllələbaran eləyib qırıblar...

Anam həssas qadın idi. Kiçik bir sarsıntı onun bənizini dərhal soldururdu. İndi bu əhvalatı eşidəndə də rəngi ağardı və o, həyəcanla soruşdu:

– Yazıq arvad-uşağın nə təqsiri vardı?

Qaçaq Xanmurad eyni nəşə ilə dedi:

– Düşmən düşməndi, kimdi arvad-uşağa baxan?!

Amma bu söhbətdən qabaq mən xəyala dalırdım ki, əgər, Qaçaq Xanmurad kimi bir igid olsam, yeddi gün, yeddi gecə at sürərək gedib ağ divi necə öldürərəm və onun oğurlayıb apardığı gözəl qızı necə xilas edib, anasının yanına qaytararam və anası da sevincindən ağlayaraq mənə "sağ ol" deyər...

Qaçaq Xanmuradın o dəhşətli əhvalatı və o əhvalatı danışarkən gözəl, solğun üzündə duyduğum nəşə, məndə anlaşılmaz qüssə doğurdu, birdən-birə mən özümü, nə isə, qiymətli bir şey itirmiş kimi hiss elədim. Nurani saqqallı, başı əsən və əlli ildən artıq qaçaqçılıq eləmiş Qaçaq Məşədi Təhməzin nişana atdığı zaman balaca gözlərində gördüyüm parıltı məndə indi qəribə bir vahimə doğurdu. Mənə elə gəldi ki, qəfil öz ovunun üzərinə tullanıb, onu bir anda parçalayan pələngin də gözlərində yəqin belə vəhşi parıltı olur. Mən tərəkəmə qohumlarımdan eşitmişdim ki, yırtıcı heyvanlardan ən xaini canavardır. Ancaq nə üçünsə, qoca qaçağın gözündəki parıltı mənə canavarı deyil, məhz pələngi xatırladırdı. Artıq Qaçaq Xanmurad mənim xilaskar qəhrəmanım ola bilmirdi. Yəni, mən, daha onu o cür təsəvvür eləyə bilmirdim və buna görə də məyus olurdum. Mən belə anlarda özümü yalqız və köməksiz hiss edirdim. Sonralar Qaçaq Xanmuradın babamgilə gəlişi,

yoldaşları ilə eyvandan nişana atmaları daha məni əvvəlki kimi fərəhləndirmirdi.

Qırx adamı bir-birinə qırdıran gödək Nisə isə hər dəfə qabağıma çıxanda mən Fatma nənəmin nağıllarında eşitdiyim ana divi xatırlayırdım. Bu arvadın ana div kimi sarı balta dişləri, buynuzu yox idi. Bu arvad ana div kimi nəhəng deyildi və onun kimi dəhşətli dərəcədə eybəcər görünmürdü. Bu arvad insan idi, özü də mənim hər gün gördüyüm Xəlsə nənəm kimi, başqa qarılar kimi insan idi. Demək, bu ana div insan cildinə girmişdi. İnsan cildinə girdiyi üçün də bütün evlərə asanlıqla yol tapıb, uşaqları anasız, anaları uşaqsız qoya bilərdi. Kim bilir, bəlkə əmim oğlu Bəhlulun anasına cadu eləyib sill azarına salan elə həmin bu Nisə qarı imiş... Axı, deyirlər, gödək Nisə Vəli uşağından olan Əbdüləzizin böyük bacısıdır. Beli əyri, boynu qısa, başı çiyinlərinin arasına girmiş və deyilənə görə, son dərəcə hiyləgər bir adam olan Əbdüləzizin özü də, məgər, insan cildinə girmiş div deyilmi?!

Analığı əmim oğlu Bəhlula gün vermirdi. Hey döyüb ağladırdı, Bəhlul daim ac olurdu. Mən evimizdən yağlı çörək, kişmiş aparıb verirdim ona və onun, içində adam yaşamayan damlarının dəhlizində bu şeyləri necə acgözlüklə yediyinə tamaşa edirdim. Yağlı çörəkdən mənim zəhləm gedirdi. Çox konfet yediyim üçün şirin şey də ürəyimi vururdu. Mən fikirləşirdim ki, əgər, anam ölərsə, mənim də atam ayrı bir arvad alar və o da məni Bəhlulun gününə salar. Qubad əmi hər axşam tarladan, ya Qayaburnu bağlarından qayıdaraq çarığını çıxarıb, dəstəmaz alaraq iri ayaqlarını yuyub namaz qılardı. Sonra da yerdə, palazın üstünə salınmış köhnə döşəkcənin üstündə bardaşqurma əyləşərək, arvadının dinməz gətirib qoyduğu qatıq-çörəyi və ya şomu dovğasını şirin-şirin yeyərdi. Bir dəfə də olsun, oğlu Bəhlulun əhvalını soruşmazdı, ac və ya tox olub-olmadığı ilə maraqlanmazdı. Elə bil ki, o Bəhlulun yeyib-içmiş olduğuna, tox olduğuna əmin idi. Demək, əgər, anam olmasaydı, mənim də atam bu cür edərdi.

Bu nəticələr anamın üstündə mənim yarpaq kimi əsməyimə səbəb olurdu. Anamın başı ağrıyanda və ya qızdırması gələndə mən özümü olduqca bədbəxt hiss edirdim. Hətta, xəlvətə çəkilib ağlayırdım da.

Beləliklə, ögey ana dünyada mənə ən qəddlar məxluq kimi görünürdü.

Mənim qapalı aləmimdə bir tutqunluq hökm sürməkdəydi. Əlbəttə, bu tutqun aləm barəsində mən heç kəsə bir söz demirdim, yəni, demək heç ağlıma da gəlmirdi, çünki bu tutqunluğu yalnız mən hiss

edirdim, mahiyyətini, səbəblərini aydın dərk eləmirdim, elə bil ki, xaricdən aldığım təsirlər bu tutqunluğu getdikcə tündləşdirirdi.

Fatma nənəm dərdini heç kəsə söyləməsə də, öz-özünə olan danışıqlarından görürdüm ki, bütün fikri-zikri, kim bilir, indi haralarda olan Nuru dayımın yanındadır və öz-özü ilə olan danışığında o, daim Bayram babamı günahlandırırdı. Evdə tək olduğum zaman nənəm (nənəm məni uşaq hesab elədiyi üçün yanımda öz-özünə danışmaqdan çəkinmirdi.) taxtın üstündə əyləşərək gözlərini qarşısında bir nöqtəyə zilləyib müştükdə papiros çəkə-çəkə hey deyirdi: “Cavanın beyni qan olar... Gərək başına ağıl qoyasan. Kişi yaylaqda qardaşının günahını tökdü yazıq uşağın üstünə, ta demədi ki, tək oğlumdu...”

Fatma nənəm bu cür sözləri bəlkə gündə yüz dəfə yana-yana təkrar edirdi, hər dəfə namaz qılanda oğluna dua edirdi və nənəmin oğlu sarıdan olan bu ümidsiz dərdi məndə qüssə doğururdu. Gözəl Aynanın vurulub yaşıl otlar üstünə sərilməsi, sonra onu palazın arasına qoyub aparmaları gözlərim önündən çəkilmirdi. Yaylaqdakı Qaraca ilə buradakı əmim oğlu Bəhlul mənim xəyal aləmimin daimi iştirakçıları idilər. Biri gözümün qabağında canlanan kimi, o biri də böyürdən çıxırdı.

Bayram babam da bütün günü öz işində olurdu, başqa kəndlərə gedirdi. Mənə elə gəlirdi ki, Bayram babam dünyanın ən mərhəmətli adamıdır. Ancaq bir gün dəhşətli bir əhvalat oldu. Yasavullar ortaboylu, cantaraq bir kişi tutub gətirmişdilər. Bayram babam həyətdə onu üzü üstə yerə yıxdırdı. İki yasavul bir tərəfində, ikisi də o biri tərəfində duraraq pencəyini, köynəyini yuxarı sivirib, çılpaq belinə şallaqla döyməyə başladılar. Adamlar tamaşa edir, yasavullar şallaqlayırdılar. Kişinin beli qıpqırmızı qızarmışdı. Nəhayət, o, davam gətirməyərək qışqırdı. Yalnız bu zaman babam yasavullara əmr etdi ki:

– Dayanın!

Yasavullar onu qaldırıb yenə də qollarını arxadan bağladılar. Sonra babam oraya yığılan adamlara xitabla dedi:

– Bu adam Hacı Fərzəlinin bir erkəyini oğurlayıb kəsib. Kim oğurluq eləsə, bunun kökünə düşəcək!

Birdən qolları arxasında bağlı olan həmin döyülən kişi həyəcanla:

– A bəy, – dedi, – erkəyi kefimdən oğurlamamışam. Beş körpə uşağım, budur, iki aydır ki, pencərlə dolanır. Hacı Fərzəlinin dörd-beş min qoyunu var.

– Bəs, səninki niyə yoxdu? – deyə babam acıqlandı. – Niyə uşaqlarının haqqında vaxtında fikirləşməmisən? Hacı Fərzəli o dövləti başqalarına çoban olmaqla qazanıb, amma sən günortayacan yatıb, gözünü dikmisən onun-bunun varına, Allahın yolundan çıxıb, oğurluğa qurşanmısan.

Həqiqətin nədə olduğunu aydınlaşdıra bilməsəm də, babamın bu adamı döydürməsi mənə pis təsir elədi. Mən fikirləşdim ki: "əgər, bu kəndlinin beş balaca uşağı acdırsa, dövlətli Hacının bir qoyununu kəsəndə dünya dağılmaz ki?.. Kişinin görkəmi məni inandırdı ki, onun körpə uşaqları acdırlar! O körpə uşaqlar müxtəlif şəkillərdə gözlərim qarşısında canlanırdılar. Mən onların qapıdan içəri girən atalarına dikilmiş ac baxışlarını, arıq, solğun bənizlərini görürdüm və bu məni o qədər mütəəssir edirdi ki, babamın onların atasına elədiyi töhmət haqqında düşünə bilmirdim, mən ancaq gözləri qapıdan içəri girən atalarının əlinə dikilmiş balaca uşaqların ac üzlərini görürdüm və o günü mən anamın, Fatma nənəmin təkidinə baxmayaraq, səhərdən axşamacan heç nə yemədim. Mən aclığın necə murdar, xoşagəlməz şey olduğunu gördüm. Mən o gecə, həmişə olduğu kimi, yatmazdan əvvəl Bayram babamın yanında uzanıb onun məni güldürmək üçün elədiyi məzəli söhbətlərə, nağıllara qulaq asmadım, daha doğrusu, qulaq asa bilmədim. Mən indi də səbəbini özümə izah eləyə bilmirəm ki, nə üçün o günü özümü o qədər bədbin, o qədər kədərli hiss edirdim? Özü də sanki mənim kədərim qara bir bulud kimi bütün dünyanın üzərinə çöküb hər şeyi pərişan eləmişdi. Güney Güzdəyi bürüyən aclığın dəhşətini mən indi hiss edirdim. Gecə acların fəryadını eşidərək uzun zaman yuxuya gedə bilmirdim. Onlar bizim olduğumuz evin ətrafına toplaşaraq: "Ay bəy uu..." deyə tükürpədən bir səslə qışqırırdılar. Onlar çörək istəyirdilər.

Mən Bayram babamgillə bir otaqda yatdığım üçün kişinin qaranlıqda, yerinin içində dalbadal çəkdiyi papirosların közərtisini görürdüm.

Sonra yasavulların müşayiəti ilə babamgilin qapısına bir neçə araba un gətirdilər. Anamgil deyirdilər ki, "bu unu Hacı Zeynalabdin Tağıyev göndərib".

Sonra aclar tökülüb gəldilər və babamın əmri ilə həmin unu paylamağa başladılar. Əvvəl adamlar elə basabas, elə qışqırıq salırdılar ki, az qalırdı hücum eləyib un yığılan anbarı dağıtsınlar. O zaman Bayram babam eyvana çıxıb bərkdən dedi:

– Camaat, əgər, belə eləsəniz, anbarın ağzını möhürlətdirəcəyəm! Strajniklərə də əmr verəcəyəm ki, yaxına gələnləri güllə ilə vursunlar!

Bütün səs-küy bir anda kəcildi. Acından quyunun dibinə düşmüş gözlər dəhşətlə kişiyə zilləndi. Daha heç kəs cınqırını çıxarmağa cəsarət eləmədi.

## YENƏ ŞƏHƏRDƏ

Bir neçə gündən sonra babam anamgilə xəbər verdi ki, onu "A" qəzasına rəis təyin eləyiblər. Ona görə də köçüb getdik şəhərə, evimizə...

Sonra Bayram babam kürkünün üstündən iki patrondaş çəkdi, gödək beşatılanını doldurdu, ağac qoburlu onatılanını belinə bağlayaraq məşhur kəhər atına minib, Qızılbaşoğlu Alının müşayiətilə "A" qəzasına yollandı. Fatma nənəm babamın ardınca su atdı. Babamı yola salmağa atamla anam da gəlmişdilər. Novruz bayramından keçməsinə baxmayaraq, çöllər hələ ki, qar idi. Anam babamın ardınca baxaraq dedi:

– Kişiyə soyuq olacaq.

Atam dedi:

– Soyuq olmaz. Kəhər at onu isti aparacaq, ancaq Allah eləsin ki, qaçaq-quldura rast gəlməsin.

Anam qayğısız cavab verdi:

– Dədəmlə Qızılbaşoğlu yüz adamın qabağıdırlar. Qaçaq-quldur nə qələt eləyə bilər?

Atamla ulduzu barışmayan Fatma nənəm də üzünü başqa səmtə çevirərək kinli-kinli dedi:

– Bəyəm, qaçaq-quldur Bayramı tanımır?!

Mən heç vaxt Bayram babamla Fatma nənəmin qabaq-qabağa oturub danışdıqlarını görməmişdim. Mənə elə gəlirdi ki, bu, elə belə də olmalıdır. Ona görə də, Fatma nənəmin indi babamın ardınca su atmağı mənə qəribə görünürdü.

...Bir azdan havalar qızdı, qar əridi. Çöllərdə yüz cürə çiçəklə dolu göy ot dizə çıxdı. Bizim şəhərin şimal tərəfindən axan Quruçay daşıb göylə getdi. Atam həmişə mənimlə sərt rəftar elədiyi üçün mən yenə də Fatma nənəmin yanında qalırdım. Mən özümü tamam sərbəst hiss elədiyim üçün nadincliyimlə Fatma nənəmi tez-tez cinləndirirdim. O, mənə qışqıraraq:

– Ay irtməkli köpəkoğlu, çıx get dədənin evinə dayna! – deyib əlinə keçəni mənə tolamaz atırdı. Mən də qəhqəhə ilə gülüb kənara qaçırdım. Ancaq yarım saatdan sonra arvadın hirsi sovuşurdu və mən onun dizinin dibini kəsdirərək yalvarırdım ki, nağıl desin. O da yüz dəfə dediyi nağıllardan birini yenə də danışmağa başlayırdı.

Nağıllar həmişə məni öz aləminə çəkib aparırdı. Mən gecələr Quruçayın qıjıltısına qulaq asaraq Məlikməmməd, Əmir Arslan, Koroğlu haqqında düşünürdüm. Əvvəllər daşmış Quruçayın hakim qıjıltısı bu qəhrəmanların mübarizəsindəki igidliyə sanki fövqəladə bir ahəng verirdi. Ancaq mən indi daha Qaçaq Xanmurad haqqında düşünmürdüm. Zərif, solğun təbəssümlü Qaçaq Xanmuradın anama danışdığı amansızlıqlar, arvad-uşağa rəhmsizcəsinə basqını – çadırı atəşə tutmağı onun igidliyini gözümdən salmışdı. Mən xilaskar qəhrəmanlar haqqında düşünürdüm. Mən belə qəhrəmanlar haqqında xəyala dalmaq üçün gecə tez yerimə girmək istəyirdim. Fatma nənəmin gecə-gündüz dua elədiyi Nuru dayımın şahidi olduğum igidlikləri indi məndə xoşagəlməz hisslər oyadırdı. Mən indi hər dəfə, məni dünyada hamıdan çox istəyən Bayram babam haqqında düşünərkən, onun döydürdüyü adamın dəhşətlə alacalanmış gözlərini görürdüm. “Beş körpə uşağım iki aydır pencərlə dolanır...” sözləri qulağımda aramsız səslənirdi.

Bir dəfə Kəklik xalanın oğlu Həşimin toyu idi. Anam da ən gözəl paltarlarını geyib, qızıllarını, daş-qaşlarını taxaraq məclisdə, qız-gəlin arasında əyləşmişdi. Onun mirvari tacı altından çıxan xurmayı saçları, enli qızıl kəmər çəkilmiş incə beli, durna boynu kimi uzun, ağ boğazı mənə o qədər gözəl görünürdü ki, mən məclisdəki başqa qadınlara deyil, ancaq anama tamaşa edirdim. Bütün qadın toylarında qız-gəlini dartıb oyuna salan, qəribə qaravəllilər söyləyən, gülməli rəqslər eləyən Gülbəs xala anamı nə qədər oyuna çəkdisə də, anam qalxıb oynamadı. Sonra biz evə gələndə anam hirslənib məni o ki var danladı ki, nə üçün məclisdə eyzən ona tamaşa edirdim. “Xalqın uşaqları oynayıb-gülür, sən də oturub gözünü dikmisən mənə”. Sonralar başa düşdüm ki, anam məhz mən ona tamaşa elədiyim üçün oynamayıb. Amma anamın o danlağı heç bir zaman yadımdan çıxmadı, çünki mənim heç kəsə məlum olmayan fərəhim təhqir olunmuşdu.

Bir dəfə atam mal gətirmək üçün Bakıya getmişdi. Qayıdanda gördük ki, Nuru dayım onunla gəldi. Sonra atam anama danışırdı ki, neft mədənlərində işləyən qohumlarını görmək üçün Binəqədiyə gedibmiş. Birdən cır-cındır içində olan Nuru dayım çıxır qabağına. Qərəz, məlum olur ki, dayım atasının evindən satdığı şeylərin pulunu kefə sovurandan sonra lüt qalıb, gəlir neft mədəninə, Fatma nənəmgilin kürd qohumlarından olan fəhlələrin yanına. Fəhlələr də onu yedirib-içirdirmişlər.

İndi dayım elə şən idi ki, elə bil, Parisdən kefdən gəlmişdi. Laklı uzunboğaz çəkmə, qalife şalvar, qiymətli buxara dərisindən təpəsi gen qabardin papaq, qolları enli üst köynəyi, körpüləri qızıl Qafqaz kəməri, nazik, qumral bığları, onsuz da, gözəl olan dayıma fövqəladə yaraşıq verirdi. O, Tiflisdə, Bakıda, daha nə bilim haralarda çəkdiyi keflərdən anama səhnələr danışırdı. Ən maraqlı söhbətlərdən biri də anamgilin ögey qardaşı, yəni, Fatma nənəmin qabaqkı ərindən olan oğlu Cəlilə rast gəlməsi idi. Nuru dayımın danışmağına görə, Cəlil indi Bakının adlı-sanlı mühərrirlərindən, ziyalılarındandır. Fatma nənəm onun bu söhbətinə kənardan diqqətlə qulaq asaraq, Cəlil barədə heç nə soruşmurdu. Mən də buna təəccüb edirdim. Mən başa düşmürdüm ki, Fatma nənəm Nuru dayımı bu qədər istədiyi halda, nə üçün öz dualarında, söhbətlərində bir dəfə də olsun o vaxt atasının üstünə atıb getdiyi oğlu Cəlilin adını dilinə gətirmir?

Nuru dayım hər gün Fatma nənəmdən, anamdan pul alır, öz dostları ilə yeyib-içir, kef çəkirdi. Bir gün dedilər ki, qubernator Xosrov bəy şəhərimizə gələcək. Hamı qubernatora tamaşa eləmək üçün Ağdam – Gəncə yolunun kənarına axışdı. Anam mənimlə bacımı da apardı. Gördük ki, şəhərimizdə olan müsavat əsgərləri şose yolun hər iki tərəfində cərgəyə düzülüblər. Zabitlər də aşağı-yuxarı qaçaraq hər şeyin öz yerində olmasına, əsgərlərin geyim-keciminə diqqət yetirirdilər. Birdən uzaqdan dalbadal gələn iki avtomaşın göründü. Zabit farağat komandası verdi. Maşınlar gəlib əsgərlərin qarşısında dayandı. Gəncə qubernatoru doktor Xosrov bəy maşından düşüb əsgərlərə salam verdi. Ucaboylu, enlikürək, yaraşıqlı bir adam idi. Gözünün biri kor idi. Əynində çərkəzi çuxa, ayaqlarında uzunboğaz çəkmə, belində nazik Qafqaz toqqası, başında təpəsi gen buxara papaq vardı. O, sıranın qarşısında irəliləyərək əsgərləri diqqətlə nəzərdən keçirdi. Sonra zabitlərə nə isə dedi. Sonra da maşına əyləşərək şəhərə getdi.

Bu əhvalatdan bir neçə gün sonra Nuru dayım çiyinlərində paqon gəlib anama sevinclə xəbər verdi ki, qubernatorun əmri ilə onu müsavat ordusuna zabit təyin eləyiblər. Mən dayımın necə zabitlik elədiyini bilmirəm. Ancaq hər axşam onun öz yoldaşları ilə Bayram babamgilin bağçasında yeyib-içib kef çəkdiklərini, sonra faytona minərək şəhərin malakanlar yaşayan hissəsinə getdiklərini görürdüm.

Nuru dayım gözəl malakan qızı Tanya haqqında anama gülə-gülə danışırdı. Mən də sövq-təbiilə hiss edirdim ki, belə söhbətlərə qulaq asmaq mənə yaramaz. Ona görə də, anamın acıqlanmasını gözləməyib əkilirdim. Atamın dediyinə görə, içməkdə heç kim dayıma çatmazdı. Onun zabit yoldaşları da özü kimi cavan, kefcil bəy oğlanları idi. Həmin bu vaxtlar bir neçə zabit, o cümlədən Nuru dayım, restoranın xüsusi otağında kef çəkdikləri zaman yaxın dostlarından biri – Alay bəy böyük mülkədar Həsən ağanın oğlunu tapança ilə vurub öldürərək eyvandan tullayıb, özünü şəhərin ortası ilə axan Çərəkən arxının qamışlığına salıb qaçmışdı. Vurulan çox gözəl oğlan imiş. Anam öz rəfiqələrilə onun haqqında yana-yana danışırdı.

Sonra Nuru dayım anama deyirdi ki, Alay bəyi tutub gözəl xalı-gəbə ilə döşənmiş bir otaqda, guya, dustaq eləyiblər. Atasının aşpazı da hər gün ona cürbəcür xörəklər gətirir. Sonra da gördüm ki, dayımla gözəl (o da Nuru dayım kimi ucaboylu, yaraşıqlı bir oğlan idi) geyinmiş Alay bəy Bayram babamgilin bağında gur çiçək açmış yasəmən gülləri arasına qoyulmuş stolun arxasında əyləşib içirlər (mən Alay bəyin həbsdən necə buraxıldığının təfsilatını bilmədim) və dayım da pəsdən muğamat oxuyur.

Dayımgilin bu bitməz-tükənməz nəşəsilə mənim həyatım arasında intəhasız bir məsafə vardı... Anamın malyariyası qurtarmadığı üçün mən qapalı bir dərd içindəydim. Qonşumuzda Abbas bəy adlı, təxminən mən yaşda bir uşaq var idi. Neçə il qabaq onun anası vəfat etmişdi, biz bir gün bir yerdə oynadığımız zaman Abbas bəy danışırdı ki, hər gün gedib anasının qəbrinin yırtıq-deşiyini tutur ki, ilanlar girib onu yeməsinlər. Bu da məni dəhşətə gətirirdi və mən Abbasın bu əhvalatı necə sakit danışdığına təəccüb edirdim. Mən Nuru dayımın da, atamın da, hətta, Fatma nənəmin də anamın xəstəliyindən heç də mənim qədər mütəəssir olmadıqlarına da təəccüb edirdim.

Atamın məni fərsiz saydığını hər dəqiqə hiss eləyəndən sonra, anamın xəstəlikləri ilə aylarla dərd-kədərə batandan sonra, heç kəsdən (yalnız Bayram babamdan savayı) tərifli bir söz eşitməyəndən

sonra (yalnız anamın rəfiqələri mənim çox gözəl olduğumu, gələcəkdə qızları heyran edəcəyimi söyləyirdilər ki, belə sözlərdən də nə üçünsə acığım gəlirdi) uşaq oyunlarına marağım söndü. Mən saatlarla evimizin küçəyə açılan dal qapısında oturub qonşu uşaqlarının haray-həşirlə "toqqa-toqqa", "gizlənqaç", "eşşəkbeli" oynamalarına tamaşa edərdim. Bu uşaqların içində də anası xəstə olanlar var idi. Lakin bacım Mahtab kimi, analarının xəstəliyi onların da vecinə deyildi. Mən getdikcə qapalı və çəkingən olurdum. Məni son dərəcə bədbinləşdirən işlərdən biri də atamla anamın lap sarsaq şeylər üstündə tez-tez dalaşmaları idi. Belə dava-dalaşdan sonra onlar aylarla küsülü qalırdılar və bu vaxtlar atam daim qaşqabaqlı olur, xüsusən, mənimlə daha sərt rəftar edirdi. Elə bil ki, bunların dalaşmalarında mən təqsirkar idim. Mən qonşularımızdakı başqa ataların öz uşaqları ilə necə gülərüzlə, necə şən rəftar elədiklərini, onları necə təriflədiklərini gördükcə özümü daha da bədbəxt hesab edirdim.

Mən Fatma nənəmdən dəfələrlə eşitmişdim ki, bütün insanları, heyvanları, bütün dünyanı Allah yaradıb. Ona görə də tez-tez bağımızın qaranlıq yerində olan, mənim həmdərdim tut ağacının altına qaçaraq, iri yarpaqlar arasından görünən mavi göyə baxıb:

– Ay Allah, – deyirdim, – nə üçün sən mənim də atamı o biri uşaqların ataları kimi yaratmamısan?

Anam heç vaxt namaz qılmaz, Quran oxumazdı, oruc tutmazdı. Atam isə, cavanlığına baxmayaraq, bütün dini ayinlərə riayət edərdi. Müəyyən vaxtlarda namaz da qılardı, oruc da tutardı. Mən buna təəccüb edərdim. Çünki o, namaz qılanda və ya avazla Quran oxuyanda üzü, baxışları olduqca mehriban bir ifadə alırdı. Elə bil ki, o birdən-birə bu dünyadan ayrılaraq dönüb başqa adam olurdu. O da mənim nəzərimdən qaçmırdı ki, yoxsullara, dilənçilərə qarşı anam atamdan daha çox mərhəmətli idi. "Nə üçün gedib işləmirsən" deyə atam şikəst olmayan yolçulara acıqlanırdı. Anam isə qapıya gələn yolçunu, kim olursa-olsun, əliboş qaytarmazdı, xüsusən, yetim uşaqlara çox acıyardı.

...Dayım xəlvətcə gəlib anama dedi ki, onunla Alay bəyi göndərirlər Bakıdan hərbi sursat gətirməyə, özü də, bu, çox məsuliyyətli işdir.

İki gündən sonra dayımgil getdi. Sonra da gözlədik dayımgil gəlib çıxmadı. Atam dəfələrlə Bakıya ticarətə gedəndə dayımı soraqlaşırdı. Lakin heç yerdə "gördüm" deyən olmamışdı. Yenə də Fatma nənəmin təlaşlı günləri, duaları başladı. Yenə də hər axşam eyvandakı taxtın üstündə oturub, gözünü dikirdi Yevlağa gedən şose yola.

Atam hər dəfə Bakıya gedib-gələndə müsavat hökumətinin ideoloqu Məhəmməd Əmin Rəsulzadənin nitqlərindən danışardı. Küçələrdə uşaqlar Azərbaycan haqqında, vətən haqqında nəğmələr oxuyardılar, anamla rəfiqələri eyzən zabitlərdən söhbət edərdilər. Bizim şəhərimizdə müsavat zabitləri ilə bərabər, türk zabitləri də var idi. Bunlar Azərbaycana gələn türk hərbi hissəsinin zabitləri idi. Onlardan Hatəm bəy və Tofiq bəy adlı iki nəfəri bizim qonşuluğumuzdakı ikimərtəbəli binada yerləşmişdilər, yazın gur vaxtı olduğu üçün axşamçağılar bağçadakı qızılgüllükdə stul qoydurub, orada əyləşərdilər. Bəzən çay, bəzən şərab içərək bərkdən danışıb gülərdilər. Anam və rəfiqələri bizim bağımızda gəzib söhbət edərdilər.

Anamın Məhbub xanım adlı çatmaqaş, qaraşirin, uzun qarasaç, incəbel bir rəfiqəsi var idi. O, bizə gələn bütün cavan qadınlardan gözəl və zinətli geyinərdi. Mən həmişə ona baxanda nağıllarda eşitdiyim şahzadə gözəllər yadıma düşərdi. Şən, deyib-gülən bir gəlin idi. Onun da tumanı anamınkı kimi uzun idi. Tumanının ayağında əşrəfi deyilən qızıl, qanavuz arxalığının yaxasına isə qızıl düymə düzülmüşdü. Belində enli, qızıl kəmər vardı. Atası Məşədi Həbib şəhərimizdəki böyük hamamın və motorla işləyən un dəyirmanının sahibi idi. Anam bizi hamama aparanda qabaqcadan xüsusi nömrə hazırlanardı. Biz çimib çıxandan sonra gəlib Məhbub xanımgildə çay içərdik (onların evləri hamamın böyründə idi). Məhbub xanımın anası Xurşid xanım iricüssəli, kök, yaraşıqlı bir qadın idi, həmişə Novruz bayramında üç-dörd vedrə sututan iri mis qazan dolusu səməni bişirib, bütün qonşulara paylayardı. Qışda da iki-üç dəfə hədik, ya da əriştə bişirib yenə də qonşulara paylayardı. Anam atama deyirdi ki, "Xurşud xala bundan həzz alır". Məhbub xanımı Aşqabadda yaşayan əmisi oğlu Talıba vermişdilər, ancaq anamın söhbətlərindən bilirdim ki, oğlan qıza qarşı soyuq imiş, ona görə də tezliklə ayrılmışdılar.

Məhbub xanım indi bizə tez-tez gəlirdi və həmişə də o gələndə, türk zabiti Tofiq bəy olduqları evin bağçasında görünürdü.

Məhbub xanım gülə-gülə anama nə isə deyər və zabitə baxardı. Əlbəttə, mən bütün bunların nə demək olduğunu aydın dərk eləməsəm də, onların arasında, nə isə, bir hiss yarandığını duyurdum. Bu mənə fövqəladə dərəcədə gözəl görünürdü. Mən eyni hissləri qızılgüllər açılanda bağçamıza gəlib təzə yarpaqların arasında şənliklə qışqırışan bül-

büllərin, sığırçınların səsində də duyurdum. Yəni, mənim dil ilə ifadə eləyə bilmədiyim gözəlliyi duyurdum. Məhbub xanımın gözəl təbəssümü, anamın gözəlliyi, bağçamızın gözəlliyi mənim ruhi aləmimdə, elə bil ki, ayna kimi əks olunurdu. Atam indi başqa şəhərlərə tez-tez getdiyi üçün mən çox vaxt öz evimizdə olurdum. Ancaq gündə bir neçə dəfə bağlardan keçərək Fatma nənəmə dəyməyi unutmurdum. Fatma nənəm eyvandakı ağac taxtın üstündə əyləşərək Bayram babamın qardaşı Eyvaz əmi haqqında öz-özünə daha qəzəbli danışırdı. Mən yanında dayanaraq qulaq asıb eşidirdim ki, Eyvaz əmi Kürdobadan çölləmə yolla tez-tez Bayram babamın naçalnik olduğu qəzaya gedir, babam da ona hər dəfə ya bir at, ya bir dəvə, ya da başqa bir şey verib xeyli sovqatla yola salır. Nənəm yenə də ona görə hirslənirdi ki, nə üçün babam əlinə düşən hər şeyi qardaşına verir? Niyə öz evinə heç nə göndərmir? Niyə gözünün ağı-qarası bircə oğlu olduğunu nəzərə almır?

...Bir gün də anam atama xəbər verdi ki, hamamçı Məşədi Həbibin qızı Məhbub xanım həmin türk zabiti Tofiq bəyə qoşulub qaçıb.

Bu əhvalatdan bir neçə gün sonra anam Məhbub xanımın görüşünə gedəndə məni də özü ilə apardı. O, Məhbub xanımdan xoşum gəldiyini bilirdi, hətta, bir dəfə bunu onun özünə deyib məni utandırmışdı da. Ancaq mən özüm də bilməmişdim ki, niyə utanıram?! İndi Tofiq bəy bizim qonşuluğumuzda deyil, ayrı binada yaşayırdı.

Anam Məhbub xanımın boynunu qucaqlayıb, üzündən öpdü. Sonra ona baxıb:

– Ay qız, – dedi, – sən öl, ərə getmək sənə yaman düşüb. Əvvəlkindən də qəşəng olmusan...

Sonra mən eşitməyim deyə, əyilib onun qulağına nə isə dedi və hər ikisi qəhqəhə ilə güldü. Həqiqətən mənə elə gəlirdi ki, bu qəşəng gəlini təzə görürəm. Mən onun sevincinin, fərəhinin yerə-göyə sığmadığını hiss edirdim və qəribə idi ki, bu, mənim özümü də sanki xoşbəxt edirdi. Məhbub xanım təzə ərinin onu necə istədiyini zərif təbəssümlə anama danışırdı.

Sonra çox yaraşıqlı bir zabit olan Tofiq bəy gülümsəyə-gülümsəyə pəncərənin qabağından keçərək o biri otağa getdi. O vaxtlar qadının yad kişiylə danışmağı məqbul olmadığı üçün Tofiq bəy anamla salamlaşmadı, ancaq bizim gəldiyimizdən xoşhal olduğunu təbəssümlə hiss etdirdi.

Həmin bu vaxtlarda Bayram babam öz bağlarında tikdirməyə hazırlaşdığı evin işi üçün gəlmişdi. (Özü faytonda əyləşmişdi, iki nəfər strajniki və Qızılbaşoğlu onu müşayiət edirdi.) Babam istəyirdi ki, indiki birmərtəbəli evi sökdürüb yerində ikimərtəbəli, böyük evlər tikdirsin. Bunun üçün qapıya guşə daşı, qum daşınırdı. Bayram babamın gəldiyini eşidib qazı ağa ilə şəhərimizdə məhkəmə sədri olan Balaş bəy görüşə gəlmişdilər. Onlar yeni hökumətin taleyi ilə maraqlanırdılar. Söhbət bu barədə gedəndə Bayram babamın üzü qayğılı göründü və o, papiros yandıraraq dedi:

– Bilirsiniz, əgər, xaricdən kömək olmasa, müsavat hökumətinin işi çətin olacaq. Düzdür, indi biz əsgər toplayırıq, qoşun təşkil edirik, ancaq bununla iş qurtarmır. Qoşuna silah lazımdı, hərbi işi yaxşı bilən adamlar lazımdı. Bu saat bizköməksiz uşaq kimiyik.

Balaş bəy dedi:

– Müsavat hökuməti çox ləng tərpənir, sizi inandırıram ki, bu saat Azərbaycanın hər yerində kommunistlər gizli iş aparırlar. Özləri də Rusiyada qurulan bolşevik hökuməti ilə əlaqədədirlər.

Mən bütün bu söhbətlərdən heç nə başa düşməsəm də, onlar öz-özünə beynimə həkk olunurdu. Məni ən çox maraqlandıran uzun, kök, qırmızısaqqal, qırmızısifət qazı ağa idi. qazı ağa balaca stəkanda tünd rəngli çay içib, uzun qırmızı müştüyündə dalbadal eşmə papiros çəkirdi və arabir məzəli sözlər deyirdi.

Qazı ağa yoğun papiros bükərək müştüyə qoyub yandırdı və dərin bir nəfəs alıb:

– Yaxşı, – dedi, – peyğəmbər özü də bərabərlik təbliğ eləyib, birinin o birinin haqqını tapdaladığını günah buyurub, belə olan tərzdə, bəs, niyə kommunistlər dinin düşmənidirlər?

Balaş bəy dedi:

– Kommunistlər deyirlər ki, din bəylərin, kapitalistlərinköməkçisidir, din zəhmətkeşləri onlara tabe olmağa çağırır.

Qazı ağa dedi:

– Yəqin məsələdir ki, insan gərək öz vəli-nemətinin üzünə ağ olmasın. Əgər, bir şəxs ki, sənə çörək verir, niyə gərək ona təpik atasan?

Bayram babam dedi:

– Məsələ orasındadır ki, kommunistlər deyirlər ki, tacirlər, dövlətlilər zəhmətkeşlərin hesabına varlanırlar.

Qazı ağa dedi:

– Məgər, Hacı Zeynalabdin cənablarının əvvəli ona-buna günəmuzd işləyən bənna deyildimi? Hər şey insanın öz fərasətindən asılıdır.

Sonra babama müraciətlə əlavə etdi:

– Sənin yeznən kənddən şəhərə gələndə kasıb bir oğlan idi, amma indi, maşallah, əməlli-başlı güzəran sahibidir. Filan tacir oturub gözləyə bilməz ki, görsün keçəl Şirin nə vaxt gəlib ona çatacaq.

Mən bu yaşlı adamların rəftarında qəribə ziddiyyətlər hiss edirdim və onları başa düşmək üçün məndə şiddətli bir maraq olsa da, heç nə soruşmurdum. Bu ziddiyyətlər mənim aləmimdə getdikcə bir xaosa çevrilirdi, məndə adamlara qarşı şübhə doğururdu. Mən nəyin yaxşı, nəyin pis olduğunu, nəyin günah, nəyin günah olmadığını aydınlaşdıra bilmirdim. Bilmirdim ki, Nuru dayım yaxşı adamdı, yoxsa qazı ağa? "Yaxşılıq", "pislik" məfhumları getdikcə mənim üçün anlaşılmaz olurdu.

## YOLDA YAXALANMIŞ NAMƏLUM ŞƏHƏRLİ

Bayram babam Qarabulağa gəlməsindən istifadə eləyərək indi qışlaqda olan anası Səkinəni gedib görmək istədi. Mən həvəsə düşərək babama yalvardım ki, qoysun mən də gedim, babam heç bir zaman mənim sözümü, xahişimi rədd etməzdi.

Dedi:

– Yaxşı, gedək.

Anamgil də etiraz eləmədi.

Biz səhər tezdən Həbibin faytonunda, Qızılbaşoğlunun müşayiəti ilə yola düşdük.

Biz yetişib qılçıqlanmaqda olan buğda zəmilərinin, yaşıl darı tarlalarının arası ilə irəliləyərək dərəyə endiyimiz zaman gördük ki, yolun ortasında bir fayton durub. Bir az aralıda üç nəfər atlı-tüfəngli adamın qarşısında gözünün biri azca qıyıq ortayaşlı bir adam dayanıb. Atlılardan sarıbəniz kişi babama dedi:

– Xoş gördük, Bayram bəy!

Babam qaçaqların qabağında dayanmış adama işarə ilə soruşdu:

– Kimdi bu binəva keçib sizin girinizə, Rzaqulu bəy?

Mən Rzaqulu bəy adlı amansız, qəddar bir qaçaq olduğunu eşitmişdim. Qaçaq Rzaqulu bəy cavab verdi ki:

– O, binəva deyil, əşi, bolşevikdir. Güllələyəcəyik köpəkoğlunu!
Babam soruşdu:
– Nə bilirsiniz bolşevikdir?
– Uşaqlar tanıyıblar. Budur, cibindən də kağız-kuğuz çıxıb, – deyə Qaçaq Rzaqulu bəy əlindəki kağızları babama verdi.
Babam kağızları diqqətlə nəzərdən keçirib zarafatyana dedi:
– Nə olar bolşevik olanda?!
Qaçaq Rzaqulu bəy təəccüblə cavab verdi:
– Necə nə olar, əşi? Bunlar nə Allah tanıyırlar, nə peyğəmbər... nə ana, nə bacı, nə dost! Bu köpəkoğlu kəndləri gəzib camaatı dilə tuturmuş ki, "öldürün naçalniki, idarəsini dağıdın, bəyləri qırın..."
Əlində papiros dayanıb bizə baxan kişi sakit səslə dedi:
– Yalandır, biz terror tərəfdarı deyilik.
Babam soruşdu:
– Haralısınız?
Kişi dedi:
– Əslim Gəncə tərəfdəndi. Ancaq uşaqlıqdan Bakıda olanam.
Babam soruşdu:
– İndi haradan gəlib, hara gedirsiniz?
Kişi dedi:
– Bakıya gedirəm.
Mən çox maraqlanırdım ki, babam ondan soruşsun kimdi, nəçidi, buralarda nə gəzir?
Amma babam heç nə soruşmayıb, Qaçaq Rzaqulu bəyə dedi:
– Buraxın, getsin!
Qaçaq Rzaqulu bəy yenə də təəccüblə babama baxaraq dedi:
– Nə danışırsan, Bayram bəy, bu ilanın əlinə belə girəvə düşsəydi, səni salamat buraxardı?
Bayram babam gülümsədi:
– Onsuz da, – dedi, – əgər, bolşeviklər hökumət başına keçsələr, yəqin ki, mənim kimi naçalnikləri sağ qoymazlar. Tək bu kişini siz öldürməklə nə olacaq?
Qaçaq Rzaqulu bəyin sarı bənizi qıpqırmızı oldu:
– Bayram bəy, – dedi, – özün bilirsən ki, sənin bizim yanımızda xətrin əzizdir, ancaq bu dinsizi sağ buraxmayacağam!
Babamın bənizi soyuq, ciddi bir ifadə aldı. Gördüm ki, Qızılbaşoğlu da sağ əlini yavaşca qoydu onatılanın üstünə.
Babam, sükut içində gözünün birini qıyıb baxan bolşevikə dedi:

– Gedin! Azadsınız!

Kişi, Qaçaq Rzaqulu bəyə ani bir nəzər saldı. Sanki bir an yerindən tərpənməyə qorxdu. Sonra çevrilib iti addımlarla gedərək gəldiyi faytona mindi. Faytonçu atları dörddəmə çapdı.

Qaçaq Rzaqulu bəy yana-yana babama dedi:

– Gördünmü, sən onu ölümdən qurtardın, amma o sənin kimi kişiyə, heç olmazsa, bir "sağ ol" da demədi. Qoymadın o haramzadanın başına bir güllə ilişdirək!

Babam faytonçuya dedi:

– Sür!

Biz bir qədər aralanandan sonra mən babama dedim:

– Qaçaqlar dalınca gedib o adamı yenə də tutarlar.

Babam papiros çıxarıb yandıraraq dedi:

– Tutmazlar.

Atını faytonun yanınca sürən Qızılbaşoğlu babama dedi:

– Əgər, sənin sözünə baxmasaydılar, üçünü də atacaqdım.

## ÇARVADAR HƏBİB

Bayram babam bu söhbətin üstündən keçərək zarafatyana soruşdu:

– Həbib, yenə dörd aşıqla aran sazdı?

Həbib güldü:

– Bəy, məni utandırırsınız...

Mən atamgildən eşitmişdim ki, Çarvadar Həbib bərk qumarbazdı. Özü də toylarda məzəli oyunları ilə məşhurdur. Onu da bilirdim ki, atam anamı götürüb qaçanda həmin bu Həbibin faytonunda (bəlkə də elə bu faytonda) gediblər.

Bir vaxt Həbibin üç faytonu var imiş. Onda adına "Çarvadar Həbib" deyərmişlər. İndi faytonun ikisini atları ilə uduzmuşdu, qalmışdı biri. Ona görə də, indi adına aradabir "Faytonçu Həbib" deyirdilər.

Biz sükut içində yolumuza davam edirdik. Ucsuz-bucaqsız Qarabağ çölləri ilə faytonda getmək mənə ləzzət verirdi. Bayram babam dedi:

– Həbib, deyirlər sənin pəsdən yaxşı oxumağın var, yavaş-yavaş de gəlsin.

– Mənə sataşırlar, bəy, oxuyan deyiləm.

Mən başa düşdüm ki, Həbib, babamın yanında təvazökarlıq eləyərək belə deyir.

Babam dedi:

– Yaxşı... Yaxşı... Bir-iki ağız de görək.

Həbib pəsdən oxumağa başladı:

Nə mən olaydım, ilahi, nə də bu aləm olaydı,
Nə də bu aləm dil müğəyyədi-qəm olaydı.

Doğrusu, bu qədər həzin, bu qədər təsirli oxumaq faytonçu Həbibin uzun burnuna, bir az pörttə gözlərinə, atların cilovundan yapışan, günəşdən, ayazdan yanıb qaralmış iri əllərinə heç yaraşmırdı.

Yönü o yana olduğu üçün mən onun üzünün indi nə cür ifadə aldığını görmürdüm. Amma onun ürəyindən gələn kədəri, qəmi hiss edirdim. Bu kədərlə, onun toylarda məzəli hərəkətlərlə oynayıb taytuşunu güldürməyi mənim xəyalımda anlaşılmaz bir mənzərə təşkil edirdi. Mən onu da anlaya bilmirdim ki, faytonçu Həbibin bu qədər qəmli, bu qədər həzin oxumasına səbəb nədir?

O, oxuyub qurtaranda babam soruşdu:

– Deyəsən, Xurşidbanunun sözləridi...

Həbib dərindən nəfəs alıb dedi:

– Bəli, Xan qızının sözləridi... Allah rəhmət eləsin... Mənim atam onun mehtəri olmuşdu. Atamın yeddi qızı var idi. Hamısını Xan qızı özü cer-cehizlə ərə verdi. Onun sayəsində hərəsi bir ev-eşik sahibi oldu. Yoxsa, rəhmətlik atamın nəyi vardı ki?

Həbib şallağını havada şaqqıldadaraq atları tərpədib sözünə davam etdi:

– Mən balaca uşaq idim, hər bayramda Xan qızı, hərəsi səkkiz-doqquz vedrə sututan böyük mis qazanlarda zəfəranlı plov paylayardı. Novruz bayramında yoxsulların evinə un, düyü, şirniyyat göndərərdi. Allah rəhmət eləsin, bu sözdən deyildi Xan qızı. Atam danışardı ki, Xan qızı o suyu Şuşa qalasına çəkdirənə qədər camaat şirin suya həsrət idi.

Babam dedi:

– Deyirlər, Xan qızı cavanlıqda çox gözəlmiş.

– Bəli, atam danışardı ki, çox zərif zənən idi.

Lotuluqda, qumarbazlıqda ad çıxaran Çarvadar Həbibin şairə haqqında bu cür hərarətlə, ədəblə danışması sonralar (yəni, mən şerin nə

demək olduğunu anlayanda) yadıma düşəndə mənə çox təsir eləyirdi, mən hiss edirdim ki, ömrü bu tozlu yollarda fayton sürməklə, atlara arpa-saman verməklə keçən Çarvadar Həbibin ürəyində heç onun özünün də dərk etmədiyi, bir dərdmi deyim, sirmi deyim, var və bu dərd, bu sirr bütün insanlara məxsusdur. Yoxsa, bizim muğamlarımızda, dahi bəstəkarlarımızın əsərlərindəki o anlaşılmaz, əbədi kədər haradandı? Son dərəcə gözəl, şən bir oğlan olan məşhur xanəndə Xanın səsindəki o nəhayətsiz, o əsrarəngiz kədər, həsrət haradandı? Nə üçün təbiətin şən bir qadını olan anam dan üzü xoruzun banladığını eşidəndə qüssələnir? Nə üçün atam Quran oxuyanda üzü o qədər həlim, dərdli ifadə alır? Axı, o, təbiətən çox sərt bir adamdır! İncə-mincə işlərlə də arası yoxdur. Necə olur ki, atın qızğın qaçarağında bir gülləyə iki ceyran vuran Bayram babam, Çarvadar Həbibin astadan oxuduğu həzin muğama qulaq asanda o cür qəmli görünür? Mən öz qapalı, balaca həyatımda bunları hiss edirdim və bu anlaşılmazlıqlar mənim təbiətimdəki məyusluğu artırırdı. Anamın dediyi kimi, məni "cümləqayğı" edirdi, ancaq bu sözün nə demək olduğunu bilmirdim, bilmirdim ki, anam nəyə görə mənə "cümləqayğı" deyir? Mən sonralar, böyüyəndə, bu qəribə ifadənin dürüst mənasını bilməsəm də, başa düşürdüm ki, məsələ heç də təkcə mənim təbiətimdəki qəribəlikdə və ya hər kədərli hadisədən mütəəssir olmağımda deyil. Məsələ, bizim qəlbimizin harasındasa, hansı səbəbdənsə yaranmış gizli, anlaşılmaz əbədi kədərdə idi...

## QARA DAMIN VAHİMƏSİ

Biz Kürdoba qışlağına çatanda toran qovuşurdu, yeraltı damların qapılarında qalanmış ocaqlardan gərmə tüstüsünün iyi duyulurdu. Mal-qara kəndə qayıdırdı, inəklərin, buzovların səsi bir-birinə qarışmışdı, itlər hürüşürdü. Qışlağın böyründəki sarıtikanlı düzdə çılpaq dəvələr otlayırdı. Qoyun-quzu isə, yəqin ki, qışlaqdan on beş-iyirmi kilometr aralıdakı Haramılarda idi.

Fayton babamgilin dədə-baba damına çatıb dayandı. İtlər qəzəblə hürə-hürə faytonu dövrəyə aldı. Eyvaz əmigilin alabaşı Bayram babamı tanıyıb, quyruğunu buladı. Eyvaz əmi və qonşu damlardakı kişilər yüyürüb: "Ay it! Ay it!" – deyə itləri qovdular. Səkinə qoca da, Fatma nənəm də, Eyvaz əminin arvadı da, tanımadığım başqa yaşmaqlı qonşu gəlinləri də mənim üzümdən öpdülər.

Səkinə qoca, qalın kişi səsilə bərkdən dedi:

– Ay Bayram, bircə de görüm, qadasın aldığım Nurudan nə xəbər var?

Bayram babam soyuq ifadə ilə dedi:

– Xəbərim yoxdu, ana.

Gördüm Fatma nənənin üzünə məyusluq çökdü. Sonra o, pıçıltı ilə məndən soruşdu:

– Anangil də dayından bir xəbər bilmir?

Mən tutqun halda, "yox" mənasında başımı buladım. Fatma nənəm bu adamların arasında yenə də qərib, onlardan ayrı görünürdü. Birdən-birə, babamın və Fatma nənəmin orada olmalarına baxmayaraq, bu adamların arasında mən də özümü yad, yalqız hiss elədim. Biz asma fənərlə işıqlanan dama girdik. Arvadlar yerdə keçələrin üstünə döşəkcələr saldılar, söykənmək üçün mitəkkələr qoydular. Biz əyləşdik. Eyvaz əmi ayaq üstündə dayanıb mismar yeşiyinə bənzəyən xırdaca gözlərilə bizə tamaşa eləyən Qaracaya dedi:

– Gəl, Bayram əminin çəkmələrini çək.

Qaraca, görünür, bu buyruğa şad olaraq, cəld irəlilədi, ancaq babam razı olmayıb, uzunboğaz çəkmələrini bir-bir özü çıxarıb kənara qoydu.

Damın içi meydan kimi geniş idi. Otaqda yorğan-döşəkdən, xalı-gəbədən böyük yük yığılmışdı. Mən başımı qaldırıb tavana baxanda, elə bil ki, dərin və yarıqaranlıq sükut içində olan vahiməli bir aləm gördüm. Başımızın üstündəki tavan və yerdən qalxan dirəklər üzərindəki nəhəng tirlər ortalıq ocağının hisindən qaralmışdı (kim bilir, bəlkə də, buna görə bu damlara "qara dam" deyirdilər...), onların arasında hörümçək torları görünürdü. Bir an mənə elə gəldi ki, bu nəhəng tirlərdən o yanda, mənim görüb tanımadığım bu dünya ilə əlaqəsi olmayan başqa, qorxulu bir dünya var. Elə bu zaman Eyvaz əmi Bayram babama neçə gün əvvəl başına gəlmiş qəribə bir hadisə danışdı. Eyvaz əmigilin neçə pud götürən məşhur bir nəri var idi, neçə gün imiş həmin nər qızıb çöldə qalırmış, heç kəs də qorxusundan yaxın gedə bilmirmiş. Eyvaz əmi nağıl eləyirdi ki:

– Günortaüstü əynimdə yapıncı aşağı qışlaqdan gəlirdim, bir də gördüm nər Cin dərəsinin qırağında dayanıb harasa baxır. Mən yavaşca sivişib qaçmaq istəyəndə nər başını döndərib məni gördü, bildim ki, cumacaq üstümə. Keçən il yerə xıxmadığı üçün acıqlanıb bir ağac vurmuşdum dizinə. Mən qaçdım, o qovdu. Gördüm ki, az qalıb haqlasın məni, nəfəsim də kəsilirdi, yapıncını çiynimdən atdım yerə.

Qoca Mustafaoğlu dedi:

– Yaxşı ki, yapıncını yerə atmaq ağlına gəlib.

– Hə, – deyə Eyvaz əmi davam etdi, – qaça-qaça qanrılıb gördüm ki, nər yerə çöküb yapıncını dizləyir, sonra qalxıb yenə də dalımca cumdu. Bayramın canı üçün, əgər əmioğlu Zülfüqargilin pəyəsi yaxında olmasaydı, əlindən qurtara bilməyəcəkdim, elə məni haqla-haqlada özümü saldım pəyəyə. Gəlib pəyənin qapısında yerə xıxıb başını qoydu pəyənin qapısının düz ağzına. Axırda uşaqlar pəyənin dalından külfəni genişləndiriblər, oradan çıxmışam.

Səkinə qoca dedi:

– Dəvə qisas almayınca, ona toxunanı yaddan çıxarmaz.

Mustafaoğlu dedi:

– Gör necə işdir ki, cinlər gecə atları minib çapırlar, qaranəfəs eləyirlər, amma dəvə qisminə yaxın gəlmirlər.

Bayram babam gülümsəyib dedi:

– Cinlər yenə heylə iş eləyirlər?

Səkinə qoca dedi:

– Onların adını tutanda "bismillah" de, Bayram.

Hacı dedi:

– Əmimgilin kəhər ürgəsini hər gecə minib qaranəfəs eləyirlər. Səhər durub görürəm ki, at qan-tər içindədi, yalını da xırda-xırda hörüblər.

Bayram babamın üzü ciddi bir ifadə aldı, ancaq heç bir söz demədi. Mən Ziyətdən eşitmişdim ki, Mustafaoğlu Mehdi qarlı bir gecədə Haramıdan tək qışlağa gələndə həmin bu Kürdobanın böyründəki Cin dərəsində cinlərin yığıncağına düşüb. İndi mən bunu ondan soruşmaq istədim, amma cəsarət eləyib cinlərin adını tuta bilmədim. Çünki indi mən anlaşılmaz bir vahimə içindəydim. Bu vahiməni doğuran cinlər haqqındakı söhbətlər deyildi, başımızın üstündəki qapqara, nəhəng tirlər idi.

Sonralar anamgil deyirdilər ki, guya, mən fikirləşmişəm ki, gecə bu nəhəng tirlər uçub tökülər üstümüzə. Atam da məni qorxaqlıqda təqsirləndirirdi. Amma məsələ heç də belə deyildi, tirlərin uça biləcəyi heç mənim ağlıma da gəlmirdi. Yuxarıda dediyim kimi, onlara baxdıqca mənə elə gəlirdi ki, onlardan o yana qaranlıq, nəhayətsiz bir dünya var və o aləm, nə isə, əcaib məxluqlarla doludur, mən onların nə şəkildə olduqlarını, eləcə də, üzlərini aydın təsəvvür eləyə bilmirdim, mən ancaq vahimələnirdim və o da qəribə idi ki, mən yarıqaran-

lıq damın tavanına, nəhəng tirlərə baxıb xoflandıqca sanki yanımda oturub söhbət eləyən adamlar, hətta, Bayram babam da, zarafatcıl Əhmədalı, ayaq üstə dayanıb damın yarıqaranlığında işıldayan gözlərilə baxan Qaraca da məndən uzaqlaşırdı, elə bil ki, onlar yuxuya çevrilirdilər və mən qorxulu, ümidsiz bir yalqızlıq hiss edirdim və mən buraya gəlməyimə peşman olurdum.

Söz-söhbətdən, yemək-içməkdən sonra qonşu kişilər getdilər. Torpaq döşəmənin üstünə sərilmiş keçələrin üstündə yerlər salındı. Mənim yerim Fatma nənəmin yanındaydı. Fənəri söndürdülər, soyunub girdik yerimizə. Damı zülmət bürümüşdü, dibsiz, vahiməli bir zülmət. Birdən məni ağlamaq tutdu. Fatma nənəm soruşdu:

– Nə olub, bala?

Mən cavab verməyib, içimi çəkə-çəkə ağlayırdım, damın yuxarı başından Bayram babamın səsi eşidildi:

– Nə olub, Murad, niyə ağlayırsan?

Mən yavaş səslə dedim:

– Yatmıram bu damda.

Babam soruşdu:

– Niyə?

Mən cavab verməyib, için-için ağlamağa davam etdim. O zaman babam acıqlanıb Fatma nənəmə dedi:

– Dur, apar. Şirinin çavıstanında yatırt.

Şirin, Eyvaz əmigilin dəyirmançısı idi, yerin üstündə qarğıdan tikilmiş çavıstanı da onların damının yanında idi, arvadı, qızı və oğlu da Eyvaz əmigilin heyvanlarına, qapı-bacalarına xidmət eləyirdilər.

Biz dəyirmançı Şirinin çavıstanında Fatma nənəmlə yanaşı yerimizə uzananda və mən balaca pəncərədən ulduzlu göyü görəndə, elə bil ki, yenidən bu işıqlı dünyaya qayıtdım və tezliklə məni yuxu apardı.

Səhər babam kasıb qohumlarından Zülfüqar adlı oğlanı çağırıb dedi:

– Zülfüqar, bu qoçaq oğlanı mindir eşşəyə, apar evlərinə.

Mən hiss edirdim ki, babam "qoçaq" sözünü mənim axşamkı hərəkətimə görə istehza ilə deyir. Birinci dəfəydi ki, babamın mənə acığı tutmuşdu. Sonralar da mən başa düşdüm ki, bizim xalq hər şeyi bağışlayır, ancaq qorxaqlığı yox. Bilirdim ki, mənim gecəki qorxum babamgilin düşündüyü qorxaqlıqdan deyil. Ancaq mən onun nədən ibarət olduğunu da izah eləyə bilməzdim.

Zülfüqar məni mindirdi at boyda boz eşşəyin belinə, babam eşitməsin deyə Fatma nənəm mənə pıçıldadı ki:

– Anana de, soraqlaşsın, bəlkə dayından bir xəbər tuta bildi.

Biz yola düşdük. Zülfüqarın qıpqırmızı üzü fındıq boyda yumrularla dolu idi. Səsi də batmışdı, danışanda güclə eşidilirdi. Zülfüqarın bir bacısı da onun kimi idi. Ancaq yol uzunu mən hiss edirdim ki, Zülfüqar çox yaxşı oğlandı, mənimlə olduqca mehriban danışırdı. Özü piyada yeriyirdi, neçə dəfə dedim ki, eşşək yekədi, gəl sən də min, razı olmayıb dedi:

– Sən rahat otur.

Sonra yolda pendir-çörək çıxarıb özü də yedi, mənə də verdi.

Nəhayət, biz gəlib çatdıq Qarabulağa, evimizə. Qapı-bacamızda heç kəs görünmürdü, o saat ürəyimə damdı ki, yəqin anam yenə xəstədir. Artırmaya çıxıb, pəncərədən baxıb gördüm ki, anam çarpayıda yatır, bacım Mahtab da yerdə oynayır. Birdən-birə özümü son dərəcə məyus hiss elədim.

Səhəri gün atam bazardan gəlib şadlıqla anama xəbər verdi ki, "malakan Jukovun bizim mağazanın dalındakı evini satın almışam". Elə bil ki, bu xəbərlə anamın xəstəliyi də birdən-birə yox oldu. Axşamçağı bacımla məni də götürüb getdi təzə mülkümüzə baxmağa.

Dörd otaq və bir mətbəxdən ibarət, firuzə rəngli kürsülü bina anamın çox xoşuna gəldi. Evin qabağında böyük bağ var idi.

Mən anamdan soruşdum:

– Bəs, o biri evlərimizi neyləyəcəyik?

Atamın kefi kök olduğu üçün zarafatyana dedi:

– O biri evləri də verəcəyik sənin o biri qardaşlarına.

Mən təəccüblə soruşdum:

– Haradadı o biri qardaşlarım?

Atam eyni nəşə ilə cavab verdi:

– Sən gəldiyin yerdə.

Mən marağımı saxlaya bilməyib soruşdum:

– Mən haradan gəlmişəm ki?

Anam güldü. Atam mənə məzəmmətlə baxıb ciddi dedi:

– Bu qədər böyüyüb, hələ heç nədən başı çıxmır... Bilmirəm bunun axırı necə olacaq? Bunun tayları gözdən tük seçirlər.

Mənə elə gəlirdi ki, doğrudan da, xeyli yaşım var, amma heç nə bilmirəm. Bu, məndə özümə qarşı olan inamsızlığı bir az da artırırdı. Ümumiyyətlə, atamın belə məzəmmətləri mənə ağır bir zərbə kimi

dəyib, özümü öz gözümdə həqiqətən də acizləşdirirdi. Mən getdikcə bədbinləşirdim. Birdən mən ürəyimdə Allahdan soruşdum: "Axı, məni nə üçün yaratmısan?"

Bu sualın sözaltı mənası məlum idi. Madam ki, mən, atamın dediyi kimi, acizəm, karsalayam, başqa uşaqlar kimi zirək, vurub-tutan deyiləm, bəs, onda, Allah məni nə üçün yaradırdı?

Belə suallar məni getdikcə yalnız atamdan deyil, hamıdan uzaqlaşdırırdı və mən daim kədərli olurdum. Özümə inamım olmadığı üçün uşaqlarla oynayanda hərəkətlərim yöndəmsiz, küt çıxırdı. Elə bil ki, gözəgörünməz bir qüvvə məni azad surətdə, cəsarətlə əl-qol açmağa, qoçaqlıq göstərməyə qoymurdu. Ona görə də, uşaqlar, məsələn, "dava-dava" oynamaq üçün tərəf-tərəf olduqda dəstəbaşçılarından heç biri məni öz dəstəsinə götürmək istəmirdi. Bu da mənim izzətinəfsimi yaralayırdı. Atam bütün məhəllə uşaqlarının heç bir sevincində, heç bir oyununda iştirak eləmədiyimi gördükcə, əsəbiləşib məni daha da bərk danlayırdı.

Bu vaxtlar mənim həyatımda başqa bir kədərli hadisə oldu. Nuru paşanın Azərbaycana gəlmiş qoşunu çəkilib getdiyi üçün anamın rəfiqəsi Məhbub xanım da öz əri – türk zabiti Tofiq bəylə getdi. Mən çox sonralar da özümdən soruşurdum: "Məhbub xanım sənin anan deyildi, bacın deyildi, heç uzaq bir qohumun da deyildi, nə üçün onun ata-anasından, sənin anandan ayrılıb uzaq ellərə getməyini eşidəndə bağınızın qalınlığındakı tut ağacının altına qaçıb gizli-gizli ağlayırdın?" Halbuki Məhbub xanım özü çox şən görünürdü. Getməklərindən bir gün qabaq o, anamla görüşmək üçün bizə gəlmişdi, həmişəki kimi gözəl geyinib, bütün daş-qaşlarını taxmışdı. İri, qara gözləri çatmaqaş altından həmişəki kimi gülümsəyirdi. Anam mütəəssir bir səslə soruşdu:

– Ay Məhbub, ürəyin necə dözür, hamıdan ayrılıb heylə uzaq yerə gedirsən?

Məhbub xanım dedi:

– Mən onunla lap o biri dünyaya da gedərəm.

Anam dərindən nəfəs alaraq bir an nə isə düşündü və mənə elə gəldi ki, bu "nə isə" onun öz həyatı ilə əlaqədardır.

Onlar, nəhayət, öpüşüb ayrılanda mən səssizcə bağa qaçıb, dediyim kimi, tut ağacının yanında xəlvətcə ağladım. O gündən sonra da hər cürə ayrılıq mənim həyatımda ən kədərli hadisə oldu. Kim bilir, bəlkə də o ayrılığı mənim üçün bu qədər kədərli eləyən Məhbub xanımın həmişə məni görəndə gülümsəməsi, "nə gözəl oğlandır, nə

ağıllı gözləri var” deyə məni tərifləməsi idi. Həyat hər gün mənim zehnimdə, təbiətimdə bir iz buraxaraq keçirdi.

İman kişi, həmişəki kimi, qonşulara mis səhənglə kəhrizdən su daşıyırdı. Bekar vaxtlarında da vərəqləri saralmış cındır kitabını pəncərədən düşən işığa tutub, “Quranın Quran olsun” deyə oxuyurdu. Ya da “Yer oğlu qıy vurub çıxdı göyə” deyə hey öz-özünə danışırdı. Ya da iri mis səhəngdə su daşıdığı zaman yenə də acıqlı-acıqlı öz-özünə Kəklik xalanın qarasına deyirdi:

– Zalım qızına deyirəm, sidiyini çək gözünə, gözün açılsın! Eləmir ki, eləmir də!

Yenə də harada qabağına qara toyuq çıxsaydı, heç vaxt əlindən yerə qoymadığı ağacı ilə vurub öldürmək istəyirdi. İman kişi hələ də o fikirdəydi ki, bütün qara toyuqlara çörəkçi Məşədi İbrahimxəlilin arvadı Gülbəs xala cadu eləyib, ona görə də, Gülbəs xala İman kişini küçədə görən kimi qaçıb girirdi evlərdən birinə. Bütün evlər isə, Gülbəs xalanın üzünə açıq idi. Gülbəs xala yenə də arvad toylarının ruhverəni idi. Onun əri çörəkçi Məşədi İbrahimxəlil bir az varlanandan sonra özünə ikimərtəbə, qəşəng daş ev tikdirmişdi. Evin qabağını da eləmişdi qızılgüllük. Məşədi varlanandan sonra daha özü təndirə çörək yapmırdı. Bunu muzdla tutduğu adamlar edirdilər. Məşədi özü isə, səliqə ilə geyinib, tərəzinin dalında əyləşirdi. Özü də ləzzətli xörəklər yeməyi sevirdi. Hər cümə axşamı cücəli plov bişirtdirirdi. Deyirdilər ki, Məşədi plovun altına qoyulan çolpanı götürüb arvadından soruşarmış:

– Gülbəs, harası? (Yəni, toyuğun harası ləzzətlidir?)

Gülbəs də misal üçün, deyərmiş:

– Məşədi, budu!

Məşədi acıqlanıb deyərmiş:

– A köpəkqızı! (Yəni, düz demədin!)

Qərəz, Gülbəs toyuğun bütün yerlərini sadalayıb, hərəsində də Məşədidən bir “köpəkqızı” alandan sonra deyərmiş:

– Məşədi, toyuğun dərisi!

Arvad yalnız indi Məşədinin ürəyindən xəbər verdiyi üçün kişi nəşə ilə deyərmiş:

– Ay bərəkallah!

...Fatma nənəm indi öz-özünə danışığında iki məsələ ilə məşğul idi. Birincisi bu idi ki, indi harada olduğu bilinməyən, çox adamın itmiş hesab elədiyi Nuruya daim dua edirdi. İkincisi də, indi Eyvaz əmi

haqqında qəzəblə danışırdı. Çünki Eyvaz əmi Bayram babamın böyük bir sahədə rəis olmağından istifadə edərək dövlətini artırırdı.

Bizim alt evlərdən birində olan Kəklik xalanın oğlanları da yavaş-yavaş işlərinin ucunu tapırdılar. Böyük oğlu Ələsgər tərəvəz alveri edirdi. Haşım mənim atamdan borc pul götürüb, balaca bir əttar dükanı açmışdı. Qasım isə, məşhur sünnət ustası, dəllək Ələsgərə şagird olmuşdu. Kazım da hələ balaca idi. Kəklik xala da anamın yorğan-döşək salmaq, ip əyirmək, yun çırpmaq kimi işlərinə kömək edirdi, sacda bizə yuxa bişirirdi. Yəqin məsələdir ki, anam da onu razı salırdı.

Atamın da işləri yağ kimi gedirdi. İndi o, dövlətlilər sırasında birinci olmağa can atırdı. İşlərinin yaxşı getməsinin onu necə fərəhləndirdiyini mən hiss edirdim. O, Rusiyada, İran tacirlərinin ona necə etibar elədiklərindən, nisyə nə qədər mal buraxdıqlarından anama iftixarla danışırdı. Ancaq bütün bunlar məni heç də şad eləmirdi. Çünki atam bir dəfə də olsun, mənim həyatıma müdaxilə eləmirdi. Bir dəfə də olsun, mənə tərifli söz demirdi. Sonralar başa düşdüm ki, yazıq kişi bu yolla məni hərəkətə gətirmək, mənim də başqa uşaqlar kimi, deyib-gülən, zirək, açıqtəbiətli bir məxluq olmağımı istəyirmiş. Daha haradan biləydi ki, mənim daxilimdə tamam başqa bir aləm var. Özüm üçün də anlaşılmaz, qaranlıq olan bu aləm məni bütün xarici mühitdən və birinci növbədə atamın özündən ayırır, məni onlara uyuşmağa qoymur.

...Bizim evdən yuxarı yalda hər gün müsavat əsgərlərinə təlim keçirdilər. Təlimdən sonra onlar nəğmələr oxuyurdular. Çox qəribə idi ki, bu nəğmələr, əsasən, hərbi ruhda olsa da, məndə kədərli bir hiss doğururdu. Elə bil ki, mahnıların özündə, nə isə, pərişan bir şey vardı.

Yeniyetmə, cavan oğlanlar balaca uşaqlardan əsgərsayağı dəstələr düzəldərək, onlara komanda verə-verə küçələrdə gəzir, türk və müsavat əsgərlərindən öyrəndikləri mahnıları oxuyurdular. Belə dəstələrdən birinin də komandiri Məhbub xanımın kiçik qardaşı Qulam idi. Bir dəfə o, anası Xurşid xanımla bizə gəldiyi zaman anam dedi ki, Qulam məni də aparıb öz dəstəsinə qoşsun.

Səhəri gün Qulam bizə gəldi. Anam mənə təzə paltar geyindirdi. Biz getdik şəhərin Murğuzlu adlanan tərəfindəki düzənliyə. Gördüm ki, burada uşaqlar dəstə-dəstə göy otluqda oturub mahnı oxuyurlar. Qulam da məni öz dəstəsinə daxil elədi. Sonra Qulam uşaqlara dedi ki, biz də gərək əsgərlər kimi təlim keçək, onlar kimi mahnılar öyrənək.

Sonra hansı bir mahnını isə oxudular.

Sonra dəstəbaşçıları bir yerə yığıldılar. Bunlar hamısı yaxşı geyinmiş oğlanlar idi. Ancaq arıq, qarabəniz oğlan hamıdan yaxşı geyinmişdi. Hiss edirdim ki, o biri oğlanlar da onunla çox hörmətlə danışırlar. O, bir növ, yoğun səslə yoldaşlarına dedi:

– Mənim dəstəmdəki uşaqlar çox balacadırlar. Onlara hərbi şeyləri nə cür öyrətmək olar?.. Çoxu hələ əlifbanı da bilmir.

Sonra mən Qulamdan öyrəndim ki, bu oğlan Cavanşir xanlığının axırıncı nəsli olan Qafar ağanın oğludur. Qulam mənim marağımı görüb, o biri dəstəbaşçılarını da mənə tanıtdı. Məlum oldu ki, onlar da bəy oğlanlarıdı. Gördüm ki, bu "komandirlərin" içində bir nəfər də fəhlə, kəndli, sənətkar, ya tacir oğlu yoxdur. Heç mənasını özüm də dərk eləmədiyim halda, bu, mənim izzəti-nəfsimə toxundu. Mənə elə gəldi ki, bu bəy oğlanları burunlarını çox dik tuturlar, öz bəyliklərilə açıq-açığına fəxr edirlər. Mən Qaçaq Xanmuradın "yenə də bəy oğlanları meydan sulayırlar" sözlərini xatırladım və məndə kasıblara, adi adamlara qarşı bir qəhmərlik hissi baş qaldırdı. Sonralar o günləri xatırlayanda başa düşdüm ki, sinfi ziddiyyət insanla birgə doğulan bir sövqi-təbiilikdir, insanın özünümüdafiə instinkti kimi bir şeydir. Sonra Qulam yenə də məni aparmağa gələndə getmədim. Səbəbini də heç kəsə demədim. Atam da məni adamdan qaçmaqda təqsirləndirərək danladı.

Bayram babamgilə gələn tərəkəmələrlə deyib danışmaq mənə daha çox xoş gəlirdi, nəinki bəy oğlanları ilə. Mən adi adamların yanında özümü daha sərbəst, daha azad hiss edirdim. Onlar mənə daha yaxın, daha səmimi görünürdülər. Əlbəttə, o zaman səmimiyyətin, yekəxanalığın nə demək olduğunu aydın mühakimə eləyə bilməsəm də, hiss edirdim. Kürdobalı Xaynamaz həftəbazarına gələndə babamgilə düşərdi. (Ümumiyyətlə, Kürdobadan atını minən, – kasıb, dövlətli, – gəlib Bayram babamgilə düşərdi. Hamı da bunu təbii bir hal hesab edərdi.) Mən də onun köhnə Qafqaz yəhərli ağ yabısının üstündən düşməzdim. Yabı da bunu vecinə almayaraq, bağda addım-addım gəzib, özü üçün otlayardı. Əlbəttə, əgər, Xaynamazın əvəzinə bir ağa – məsələn, dayımın dostlarından biri olsaydı, mən onun atına minib bu cür sərbəst gəzməzdim, bu cür ləzzət almazdım.

Dayımdan heç bir xəbər-ətər yox idi. Atam yenə də Bakıya, Rusiya şəhərlərinə ticarət üçün gedəndə onu axtarırdı. Bayram babam isə, nə onu axtarırdı, nə də barəsində bir kəlmə söz danışırdı. Bu da Fatma nənəmi yandırıb-tökürdü.

– Kişi olan kəs, – deyirdi, – o cür oğulun itkin düşməyini vecinə almır.

Fatma nənəm, "o cür oğul" dedikdə, mən təəccüb edirdim. Çünki dayımın Fatma nənəmi necə incitdiyi yadımda idi. Amma, elə bil, onlar arvadın zehnindən tamam silinib getmişdi. O, gündə üç dəfə namaz qılıb, oğluna dua eləyirdi. Onun sağ-salamat qayıtması üçün Allaha yalvarırdı, belə anlarda nənəmə yazığım gəlirdi.

Atam da nənəmə deyirdi:

– Qorxma, ay arvad, Nurunu dəyirmanın boğazından salsalar, ayağından diri çıxar.

Nənəm də uzun müştükdəki papirosundan dərin qullab alaraq, nə üçünsə, atama kinli-kinli baxıb bir söz demirdi.

Mən yenə də girəvə düşən kimi babamgilə qaçırdım. Bir dəfə də onlarda olduğum zaman babamgilin nökəri Bünyad yüyürə-yüyürə gəlib, Fatma nənəmi muştuluqladı.

– Nuru qağa gəlib, odur, Yaqut xanımgildədi.

Yazıq nənəm sevindiyindən bilmədi nə desin. Haçandan-haçana Bünyaddan soruşdu:

– Azarlı-zad döyül ki?

Bünyad dedi:

– Azarlı nədi, əşi, maşallah, laçın kimidi.

Başqa vaxt dayımdan qorxub çəkinməyimə baxmayaraq, onun gəldiyini eşidən kimi yüyürdüm evimizə. Gördüm ki, dayım başında İran qaçaqlarının geydiyi keçə araqçın, əynində sərdari çuxa artırmada oturub çay içir. Məni görəndə gülümsədi.

Anam mənə tapşırdı ki, dayının gəlməyini heç kəsə danışma. Mən bu sözə təəccüb elədimsə də, səbəbini soruşmadım.

## NURU DAYIMIN QƏRİBƏ MACƏRASI

Anamın bişirdiyi cücəli plovu, ətirli dovğanı böyük bir iştaha ilə, ləzzət çəkə-çəkə yeyəndən sonra dayım, balaca armudu stəkandakı çayın rənginə zövq ilə nəzər yetirib anamla, atamla danışmağa başladı:

– Biz, yəni, mən və dostum Alay müsavat ordusunun hesabına ələ keçirdiyimiz tüfəngləri, patronları, tapançaları aparıb İranda satmaq qərarına gəldik. Bunu bizə İranda yaşayan kontrabandtçı bir türkmən məsləhət gördü. Onun xüsusi qayığı vardı. Bakıya, Həştərxana, İrana

gizli mal aparıb gətirirdi. Bizi inandırdı ki, onun köməyi ilə bütün silahları xatasız, əngəlsiz aparıb İran kürdlərinə sata bilərik.

Qaranlıq bir gecədə qayıq İrana doğru yol aldı. Türkmənin özündən başqa da iki nəfər yoldaşı vardı.

Mən Alaya dedim ki:

– Ayıq ol, bunlarda balaca bir kələk duyan kimi üçünü də öldürmək lazımdır.

Alay dedi:

– Doğrudu. Bunu mən də sənə deyəcəkdim.

Bizimlə danışıb sövdələşən türkmən ucaboylu, yaraşıqlı bir oğlan idi. İkincisi də cavan idi.

Onlar bizimlə elə danışıb gülürdülər ki, elə bil, çoxdanın yoldaşlarıydıq. Amma onlardan bir qədər yaşlı olan üçüncüsü isə bizimlə bir kəlmə də danışmırdı. Eyzən bir gözünü qıyıb, papiros çəkirdi, bizim qızıl vəznələrimizə qəribə bir kinlə baxırdı. Qayıq açıq dənizdə xeyli uzaqlaşandan sonra mən çamadandan iki şüşə araq, yemək çıxarıb türkmənlərə təklif elədim ki, bizimlə vursunlar. Cavanlar təklifimizi məmnuniyyətlə qəbul elədilər. Üçüncüsü – yaşlısı yeyib-içmək zamanı nə bir kəlmə danışırdı, nə də bizim üzümüzə baxırdı. Orası da qəribə idi ki, bizimlə sövdələşən cavan türkmən tez-tez öz dillərində ona nə isə deyirdi, amma o, yenə də susub bir kəlmə cavab vermirdi. Biz xeyli içib dəmlənmişdik. Birdən yaşlı türkmənin hərəkəti məni hirsləndirdi. Mənə elə gəldi ki, gözünü qıyıb bizim arağımızı yekəxana bir əda ilə içən bu hərif bizim başımızı nə vaxt kəsəcəyini gözləyir.

Mən qəddimi düzəldib ona dedim:

– Ey dost, niyə ağzına su almısan? Sən ali cəmiyyətdən olan zabitlərin məclisindəsən!

O, gözünü qıyıb, mənə iti bir nəzər saldı, amma yenə dinmədi. Əlindəki qədəhi içəndən sonra qalxıb aralandı. Mən birinci türkməndən soruşdum:

– Sizin bu yoldaşınız niyə dinmir, laldır?

Cavan türkmən dedi:

– Yox, lal deyil, xasiyyəti belədi, fikir verməyin.

– Bu qayığın sahibi odur?

– Xeyr. Bu qayıq bizim üçümüzündü.

Mən çox içmişdim, gözünü qıyıb bizi saymayan o hərifin baş-gözünü əzmək istəyirdim. Əlimi belimdəki onatılanın dəstəsinə qoyub cavan türkməndən soruşdum:

– Yoxsa, o bizim haqqımızda başqa xəyaldadı?

– Xeyr! – deyə cavan türkmən tələsik cavab verdi. – Nə danışırsan, ağa? Sizinlə biz qardaşıq! Siz azərbaycanlı, biz türkmən. Mənim xalaqızımın əri azərbaycanlıdır, Aşqabadda yaşayırlar.

Alay fransızca mənə dedi:

– Çox ağartma.

(Dayım fransız dilini yaxşı bilirdi. Ümumiyyətlə, onda dil öyrənməkdə iti bir yaddaş vardı. Rus, fransız dillərini ana dili kimi bilirdi, fars dilini öz-özünə öyrənib "Şahnamə"ni o dildə oxumuşdu.)

Sonra biz Alayla "Süsən sünbül" mahnısını oxuduq. Sonra mən çamadandan iki şüşə də şərab çıxarıb, cavan türkmənləri yenə də dəvət elədim. Onlar gözüqıyıq türkmənlə nə barədəsə mübahisə edirdilər. Mən təklif eləyən kimi söhbəti kəsib, bizə yaxınlaşdılar.

Mən onların stəkanlarını doldurandan sonra qəsdən amiranə bir tonla gözüqıyıq türkmənə dedim:

– Ey, sən də gəl!

Mən o biri türkmənlərlə olduğu kimi, onunla da rusca danışırdım. Lakin o, mənə təmiz Azərbaycan dilində cavab verdi.

– Sağ ol, ağa. Mən şərab içmirəm.

Mən cavan türkməndən soruşdum:

– Bəyəm, o, azərbaycanlıdır?

Oğlan cavab verdi ki:

– Xeyr, tatdı, Balaxanıdandı.

Külək bizim getdiyimiz istiqamətə əsdiyi üçün qayıq sürətlə gedirdi. Hava yavaş-yavaş işıqlanırdı. Dənizin sakit şırıltısı adama ləzzət verirdi. Alayı yuxu aparmışdı. Özünüz bilirsiniz ki, mən nə qədər içsəm də kefli olmuram. Yatmaq da istəmirdim. Əgər, Alayı yuxu aparmasaydı, səhərə qədər içərdim. Mən birinci dəfəydi ki, dənizdə, özü də açıq qayıqda yol gedirdim. Mən arxası üstə uzanıb, gözlərimi yumaraq, İranda necə kef çəkəcəyimiz haqqında düşünürdüm. Bir də gördüm ki, gözünü qıyıb baxan tat səssiz addımlarla bizə yaxınlaşıb dayandı. Alay bərk xoruldayırdı. Mən də xoruldamağa başladım. Özü də bunu elə elədim ki, hərif mənim qəsdən xoruldamağımı başa düşməsin. O, bir xeyli, guya, dənizə baxırmış kimi dayandıqdan sonra yoldaşlarının yanına qayıdıb dedi:

– Piyandılar, ölü kimi düşüb qalıblar.

Birinci cavan türkmən acıqlı-acıqlı:

– Lazım deyil, – dedi. (Türkmən dili bizim dilə çox yaxın olduğu üçün mən onun nə dediyini başa düşürdüm.)

Gözüqıyıq dedi:

– Sən nə vaxtdan belə molla olmusan?

Sonra əlavə etdi:

– Oğrudan oğruya halaldı.

Qan başıma vursa da, özümü saxlayıb qulaq asmağa davam elədim.

Gözüqıyıq dedi:

– O, sarının (yəni, mənim) təkcə barmağındakı brilyant üzüyünün azı dörd-beş yüz qızıl qiyməti var. Çamadanları da yəqin doludur.

Araya sükut çökdü. Mən usdufca əlimi aparıb onatılanın dəstəyindən yapışdım. Birinci türkmən bu dəfə yavaş səslə dedi:

– Yox... lazım deyil.

Elə bil ki, o, indi tərəddüd keçirirdi. Yenə də qısa bir sükutdan sonra o əlavə elədi...

– Namərdlik olar!

O biri cavan türkmən də nə isə dedi. Lakin mən onun sözünü başa düşmürdüm. Gözüqıyıq hərarətlə dedi:

– Nə namərdlikbazlıqdı?! İki bəy oğlunu cəhənnəmə vasil eləmək namərdlik niyə olur?! Yaxşı, siz əlinizi tərpətməyin, onların işlərini mən özüm bitirərəm.

Sonra pıçıltı ilə dedi:

– Gəlin bəri, vaxt keçir!

Birinci türkmən bu dəfə sanki yuxudan ayılaraq qəti səsdə gözüqıyıq kişiyə bozardı:

– Sənə dedim ki, olmaz!

Mən artıq dayana bilməyərək gözümü açıb dikəldim. Guya, indicə yuxudan ayılıram kimi dedim:

– Deyəsən, biz yaman çox yatmışıq...

Onların heç biri dinmədi. Mən birinci türkməndən soruşdum:

– Görəsən, yolu yarılamışıq?

– Yarıdan keçmişik, ağa! – deyə o, cavab verdi.

Mənim səsimə Alay da oyanıb dikəldi. Mən yavaşca Alaya dedim:

– Əlin silahında olsun.

O, fransızca soruşdu:

– Nə olub?

Mən dedim:

– Gözüqıyıqda xəyanət var.

Bu zaman bizim qayıq balaca bir adanın təxminən üç-dörd yüz metrliyindən keçirdi. Mən qayığın kənarına söykənib papiros çəkən gözüqıyıqdan zarafatyana soruşdum:

– Buradan o adaya üzüb çatmaq olar?

O, görünür, mənim axmaq sual verdiyimi düşünüb istehza ilə gülümsədi:

– Ora, uşaq da üzüb çata bilər.

– Yəni, neçə metr olar ora ki? – deyə mən yenə də sadəlövhlüklə soruşaraq, ona yaxınlaşdım. O, adaya sarı baxıb, saymazyana dedi:

– Neçə olacaq?.. Çox olsa, dörd-beş yüz metr...

– Doğrudan?! – deyə mən qəfil ondan yapışaraq bir anda qaldırıb tulladım dənizə və həmin anda da onatılanı çıxarıb cavan türkmənlərə tuşlayaraq qışqırdım:

– Əllər yuxarı!

Onlar özlərini itirmiş halda əllərini qaldırdılar. Alay da tapançasını onlara tuşlamışdı.

Mən cavan türkmənlərə dedim:

– Əlinizi tərpətsəniz, vuracağam ikinizi də!

Sonra bir gözüm onlarda olduğu halda, qayığa sarı üzən gözüqıyığa dedim:

– Nahaq zəhmət çəkmə, yaxşısı budur, vaxt itirmə, qayıt üz o adaya! Özün də Allahına şükür elə ki, səni quduz it kimi güllələmirəm!

O, ilan dili çıxarıb yalvardı. Dedim:

– Qayıt! Qayıtmasan, öldürəcəyəm.

O, yenə də qayığa sarı üzməyə davam eləyəndə düz qabağına güllə atdım. Gördü xeyr, işin orası deyil, üzünü çevirdi adaya tərəf və bir qədər aralanandan sonra başını geri döndərib, türkmənlərə qışqırdı:

– Ehey, Durdu! Əgər, mənim bir qəpiyimi o yan-bu yan eləsəniz, əlimdən qurtarmazsınız!

Birinci türkmən mənə dedi:

– Ağa, vur onu!

Mən birinci türkmənə dedim:

– İkiniz də silahlarınızı çıxarın, qoyun bura!

O dedi:

– Ağa, hamısı qayıqdadı.

Dedim:

– Yeri göstər!

O, tapançanın qabağında gedib silahlarını çıxarıb qoydu stolun üstünə!

Sonra mən Alaya dedim:

– Bunların ikisinin də qolunu daldan bağla.

Alay başqa şey tapmadığı üçün əl-üz məhrəbasını bıçaqla iki yerə bölərək onların qolunu arxadan möhkəm bağladı.

Birinci türkmən dedi:

– Ağa, vallah, bizdə təqsir yoxdur.

Mən dedim:

– Oturun! Tərpənsəniz, ikinizi də güllələyəcəyik.

– Bəs sövdəmiz?

Mən dedim:

– Necə danışmışıqsa, eləcə də olacaq.

O təkrar dedi:

– Ağa, vallah, bizdə təqsir yoxdur.

Mən sərt səslə dedim:

– Oturun, gözləyin!

Sonra dönüb gözüqıyığın ardınca baxdım. O, artıq adanın üstündə durub bizə tərəf baxırdı. Biz adadan xeyli uzaqlaşmışdıq...

İran sərhədinə yaxınlaşdıqda, biz dənizdə dayanıb gecənin düşməsini gözlədik.

Gecə zil qaranlıq idi. Sahilə bir neçə mil qalmış mən Alaya dedim:

– Aç bunların qolunu.

Sonra özlərinə yenə təkrar etdim ki, əgər, başqa xəyala düşsəniz, öləcəksiniz.

Qərəz, nə başınızı ağrıdım, İranda türkmənlərin tapıb gətirdikləri kürdlərə silahların hamısını qızıl pula satdıq. Türkmənləri danışdığımızdan da artıq razı saldıq. Birinci türkmən haqlarını alıb bizdən ayrılanda yenə dedi:

– Ağa, vallah, biz sizə əl qaldırmaq fikrində olmamışıq.

Mən ona dedim:

– Bilirəm, o gecə tat sizi dilə tutanda mən hamısını eşidirdim, yatmamışdım.

...Alayın əmisi oğlu İstambulda yaşayır. Deyilənə görə, çox dövlətli bir adamdır. Alay mənə də təklif elədi ki, gedək İstambula. Bu gün-sabah Azərbaycanda şura hökuməti qurulacaq, onda qayıdarıq

Azərbaycana. Mən də təklif elədim ki, əvvəlcə gedək Tehranı-zadı gəzək. Alay razı olmadı. Dedi:

– Pulumuz-zadımız qurtarar, qalarıq belə. Yaxşısı budur, buradan xalı-gəbə alıb aparaq Türkiyəyə, həm ziyarət, həm ticarət.

Mən dedim:

– İldə-əyyamda əlimizə bu qədər pul düşüb, qoy əvvəl gedək Tehranı görək.

Xülasə, Alaydan ayrıldım, Tehrana gedib Laləzar xiyabanında ən bahalı mehmanxanaya düşdüm. Əvvəl özümə bir neçə dəst paltar aldım, sonra başladım Tehranın əfsanəli həyatı ilə tanış olmağa... Eh... Bu dünyada əsl kef çəkmək istəyən Tehrana getsin. Elə işlərə rast gəlirsən ki, sonra adama yuxu kimi görünür...

– Nə cür işlərə? – deyə anam maraqla soruşdu.

Atam mənə acıqlandı:

– Dur get o yana... Sənə deməmişəm ki, böyüklərin söhbətinə qulaq asma.

Doğrudur, atam mənə bunu dəfələrlə demişdi, lakin böyüklərin söhbəti mənə həmişə uşaqların söhbətindən maraqlı görünürdü, böyüklərin söhbəti hər zaman mənim üçün təzə idi, mənə məlum olmayan aləmdən idi. Mən durub çıxdım. Xəlvətcə o biri otağa keçib, qulağımı açar yerinə dirəyərək yenə də qulaq asmağa başladım.

Dayım öz şirin bəlağətilə söhbətinə davam edirdi:

– Bir gün Sədi xiyabanında gəzdiyim zaman hiss elədim ki, çarşablı, rübəndli bir qadın məni izləyir. Birdən qəfil dayanıb geri çevrilərək ondan soruşdum:

– Sizə nə lazımdır?

O, yavaş və çox nəzakətli səslə mənə dedi:

– Ağa, əgər, özünüz kimi gözəl, ceyran bir xanımı siğə eləyib bir gecə vaxt keçirmək istəyirsinizsə, ardımca gəlin.

Onun, xanımı mənə oxşatmasına hirslənib soruşdum:

– Kimdi o xanım, siz özünüzsünüz?

– Xeyr, ağa, – dedi, – görərsiniz, təşrif buyurmağınıza heyfsilənməyəcəksiniz.

Mən Tehran küçələrində belə aradüzəldən qadınlar olduğunu bilirdim. Düzü, bu mənə maraqlı bir macəra kimi göründü, ona görə də razılıq verdim.

Biz bir neçə tin keçib, qədim, dar bir küçəyə düşüb bir xeyli gedəndən sonra arvad balaca bir darvazanın qabağında dayanıb, diqqətlə o

tərəf-bu tərəfə baxdı. Sonra dəmir toxmağı üç dəfə usdufca vurdu. Qapını on altı-on yeddi yaşında bir qız açdı. Zalım qızı o qədər gözəl idi ki, mən yerimdə donub qaldım. Heç ağlıma da gəlməzdi ki, mənim siğə eləyəcəyim xanım budur. O da dayanıb mat-mat üzümə baxırdı. Onun alnının ortasında süni bir xal vardı. Başı açıq idi. Uzun, qara hörükləri daldan ayaqlarına qədər uzanmışdı. Biləklərində iri gümüş bilərziklər, başında yəqin ki, süni olan mirvari tac vardı. Biz gül-çiçəklə dolu balaca bir bağçaya girdik. İki-üç otaqdan ibarət birmərtəbə evin ətrafında bişmiş kərpicdən barı vardı. Barı o qədər hündür idi ki, küçədən ancaq evin taxtapuşu görünürdü. Biz çiçəklərin arasındakı cığırdan keçib, balaca otağa girdik. Yerə əlvan xalılar döşənmişdi. Mavi şüşə örtüyün içində neft çırağı yanırdı. Biz içəri girəndən sonra məni gətirən arvad çadra ilə rübəndi çıxartdı. Gördüm bu, təxminən qırx-qırx beş yaşında sağlam, enlikürək, iri gözləri sürməli, qırmızısifət bir arvaddır. Mənalı-mənalı mənə baxıb gülümsədi. Dişləri balta kimi sağlam idi. O, mənim yadıma nağıllardakı cadugərləri saldı. Yanına mitəkkə-yastıq qoyulmuş ipək döşəkcəyə işarə ilə farsca mənə dedi:

– Əyləşin, ağa.

Sonra gözəl qıza dedi:

– Ağaya xidmət elə.

Bayaqdan qızın gözü məndəydi. Arvad ona müraciət eləyəndə mənə elə gəldi ki, qız nəyə görəsə diksinib qorxmuş halda əvvəl qadına, sonra mənə baxdı. Arvadın üzü mənə təəccüblü dərəcədə soyuq, qəddar göründü. Ancaq o, gözünü qızdan çəkib mənə baxanda üzündə yenə yaltaq bir təbəssüm zahir oldu.

– Siz bir qədər məşğul olun, ağa, mən qonşudan mollanı çağırım, siğənizi oxusun.

Mən ondan soruşdum:

– Hanı mənə siğə edilən xanım?

O, qızı göstərib dedi:

– O, sizin qulluğunuzdadır, ağa.

Doğrusu, bu siğə əhvalatı mənə çox maraqlı görünürdü.

– Yaxşı, – dedim, – çağır mollanı.

Qız mənim qabağıma qısaayaqlı, balaca bir stol qoyaraq o biri otaqdan qədim kuzədə şərab, qədəh və balaca bir boşqabda da xuşgəbər gətirdi. Qadın qıza məndən oğrun, mənalı bir nəzər salıb getdi. Qız isə, ayaq üstündə qabağımda dayanıb mənə baxırdı. Mən gülümsəyib dedim:

– Gəl, əyləş.

Ancaq o, yerindən tərpənmədi, mən gülə-gülə ondan soruşdum:

– Sən farssan?

O, başını bulayıb:

– Yox, ağa, – dedi, – mən kürdəm.

Mən öz qədəhimi şərabla doldurub təkrar ona təklif elədim:

– Gəl, əyləş...

O, yenə də yerindən tərpənmədi. Ancaq mən qədəhi qaldırıb ağzıma aparanda o, özünü irəli atıb, əlimdən yapışdı:

– İçməyin, ağa!

Mən dərhal qədəhi yerə qoyub soruşdum:

– Nə olub?

O, mənim sualıma cavab verməyib, həyəcanla pıçıldadı:

– Durun burdan qaçın, ağa. Siz çox cavansınız. Tez olun, qaçın!

Mən qeyri-şüuri hərəkətlə əlimi, həmişə pencəyimin altında, belimdə gəzdirdiyim balaca tapançanın üstünə qoyub sərt səslə soruşdum:

– Nə olub?

O, rəngi ağappaq olmuş halda yenə də dedi:

– Qaçın, tez olun, onlar bu saat gələcəklər.

Doğrusu, "qaçın" sözü mənə toxundu. Belimdə tapança ola-ola bu gözəl qızın gözləri qabağında qorxub-qaçmaq mənə ar gəldi.

Mən ondan soruşdum:

– Neçə nəfərdi onlar?

Qız pıçıldadı:

– İki nəfərdirlər, ağa.

Mən dedim:

– Sən sakit dur. Onlar gələndə heç nə büruzə vermə.

O da vahimə içində pıçıldadı:

– Oy, ağa!

Mən acıqlı-acıqlı əmr elədim:

– Sakit!

Özüm də keçib əyləşdim. Elə bu vaxt əvvəlcə arvad, ardınca da iki kişi gəldilər. Kişilərdən birinin əynində əba vardı, ancaq mollaya oxşamırdı. İkisi də ortayaşlı, sağlam adam idi. İçəri girib məni görəndə onlar da, arvad da, elə bil, bir an nəyə isə təəccüb elədilər. Arvad qəribə bir ifadə ilə əvvəl qıza, sonra da mənim qabağımdakı dolu qədəhə baxdı. Ancaq hərif özünü onda qoymayıb mənə dedi:

– Ağa, icazə verin kəbininizi kəssinlər.
Mən ayağa durdum, tapançanı onlara tuşlayıb sakit səslə dedim:
– Əllər yuxarı! Üçünüz də! Ey, ifritə! Sən də!
Araya ani bir sükut çökdü, mən təkrar etdim:
– Əllər yuxarı!
Onlar əllərini yuxarı qaldırandan sonra əbalı kişi dedi:
– Ağa, bu nə zarafatdı?
Mən qəzəblə onun sözünü kəsib əmr etdim:
– Əlinizi tərpətsəniz, üçünüzü də güllələyəcəm. Çıxın bayıra!
Əbasız kişi dedi:
– Ağa, axı, biz nə günahın sahibiyik?
Mən onların başının üstündən bir güllə ataraq qışqırdım:
– Bayıra! Nə günahın sahibi olduğunuzu zindanda bilərsiniz!
Əbasız kişi dedi:
– Ağayi ajan, haqqınızı alın, gedin. Axı, bizi divanın əlinə vermək-dən sizə nə xeyir?
Arvad da, əbalı kişi də bir-birinə macal vermədən yalvarırdılar. Axırda mən dedim:
– Yaxşı, sizdən əl çəkməyim üçün mənə nə verirsiniz?
Kişilərin ikisi də dönüb arvada baxdı. Arvad dedi:
– Ağa, icazə ver, sandığa yaxınlaşım.
– Gəl! – dedim.
O, əsə-əsə irəliləyib sandıqdan on qızıl çıxarıb mənə uzadanda əlini geri itələyib dedim:
– Bu nədi? Sizin kimi caniləri on qızıla? Heç vaxt!
Sonra alacalanmış gözlərilə üzümə baxan arvada dedim:
– Yüz qızıl!
O, yenə də yalvarmağa başladı:
– Ağa, fəqir adamıq. Məndə o qədər qızıl nə gəzir?
Mən dedim:
– Yüz qızıl! Biri əskik olsa, götürməyəcəm!
O, balaca pul kisəsini gətirib, mənim qabağıma əlavə yetmiş qızıl sayaraq and içdi ki, bundan savayı heç nəyim yoxdur.
Mən qızılları cibimə qoyub, arvada dedim:
– Otağın bayırdan bağlanan açarını ver!
– Nə üçün, ağa!
– Ver! – deyə mən qışqırdım.
– Ağa, açar qapının üstündədir.

Mən qıza dedim:

– Çıx bayıra!

Qız qorxmuş halda üzümə baxıb tərpənmədi. Mən mülayim səslə ona dedim:

– Qorxma, çıx bayıra.

Qız bayıra çıxandan sonra onlara dedim:

– Hələlik! Allahınıza şükür eləyin ki, sizi salamat buraxıram. Ancaq bilin ki, həmişə nəzarət altındasınız. Əgər, bir də belə işlə məşğul olsanız, sizi buraxmayacağam.

Bunu deyib, cəld bayıra çıxaraq qapını daldan bağladım. Sonra qıza dedim:

– Gəl gedək!

– Hara, ağa? – deyə o, həyəcanla soruşdu.

Mən dedim:

– Sən qalsan, bunlar səni öldürərlər. Gedək, neyləmək lazım olduğunu sonra fikirləşərik.

Gəldik mən yaşadığım mehmanxanaya...

Dayım susdu. Bir azdan anam soruşdu:

– Axı, bu kürd qızı orada nə gəzirmiş?

Dayım dedi:

– Özünün nağıl elədiyinə görə, İran kürdlərindən, kasıb bir kişinin beş qızından biri imiş... On dörd yaşı olanda kəndləri gəzib vergi yığan bir nəfər onu görüb, elçi düşüb. Evlənəndən sonra fars onu özü ilə Tehrana gətirib, beş-altı ay saxlayandan sonra boşayıb, qovub. Qız Tehranın küçələrində avara-sərgərdan qaldığı zaman həmin arvada rast gəlib...

Dayım yenə də susdu... Anam soruşdu:

– Sonra nə oldu?

– Sonra mən qızdan soruşdum ki, öz yerlərinə getmək istəyirmi?

O:

– Ah, ağa, – dedi, – əgər, siz məni özünüzə bir kəniz eləsəydiniz, heç yerə getmək istəməzdim...

Mən də dedim ki, tezliklə İranı tərk eləyib gedəsiyəm. Onu özümlə apara bilmərəm. O, çox məyus oldu, hələ ağladı da. Mən onu başa saldım ki, Tehranda qalsa, məhv olar. Qayıdıb öz yerlərinə getsə yaxşıdır. O da naəlac qalıb razı oldu. Mən ona üç-dörd dəst paltar, ayaqqabı aldım. Özünə də xeyli pul verib, yola saldım evlərinə.

Bir qədər sükutdan sonra atam dedi:

– Gərək o arvadla kişiləri verəydin polisə.
Dayım dedi:
– Siz elə bilirsiniz ki, onları cəzalandıracaqdılar? Şahın məmurları rüşvət alıb buraxmayacaqdılar?
Sonra atam zarafatyana dayımdan soruşdu:
– İndi danış görək, necə oldu ki, əlinə bir o qədər pul keçə-keçə bura qəpiksiz gəlib çıxdın?
Deyəsən, atamın sözü bir az toxundu dayıma. O dedi:
– Nə olacaqdı, tacirlik eləməyəcəkdim ki?.. Tehran elə bir kef yeridir ki, bir milyonun da olsa, bir ilin içində çıxıb gedər işinə.
Sonra dayım nəşə ilə söhbətinə davam eləyib dedi:
– Qərəz, nə başınızı ağrıdım, bir də baxdım ki, cəmi beş-altı tümən pulum qalıb, bununla da heç yerə gedib çıxa bilmərəm. Oturub fikirləşirdim ki, neyləyim? Birdən yadıma düşdü ki, atam Şuşada gimnaziyada oxuyanda bizim Kürdobadan onunla bir yerdə Tağı adlı bir oğlan da oxuyurmuş. Bir gün Tağı atamı öyrədir ki, "nə var Şuşada, gəl qaçaq gedək Bakıya. Orda özümüz üçün bir iş tapıb kef çəkərik". Özü də Tağı atamdan iki-üç yaş böyük imiş. Onlar Bakıya qaçandan sonra orası yadımda deyil, nə cür olursa, atam Bakıda Tağını itirir, bir neçə gün orda gəzəndən sonra qayıdır yenə Şuşaya. Hamı Tağını itib-batmış hesab eləyir. Ancaq neçə il sonra Tehrandan kağız gəlir. Məlum olur ki, orda ticarətlə məşğuldur. Bunu xatırlayan kimi getdim Tehrandakı "Qarabağlılar" məhəlləsinə. Bu məhəllədə yaşayanlar vaxtilə Qarabağdan köçüb gələnlər idi. Xeyli soraqlaşandan sonra mənə dedilər ki, parça-çit bazarında Tağı adlı dövlətli bir sövdəgərin mağazası var, bəlkə o ola. Gedib mağazanı tapdım, gördüm cavan satıcılar alver eləyir, amma uzun, qırmızısaqqallı, nurani bir kişi də balaca kətilin üstündə əyləşib, qabağında balaca stəkanda çay, təsbeh çevirir. Satıcılardan birindən yavaşca soruşdum: "Ağayi Tağı budur?" Dedi: "Bəli." Yaxınlaşıb ədəblə, özü də azərbaycanca dedim:
– Salam-əleyküm, Tağı əmi.
Kişi təəccüblə soruşdu:
– Kimsən, bala, hardan gəlmisən?
Dedim:
– Qarabağdan.
Bir qədər diqqətlə üzümə baxıb birdən soruşdu:
– Olmuya Bayramın oğlusan?
Dedim:

– Özüdür.

– Gözlərindən tanıdım, – deyib, kişi qalxıb boynumu qucaqladı.

Bütün qohum-əqrəbadan hal-əhval tutdu, hiss elədim ki, kişiyə qürbət yaman təsir eləyib.

Sonra məni apardı evinə, gördüm məndən də böyük oğlanları var. Dövlət də ki, aşıb-daşır... Qərəz, düz on beş gün məni qonaq saxlayandan sonra soruşdu:

– İndi neyləmək fikrindəsən?

Dedim:

– Heç bilmirəm.

Dedi:

– Məsləhət görürəm ki, qayıdıb gedəsən Qarabağa. Vətəndən həmişəlik ayrı düşmək yaman dərddir, mənim kimi ilişib qalarsan, ata-ananın da yəqin ki, gözü yoldadır.

Mən özüm də qayıtmaq istəyirdim, ancaq bayaq dediyim kimi, pullar çıxıb getmişdi, ona görə də, kişiyə yalan satmalı oldum, dedim:

– Tağı əmi, var-yoxumu mehmanxanada oğurlayıblar.

Qərəz, kişi bəsdir deyincə mənə yol pulu verdi, özümü də təntənə ilə yola saldılar ki, guya, vətənə gedirəm.

Nuru dayım burada bərkdən güldü. Anam soruşdu:

– Bəs gəlmədin?

– Yox, – dayım nəşə ilə cavab verdi. – Əyləşdim faytona, “Qarabağlılar” məhəlləsindən aralanandan sonra faytonçuya əmr elədim:

– Sür Laləzar mehmanxanasına.

Atam dedi:

– Başladın təzədən vur-çatlasına?

Dayım bərkdən güldü:

– Bir də onda ayıldım ki, pulum lap az qalıb. Fikirləşdim ki, daha bu dəfə Tağı əminin yanına getmək olmaz. Vətənə sarı yola düşdüm. Pulum tezliklə lap qurtardı. Saqqalım da xeyli uzanmışdı, baxıb gördüm hamı məni rus bilir. Kimdənsə eşitmişdim ki, İran kimi müsəlman ölkələrində ayrı dindən dönüb müsəlman olana maddi yardım eləyirlər. Mən harada gəldi, dedim ki, rusam, dinimi dəyişib olmuşam müsəlman... “Dinə gəlmisən, ay kafər, behiştə gedəcəksən” deyə məni tərifləyib pul verirdilər, mən də əllərimi göyə qaldırıb onlara dua eləyirdim. Soruşurdular ki, rus olanda adın nə idi? Deyirdim: “Aleksandr”. Deyirdilər: “Bəs, indi döndərib nə qoymusan?” Deyirdim:

"İsgəndər". Öz adımı qəsdən demirdim. Elə ki, bərkdən ərəbcə dua oxuyurdum, başıma toplaşan adamlar elə təəccüblə qulaq asırdılar ki, elə bil, dünyada görünməmiş bir şey eşidirdilər.

Bu minvalla dinə gəlmiş təzə müsəlman gəlib çıxdı Təbrizə. Bir qədər də orada pul yığandan sonra kirayə bir at tutub gəldim İran Şahsevəninə, orada da ki, atamgilin köhnə qonaqlarını tapdım. Onlar da məni pələ ilə keçirdilər bu taya. Bilirsiniz ki, bu saat Arazın daşmış vaxtıdır, pələdə hər dəqiqə batacağımı gözləyirdim. Əhd elədim ki, bu taya salamat çıxsam, düz bir ay oruc tutub, namaz qılacağam...

O zaman orucluq təzə başlayırdı. Dayım, doğrudan da, hər gün oruc tutub, namaz qılırdı. Bu mənə də, atamgilə də çox qəribə görünürdü. Mən həmişə dayımı yoldaşları ilə səhərdən axşamacan oradaburada şərab içib kef çəkən görmüşdüm. İndi onun belə mömin olması çox gülməli idi. O, namaz qılanda Fatma nənəm də arxadan təəccüblə tamaşa eləyirdi. Dayımın iftarı üçün cürbəcür şeylər hazırlanırdı. Babamgilin nökəri onun iftarı üçün ağ tut yığırdı. Dayım bütün günü təsbeh çevirib, namaz qılırdı, dua oxuyurdu, sarı qıvrım saqqalı da getdikcə uzanırdı.

Ancaq bir gün babamgilə gəlib gördüm ki, dayım saqqalını tərtəmiz qırxdırıb, uzunboğaz çəkmələrini, qalife şalvarını geyib, olub əvvəlki kimi gözəl bir oğlan, özü də iki nəfər dostu ilə bağda, ağacların altında qoyulmuş stolun ətrafında oturub, təzə quzu ətinin soyutması ilə şərab içirlər. Möminlik, saqqal, təsbeh də çıxıb gedib işinə...

Sonra mən fikirləşirdim: demək, dayım o kürd qızını xilas eləyib, demək, dayım yaxşı iş görüb. Kürdə pul da verib! O günü də qəribə bir hadisə olmuşdu, dayım bizə gəlib anama dedi:

– Mənə bir az pul ver, indi bazardan gələndə yanında iki körpə uşağı olan dilənçi bir arvada rast gəldim, ürəyim birtəhər oldu, cibimdəki pulun hamısını çıxarıb verdim arvada, uşaqlar üzümə elə baxdılar ki, gözüm yaşardı...

Əgər, dayım belə yaxşı adamdısa, bəs, nə üçün Fatma nənəmi incidir? Nə üçün o vaxt İmaşı o cür döyürdü? Nə üçün Kürdoba cavanlarını başına yığıb gecə başqa obaya hücum edirdi? Nə üçün Əhmədin üç arvadı öldürməyindən o cür kefi kök danışırdı? Hər şey bir tərəfə, axı, o arvadlardan biri bizim qoca nənəmiz idi... Nə üçün Əhmədin, arvadları məhz onun tapançası ilə öldürməyi dayıma vicdan əzabı vermirdi?

Mən bu suallara cavab tapa bilmirdim, ona görə də, mənim təsəvvürlərim alt-üst olurdu, başımda tamam bir xaos yaranırdı, mən fikir-

lərimin bu qarmaqarışıqlığı içində eyzən bir dəstə quldura çomaqla hücum eləyən Məşədi Gülməmməd babanı, cavan ömrünü, uşaqlarına həsr eləyən Səkinə qocanı, Xəlsə qocanı, Xanım nənəni xatırlayırdım, mən, eyni zamanda, öz kefi üçün uşaqlarını başsız qoyaraq çoban Mahmuda qoşulub qaçan, sonra onu o cür öldürən Qızyetəri də xatırlayırdım. Bir tərəfdən, dağ yolunda bizim o cür harayımıza çatan, bizi otaylı quldurlardan xilas eləyən, kasıblara əl tutan, o biri tərəfdən də, özü anama nağıl elədiyi kimi, arvad-uşaqla dolu alaçığı gülləyə basan Qaçaq Xanmuradı xatırlayırdım...

Ancaq mən dumanlı halda əqlimə gələn, mənə xoşagəlməz təsir eləyən bu suallar barəsində heç kəsdən bir şey soruşmurdum, çünki bir dəfə belə bir sual üstündə atam məni danlayıb demişdi:

– Uşaqsan, get uşaq işinə.

Sonra anama xitabən əlavə eləmişdi:

– Bu uşaq çoxbilmişliyindən kökəlib-eləmir də.

## HƏYƏCANLI XƏBƏRLƏR, KÖƏHAKÖƏ VƏ SANDIQ ƏHVALATI

Atamgil Rusiyada qurulmuş fəhlə-kəndli hökuməti barədə indi daha tez-tez söhbət edirdilər. Mən də bu söhbətlərə böyük bir maraqla qulaq asırdım. Mən eşidirdim ki, orada ağalara, böyük tacirlərə divan tuturlar. Hökuməti kasıblar, fəhlələr, kəndlilər idarə edirlər.

Çox qəribə idi ki, kasıbların, Xaynamaz kimi kəndlilərin Rusiyada hökumət başına keçmələri məndə fərəh doğururdu. Elə bil ki, mən özüm yekəxana bəy balalarından nəyinsə qisasını alırdım. Doğrudanmı, bu, həmin bəy oğlanlarının hər yerdə öz bəyliklərini hiss etdirmələrinin nəticəsi idi? Kim bilir, bəlkə buna səbəb ata-babadan, lap ulu babalarımızdan bəri bizim nəslin damarlarında axan rəiyyət qanı idi? Mən anama dedim:

– Yəqin ki, burada da fəhlə-kəndli hökuməti qurulsa, tay bəy oğlanları heylə lovğalanmazlar.

Atam təəccüblə mənə baxıb dedi:

– Bu uşaq ya gicdi, ya əllamə!

Anam dedi:

– Uşağa ad qoyma, gic niyə olur?!

– Görmürsən, yaşından böyük elə danışır ki, elə bil, anadangəlmə bolşevikdi. Tay xəbəri yoxdu ki, burada fəhlə-kəndli hökuməti qurulsa, bunun atasını, babasını gülləleyərlər.

Mən də gözlənilməyən bir ötkəmliklə dedim:

– Sizi nə üçün güllələyirlər? Siz bəy-xan nəslindən döyülsünüz ki?

Atam yenə də təəccüblə baxdı, anam bərkdən güldü. Atam bu dəfə, nə üçünsə, həmişə olduğu kimi acıqlanmayaraq, mülayim səslə izah elədi:

– Bolşeviklər təkcə bəylərin, xanların deyil, bütün varlıların düşmənidir. Deyirlər heç kəs dövlətli olmasın! Hamı Fətiş kimi lüt olsun. (Fətiş atamgilin kəndində ən yoxsul adam idi.)

Mən atamın bu axırıncı sözlərində dərin bir kin hiss elədiyim üçün, ürəyimdə ona inanmayaraq, daha heç nə soruşmayıb, bağçaya endim.

Mən dayımla dostluq eləyən cavan bəylərin atama necə yuxarıdan-aşağı baxdıqlarını hiss edirdim və bu, mənim izzəti-nəfsimə toxunurdu. Eyni halı mən Məşədi Qara kimi milyonerlərin atamla rəftarında da duyurdum. Ona görə də, uzaq Rusiyada Xaynamaz kimi, Fətiş kimi, dayımın döydüyü İmaş kimi yoxsulların hökumət olmaları məndə qəribə, təravətli, hətta, sevincli hisslər doğururdu.

...Bir neçə gündən sonra, axşamçağı artırmada oturub çay içirdik, böyük darvaza döyüldü. Zinyət yüyürüb açdı. Bayram babam, Qızılbaşoğlu Alının və kürdobalı Hacının müşayiəti ilə həyətə daxil oldu. Qızılbaşoğlu ilə Hacı tüfəngli, patrondaşlı idilər. Onlar atlardan düşüb artırmaya qalxdıqda, həmişə mənimlə gülüb-zarafatlaşan Bayram babamın bu dəfə çox tutqun olduğunu hiss elədim.

O, tapançasını açıb pəncərənin qabağına qoyaraq, stul çəkib əyləşdi. Papiros çıxarıb yandıraraq hal-əhvaldan sonra atamgilə dedi:

– Sabah şəhərdən çıxmaq lazımdır.

Atam həyəcanla soruşdu:

– Nə olub, əşi?

Babam papirosundan dərin bir nəfəs alıb dedi:

– Bolşeviklərin on birinci ordusunun hissələri gəlib çatıb Bərdəyə. İki-üç günəcən burada olarlar.

Araya ağır sükut çökdü. Nəhayət, atam soruşdu:

– Düzdür ki, deyirlər, boyu bir metrdən yuxarı olanları qırırlar?

Babam hələm-hələm acıqlanan adam deyildi, sərt ifadə ilə atama dedi:

– Siz də belə axmaq-axmaq sözlərə inanırsınız?!

Yenə də ağır sükut çökdü. Babam bir neçə nəfəs papiros çəkəndən sonra, öz-özü ilə danışırmış kimi, kimsənin üzünə baxmadan acıqlı-acıqlı davam etdi:

– Kəhrizli Ayna xanıma dedim ki, farağat oturun. Camaatı qırğına verməyin, bu selin qabağında durmaq mümkün deyil. Arvad beş yüz atlı ilə Bərdəni kəsdi ki, mən “Qızıl ordunu Qarabağa qoymayacam”. Heylə eləyəndə, əlbəttə, qoşun acığa düşər. Böyük-böyük dövlətlər bolşeviklərlə bacarmır, amma bu arvad beş yüz atlı ilə onun qabağını saxlamaq istəyir...

...Çay-çörəkdən sonra Bayram babam atama dedi:

– Əhmədalını dünən göndərmişəm Kürdobaya ki, sizi şəhərdən çıxarmaq üçün üç-dörd at gətirsin, elə hazırlaşın ki, dan üzü çıxa biləsiniz. Atlar bu gecə burada olacaq.

Atam soruşdu:

– Bəs, mağaza, ev-eşik nə olsun?

Babam dedi:

– Qiymətdə ağır, vəzndə yüngül nəyiniz varsa, götürün. Bu qədər şey-şüyü daşımağa vaxt çatmaz. Hələlik gedərsiniz Şehliyə, görək işlər nə göstərir.

– Bəs, sənin özün neyləmək fikrindəsən, dədə? – anam soruşdu.

Babam dedi:

– Özüm, hələlik, Fatmanı aparıb Kürdobada qoyub qayıdacağam Alxaslıya, qazı Mirzəgilə. Ora Araza yaxındı.

Atam soruşdu:

– Bəlkə o taya keçdiniz?

Babam dedi:

– İş bərkə düşsə, başqa neyləmək olar?

Bir neçə il bundan qabaq öz kəndliləri ilə Rusiyaya fəhləliyə gedən kiçik əmim Zəbi təzəcə gəlib çıxmışdı. O, Rusiyadakı inqilabdan qəribə şeylər danışırdı. Deyirdi, knyazları, burjuyları arabaya qoşurlar (mən sonralar bildim ki, əmim bir az şişirdirmiş), adamlar bir-birinə “tavariş” deyirlər.

Atam anamla məsləhətləşib qərara aldılar ki, Zəbi əmim qalsın bizim evlərdə. Fəhlə olduğu üçün bolşeviklər ona dəyməzlər. Əmim də razı oldu.

Sonra atamla-anam gecə pərdələri salıb qiymətli nələri vardısa, yığdılar böyük dəmir sandığa. Səhər də dolu bir xurcunla həmin sandığı yüklədilər Kürdobadan gələn atlardan birinə. Biz də yəhərli atlara minərək düşdük yola. Evlərimizin hamısı xalı-gəbə ilə, gümüş qab-qacaqla dolu qaldı, həmçinin, atamın mağazası da dolu idi.

Biz şəhərdən çıxanda dan yeri təzəcə sökülürdü. Amma yollar qaçan adamlarla dolu idi. Kimi şey-şüyünü şəllənib, uşağının əlindən tutaraq pay-piyada gedirdi, kimi atlı, kimi arabada.

Atam təəccüblə anama dedi:

– Balam, bütün şəhər bolşeviklərin gəlməyini bilirmiş ki...

Anam piyada qaçanlara diqqət yetirib dedi:

– Qəribədir ki, kasıb-kusub da şəllənib qaçır.

Atam dedi:

– Çox ola bilsin ki, hamı küyə düşüb qaçır, dünən eşitmədinmi kişi nə dedi? Mən də bilirdim ki, bolşeviklər haqqında deyilənlər şayiədir.

Mən atamın izah eləməyinə baxmayaraq, başa düşə bilmirdim ki, bolşeviklər nə üçün, hətta, bəy, xan olmayan tacirlərlə, dövlətli kəndlilərlə də düşməndirlər?

...Biz şəhərin səkkiz-doqquz kilometrliyindəki Şehli adlı kəndə çatıb, Bayram babamın köhnə dostu Həmid yüzbaşının evinə düşdük. Bu, daşdan tikilmiş, bir neçə otaqdan ibarət, kürsülü, üstü qırmızı dəmirli bir bina idi; Həmid yüzbaşı özü evdə olmasa da, adamları bizi çox hörmətlə qarşıladılar.

...Yenə də orada-burada silahlı atlılar peyda olmuşdu. Həmid yüzbaşının qohum-əqrəbasından olan tüfəngli-tapançalı adamlar onun evinə dalbadal gəlib-gedirdilər. Tezliklə mən bu sirrə də vaqif oldum; gördüm atam ev sahiblərindən xəlvət anama danışır ki, Həmid yüzbaşının adamları evlərinə qayıdan müsavat əsgərlərini orada-burada soyub tüfənglərini, patronlarını alırlar, deyəsən, hələ özlərini də öldürürlər.

Anam da həyəcanla deyirdi:

– Yaxşı, tüfənglərini, patronlarını alırlar-alsınlar, bəs, özlərini niyə öldürürlər? Yəqin ki, Həmid yüzbaşı özü burada olsaydı, qoymazdı.

(Biz gələndən bir neçə gün əvvəl Həmid yüzbaşı qoyunlarına baş çəkmək üçün bir neçə atlı ilə yaylağa getmişdi.)

Anam papiros yandırıb əlavə elədi:

– Bəs, onlar yazıq deyillər?

Atamla anam evdə belə danışdıqları zaman Həmid yüzbaşının yaxın qohumlarından olan və qızdırma xəstəliyindən təzə qalxdığı üçün rəngi qaçmış uzun, arıq bir oğlan belində iki patrondaş, əlində tüfəng, iki başqa oğlanla pəncərənin qabağından yüzbaşının külfəti olan hissəyə keçdi. Atam həmin rəngi saralmış oğlana işarə ilə anama dedi:

– Bax, o oğlan yanındakı yoldaşlarıyla dünən gecə bir at yükü əsgər paltarı, tüfəng, patron gətirmişdi. Kim bilir, yazıqların neçəsini öldürüblər, yolda gizlənib pusurlar, əsgərlər gəlib keçəndə qəfil gülləyə tuturlar.

Anam yana-yana dedi:

– Yazıq əsgərlər.

Atam da dərindən nəfəs alıb dedi:

– Bizim millətimizdir də...

Bu əhvalat mənim daxili aləmimə anlaşılmaz bir dərd kimi daxil oldu. Mən hey evlərinə qayıdan cavan əsgərlər haqqında, tüfəngdən, paltardan ötrü onları öldürən rəngi saralmış qızdırmalı oğlan barədə düşünürdüm. Mən evlərində anaları yollarını gözləyən cavan oğlanları qəfil gülləyə tutan həmin rəngi saralmış oğlanın qəddarlığını dərk eləyə bilmirdim. Mən yalquzaq canavarların qəfil hücum eləyib adamları parçaladıqlarını, obadan körpə uşaq apardıqlarını çox eşitmişdim. İnsanın insanı öldürməyi, özü də pul, paltar üstündə öldürməyi, məndə yalnız dərin qüssə deyil, eyni zamanda, ikrah hissi doğururdu. Bu, mənə insanın insanı yeməyi kimi dəhşətli və iyrənc görünürdü. Rəngi qızdırmadan saralmış oğlan mənə ilan kimi zəhərli və soyuq görünürdü. Mən ilandan həm qorxur, həm də iyrənirdim. Mənə elə gəlirdi ki, ilan bütün vəhşi heyvanların ən namərdidir.

...Nə üstündə isə balaca bacım Mahtabı vurub ağlatdığım üçün anam məni tutub döymək istəyəndə qaçıb artırmanın təkyəsindən yerə tullandım və sağ qolumda şiddətli ağrı hiss edərək qışqırdım. Məlum oldu ki, qolum altımda qalıb sınıb. Bu kənddə sınıqçı yox idi, ona görə də atam məni yeddi-səkkiz kilometr aralıdakı Xələfli kəndində olan məşhur sınıqçı Məşədi Mahmudun yanına aparmalı oldu. Həmid yüzbaşının arvadı atama dedi:

– Sən zəhmət çəkmə, uşaqlar apararlar.

Ancaq atam razı olmayaraq, qaçarağı ilə məşhur boz atımızı yəhərləyib minərək, məni də qucağına alıb özü apardı. Qolumun boynumdan asılı olmasına baxmayaraq, at silkələdikcə bərk ağrıyırdı, ona görə də, atam məcbur olurdu bir əli ilə cilovdan yapışsın, digər əli ilə sınmış qolumun altından tutsun. Yəqin ki, qaçaq-quldura rast gəlməmək üçün atam əsas yolla deyil, dərə-təpədən keçərək çölləmə gedirdi.

– Qolun ağrımır ki? – deyə atam tez-tez soruşurdu.

Mən kiçik həyatımda birinci dəfə olaraq atamın səsində özümə qarşı təsirli mehribanlıq və qayğı hiss edirdim və bu, mənim ürəyimi kövrəldirdi.

Biz Xələfli kəndinə girib Məşədi Mahmudun həyətinə daxil olduq. Altmış beş-yetmiş yaşlı bir adam olan Məşədi Mahmud artırmada böyük taxtın üstündə əyləşərək mitəkkəyə söykənib təsbeh çevirirdi, bizi görərkən dikəlib:

– Ay uşaq, qonağın atını tut! – deyə səsləndi.

Atam əvvəl məni usdufca yerə qoydu, sonra da özü aşırılıb düşdü. Cavan bir oğlan uşağı yüyürüb bizim atı tövləyə çəkdi. Əynində atlas arxalıq, başında gümüşü papaq olan Məşədi Mahmud taxtdan düşərək qabağımıza yeriyib, köhnə tanış kimi atamla görüşdü və bizi də taxtın üstündə əyləşməyə dəvət elədi. Atamla ordan-burdan söhbət elədilər. Bolşeviklərin gəlişindən danışdılar. Məşədi Mahmud sakit və qayğılı səslə:

– Gəlsinlər, görək nə deyirlər?

Həmin cavan oğlan bizə çay gətirdi. Sonra Məşədi Mahmud zarafatyana mənə dedi:

– Qoçaq oğlan, göstər görüm qolunu.

Atam mənim qolumu açdı. Məşədi qolumu əli ilə yoxlayanda mən şiddətli ağrı hiss eləsəm də, səsimi çıxarmadım. Dişlərimi bir-birinə bərk sıxıb dözdüm. Məşədi nələrdənsə təpitmə qayırıb qolumu sarıyandan sonra gülümsəyib dedi:

– Bu, doğrudan da, dözümlü oğlanmış...

Sonralar... çox sonralar mən həyatımın kəskin əzablarına dözəndə həmişə sınıqçı Məşədi Mahmudun o sözlərini xatırlayırdım. Görünür, tale mənim gələcəkdə nələr çəkəcəyimi bildiyi üçün mənim lap kiçiklikdən hər cür ağrı-acıya alışmağıma kömək edirmiş. Əlbəttə, birinci növbədə, mənəvi ağrılara...

Biz sınıqçı Məşədi Mahmudun həyətindən çıxanda axşam sərini qalxmışdı. Biz yenə də çölləmə gedirdik. Boz at yaxşı yeyib dincəldiyi üçün (bizim yerlərdə qonağın özünə olduğu qədər də atına qulluq edərdilər) dərələri, təpələri yel kimi çıxıb enirdi. Atam soruşdu:

– İndi necədi ağrısı?

Hələ bərk ağrısa da, dedim:

– Yaxşıdır.

– Məşədi dedi ki, bir az ağrıyıb kəsəcək.

Atamın mülayim danışığı və onun səsində özümə qarşı hiss elədiyim qayğı məni xoşbəxt edirdi və mən öz-özümə fəxrlə deyirdim: “Bax, mənim də atam məni çox istəyir...”

Atam hey ev-eşiyin, mağazanın başına nə gələcəyi barədə danışırdı. Narahat olurdu. Belə anlarda anam ya papiros çəkib biganə bir ifadə ilə ərinin sözlərini təsdiq edirdi, ya da ona qulaq asa-asa tamam ayrı bir şey barədə fikirləşirdi. Mənə isə, anamın belə hərəkəti daha şirin, daha cazibədar təsir bağışlayırdı. Mən öz var-dövləti barədə atamın büruzə verdiyi qayğıda, nə isə, soyuq, tutqun bir şey hiss edirdim. Halbuki mən, uşaq olsam da, var-dövlətin nə demək olduğunu bilirdim. Ancaq mənə elə gəlirdi ki, anamın sağlamlığı, şənliyi, qayğısızlığı mənim üçün dünyada hər cür dövlətdən, qızıldan, puldan sevinclidir.

On birinci ordunun hissələrinin şəhərə çatdığını eşitdiyimiz günün səhəri gördük ki, vaxtilə Bayram babamgilin nökəri, indi isə, adlı qaçaqlardan biri Bahadur öz dəstəsilə gəldi. Anam Qaçaq Bahadur haqqında çox həvəslə danışardı. Onun necə sədaqətli, üzügülər, gözəl oğlan olduğunu söyləyirdi. Mən isə, onu ilk dəfə görürdüm. Ucaboylu, əsmərbənizli və çox yaraşıqlı oğlan idi. Qızılbaşoğlu kimi, Qaçaq Xanmurad kimi birçək saxlamırdı. Qara sıx saçlarını şəhərlilərsayağı vurduraraq geriyə daramışdı. Ayaqlarında təmiz silinmiş uzunboğaz çəkmə vardı. Belinə üç patrondaş bağlayıb, ikisini də çiyinlərindən çalın-çarpaz aşırmışdı.

O, anamla köhnə bir dost kimi görüşüb gülə-gülə onun kefini soruşdu. Atamla, bir növ, rəsmi görüşdü.

Məlum oldu ki, Bayram babam onları göndərib ki, bizi Alxaslı kəndinə aparsınlar. Atam getmək istəmirdi, o istəyirdi biz, heç olmazsa, öz kəndimizə – Güney Güzdəyə gedək. Anam iki ayağını bir başmağa dirəyib qəti razı olmadı. Anamın Güney güzdəklilərdən zəhləsi gedirdi, onları namərd, qəddar hesab edirdi.

Nəhayət, biz atlanıb Alxaslıya gedəsi olduq. Anam mənə işarə ilə dedi:

– Gərək bir adam sarıqlı qolundan ehmal tutsun.

Qaçaq Bahadur dedi:

– Qaqaş bir yaşında olanda həmişə Bahadur dayısının qucağına minərdi, yəqin, indi də minər.

Qaçaqlardan biri məni qaldırıb qoydu Qaçaq Bahadurun qucağına. Qaçaq Bahadur da mənim sarıqlı qolumdan yapışaraq atını mahmızlayıb düşdü qabağa.

Yollar atlı-tüfəngli adamlarla dolu idi. Hər yerdə hökumətsizlik bilinirdi.

...Biz Alxaslı kəndində babamın köhnə dostu, qazı Mirzəlinin evinə düşmüşdük. Alxaslı da Kürdoba kimi tərəkəmə idi. Əhalinin çox hissəsi hələ mayın on beşindən yaylağa köçmüşdü. Qazının da qoyun-quzusu yaylaqda idi, ancaq, görünür, son hadisələrlə əlaqədar olaraq, özü və arvad-uşağı hələ yaylağa köçməmişdi. Qazının dörd oğlu var idi. Qızı isə, bizim şəhərin lap yaxınlığındakı Şahbabalı kəndində Ədil bəy adlı oğlana ərə getmişdi. Ədil bəy də atamın yaxın dostu olub, ticarətlə məşğul idi.

Qazının böyük oğlu Mirzə Sadıq mollalığa hazırlaşırdı. Qısa vurulmuş qara saqqalı və molla papağı vardı. Ayaqlarına qədər uzanan arxalığının üstündən ağ qurşaq bağlamışdı. Kiçik oğlu Sərdar isə məndən üç-dörd yaş böyük olardı. Qazının evi kənddə, daşdan tikilmiş yeganə üstü dəmirli, böyük, ikimərtəbəli bina idi. Evin alt tərəfindən Köndələn çayının bir qolu axırdı. Qazı ağanın üç yüzə qədər inəyi sağılırdı. Bütün Arazboyu kəndləri kimi, Alxaslı da çox isti yer idi. Bütün günü isti çəkirdik. Qazının kiçik oğlu Sərdar məni aparırdı arxın qırağına. Arxın üstünə bir tir qoyulmuşdu. Sərdar məni də qucağına götürüb tirin üstü ilə yüyürə-yüyürə o tərəf-bu tərəfə keçirdi. Bir dəfə məni yerə qoyub dedi:

– İndi özün tirin üstüylə yeri görüm.

Mən özümü nə qədər bərkişdirdimsə də, tirin üstü ilə arxı keçməyə cəsarət etmədim. Sərdar qəhqəhə ilə gülüb:

– Ə, bu şəhər uşaqları nə qorxaq olurlar, – dedi və bir neçə dəfə tirin üstü ilə yüyürə-yüyürə o tərəf-bu tərəfə keçdi.

...Başda babam olmaqla, Arazqırağı kəndlərinin, obalarının, demək olar ki, bütün adlı-sanlı adamları gündüzləri "Şıpartı" deyilən çöldə daldalanıb, gecələr qasid vasitəsilə hələlik bolşeviklərin Alxaslı tərəfə üz qoymadıqlarını öyrənib, gəlirdilər qazı Mirzəlinin evinə. Burada qoyunlar kəsilir, samovarlar qoyulurdu. Onların içində necə olmuşdusa, Nuru paşanın ordusundan ayrılıb qalmış Kazım bəy adlı bir zabit də vardı. Dəstənin sayı getdikcə artırdı. Hər gün qazının evində iki-üç erkək kəsilirdi. Gecələr kəndin aşağı tərəfindən, şəhərə gedən yolun üstündə qarovolçu qoyub, həyətdə salınmış xalı-gəbənin üstündə əyləşərək, yeyib-içir və eyzən bolşeviklər barədə həyəcanla danışırdılar.

Qazının böyük oğlu Molla Sadıq isə, gündüzlər uzun bir ağacın başına bir parça ağ bağlayaraq bayraq qayırıb, səhərdən axşamacan evin qabağındakı təpənin üstündə əyləşirdi ki, bolşeviklər gələndə lap uzaqdan görsünlər ki, kənd əhli ağ bayraq qaldırıb onları gözləyir. Cavan Molla Sadığın bu hərəkəti anama çox gülməli görünürdü. Anam ona sataşaraq deyirdi:

– Bolşeviklər mollalarla da düşməndirlər, gərək saqqalını qırxdırıb, paltarını da dəyişəsən.

Molla Sadıq da fasıq-fasıq gülümsəyib, heç bir söz demirdi və onun bu təbəssümü ikiüzlü bir hərəkət kimi mənə pis təsir eləyirdi. Ona görə də, mən cavan mollanı sevmirdim, istəyirdim ki, bolşeviklər gəlib onu məhşər ayağına çəksinlər, görək onda da belə fasıq-fasıq güləcəkmi?!

Mən ikiüzlü gülüşü, ikiüzlü hərəkəti, danışığı hiss edirdim, bəzən mənasını başa düşməsəm də, hiss edirdim. Məhz bunun üçündür ki, atam bəylərlə, böyük vəzifə sahibləri ilə hörmətlə danışanda acığım tuturdu. Mən bilirdim ki, atam bəyləri sevmir. Daldada onları "ciblərində siçan oynayan, yekəxana, müftəxor cənablar" adlandıraraq lağa qoyurdu. Mən onu da hiss edirdim ki, anamın bəylərlə hüsn-təvəccöhi atama qətiyyən xoş gəlmir.

Alxaslıya gələndən bir neçə gün sonra Bayram babam gecə bizim yanımıza gələrək atama dedi:

– Məsləhət belədir ki, Güney Güzdəyə gedəsiniz. Ora sizin üçün buradan qorxusuz olar.

Atam soruşdu:

– Nəyə görə?

Babam dedi:

– Ona görə ki, bura qazı Mirzəlinin evidir. Amma Güney Güzdəkdə sənin qardaşın ayağı çarıqlı kəndli babadır. Bolşeviklər ona toxunmazlar. Siz də paltarlarınızı dəyişib sadə kəndli paltarı geyərsiniz. Aralıq sakit olana qədər orada qalarsınız.

Anam soruşdu:

– Bəs, siz neyləyəcəksiniz?

Babam qaşlarını çatıb, artırmadan görünən Cənubi Azərbaycan dağlarına baxaraq dedi:

– Biz o taya keçəcəyik.

Anam soruşdu:

– Hamınız?

Babam gözlərini o taydan çəkməyərək dedi:
– Hamımız.
Sonra əlavə etdi:
– Hazırlaşın, Qaçaq Bahadur səhər tezdən sizi aparsın Güney Güzdəyə.
...Qaçaq Bahadurla üç yoldaşı qabaqda, biz də onların ardınca hər yerdə şose yoldan kənar, çölləmə gedərək axşamçağı çatdıq Güney Güzdəyə.
Qubad əmim:
– Hə, deyəsən, "yoldaşlar"dan ürküb yayınmısınız, – deyə zarafat elədi.
Mən onda qəribə bir ruh yüksəkliyi hiss elədim.
Anam istehzalı təbəssümlə dedi:
– Deyəsən, "yoldaşlar"ın gəlməyinə sevinirsən?
Qubad əmim dedi:
– Niyə sevinməyim, "yoldaşlar" mənim kimi ayağı çarıqlıların hökuməti deyil?!
Anam ona kinli bir nəzər salıb dedi:
– Yoxsa, elə bilirsən onların vaxtında əfsər çəkməsi geyəcəksən?
Qubad əmim eyni ruhla dedi:
– Mən geymərəm, oğlanlarım geyərlər.
Anamın dodaqları ağardı. O, həmişə bərk acıqlananda belə olurdu, atam zarafata salıb dedi:
– Qubad çoxdanın bolşevikidir.
Mən düşünürdüm:
"Qubad əmimin də, Zəbi əmimin də dövlətlilərlə arası yoxdur. Nə üçün bunlar da atam kimi dövlətli olmağa çalışmayıblar? Fatma nənəm həmişə deyir ki, Allah birinə dövlət verib, birinə zillət... Nə üçün atamgilin yeznəsi – başı çiyinlərinin arasına girən, balaca gözləri hiylə ilə baxan gödək Əbdüləzizə Allah dövləti versin, amma atamgilin başqa qohumu – İdris adlı ucaboy, xoşsifət, yaraşıqlı oğlana verməsin?"
Bu, mənim həyatda hiss elədiyim birinci böyük ziddiyyət idi. Mən bu ziddiyyətin mənasını başa düşmədiyim üçün bir şübhə, key bir anlaşılmazlıq içində olurdum. Düşünürdüm ki, bəlkə Əbdüləziz kişi eybəcər dona girmiş mələkdir? Axı, bizim nağıllarda mələk kimi gözəl, günahsız qızlar, oğlanlar bəzən meymun, qurbağa donuna girirlər. Ancaq onlar bu donda istədikləri adama yaxşılıqlar edirlər. Əbdüləzizdən isə kim bir yaxşılıq görüb?

Biz təzə paltarlarımızı çıxarıb köhnə paltar geyindik ki, kənd əhlindən seçilməyək. Anam nimdaş kəndli paltarında mənə çox qəribə görünürdü. Atam da gümüşü papağını saçaqlı kəndli papağı ilə əvəz eləmişdi. Bahalı şibilit çəkmələrini çıxarıb ucuz çust və köhnə kəndli arxalığı geymişdi, bununla belə, o, gecə evdə yatmağa cəsarət eləməyərək, yeznəsi Əbdüləziz ilə qohumları Məhəmməd bəylə və kəndin başqa varlıları ilə gedib kəndin kənarındakı bağlarda qalırdı. Bizə xəbər çatdı ki, Bayram babamgil də keçiblər Arazın o tayına.

Bizim kəndin yoxsulları dəstə-dəstə orada-burada toplaşıb, nə haqdasa hərarətlə danışırdılar. Anam onlara acıqlı-acıqlı baxıb dedi:

– "Yoldaşlar"ı gözləyirlər.

Nəhayət, bir gün kimsə şəhərdən xəbər gətirdi ki, "yoldaşlar" gəlirlər!

Kəndin kasıb cavanları şəhərdən gələn şose yolun alt tərəfindəki yola yığılaraq, səs-küylə danışıb gözləyirdilər. Atamgil əkilmişdilər bağlara. Anam evimizin yola baxan arxa eyvanında oturaraq, papiros çəkib yola tamaşa edirdi. Birdən atlar qoşulmuş balaca arabalar, onların da ardınca bir dəstə əsgər göründü. Ayaqyalın, başıaçıq, cındır paltarlı kənd uşaqları şən səs-küylə yüyürürdülər onlara tərəf. Doğrusu, bolşeviklər haqqında çox qorxulu söhbətlər eşitməyimə baxmayaraq, mən də onların qabağına yüyürmək istəyirdim. Onlar gəlib bizim arxa eyvanın qabağından keçdikcə, mən görürdüm ki, heç kəsə kinli, acıqlı baxmırlar, gülümsəyə-gülümsəyə kənd uşaqlarına kişmiş verirlər. Birdən kəndin ən kasıb adamlarından olan və qoluna qırmızı parça bağlamış Cavad bərkdən qışqırdı:

– Yaşasın Şura hökuməti!

İki zurna-balaban çalan da, nağara vuran da çala-çala əsgərlərin qabağına yeridilər. Uşaqlarını aclıqdan pencərlə yaza çıxaran Səadət arvad ortalığa düşüb oynadı. Muzdur Veysəl süzə-süzə onun qabağına yeridi, uzun zaman Rusiyada fəhləlik eləmiş Cavad da, nə isə, başqa bir hava çaldırıb ruslar kimi oynadı. Bunu belə görən cavan əsgərlər də ona qoşuldu. Bütün kənd axışıb gəlirdi. Qoluna qırmızı bağlamış Cavad daşın üstünə çıxıb bərkdən dedi:

– Camaat, görürsünüz ki, qırmızı ordunun əsgərləri adam kəsənzad döyüllər! Onlar da bizim kimi yoxsul kəndli-fəhlə oğlanlarıdı! Amma burjuylar onların haqqında yüz cür söz çıxarırdılar!

Kimsə qışqırdı:

– Məhv olsun burjuylar!

Sonra, ortaboylu, enlikürək bir komandir danışdı, Cavad onun sözlərini kəndlilərə tərcümə elədi:

– Yoldaş komandir deyir ki, biz sizin qardaşlarınızıq. Biz gəlmişik ki, sizin torpağınızın yiyəsi olmağınıza, azad yaşamağınıza kömək eləyək. Bizim rəhbərimiz yoldaş Lenin demişdir ki, torpaq kəndlinindir!

Bunu deyəndə bütün izdiham hərəkətə gəldi. Veysəl qışqırdı:

– Yaşasın Şura hökuməti!

Əsgərlərdən biri Leninin şəklini yuxarı qaldırdı. İzdiham bir saniyə sakit olub şəkilə baxdı.

– Sonra komandir deyir ki, qoy hər kəs öz təsərrüfatı ilə məşğul olsun. Biz fəhlə-kəndli hökumətiyik, heç kəs öz halal zəhmətilə yaşayan adama gözün üstə qaşın var deyə bilməz! Hökumət adamlarını siz özünüz öz içinizdən seçəcəksiniz!

Sonra əsgərlər bizim evin yaxınlığında olan keçmiş dəftərxana binasına tərəf getdilər, camaat da onların ardınca.

Qızıl ordu hissəsi bizim kənddə kiçik bir dəstə qoyaraq Cəbrayıl nahiyəsinə tərəf yoluna davam etdi. Bu hissə kənddə olan müddətdə atamgil gündüz də evə gəlmirdi.

Arabaları, yemək sursatları bizim evin yanında dayanan əsgərlərin yanına mən də gedirdim. Onlar öz dillərində bizimlə zarafatlaşırdılar, bizə kişmiş verirdilər. Mən, başqa zaman öz evimizdə bahalı konfetləri, şokoladları yemək istəmədiyim halda, indi bu tozlu-torpaqlı kişmişi həvəslə yeyirdim. Mən, kim bilir, haralardan gələn bu zarafatcıl oğlanlara qarşı özümdə qəribə bir səmimiyyət duyurdum və atamgilin bunlardan qorxub evə gəlməmələri mənə pis təsir edirdi. Çünki mən də özümü bu kəndli uşaqları kimi onlara yaxın hiss eləyə bilmirdim. Mənə elə gəlirdi ki, mən bu cavan əsgərlərdən də, onların başına toplaşan bu uşaqlardan da tamam ayrıyam. Elə bil ki, mən azıb bura düşmüş yad bir quş idim. Elə bilirdim ki, onlar atamın onlardan qaçıb bağda gizlənmiş olduğunu eşitsələr, mən xəcalətimdən ölərəm.

Atamgil bütün qiymətli şeylərini, qızıl-mızıllarını yığdıqları böyük dəmir sandığı Qubad əminin məsləhətilə, ulu babamgildən qalmış və indi içində barama saxlanan qədim damda gizlətmişdilər. Əldə elə bir qiymətli şey qalmamışdı ki, anam bu kənddə yemək şeylərinə dəyişsin. Qubad əmimin arvadının anamı görməyə gözü olmadığı üçün inəklərinin, camış-larının yavanlığından bizə bir tikə də vermirdi. Ona görə də, mən birinci dəfə olaraq, yoxsul yaşamağın zərbəsini hiss eləməyə başlayırdım. Bacım ağlayıb konfet istəyirdi, ət xörəyi istəyirdi.

Anam bütün günü əsəbilik keçirirdi. Atam da bütün günü bağda gizləndiyi üçün heç bir şey eləyə bilmirdi. Bayram babamgildən də heç bir xəbər yox idi. Rəng-rufu sapsarı, arıq, azardar bir qadın olan əmim arvadı, demək olar ki, hər gün bir şeyi bəhanə eləyib anamla dalaşırdı. Bizi kənddə olan əsgərlərlə hədələyirdi:

– Çox o yan-bu yan elərsiniz, – deyirdi, – gedib bolşeviklərə xəbər verərəm ki, bunlar burjuydular, gəlib burada paltarlarını dəyişib gizləniblər.

Əgər, mənim anam bu əmim arvadına bir pislik eləmiş olsaydı, fikir edərdim ki, o, qisas alır. Çünki mən qisasın, intiqamın nə demək olduğunu artıq bilirdim. Ancaq anam ona heç nə eləməmişdi. Elə isə, bu əmim arvadının hərəkətini nə ilə izah eləmək olardı? Atamgil məni hər nə qədər "əllamə" adlandırsalar da, mən əmim arvadının anama qarşı qəzəbinin sirrini anlaya bilmirdim.

...Nahəyət, aralıq tamam sakit oldu. Hamı bildi ki, dinc duran adamla bolşeviklərin işi yoxdur. Bir gün biz də hazırlaşdıq ki, gedək şəhərə, evimizə. Atam da artıq üzə çıxmışdı. Atamın xahişilə Qubad əmim gedib damdakı sandığımızı gətirəndə gördük ki, sandıq tamam boşdur. Sındırıb içində nə varsa, hamısını aparıblar. Atamla anam qorxu və təəccüblə bir-birinə baxdılar. Anam Qubad əmimdən soruşdu:

– Hanı bunun içindəkilər?!

Qubad əmim dedi:

– Mən nə bilim hanı?

– Sandığın yerini səndən başqa bilən yox idi.

Qubad əmim dedi:

– Mənim heç nədən xəbərim yoxdu!

Atam çıxarıb papiros bükdü.

Anam rəng-rufu qaçmış halda əmimə dedi:

– Şeyləri necə götürmüsənsə, heylə də gətir!

Qubad əmim bozardı:

– Sənə dedim ki, bizim xəbərimiz yoxdu!

Anam dedi:

– Başın bədəninə ağırlıq eləməsin, Qubad, get şeyləri gətir!

Birdən əmim özündən çıxdı:

– Kimi hədələyirsən, məni, az?! Getdi Bayram bəyin qaçaq-quldurு başına yığıb meydan suladığı vaxtlar! Allaha and olsun, o yan-bu yan elərsən, gedib əsgərləri gətirərəm, hamınızı qılıncdan keçirərlər. Cəhənnəm olun, çıxın gedin xarabanıza!

Qubad əmim belə deyib getdi.

Anam qəzəblə atama dedi:

– Axı, bütün var-yoxumuz o sandıqdaydı! Qardaşın bizi dilənçi kökünə saldı. Niyə dilini tərpətmirsən?

Atam təmkinlə dedi:

– Dinməyin mənası yoxdur. Eşitmədin nə dedi?

Sonra atam başqa qohumlarından birinin öküz arabasında bizi gətirdi şəhərə.

Yol uzunu mən eyzən atamla Qubad əmim barədə fikirləşirdim. Həyatımda birinci dəfəydi ki, mən qardaşlar arasında belə münasibət görürdüm. Fatma nənəm, qardaşlarının Məlikməmmədi aldadıb qırx arşın quyuya saldıqlarını nağıl eləyəndə mən inana bilmirdim. "Adam da qardaşını quyuya salarmı?" deyirdim. Fatma nənəm də uzun müştüyündəki papirosundan dərin bir qullab alıb deyirdi: "Vələdüzna qardaş salar!" Sonra da başlayardı Eyvaz əminin Bayram babamı dilə tutub, kişinin qazancını "kamına çəkməsi" barədə yana-yana danışmağa.

Atamla Qubad əmimin qardaş olmaqları da mənə təəccüblü görünürdü. Fikirləşirəm ki, görəsən, bunlar uşaqlıqda bir-birilə necə rəftar edirmişlər? Onda da Qubad əmim öz qardaşının şeylərini belə götürürmüş? Mən "oğurlayırmış" deyə bilmirdim, çünki qardaşın qardaşdan oğurluq eləməyi mənə Məlikməmmədi qardaşlarının qırx arşın quyunun dibinə salmaları kimi dəhşətli və ağlasığmaz görünürdü. Mən onu da hey fikirləşirdim ki, bəlkə anam səhv edir? Bəlkə sandığın yarılmasından, doğrudan da, əmimgilin xəbəri yoxdur? Ancaq bir həqiqət vardı ki, sandıqdakı şeylərin getməyi, anam deyən kimi, bizi tamam yoxsul bir vəziyyətə saldı.

## TƏZƏ GÜNLƏRİN TƏZƏ ƏHVALATLARI

On birinci ordunun bir batalyonu bizim evlərdə yerləşmişdi. Otaqların ancaq birini vermişdilər bizim, guya, "nökərimiz" olan Zəbi əmimə. Biz də həmin otaqda yerləşdik. Evdə qoyub getdiklərimizdən heç bir əsər-əlamət qalmamışdı. Atamın keşişdən aldığı mebelləri də sındırıb dağıtmışdılar.

Qərəz, demək olar ki, biz lat-lüt qalmışdıq. Mağazadakı şeylərdən də əsər qalmamışdı. Zəbi əmim deyirdi ki, "kəndlilər gəlib şeyləri müftə aparıblar". Bunun nə dərəcədə doğru olub-olmadığını aydınlaşdırmaq mümkün deyildi.

Anam deyirdi ki, Zəbi yalan danışır. Heç kəs atama görə bizim şeyimizi müftə aparmaz. Mağazanın şeylərini də, evdəki xalı-gəbələri də Zəbi yeyib, üstündən su içib.

Batalyon komandiri yaxşı oğlan idi. Bizə düyü, çörək, kişmiş verirdi. Mənimlə, bacımla zarafat edirdi. Bəzən bizi özləri ilə bir stolda oturdub "kaşaya" qonaq edirdi. Vaxtilə anam cücə plovu, ceyran ətinin kababını bizə zorla yedirdirdi. Amma indi bu duzsuz-dadsız çovdar aşını biz elə şirin-şirin yeyirdik ki, komandir aşpaza əmr edirdi ki, boşqabımıza bir az da əlavə eləsin.

Mən bu komandirin də, cavan əsgərlərin də yanında indi özümü olduqca sərbəst və necə deyərlər, ruhlu hiss edirdim. Batalyon komandiri ortaboylu, enlikürək və çox sağlam bir oğlan idi. Biz gələndən bir neçə gün sonra malyariya tutmuşdu, bərk titrədib-qızdırırdı. Titrədəndə şineli, adyalı üstünə töküb, dişləri bir-birinə dəyə-dəyə zarafatla mənə deyirdi:

– Bir gör ha... Sizin yer necə yerdi... Heç Sibirdə – əlli dərəcə soyuqda mən belə titrətmirdim, amma bu istidə titrədirəm.

Anam çay dəmləyib çayniki mənə verirdi, mən də aparıb stəkana tökərək qoyurdum onun qabağına. O da qızdırmaya düşəndə bu çayı ləzzətlə içib tərləyirdi.

Bizim köhnə dostumuz doktor Quliyev gəlib ona iynə vururdu. Komandirin, gözündə eynək olan, qısaboylu, arıq bir yoldaşı da vardı ki, onunla bir otaqda qalırdı. Bir gecə iki nəfər əsgər gəlib atamı apardı. Gözlədik, atam gəlmədi. Səhər anam komandirdən soruşdu ki:

– Bu nə əhvalatdı?

Komandir dedi:

– Bu, Voronov yoldaşa (yəni, həmin eynəkli komandirə) aid işdir.

Zəbi əmim öyrənib bildi ki, kimsə atamı şeytanlayıb ki, guya, o, böyük kapitalist olub, zülmkar olub. Bizim dostumuz doktor Quliyev həmişə komandirə iynə vurmağa gələndə bizə də baş çəkirdi. Bu dəfə də gələndə anam əhvalatı ona nağıl elədi. Doktor da həmin eynəkli komandiri inandıra bildi ki, tutduğunuz adam, bir az varlı olsa da, nə kapitalist olub, nə də zülmkar. Eynəkli komandir də doktorun sözünə inanıb, atamı buraxdı.

Mən birinci dəfəydi ki, "şeytanlamaq" sözünü eşidirdim və təəccüb edirdim ki, nə üçün insan şeytana çevrilir? Fatma nənəm kor şeytan haqqında mənə çox nağıllar danışmışdı. Fatma nənəm demişdi

ki, şeytan da bir zamanlar mələklərdən biri imiş. Bir gün Allahın ona qəzəbi tutur və şeytanı lənətləyərək qovur. İndi o vaxtdan bəri şeytan da Allahın yaratmış olduğu insanlara daim pislik eləməklə ondan intiqam alır. Mən təəccüb edirdim ki, nə üçün hər şeyə qadir olan Allah şeytanın bu qədər pis işlər görməsinə yol verir? Nə üçün bir ildırım çaxdırıb şeytanı kül eləmir?! Mən bunu soruşanda Fatma nənəmin acığı tuturdu: "Allahın işinə əl aparmaq olmaz!" deyə məni qovlayırdı.

Fatma nənəm deyirdi ki, şeytan insan qəlbinə girib, onu yoldan çıxarır. İnsan da pis işlər görür.

Mən, şeytanın yorulmaq bilməyən bu hərəkətlərində axmaq bir mənasızlıq hiss edirdim və bunu heç kəsə demirdim. Mən başqasını incitməkdə heç bir ləzzət görmürdüm. Əksinə, belə hərəkətlər, mənim duyduğum xarici aləmə bir soyuqluq, bir qüvvət verirdi. İndi mən fikirləşirdim ki, bəlkə atamı mənimlə həmişə sərt rəftar eləməyə, məni danlamağa sövq eləyən şeytandır? Axı, mənim qolum sınanda və ya mən xəstələnəndə atam mənimlə mehriban olurdu? Mənə təzə paltar alırdı. Mən bu lənətə gəlmiş şeytana nə pislik eləmişəm?! Mənim atam, onu qırmızı komandirə şeytanlayıb tutduran adama nə pislik eləyib? Bilirdim ki, o, heç kəsə pislik eləyən adam deyil. Mən fikirləşirdim ki, yəqin, şeytan uşaqlıqda heç də pis işlər görməyib. Yadımdadır, bacım Mahtab yeddi-səkkiz aylıq körpə olanda bir dəfə yuxuda gülümsədi. Anam dedi ki, "körpə yuxuda mələkləri gördüyü üçün xoşallanıb gülümsəyir..." Mən Leninin gülümsəyən şəkillərinə maraqla baxırdım. Mən artıq bilirdim ki, padşahı taxtdan çəkib salan (mən o inqilabı belə də təsəvvür edirdim) Lenindir. Padşahın qoşunları ilə dava eləyən fəhlə-kəndli ordusunun komandiri də Lenindir. Şəklini görənə qədər mən Lenini, Fatma nənəmin nağıllarındakı yenilməz nəhəng Rüstəm Zal kimi bir qəhrəman təsəvvür edirdim. Sən demə, bu da doktor Quliyev kimi qalstuk bağlayan, gülümsər üzlü bir kişi imiş... (Doktor Quliyev də həmişə məni görəndə, bax, bu cür, Lenin kimi gülümsəyirdi.) Bu, məndə mənasını dərk eləmədiyim bir fərəh doğururdu. Mən də anamdan bir parça ipək qırmızı lent alıb, bolşevik kimi sol döşümə sancırdım. Atam mənim qırmızı lentimə baxıb gülümsəyirdi və öz dostlarına zarafatyana deyirdi ki, bizim bu oğlumuz bolşevikdir! Səhərdən axşamacan Leninin şəklini çəkir. Mən də bu sözlərlə fəxr edirdim. Bolşeviklər kimi geyinməyə çalışaraq, evimizdə olan həmin komandirin dolağından xəlvətcə kəsib qılçama dolayırdım. (O zaman

əsgərlərin də, komandirlərin də çoxu boğazlı çəkmə əvəzinə kobud ayaqqabı geyib, dolaq dolayırdılar.) Sonra anamdan xahiş elədim ki, əsgərlər kimi mənə də şiş papaq tikdirsinlər. O özü mənə ot rəngli parçadan şiş papaq tikdi. Mən dedim:

– Qırmızı parçadan beşguşəli ulduz kəs, tik papağın qabağına.

Anam bu dəfə mənə acıqlanıb dedi:

– İtil o yana.

Atam ömründə birinci dəfə olaraq mənim tərəfimi saxlayıb, anama dedi:

– Yaxşı də... tik deyir, tik!

Anam mənim şiş papağıma beşguşəli ulduz da kəsib tikdi. Mən komandirin dolağından kəsdiyim parçanı doladım qılçama, qırmızı ipək lent sancdım döşümə, şiş papağı da qoydum başıma. Oldum qırmızı komandir. Bu, mənim həyatımda yeni bir həvəs idi. Mən özümdə fərəh və gümrahlıq hiss edirdim. Mənim üçün bu aləmdə ən maraqlı cəhət bir də o idi ki, atam mənim bu cür "qırmızı komandir" olmağımdan xoşhal görünürdü. Hətta, Sərrac Qafara mənim üçün enli bir komandir kəməri də tikdirdi.

Burası da qəribə idi ki, bütün otaqlarımızda, mağazalarımızda, qoyub getdiyimiz şeylərin tamam dağılıb getməsinə baxmayaraq, mənə elə gəlirdi ki, atam bolşeviklərə heç də düşmən kimi baxmır. Mən onda bolşeviklərə dərin kin hiss eləmirdim. Axşamlar atam həmin malyariya tutan komandirlə saatlarca oturub söhbət edirdi. Mənə elə gəlirdi ki, atamın bolşeviklərə kin bəsləməməyinini əsas səbəbi onun böyük kapitalistlərə, xüsusən bəylərə qarşı düşmən münasibəti idi. Kim bilir, bəlkə o zaman sovet idarələrində atama bir qulluq təklif eləsəydilər, o, buna məmnuniyyətlə razı olardı... Bəlkə lap kommunist partiyasına da daxil olardı. Lakin belə bir təklif heç kəsin ağlına da gəlmirdi. Atam isə, daim qorxu içində idi. Daim özünün bu gün-sabah həbsə alınacağı barədə düşünürdü. Atam anamla eyzən bu barədə söhbət edirdi. Anam sovetlərə qarşı tam barışmaz idi. Bir vaxt ona-buna paltar yuyan, çörək bişirən Töhfə arvadın indi şəhər sovetinin sədri seçilməsi, naxırçı gödək Tapdığın Muzdurlar Komitəsinin sədri olub, varlılara qan uddurması anamı yandırıb tökürdü. Anam atama deyirdi ki:

– Sifariş elə Qızılbaşoğlu xəlvətcə, gecə iki-üç at gətirib bizi keçirsin Arazın o tayına. Atamgil də oradadır.

Ancaq atam razı olmurdu.

– Bəs, – deyirdi, – bu ev-eşik nə olsun?

Anam deyirdi:

– Şura hökuməti gedər, yenə də qayıdıb gələrik.

Anam qəti inanırdı ki, bolşeviklər gəldikləri kimi də qayıdıb gedəcəklər.

Anam deyirdi:

– Padşahsız məmləkət olmaz.

Atam da deyirdi ki:

– Bolşeviklər Nikolay padşahı bütün əhli-əyalı ilə güllələyiblər.

Atam gecə-gündüz ustaların başının üstündə durub tikdirdiyi ev-eşiyi, böyük bir həvəslə saldığı bağ-bağçanı qoyub getmək istəmirdi. O, bu ağacların, güllərin toxumunu, qələmini cürbəcür yerlərdən gətirtmişdi və hamısını da öz əlilə əkib-becərmişdi. Atamın təbiətində tacirliklə kəndlilik birləşmişdi, o, mahir tacir olduğu qədər də həvəskar kəndli idi. Sonralar, yəni, on iki-on üç yaşına çatdığım zaman da o, məni ona görə “fərsiz” hesab edirdi ki, mənim nə ticarətə, nə də kənd işlərinə, fiziki zəhmətə həvəsim olmadığını hiss edirdi. O, tez-tez anama deyirdi: bilmirəm bunun axırı nə olacaq?!

Anam isə, mənim haqqımda atam qədər bədbin deyildi. Anam ticarətə də, adi təsərrüfat işlərinə də həmişə biganə idi. Anam da, atam kimi, heç bir zaman mənim haqqımda özümə tərifli söz deməzdi. Ancaq anamın məni heç də fərsiz hesab eləmədiyini duyurdum və bu hiss məni anama daha möhkəm bağlayan gözəgörünməz bir qüvvəyə çevrilirdi. Mən anamı itirməkdən qorxurdum. Düşünürdüm ki, bizim küçədə mən yaşda olan Abbas bəyin anası kimi, mənim də anam ölə bilər. Belə fikirlər məni dəhşətə gətirirdi. Mən Abbasın öz anasının ölümünü heç də vecinə almadığına təəccüb edirdim. Onun əvəzinə mən özüm dərin bir kədərə dalırdım. Mən onu son dərəcə yazıq hesab edirdim. Halbuki onu bir dəfə də bikef görmürdüm. O, tamam dərdsiz-qəmsiz halda uşaqlarla ora-bura qaçır, oynayıb hay-küy salırdı.

Həyatda mənim bütün varlığıma hakim olan, bir dəqiqə də olsa, məndən uzaqlaşmayan ilk qorxu hissi bu cür peyda oldu.

...Bizlərdə hökumət orqanları qurulandan sonra on birinci ordunun hissələri, o cümlədən, bizim evdə olan hərbiyəlilər də tərpənib getdilər.

Biz, demək olar ki, tamam yoxsul vəziyyətdə qalmışdıq. Zinyət də çıxıb getmişdi obalarına. Şəhərdə çörək-filan da qıt olmuşdu. Anam indi gündə bir dəfə, özü də ucuz başa gələn bişmiş bişirirdi, özü xəstə

olanda isə, Bəyim xala və ya anama çox uzaq qohumluğu çatan Nabat xala gəlib bişirirdi. Nabat xala qırx beş-əlli yaşlarında qozbel, olduqca xoşsifət bir qadın idi. Ərə getməmişdi. Özündən böyük bacısının ailəsində yaşayırdı. Bacısının əri, əsli Arazın o tayından olan bir tacir idi.

Nabat xalanın bişirdiyi xörəklər qeyri-adi dərəcədə ləzzətli olurdu. Bir dəfə də olsun, mən onu qaşqabaqlı və ya qəmgin görməmişdim. Və mən düşünürdüm ki, kaş mənim anam da Nabat xala kimi qozbel olaydı, amma onun kimi heç bir zaman xəstələnməyəydi! Əlbəttə, mən ürəyimin dərinliyində anamın qozbel olmasına heç də dözməzdim, ancaq anam o qədər tez-tez xəstələnirdi və mən bu barədə o qədər gizli dərd çəkirdim ki, deyirdim, hər nə olurdusa-olaydı, amma anam azarlamayaydı. Mən görürdüm ki, Nabat xala heç bir zaman öz taleyindən şikayətlənmir, həmişə təmiz-tarıq, səliqə ilə geyinir, zarafat eləyib anamı güldürür. Hiss edirdim ki, arvad öz söhbətindən, bişirdiyi ləzzətli xörəklərdən də zövq alır. Ancaq özünün yeməyi dörd-beş yaşında uşağın yeməyi qədər olurdu. Başa düşə bilmirdim ki, Allah belə yaxşı bir qadını niyə qozbel yaradıb?

...Sonra gördüm atam anamın qalan daş-qaşlarından, qızıl zinətlərindən nə isə satıb yaxşı qaçan bir at aldı, ingilis yəhəri aldı. Bir gecə də gördüm ki, iki qatar patronla beşaçılanı alıb, xəlvətcə gətirdi evə.

Bundan bir neçə gün sonra isə, qaranlıq bir gecədə atam boğazlı çəkmə geyib, patrondaşları bağladı belinə. Göydəmir atı yəhərləyib minərək anama:

– Allah amanatında olasınız! – deyib hara isə getdi.

Mən anamdan soruşdum ki:

– Hara gedir atam?

Anam da ancaq onu dedi ki:

– İşi var, özgə yerə gedir.

Ancaq səhəri gün Fatma nənəmlə danışıqlarına gizlincə qulaq asıb bildim ki, atam dörd yoldaşı ilə Təbrizdən qaçaq mal gətirməyə gedib.

Fatma nənəm dedi:

– Bəlkə o tayda kişini də (yəni, Bayram babamı) gördülər.

Anam dedi:

– Ağlım kəsmir... Onlar yiyəsiz yerlərlə çölləmə gedəcəklər.

Bir neçə gündən sonra yenə də qaranlıq bir gecədə atam gəldi. Atın tərkinə bağladığı keçə xurcunu açıb, qaldırdı evimizə. Anam soruşdu:

– Bəs, satmağa bir şey gətirməmisiniz?
Atam da cavab verdi ki:
– Gətirmişik. Ədil bəyin evindədir.
Ədil bəy atamın yaxın dostu idi. Üzündə tək-tük çopuru olan yoğun, yaraşıqlı bir kişi idi. Tez-tez bizə gələrdi, bəzən stulda, ya divanda bardaş qurub oturardı, mən də təəccüb edərdim, Ədil əmi bu qədər yoğun qılçalarını necə qatlayıb bardaşqurma otura bilir? Həmişə bizə gələndə gülümsəyib, məndən soruşardı:
– Kişi oğlu, necəsən? Həsən döyər, yoxsa sən?
Həsən onun, məndən iki-üç yaş böyük oğlu idi. Bizim şəhərin lap yaxınlığındakı kəndin kənarında Ədil əmigilin neçə otaqdan ibarət mavi taxtapuşlu böyük evləri var idi. Biz tez-tez onlara qonaq gedərdik. Onun arvadı da Bayram babamın dostu qazı ağanın qızı idi. Arıq, sağlam bir qadın idi.
Atam anama dedi:
– Xurcunu aç, uşaqlara xuşgəbər ver.
Sonra mənə məlum oldu ki, atamgil Təbrizdən cürbəcür parça-filan gətiriblər... Və onlar gətirdiklərini satıb qurtaran kimi yenə də gizli surətdə Təbrizə getdilər.
Bu əhvalat da mənə çox maraqlı görünürdü. Çünki yaz vaxtı olduğundan bütün çaylar, o cümlədən, Araz daşıb göylə gedirdi. Atamgil özləri Arazı pələdə keçirdilər. Atlar isə üzgüçülərin müşayiətilə Arazı üzüb keçirdilər. Bizim şəhərdən Təbrizə atla üç-dörd günlük yol idi. Bütün bunları mən atamın anamla olan söhbətindən bilirdim, bilirdim ki, pələ çox təhlükəli şeydir. Beş-altı ağacı yan-yana bir-birinə bənd eləyib, altına üç-dörd qoyun dağarcığını üfürüb bağlayırlar, adamlar da otururlar üstündə. Pələçi kürəkləyib keçirir çaydan...
Sonra atamgil yollarda hər saat, dəstə ilə gəzən qaçaq-quldura rast gələ bilərlər. Bütün bu qorxulara baxmayaraq, atam yavaş-yavaş bizim ailə vəziyyətimizi babatlaşdırırdı. Bu da məni sevindirirdi, çünki mən bu az zamanda yoxsulluğun nə demək olduğunu hiss eləmişdim.
...Sovet hökuməti qurulandan sonra Qəza İcraiyyə Komitəsinin sədri bizim mahala gəlmişdi. Evimizdə olan söhbətlərdən eşitmişdim ki, köhnə inqilabçılardandır, Bakıda çox hörməti var. Bizim mahala gələndən sonra da az vaxt içində xeyli hörmət qazanmışdı. Hamı deyirdi: “Yaxşı adamdı...”
Bir gün atam bazardan həyəcanlı gəlib anama dedi ki:
– Qəza İcraiyyə Komitəsinin sədri məni çağırtdırmışdı...

Anam maraqla soruşdu:
– Nəyə görə?
Atam dedi:
– Məndən soruşdu ki, "sənin qaynatan Bayram bəy nə üçün qaçıb İrana?" Mən də düzünü dedim... Dedim, yəqin ki, tutulmaqdan-zaddan qorxub. Dedi: "Sən ona mənim adımdan sifariş göndərə bilərsənmi ki, qorxmasın, gəlsin, çıxsın üzə?"
Anam soruşdu:
– Bəs, sən nə cavab verdin?
– Dedim, mənim heylə imkanım yoxdur.
Anam dedi:
– Yaxşı demisən.
Sonra anam sədrin qarasına acıqlı əlavə etdi:
– Sifariş göndərək gəlsin, sən də tutub güllələdəsən...
Atam dedi:
– Axı, o, qəribə bir söz də dedi...
– Nə dedi? – Anam soruşdu.
– Dedi ki, Bayram bəyə sifariş göndərin, mən onu tanıyıram, qorxmasın!
Anam yana-yana başını buladı:
– Sən də onun sözünə inandın? Deyirlər, o, gəncəlidi, haradan tanıyacaq dədəmi? Heylə aldillə gətirdib tutmaq istəyir.
Atam dinmədi. Mən hiss edirdim ki, atam sədrin sözünə inanır.
O, papiros büküb yandırandan sonra:
– Ancaq, – dedi, – xoşsifət adamdı... Mərdimazara oxşamır.
Anam yenə də acıqlandı.
– Sən də söz danışdın. Bunlara inanmaq olar?
...Ancaq bir gün anam evdə oturub maşında nə isə tikirdi. Mən də artırmada bacımla oynayırdım. Hava soyuq və çiskinli idi. Bir də gördüm çöl tərəfdən həyətimizə atın üstündə, ucaboylu, əynində saçaqlı yapıncı, başında gümüşü papaq bir adam gəldi. Mən diqqətlə baxıb, birdən:
– Babam gəldi! Babam gəldi! – deyə sevinclə qışqırdım, anam da mənim səsimə yüyürdü bayıra. Bayram babam düşüb, atı ağaca bağlayaraq çıxdı artırmaya. Mənim və bacımın üzündən öpüb anamın kefini soruşdu. Sonra yapıncısını çıxarıb kətilin üstünə ataraq anamın verdiyi stulda əyləşdi. Onun yanağında qoşa xal olan yaraşıqlı üzü gündən, ayazdan yanıb mis kimi qızarmışdı. Anam soruşdu:

– Ay dədə, bəyəm, üzə çıxmısan?

(Həmişə anam babamla danışanda, elə bil ki, utanıb çəkinə-çəkinə danışırdı. Bu da mənə qəribə görünürdü. Çünki anam, kiminlə olursa-olsun, danışanda onun səsində həmişə ötkəmlik hiss olunurdu.)

Babam:

– Yox, – dedi, – sədr o taya yanıma adam göndərmişdi.

Anam hərarətlə dedi:

– Sən də onun sözünə inandın?

Babam köz kimi qızaran yaqut qaşlı gümüş qutusunu açıb, papiros bükə-bükə dedi:

– İnansam da, inanmasam da gəldim. O tayda yaşamaq mümkün deyil. Gərək orada da qaçaq yaşayasan. Şah ərbablarının əlindən insan təngə gəlir. Çox rəzil olurlar.

Anam dedi:

– Bunlara da etibar yoxdur, dədə.

Babam dedi:

– Ondan keçib... gedəcəyəm...

Babamın pencəyinin altından tapançasının lüləsi görünürdü.

Anam çay-çörək hazırladı. Babam yeyib-içəndən sonra qalxıb yapıncısını çiyninə salıb, anama dedi:

– Sən narahat olma. Mən heç bir yoxsulu-kəndlini incitməmişəm. Görsəm ki, məni aldillə gətirdiblər, sədrin özü üçün də yaxşı olmayacaq...

Mən başa düşmədim ki, bu sözlərlə babam nə demək istəyir. Onu tutandan sonra sədrin nə vecinə olacaq?

Babam ağır, təmkinli addımlarla həyətə enərək atını minib getdi.

Anam dinməz-söyləməz onun ardınca baxa-baxa papiros yandırıb çəkdi. Sonra atam gəldi. Anam əhvalatı ona danışdı, atam da heç bir cavab verməyib papiros yandırdı.

Aradan nə qədər keçdi, bilmədim, sonra bayırda at ayağının tappıltısını eşidərək yüyürdük artırmaya. Babam atdan düşüb, gümrah addımlarla çıxdı yuxarı.

Atam onun qabağına yeriyib:

– Allaha şükür, əşi, – dedi, – sağ-salamat qayıtdın.

Babam yapıncısını çiynindən götürüb stolun üstünə ataraq dedi:

– Əşi, dünyada qəribə işlər olur.

Anam soruşdu:

– Nə məsələdi?

Babam dedi:

– Atı İcraiyyə Komitəsinin həyətində bağlayıb çıxdım sədrin otağına, özü də söz verdim ki, qarınınkı Qurandan keçib, əgər, görsəm ki, məni tutmaq istəyir, o saat vurum. Ancaq kişi məni görən kimi qalxıb gülə-gülə qabağıma yeridi. Mənimlə əl tutuşub soruşdu: "Bəy, məni tanıdınız?" Dedim: "Xeyr". Zarafatla dedi: "Heylə şeyi yaddan çıxarmaq olar, bəy? O vaxt siz Şıpartı dərəsində məni qaçağın əlindən almasaydınız, indi sümüyüm də sürmə olmuşdu".

Atam həyəcanla dedi:

– Odur ki, atalar deyib: "Yaxşılıq itməz". Sonra nə oldu?

Babam dedi:

– Sonra da bildirdi ki, məni qəza milis rəisi təyin edirlər. Doğrusu, olmaq istəmirdim, dedim, axı, mən firqəçi deyiləm. Özüm də sizdən qaçmışdım. Deyir, biz sizə etibar eləyirik. Deyir, sizdən birinci xahişim budur ki, hansı yolla olur-olsun, banditizmi, ləğv eləməkdə bizə kömək eləyəsiniz. Nüfuzlu adamsınız, deyir, sizin sözünüzü eşidərlər.

Bu xəbər hamıdan çox məni sevindirdi, mən şəhərimizdə təzə peyda olmuş milisləri görürdüm. Demək, mənim babam bütün o milislərin naçalniki olacaq! Bu, mənim izzəti-nəfsimi oxşayırdı...

## MƏKTƏB, UŞAQLAR VƏ MƏN

Sentyabrın on beşində babam məni üstü qırmızı dəmirli, böyük kürsülü binada yerləşən məktəbə apardı.

Və orada mənim anlaşılmaz, daimi kədərimə yeni bir hiss də əlavə olundu: mən uşaqların şən çığır-bağırı içində birdən-birə özümü yalqız hiss elədim və bu hiss sonralar da eyzən mənimlə oldu. Uşaqlar arakəsmədə, sinif otağında o yan-bu yana yüyürüşür, bir-birilərilə gah öcəşir, gah zarafatlaşır, gah masanın üstünə çıxıb yerə tullanırdılar. Mən isə, bir tərəfdə divara söykənərək, dinməz-söyləməz, onlara tamaşa edirdim. Mən onlara qarşı özümdə bir yadlıq hiss edirdim. Mənə elə gəlirdi ki, onlar bir-birilərini çoxdan tanıyırlar, bir-birilərilə qohumdurlar. Onu da bilirdim ki, bu, belə deyil. Onlar mənə əhəmiyyət vermirdilər, heç mənə tərəf baxmırdılar da...

Həmin bu günlərdə anamın malyariyası yenə də başlamışdı. Yenə də şiddətli titrədib-qızdırırdı. Yenə də mən həyətimizdəki böyük tut ağacı-

nın altına qaçıb xəlvətcə dərd çəkirdim. Bəlkə mənim məktəbdəki uşaqların şənliyində iştirak eləməməyimin bir səbəbi də bu idi... Ancaq, axı, bizim qonşumuz Yaqubun da anası bərk xəstə idi. Bəs, nə üçün o, sinifdə hamıdan çox səs-küy salırdı, hamıdan çox nadinclik edirdi?

Bizim ilk müəllimimiz Mirzə Camal yarısaqqallı, yarımolla geyimli bir şəxs idi. Bizə papaqlarımızı çıxarmağı əmr etdiyi halda özü sinifdə dəri papaqla dərs deyirdi. Bilmirəm dərsə başladığımızın neçənci günü idi, anamı evdə yenə bərk xəstə qoyub gəlmişdim. Yenə də uşaqların şən səs-küyünə dərin qüssə içində qulaq asırdım. Yenə də bu şənlik mənə təəccüblü görünürdü. Zəng vuruldu. Biz keçib masalarda əyləşdik. Mirzə Camal ağır addımlarla içəri daxil olub dedi:

– Durun!

Biz qalxdıq.

Dedi:

– Oturun!

Biz əyləşdik.

Dedi:

– Nəğmə öyrənəcəyik.

Uşaqlar sevinclə tərpənişdilər və Mirzə Camal müəllim başladı öz yavaş, nazik səsilə nəğməni öyrətməyə. Uşaqlar hamısı oxuyurdu, məndən başqa. Anamı evdə xəstə qoyub gəldiyim üçün nəğmə oxumaq heç mənim ağlıma da gəlmirdi. Mən məyus-məyus qulaq asırdım. Birdən mənimlə bir masada oturan oğlan əlini qaldırıb dedi:

– Müəllim, bu oxumur!

Müəllim mənə yaxınlaşıb soruşdu:

– Niyə oxumursan?

Mən dinmədim. Mirzə Camal müəllim hirsləndi, mənim qolumdan dartıb masadan çıxararaq:

– Rədd ol! – deyib, itələyib saldı bayıra.

Mən arakəsmədən keçib çıxdım məktəbin həyətinə. Ətrafda heç kəs yox idi. Hamı siniflərdə idi. Mən divara qısılıb dayandım. Mənə elə gəldi ki, Mirzə Camal müəllim məni itələməklə bütün insanlardan, insanlar yaşayan bütün aləmdən ayrı saldı. Mən bir də heç zaman daxilən bu insanların içinə qayıtmadım. Bir də heç zaman daxilimdəki aləm barədə onlara bir kəlmə də söz demədim. Evimizə gələndə olduqca gombul, ağıldan bir az kəm, Rəşid adlı oğlan atamı küçədə görüb demişdi ki:

– Müəllim oğlunu nəğmə oxumadığı üçün sinifdən qovub çıxardı.

Atam bərk hirslənib məni o ki var danladı. Anam da elə xəstə-xəstə ona qoşuldu. İkisi də məni maymaq, bişüur, daha bilmirəm nə adlandırırdı. Sonra ikisi bir-birilə dalaşmağa başladı. Atam anamı ittiham edib deyirdi:

– Bunu sən belə eləmisən.

Anam da atamı məzəmmət eləyib deyirdi:

– Oxşayıb sənin qardaşlarına.

Mən söyülüb təhqir olunmağıma baxmayaraq, özümdə qəribə bir gümrahlıq hiss edirdim, çünki anamın xəstə-xəstə bu cür canlı, qızğın dava eləməsi, hələ desən, atamın onunla bacarmaması ürəyimin dərinliklərində məni sevindirirdi. Amma anamın, məni atamın qardaşlarına oxşatması izzəti-nəfsimə toxundu. Çünki atamın "qardaşları" deyəndə, birinci növbədə, Qubad əmim gözümün qabağına gəlirdi. Mənsə, Qubad əmimə oxşamaq istəmirdim.

Beləliklə, ətrafımdakı insanlarla, mənim aramdakı gözəgörünməz sədd möhkəmlənirdi. Mən özümü bu insanlar arasında yalqız hiss eləyirdim.

Mənim daxili aləmimdə fərəhli heç nə olmadığı üçün daima küskün, dumanlı bir ruhla böyüyürdüm. Xarici aləmin ancaq dərdi-kədəri mənim daxili aləmimə nüfuz edirdi. Anamın xəstəlikləri, atamın mənimlə getdikcə daha sərt rəftarı, bizim inqilabdan sonrakı yoxsul həyatımız...

Mən ikinci sinifdən çox yaxşı oxumağa başlamışdım. Rüstəm adlı cavan müəllimimiz, demək olar ki, hər gün məni tərifləyirdi, hətta atama da demişdi ki, oğlunuz çox istedadlı uşaqdı. Mən öz istedadımın nədən ibarət olduğunu bilməsəm də, onun məni lap "heç nə" hesab eləyən atama tərifləməsi və atamın gəlib bunu evdə anama danışması məni çox mütəəssir etmişdi. Mən həyətimizdəki böyük tut ağacının altına qaçaraq xəlvətcə, nə üçünsə, yana-yana ağladım. Rüstəm müəllimə qarşı ürəyimdə isti bir məhəbbət hiss eləyirdim. O, mənim xəyalımda getdikcə yüksəlirdi. Ancaq bir yaz günü qəribə bir hadisə oldu. Rüstəm müəllim dedi: "Sabah çölə gəzməyə gedəcəyik. Orada kükü bişirəcəyik". Ona görə də kükü bişirmək üçün hər uşağa bir şey tapşırdı. Mən yağ və çörək gətirməli idim. Mənim yoldaşım yumurta... və sairə. Bizim yerlərdəki baharın dünyada misli yoxdur. Gül-çiçəklə dolu ot dizə qədər qalxır. Ağaclar çiçəkləyir... Çaylar daşır...

Və bizdə ən gözəl bahar xörəyi – təzə göyərib qalxmış yabanı şomudan, quzuqulağından, gicitkəndən bişirilmiş kükü sayılırdı.

Lakin səhəri gün hava pis olduğu üçün biz gəzməyə gedəsi olmadıq. Məktəbdən çıxıb evlərimizə gedəndə, yolda Rüstəm müəllim bir daşın üstündə oturub mənə dedi:

– Gətir sənin yağından bir yaxmac götürüm.

Və o mənim heybəmi açıb oradakı təndir çörəyindən, yağdan özü üçün yaxmac düzəldəndə yuxarı sinif şagirdləri yanımızdan gəlib keçirdilər. Anamın türk zabitinə qoşulub Türkiyəyə gedən rəfiqəsi Məhbub xanımın kiçik qardaşı Bəşir də onların arasında idi.

Birdən Bəşir qışqırdı:

– Müəllimə baxın, şagirddən rüşvət alır. Müəllimə baxın.

Yoldaşları qəhqəhə ilə gülüşdülər. Rüstəm müəllim də Bəşirə dedi:

– Ay sənin boyunu yerə soxum!

Özü də, pərt olmayaraq, yaxmacını iştaha ilə yeməyə başladı. Doğrusu, heç mənim ağlıma gəlməzdi ki, "müəllim də ac olarmış... Müəllimin də evində yeməyə şey olmazmış". Bizim şəhərdə camaatın hələ aclıq çəkdiyini bilirdim. Ancaq müəllimin da ac olması...

Mən Məhbub xanımın qardaşı Bəşirin hərəkətini anama danışanda gözləyirdim ki, o, Bəşiri məzəmmət eləyəcək. Ancaq belə olmadı, anam Rüstəm müəllimi məzəmmət elədi:

– Dabbax Abdullanın oğlundan nə olacaq, – dedi.

## *MƏN VƏ KİTABLAR*

Mən anamın oxuduğu qalın cildli kitablara dərin bir maraqla baxırdım, anamın o kitablardan oxuyub bizə nağıl elədiyi Rüstəm Zal ilə oğlu Söhrabın əhvalatı, "Hind racisi", "Armanusiya" macəraları xəyalımda təəccüblü bir aydınlıqla canlanırdı. Mən Rüstəm Zal pəhləvanın əvvəl tanımadığı oğlu cavan Söhrabla vuruşaraq, ölümcül yaralayandan sonra qolundakı bazubənddən, onun, öz oğlu olduğunu bilib necə sarsıldığını unuda bilmirdim. Elə bil ki, o faciə mənim gözümün qabağındaca olmuşdu. Cavan Söhrabın onu məğlub eləyib ölümcül yaralayan bu qüdrətli pəhləvanın öz atası olduğunu biləndən sonra keçirdiyi hissləri mən öz hisslərim kimi duyurdum və mənə elə gəlirdi ki, diyarbadiyar gəzib öz atasını axtaran Söhrab onu bağışlayır, ona olan məhəbbətilə ölür və bu, cahan pəhləvanı Rüstəm Zal üçün sağalmaz

bir dərd olur. Mən onların hər ikisində yüksək bir alicənablıq hiss edirdim, əgər, Söhrabın yerinə mən olsaydım, mən də atamı bağışlayardım. Onların hər ikisində olan mərdlik və qəhrəmanlıq məni izah eləyə bilmədiyim fövqəladə hisslərlə qanadlandırırdı. Mən bütün qəhrəmanları zahirən də yaraşıqlı, gözəl təsəvvür edirdim. Cıdırlarda ad çıxaran Qarabağ atları da, qüdrətli uca çinar da, bizim sıldırımlı dağlardakı qartallar da mənə gözəl və alicənab görünürdü. Mən Şuşa qalasının qorxunc uçurumlu Xəzinə qayasına baxanda da eyni hissləri keçirirdim. Bu əzəmətli qayanın sükutu mənə əsrarəngiz görünürdü, elə bil ki, o öz sükutu ilə nəyi isə gözləyir.

Anamın oxuduğu kitablara baxdıqca mənə elə gəlirdi ki, onlarda məhz mənim sezib duyduğum, məhz mənə qarşı bir məhəbbət sükut edir. Bu məhəbbətin nədən ibarət olduğunu bilmirdim, ancaq o kitablara qarşı fövqəladə bir doğmalıq hiss edirdim. Hələ məktəbdən əvvəl anam mənə oxuyub-yazmağı öyrətməyə başlayanda görürdüm ki, sözlər hərflərdən düzəlir və mən dərhal bu hərfləri öyrənib sözləri oxuyanda sanki yeni bir aləmə daxil olurdum. Bu aləm də insanlardan, onların taleyindən, işlərindən ibarət olsa da, tamam başqa idi. Sanki burada hər şey, hər hiss təzə idi və bu hisslər mənə çoxdan məlum idi. Elə bil ki, mən özüm hansı zamanda isə o hisslə yaşamışam. Mən birinci dəfə kiçik bir hekayə oxudum. Orada təsvir olunurdu ki, balaca Murad qonşuluqlarındakı bağın yanından keçəndə qoca bağban Qədir baba ona yetişmiş sulu bir armud bağışladı. Murad armudu yemək istəyəndə birdən yadına düşdü ki, balaca bacısı evdə xəstə yatır, ona görə də Murad armudu yeməyərək aparıb bacısına verdi. Mənə elə gəldi ki, bu Murad mən elə özüm olmuşam. Ancaq xəstə bacım deyil, anam olmuşdur. Və mən ürək sərinlədən sulu armudu yeməyib, qızdırma içində ürəyi yanan anama gətirməyimdən təsəlli alırdım.

Sonra mən "Bir şahının qurbanı" adlı balaca bir hekayə oxudum. Bu hekayədə kasıb bir kişi on dörd-on beş yaşlı oğlunu bir tacirə satıcı verir. Oğlan vəzifəsini çox ləyaqətlə yerinə yetirir, ancaq bir gün görür ki, yekəpər bir kişi çiynində bir məcməyi paxlava gəzdirib qışqırır:

"Paxlava badamdı,
Yeyənə candı..."

Zəfəranlı paxlavanın ətri satıcı oğlana o qədər xoş gəlir ki, özünü saxlaya bilməyərək daxıldan bir şahı götürüb, bir paxlava alıb yeyir.

Fikirləşir ki, bir şahı götürməklə tacirə ziyan olmaz. Paxlava ona çox ləzzətli görünür. Gələn dəfə həmin yekəpər kişi paxlava ilə bərabər peşmək də satır. Oğlan bu dəfə tacirin daxılından iki şahı götürüb həm paxlava alır, həm də peşmək... Beləliklə, oğlan dadanır daxıldan gizli pul götürməyə... Bir gün də yoldaşları görür ki, bir polis nəfəri oğlanı qabağına qatıb aparır həbsxanaya. Oğlanın görmədiyim, tanımadığım ata-anasının halı gəlib durdu gözümün qabağında. Mən, oğullarının oğurluq üstündə tutulmasını eşidəndə onların nə vəziyyətə düşdüyünü aydınca görüb, hiss edirdim və oğlanın xudpəsəndliyi məndə təəccüb doğururdu. Və mən birinci dəfə qəlbimdə yaranan fədakarlıq duyğularının gözəlliyini hiss edirdim. Əlbəttə, fədakarlığın nə demək olduğunu soruşsaydılar, mən cavab verə bilməzdim. Ancaq mən heç vaxt armudu yeməzdim, anamgildən ayrı paxlava da yeməzdim və bu halı özümdə hiss etmək məni fərəhləndirirdi.

Mən kitabları oxuduqca, elə bil ki, hər gün içində olduğum həyatdan, gördüyüm insanlardan uzaqlaşırdım. Mən daha qapalı, daha sosur olurdum.

Mən dərslərimi öyrənməyə çox az vaxt sərf edirdim, özüm də müəllimlərimin dediyinə görə hamıdan yaxşı oxuyurdum. Qalan vaxt əlimə keçən kitabları acgözlüklə oxuyurdum. Hər yeni kitab mənə yeni bir aləm kimi görünürdü və mən o aləmə daha tez daxil olmağa can atırdım.

Robinzon Kruzonun macərası isə, mənim üçün tamam fövqəladə bir aləm oldu. Mən Robinzonun keçirdiyi yalqızlığı qəribə bir aydınlıqla hiss edirdim. Və mən daima özümü onun yerinə qoyub o həyatla həm kədərlənir, həm də ondan zövq alırdım. Axırda Robinzonun öz adasını və o həyatı tərk etməsi məndə anlaşılmaz bir inkisarı xəyalı doğurdu. Nə üçün? Yoxsa, mən istəyirdim ki, Robinzonun o yalqız həyatı əbədi olsun?

## DÜNYANIN KƏDƏRİ

Bayram babam qəza milis rəisi olandan sonra Qızılbaşoğlu Alı kimi, Hacı kimi, Əhmədalı kimi atıb-vurmağı, yaxşı at minməyi bacaran igid oğlanlardan başına toplayıb dağlarda, meşələrdə yurd salan oğru-əyri qaçaqlarla mübarizəyə başlamışdı. İnqilabdan əvvəl bizdə iki cür qaçaq olurdu. O adamlar ki, hökumətin, yerli bəylərin, ağaların zül-

mündən qaçıb qaçaq olurdu, onların kasıb-kusubla, camaatla işi olmurdu. Əksinə, Nəbi kimi, Süleyman kimi qaçaqların, yeri gələndə, kasıblara köməkləri də dəyirdi. Amma elələri də olurdu ki, oğurluq üstündə, başqalarına haqsız ziyan vurmaq üstündə qorxub qaçaq olurdular. Belələrinə hamı nifrətlə baxırdı. Birinci növ qaçaqları babam sülhlə üzə çıxarmağa çalışırdı. İkinciləri isə, dağda-dərədə hərləyib, nəhayət, tuturdular. Bir dəfə Bayram babam pul üstündə bir seyidi öldürdükləri üçün iki nəfəri tutub gətirmişdi. Sonra dedilər ki, onları camaatın qabağında güllələyəcəklər. Həmin gün Fatma nənəmlə birlikdə mən də getmişdim tamaşaya. Şəhərin ortasındakı meydana çoxlu adam yığılmışdı. Yeddi-səkkiz nəfər əlitüfəngli hazır dayanmışdı. Fatma nənəm arvadların içində, yerdə oturmuş qoca bir qarını göstərib dedi:

– Həmin öldürülən seyidin anasıdı bu arvad.

Bir azdan gördük gözləri bağlı iki dustağı milis nəfərləri gətirirlər. Onların ayaqları yalın idi. Meydanda çoxlu sarı tikan vardı. Birinci fikrimdən keçən o oldu ki, "bunlar bu tikanlı yerdə ayaqyalın necə yeriyəcəklər?" Onlar izdihama çatıb dayandı. Biri ortayaşlı, o biri cavan idi, həmin cavan:

– A camaat, – dedi, – razı olmayın ki, bizim nahaq qanımızı töksünlər.

Əlbəttə ki, camaatdan səs çıxmadı. Sonra milislərin başçısı komanda verdi. Milislər silahı üzə götürəndə bir nəfər sarıbəniz, qaraköynəkli adam irəli yeriyib həmin milislərdən birinin tüfəngini alaraq onu geri itələyib özü tüfəngi üzünə götürdü. Bu da mənə çox təsir elədi. Mən sonralar da hey fikirləşirdim ki, "görəsən nə üçün o adam, dustaqları məhz özü vurmaq istədi?"

Qərəz, dustaqları güllələdilər, mən də nə onlara baxa bildim, nə də arvadların içində oturan qoca qarıya. Mən cavan dustağın dediyi axırıncı sözləri xatırlayaraq hey fikirləşirdim ki, "görəsən, doğrudanmı, onların günahı yox idi? Kim bilir, bəlkə də, günahları yoxmuş..."

Mən uzun zaman o dəhşətli əhvalatın təsirindən xilas ola bilmirdim. Birinci dəfə olaraq mənə elə gəlirdi ki, adamlar üçün bir-birini öldürmək də bir heyvanı öldürmək kimi asandır. O dustaqlar seyidi öldürmüşdülər. Bu adamlar da onları öldürdülər. Demək, əvəz-əvəz oldu. Necə ki, bizim kənddə bu onu öldürürdü, onun da qohumu gəlib bunu öldürürdü. Mən alınan intiqamın təsəllisini heç vəchlə təsəvvür eləyə bilmirdim. Bu da məndə insanlara qarşı şübhəli, soyuq bir hissin

yaranmasına səbəb olurdu. Adamlar mənə yad və anlaşılmaz görünürdü. Hətta, mənə elə gəlirdi ki, Bayram babam da mənə xeyli yad olmuşdur.

Bizim evimizdə getdikcə tutqun bir ab-hava yaranırdı. Görürdüm ki, atam da, anam da bütün günü qaşqabaqlı olurlar, bir-birlərilə nə barədəsə hey danışırlar. Tezliklə o biri otaqdan xəlvətcə qulaq asıb bildim ki, söhbət "necə dolanmaq" barədə gedir. Atam deyirdi ki, yeni hökumət sərhədləri bağlayıb, daha İrandan qaçaq mal gətirmək mümkün deyil. Anam da əsəbi halda deyirdi ki, əgər, var-yoxumuzun başına qardaşın Qubad daş salmasaydı, niyə bu günə qalırdıq ki? Atam da dalbadal papiros çəkərək deyirdi ki, Allah Qubada lənət eləsin.

Atamla qardaşı arasındakı bu münasibət yenə də mənə Məlikməmmədlə qardaşları arasındakı əhvalatı xatırlatdı. Mən heç vəchlə başa düşə bilmirdim ki, necə olur ki, bir anadan doğulan qardaşlar bir-birilərinə düşmən olurlar?

Bayram babam qəza milis rəisi olduğunun ikinci ili bərk xəstələnərək vəfat etdi. O zaman anam da xəstə yatırdı. Tutqun bir qış günü idi. Atam gəlib anama ürək-dirək verərək dedi:

– Özünü toxtaq tut. Bütün yaranan gedəcək.

Anam heç bir söz demədi. Amma gözlərindən sakit yaş axırdı. Sonra o, mənə dedi:

– Get, babanı gör.

Mən də elə bil ki, tamam qeyri-şüuri bir hərəkətlə babamgilə gedib gördüm ki, Fatma nənəmlə Gülbəs arvad yerdə, yorğan-döşəyin içində, səssiz, xəfifcə bir yuxuya getmiş kimi görünən babamın yanında oturublar. Babamın gözəl üzü çox arıqlayıb göyərmişdi. Çal saçları əvvəlki təki yana daranmış kimi idi. Mən ayaq üstündə durub ona baxırdım. Gülbəs arvad mənə dedi:

– Gəl, babanı öp.

Lakin mən, nə üçünsə, yerimdən tərpənmədim. Mən ağlamırdım da, tamam şüursuz olaraq babama tamaşa edirdim. Sonra çevrilib, səssiscə gəldiyim kimi, səssizcə də çıxıb getdim. Mən bağın içi ilə dizə qədər qalxmış qarı ayaqlaya-ayaqlaya evimizə tərəf gedərkən birdən üç il bundan qabaq belə bir qarlı qış günündə babamın ayaqlarında uzunboğaz çəkmə, əynində xəz kürk, belində onatılan tapança, məşhur kəhər atının üstündə Qızılbaşoğlu Alının müşayiətilə Ağdama getdiyi yadıma düşdü. Gözümün yaşı sel kimi axmağa başladı. Mən bağın

səssizliyi içində budaqlarını qar əyən ağaca söykənib yana-yana ağlayırdım. Babam dünyada məni əzizləyən yeganə adam idi. Lakin mən bu barədə düşünmürdüm. Mən adamların soyuq, yabançı münasibətinə alışmışdım.

Məni ağladan o idi ki, bir də heç zaman babam kəhər atı minməyəcək. Bir də heç zaman qırmızı ağac qoburlu onatılanı belinə bağlamayacaq, bir də heç zaman bu dünyanı görməyəcək. Demək, bu dünyanın kədəri əbədidir!

Birdən ağacın budağına bir sərçə gəlib qondu və budağın qarı silkələnib üzümə tökülərək məni diksindirdi, elə bil ki, mən ağır, çox ağır, bir yuxudan ayılıb, məyus halda ona baxırdım. Sərçə də təlaşla ora-bura və mənə baxaraq həyəcanla səslənirdi. “Yəqin acdır, yem axtarır” deyə mən düşündüm. Neçə gün idi qalın qar hər yeri örtmüşdü. Demək, bu dünyanın dərdi əbədidir!

Mən bəlkə çörək qırıntısından-zaddan bir şey tapdım deyə ciblərimi axtardım, amma heç nə tapmadım. Sərçə uçub getdi və mən onun ardınca baxaraq nə üçünsə Qaracanı xatırladım. “Görəsən, bu soyuq qış günündə o, atasız-anasız neyləyir? Görəsən, acdı?” Sonra mən o zaman yaylaqda Bayram babamın Qaracaya pul verdiyini xatırladım. “Görəsən, Bayram babamın vəfatını biləndə Qaraca ağlayacaq?” Amma anası onları qoyub qaçanda, heç ağlamadı. Qonşumuz, mənim yaşıdım Abbas bəy də anasının vəfatından danışanda heç ağlamırdı. Heç bikef də olmurdu. Demək, bu dünyanın dərdi əbədidir!..

Mən gözümün yaşını qolumla silərək ağacdan aralanıb evimizə getdim.

Səhəri gün atam bir araba tutaraq, babamı öz atasının, əcdadının yanında dəfn etmək üçün Fatma nənəmlə və bir molla ilə Kürdobaya apardı.

...İndi anamın bu tutqun qış günündə xəstə yatmağı məni əvvəlkindən də çox qorxudurdu. Mən məktəbdə daim qaşqabaqlı olurdum. Mən tənəffüslərdə uşaqlardan ayrılıb bir yerə çəkilərək eyzən anama dua edirdim. Bununla belə, mən öz sinfimizdə ən yaxşı oxuyan şagird idim. Evimizdə, xüsusilə anam xəstə olduğu zaman çox tutqun, kədərli bir vəziyyət yaranırdı. Demək olar ki, heç kəs heç kəslə danışmırdı. Həyatımız da xeyli yoxsul keçirdi. Səhər qara çovdar unundan bişirilmiş yavan çörəklə əvəlik dadı verən çay, günortalar da çox kasıb bir nahar. Lakin, əgər, anam tez-tez azarlamasaydı, bunların heç biri mənim gözümə görünməzdi.

...Bayram babamın təziyəsi sovuşandan sonra Fatma nənəm qayıdıb gəldi öz evlərinə. O zaman Bayram babamgil yaylaqda olanda Nuru dayımın arana gəlib, pula gedən nə vardısa, hamısını satıb-sovduğundan, inqilab zamanı biz qaçandan sonra yerdə qalan şeyləri də o-bu apardığından Fatma nənəmin dolanacağı üçün daha bir şey qalmamışdı. Anam bişmişdən-zaddan hərdən mənə verirdi ki, apar nənənə. Ancaq mən babamdan sonra daha Fatma nənəmgildə qala bilmirdim. Fatma nənəm tək-tənha qalmışdı. Atamla arası olmadığı üçün bizə də gəlmirdi. Nuru dayım da yenə yoxa çıxmışdı. Harda olduğu məlum deyildi. Ancaq babamın vəfatından üç-dörd gün sonra atam şəhərdən xəbər gətirdi ki, deyirlər Nuru, Şuşada yaxşı qulluqdadı. Kefi də yaman kökdür. Mən qaça-qaça gedib bu xəbəri Fatma nənəmə dedim. Elə bil ki, arvadın gözünə işıq gəldi. Doğrusu, bu xəbər mənim özümü də sevindirirdi. Dayımın yeni hökumətdə "yaxşı qulluqda olması" məni fərəhləndirirdi.

## YENƏ DƏ NURU DAYIM...

Bir yaz günü bir də gördük Nuru dayım üç tüfəngli milislə, atlı gəldilər bizə. Atam bazardaydı. Anam dayımı görəndə, yəqin ki, Bayram babama görə gözləri yaşardı. Nuru dayımın gözlərindən bir-iki damcı sakit halda üzüaşağı yuvarlanırdı. Mən yüyürüb dayımın gəldiyini Fatma nənəmə xəbər verdim. Arvad qılçaları bir-birinə dolaşa-dolaşa mənimlə gəldi bizə, Nuru dayımın bir neçə saniyə arvadın üstündə dayanan baxışlarında buz kimi soyuq bir şey hiss elədim. Yəqin buna görədir ki, arvad özünü itirib bir söz demədi. Oğlu da bir söz demədi. Mən pərt oldum. Fatma nənəmə yazığım gəldi. Dayımın "yaxşı qulluqda" olmağı da, üç atlı milislə, tüfəngli gəlməyi də gözümdən düşdü. Dayım mənə yad və qəddar göründü.

Hamısından betəri də bu oldu ki, səhəri gün Fatma nənəmgilə gedəndə içəridə dayımın qəzəbli səsini eşidərək ayaq saxladım. O, nənəmə deyirdi:

– Dur, hər nə var gətir!

Fatma nənəm də and içib deyirdi ki:

– Bunlardan savayı heç nə qalmayıb!

Açar yerindən baxıb gördüm ki, babamın iri qızıl saatı, üç-dörd üzük, üç-dörd qızıl pul stolun üstündə dayımın qabağındadır. O, vahi-

mə içində dayanıb and içən nənəmi ağır sözlərlə danladıqda mən orada dayana bilməyib qayıdıb qaçdım. Fatma nənəmin köməksizliyi, dayımın hərəkəti məni dəhşətə salmışdı.

Səhəri gün dayım çıxıb getdi.

Bu əhvalatdan bir neçə ay sonra bir də gördük dayım, təxminən, on yeddi yaşında, Anahid adlı bir erməni qızıyla gəldi. Məlum oldu ki, evlənib.

Atam, yəqin ki, borc pulla, gəlinə paltarlıq parçalar aldı, anama da tapşırdı ki, hər gün yaxşı xörəklər bişirsin.

Ancaq dayımgil gəldiklərinin üçüncü-dördüncü günü bizi də, bütün qonşuları da təəccübə salan qəribə bir əhvalat məlum oldu. Quruçaya oynamağa, çimməyə gedən uşaqlar mənə xəbər gətirdilər ki, dayın hər gün arvadını aparıb Quruçayın qırağında döyür. Mən inanmadığım üçün bu barədə anama heç nə demədim. Səhər yenə də dayım arvadı ilə gəzməyə getdi. Mən hiss elədim ki, dayım gəzmək adı tutanda qızın gözlərinə bir vahimə çökdü. Onlar gedəndən sonra mən də Əyyub adlı yaşıdımı dilə tutub onunla Quruçaya getdim. Bir xeyli aralıdan gördük ki, dayımla arvadı çayın dikdirində yanaşı dayanıb söhbət edirlər. Mənim nə üçün gəldiyimdən Əyyubun xəbəri yox idi. Rezin sapanda daş qoyub quşlara atırdı. Mənim gözüm isə dayımgildə idi. Dayım əlini ölçə-ölçə qəzəblə nə isə dedi, sonra qıza dalbadal iki sillə vurdu. Qız çevrilib qaçdı. Dayım yetirib qızın saçlarından yapışaraq çaya tərəf sürüdü, qız ətürpədən qışqırıq qopardı. Əyyub çevrilib baxaraq həyəcanla mənə dedi:

– Ora bax! Ora bax! Dayın arvadını gör neynəyir!

Mən yerimdə donub qalaraq Əyyuba cavab vermədim. Dayım qızı çaya tərəf sürüyür, qız da bağırırdı. Bu zaman o biri sahildəki dikdirdən çaya bir atlı endi. Dayım qızı buraxdı, mən dönüb şəhər tərəfə qaçdım, Əyyub da mənim ardımca.

Anam maşında tikiş tikirdi. Mən əhvalatı danışdıqda anam təəccüb etmədi və gözünü maşının tikişindən çəkməyərək dedi:

– Xalqın qızını döyə-döyə dəli eləyəcək.

Hiss elədim ki, anam əhvalatı bilirmiş. Mən ondan soruşdum:

– Axı, niyə döyür onu?

– Nə bilim niyə döyür? – deyə anam yenə də gözünü tikişindən çəkməyərək cavab verdi.

Orası da mənə çox qəribə gəlirdi ki, onlar Quruçaydan qayıdıb gələndə elə şirin danışıb-gülürdülər ki, elə bil heç nə olmamışdı.

...Mən böyüdükcə daima kədərli, qaşqabaqlı olmağımın səbəbini hiss etməyə başlayırdım. Hiss edirdim ki, mən bu dünyada həmişə fərəhli hadisələr, əhvalatlar görmək istəyərdim. İnsanları həmişə şad, alicənab görmək istəyərdim. Lakin mən daim bunun əksinə rast gəlirdim. Ona görə də, özümü xoşbəxt hiss eləyə bilmirdim. Mənim əhvali-ruhiyyəm termometrdəki civəyə bənzəyirdi; civə isti-soyuqdan qalxıb endiyi kimi, mənim əhvali-ruhiyyəm də ətrafımdakı insanların ləyaqət və sevincindən asılı idi. Məsələn, mən istəyirdim ki, anam həmişə sağlam, sevincli olsun, amma o tez-tez azarlayırdı. İstəyirdim ki, atam başqa atalar kimi məni çox istəsin, mənimlə xoş rəftar eləsin, məni danlamasın, anamla da həmişə yaxşı dolansın. Amma atam həmişə mənimlə sərt rəftar eləyirdi, məndə heç bir fərəhli cəhət görmürdü. (Bəlkə də, görürdü, bəlkə də, məni istəyirdi, yəqin ki, istəyirdi, amma mən bunu hiss etmirdim.) Anamla sözləri düz gəlmirdi, tez-tez dalaşırdılar.

Mən Nuru dayımın yaxşı at minməyinə, çox sərrast güllə atmağına, gözəlliyinə valeh olurdum. Amma onun Fatma nənəmlə rəftarı, İmaşla olan əhvalatı, təzə evləndiyi cavan arvadını hər gün aparıb Quruçayda döyməsi onun haqqındakı yaxşı hisslərin hamısını yuyub aparırdı. İlk dəfə mən məktəbə böyük bir fərəhlə, fərəhli xəyallarla getmişdim. Amma lap birinci gün, birinci dərsdə Mirzə Camal müəllim mənim dərdimi bilməyə-bilməyə uşaqlarla birlikdə mahnı oxumadığım üçün məni kobud tərzdə itələyib bayıra saldı. Uşaqların gözü qarşısında təhqir etdi. Evdə bu məsələni bilən atam, anam mənim nə üçün mahnı oxumamağımın səbəbini öyrənib dərdimə qalmaq əvəzinə, məni “maymaq”, “filinti” deyə danlayırdılar və sairə... və sairə...

...O vaxt Bayram babam bərk xəstə olanda bir gün anam mənə dedi ki, “keç o biri evdə babana dua elə. Deyirlər, Allah günahsız uşaqların duasını tez eşidir”. Mən də o biri otağa keçərək Fatma nənəm kimi əllərimi göyə qaldırıb Allahdan iltimas elədim ki, babama şəfa versin.

Doğrudur, babam sağalmadı, lakin mən yenə də Allahdan əlimi üzmədim. O vaxtdan sonra mən, demək olar ki, hər gün Allahdan xahiş edirdim ki, anamı xəstələnməyə qoymasın. Sonra mən özümə həmdərd tapdığıma sevinərək, eyzən həyətimizdəki böyük tut ağacının altında təklənərək, gözlərimi göyə dikib incikliklərimi, kədərlərimi Allaha söyləməyə başladım. Və mənə elə gəlirdi ki, Allah məni dinləyir və nə vaxtsa iltimasıma əncam eləyəcək.

...Dayımgil gələndən on-on beş gün sonra Anahidin anası Zaro gəldi. Bu, ucaboylu, enlikürək, üzündə xal, təmkinli bir arvad idi. O, anamgilə dedi ki, "Nuru mənim qızımı dilə tutub götürüb qaçıb. Gəlmişəm qızımı qaytarıb aparım".

Anam da cavab verdi ki:

– Qızın öz xoşu ilə gəlib. Aparmağa ixtiyarın yoxdur.

Lakin Zaro dediyindən dönmürdü. Qızını kənara çəkib erməni dilində hərarətlə nə isə deyirdi.

Sonra atam Zaronu başa salmağa çalışırdı ki, "daha işdir olub, bir-birilərini istəyirlər".

Mən birinci dəfə olaraq, atamı tamam başqa adam kimi görürdüm. Birinci dəfə olaraq, atamın ağıllı, təmkinli, hörmətkar, xoşsifət bir adam olduğunu görürdüm və nə üçün onun mənə qarşı da belə olmadığına yanırdım.

Dayım Zaroya nə qədər dil tökdüsə də olmadı. Axırda Zaro şikayət elədi. Qızı çağırıb danışdırdılar. Soruşdular ki, "qayıdıb ananla getmək istəyirsənmi?" Dedi: "İstəyirəm".

Zaro qızını götürüb getdi Şuşaya.

Bir neçə gündən sonra başqa bir hadisə oldu. Nuru dayımın qəza hökumətində mühüm vəzifədə olan bir dostu ona xəlvətcə deyir: "Əgər, lap bu saat qaçmasan, səni keçmiş işlərinə görə tutacaqlar. Üçlüyün qərarı var".

Bir gün əvvəl Qızılbaşoğlu Alı da bizə gəlmişdi. Gündüz saat on bir-on iki olardı. Bir də gördük ki, dayım tələsik gəlib anamı qırağa çəkərək, həyəcanla nə isə dedi. Sonra Alını çağırıb ona nə isə dedi. Sonra balaca tapançasını cibinə qoyaraq, Alı ilə birlikdə evdən çıxıb bazara tərəf deyil, bizim evin üst tərəfindən yola tərəf getdilər. Özləri də elə yeriyirdilər ki, elə bil, gəzməyə gedirdilər. Onlar yavaş-yavaş gedib yalı aşdılar o biri tərəfə. Sonra haçandan-haçana Alı tək qayıdıb gəldi. Anama dedi ki, "Nurunu lap Qaraxanbəylinin altına qədər aparıb ötürdüm".

Və elə bu zaman bir nəfər hökumət adamı iki nəfər milislə gəldilər bizə, həmin adam anama dedi:

– Haradadı Nuru?!

Anam da cavab verdi:

– Bilmirəm. Səhərdən gedib şəhərə.

Gələnlər dayımın beşatılan tüfəngini və patronla dolu iki kəmərini götürüb getdilər.

...Fatma nənəm indi öz evlərində təkcə olurdu. Oğlunun qaçdığını eşidəndə arvadın dərdi yenə də birə-on artdı. Yenə də saatlarca oğluna dua eləyirdi. Babamdan sonra onların evləri mənə olduqca tutqun və kədərli görünürdü, mən bu binadakı otaqların necə darısqal olduğunu yalnız indi hiss edirdim. Mən Fatma nənəmin keçirdiyi iztirabları da indi daha dərindən duyurdum. Görürdüm ki, heç kəsin, o cümlədən ata-anamın da Fatma nənəmin nələr çəkdiyindən xəbərləri yoxdur. Görürdüm ki, hamı Fatma nənəmə biganədir. Və bu, mənim təbiətimdəki məyusluğu artırırdı. Mən adamların məndən də beləcə daxilən uzaq olduqlarını acı bir kədərlə düşünürdüm. Sonra mənim bu barədəki hisslərimin, düşüncələrimin miqyası getdikcə böyüyürdü. Qonşuluğumuzdakı qoca qarı nənələrə bedahat gəlinlərin necə divan tutduqlarını və ərlərinin onlara qahmar çıxdıqlarını eşitdikcə bütün mühit mənə babamgilin evi kimi tutqun və kədərli görünürdü.

Birinci dəfə olaraq, yalnız özümün deyil, ümumiyyətlə, insanların həyatındakı dərdləri hiss edirdim. Qonşumuzda bir kişi üç uşağı ilə arvadını ataraq gedib dövlətli dul bir arvadla evlənib, onun evinə girmişdi. Mən bu əhvalatı eşidəndə Kürdobadakı Qaracanı və onun çobana qoşulub qaçan anasını xatırladım. Birinci dəfə olaraq insanların nəyi, hansı ləzzəti isə, öz övladlarından çox istədiklərini dərk etməyə başladım, bu mənə son dərəcə qəddarlıq kimi göründü. Arvad-uşaqlarını atıb gedən kişiyə bəzən küçədə-zadda rast gəlirdim. Onun başqa kişilərlə zarafatlaşdığını, qəhqəhə ilə güldüyünü də görürdüm və onun bu şadlığı mənə iyrənc təsir bağışlayırdı. Mən heç vəchlə anlaya bilmirdim ki, uşaqlarını yiyəsiz atıb gedən, onların ac-susuzluğundan xəbəri olmayan adam başqa bir şeydən necə zövq ala bilər?! Bu cür adamlar da mənə Nuru dayım kimi anlaşılmaz, müəmmalı görünürdülər. Amma bütün bədəni, saçları, kirpikləri ağ olan Kəklik xalanın bizim alt evdə, torpaq döşəmənin üstündə oğlanları ilə əyləşib göy-soğanla şorçörək yemələri və heç birinin də üzündə narazılıq, kədər-filan əlamətləri görünməməsi mənə olduqca xoş təsir bağışlayırdı. Kəklik xala kimi anaları olduğu üçün mən onun oğlanlarını xoşbəxt hesab eləyirdim. Onların lap körpə vaxtlarından atasız qaldıqları barədə isə düşünmürdüm.

...Nuru dayım Qarabulaqdan qaçandan bir neçə ay sonra bir gün atam günorta naharına gələndə, bir növ, istehza ilə dedi:

– Qardaşın Bakıdadı, evi də satıb Muxtar bəyə.

– Hansı evi? – deyə anam təəccüblə soruşdu.

Atam eyni ifadə ilə dedi:

– Neçə eviniz var?.. Buradakı ata evinizi.

Anam acıqlı-acıqlı dedi:

– Ev anamındı. Nurunun nə ixtiyarı var evi satsın?

Atam dedi:

– Onu qardaşından soruşmaq lazımdı. Ağlına nə gəlir eləyir. Tutaq ki, onun da pulunu üç-dörd aya xərcləyib qurtardı, sonra?!

Anam papiros yandıraraq daha bir söz demədi. Atam nahar eləyib gedəndən sonra anamla getdik Fatma nənəmgilə. Nənəm eyvandakı taxtın üstündə oturub müştükdə papiros çəkirdi. Anam dedi:

– Məşədi Qulunun oğlu, Nurunu Bakıda görüb.

Arvadın indi tez-tez sulanan ala gözləri birdən-birə canlandı və o, həyəcanla soruşdu:

– Deyir, nə təhərdi, naxoş-zad döyül ki?

Anam acıqlı-acıqlı dedi:

– Naxoş niyə olur?.. Özü də evi satıb...

Nənəm də təəccüblə soruşdu:

– Hansı evi?

Anam yenə acıqlı-acıqlı dedi:

– Budey, bu içində olduğun evi.

Nənəm müştüyünü dərindən sümürüb düşkün səslə soruşdu:

– Kimə satıb?

– Qaradonlu Muxtar bəyə.

Fatma nənəm neçə ildən bəri onda birinci dəfə gördüyüm bir qızğınlıqla dedi:

– Bəyəm, Bayram, Muxtardan əskik kişi idi ki, onun qoyub getdiyi evi Muxtara satıb, yurdunu kor qoyurdu?!

Anam dedi:

– Sən onu oğluna de!

Elə bil ki, anamın bu sözü nənəmin bütün cəsarətini əlindən alıb, onu yenə də əvvəlki halına qaytardı. Nənəm müştüyündən dərindən bir nəfəs alıb dinmədi. Anam dedi:

– Qanunla ev sənə düşür! Nurunun ixtiyarı yoxdu özbaşına onu satsın. Qoy sənin adından bir ərizə yazaq, verək, hökumət qaytarsın.

Mən həyəcanla nənəmə baxdım. Bayram babamdan qalan evi başqa adama satdığı üçün mən də dayımın qarasına əsəbiləşirdim.

Vaxtilə babamın məni istədiyi, mənə xoş sözlər dediyi bu evdə indi kimlərinsə gəlib olacaqları məndə acı bir ruh düşkünlüyü yaradırdı, məni təhqir edirdi. Ancaq nənəm dinmirdi.

Anam soruşdu:

– Nə deyirsən, ərizə yazaq?

Nənəm qorxa-qorxa, yavaş səslə dedi:

– Tay satandan sonra nə ərizə?..

Anam acıqlı-acıqlı dedi:

– Səni başa saldım ki, ev sənə çatır. Oğlunun ixtiyarı yoxdu satsın!

Nənəm müştüyünü sümürə-sümürə qarşısında bir nöqtəyə baxıb dinmədi.

Anam:

– Sənin kimi arvada bu da azdı! – deyib qalxdı. – Onu əvvəldən o cür eləyən sən olmusan.

Mən heç cürə təsəvvür eləyə bilmirdim ki, nənəmi gəlib bu evdən çıxara bilərlər. Ancaq bir aydan sonra Muxtar bəyin adamları gəlib nənəmi xəbərdar elədilər ki, on beş günəcən evi boşaltsın.

Nənəmin getməyə başqa yeri olmadığı üçün köçüb gəldi bizə.

Sonra mən təkcə gəlib babamgilin boş qalmış evinə, yiyəsiz qalmış bağına baxdım; hər şeydə – kirəmit taxtapuşlu evin sükutunda da, ağacların duruşunda da, Bayram babamın təzə ev tikdirmək üçün vaxtilə həyətə tökdürdüyü daşların görünüşündə də dərin bir pərişanlıq görüb kövrəldim. Mən kürdobalıların Dəliçay yaylağını xatırladım. Elə bil ki, el köçüb, yurdu qalmışdı. O vaxt biz kürdobalılarla o yaylaqdan köçüb arana tərəf yol alanda Mustafaoğlu qanrılıb boş qalmış yurda baxıb, dağlarda əks olunan səslə bayatı çağırmışdı:

Dağlar marala qaldı,
Otu sarala qaldı.
Soyuq bulaq, göy çəmən,
O da marala qaldı.

Amma mən bilirdim ki, gələn yay Mustafaoğlu da, o el-oba da yenə gedəcək yaylağa. Amma nə Fatma nənəm, nə Bayram babam bir də bu evə, bu bağa qayıtmayacaq. Elə buradaca mənim yadıma İmaş düşdü. İmaş da bir daha bura qayıtmayacaq... İmaşı da buradan qaçırdan dayım oldu. İmaş o yandan şah ərbabının zülmündən qaçdı, buradan da Nuru dayımın... Nə üçün bu dünya belə qurulub?

Mən bu azca ömrümdə birinci dəfə olaraq insanların rəftarında, bu dünyaya gəlmələrində anlaşılmaz bir uyğunsuzluq və bu uyğunsuzluğu daim müşayiət eləyən acı, biganə bir kədər hiss edirdim. Və başa düşmürdüm ki, nə üçün adamların gülüşü, sevinci mənə süni görünür? Mənə sirayət eləmir?

Mən bu aləmə qaynayıb-qarışa bilmirdim. İman kişi gündüz qonşulara kəhrizdən su daşıyıb, gecələr öz aləmi ilə məşğul olduğu kimi, mən də gündüz məktəbə gedir, dərslərimi öyrənir, anamla atamın söhbətlərinə qulaq asıb, gecələr öz otağımda tək qaldıqda öz aləmimlə məşğul olurdum. Bu aləm isə qəribə idi. Fatma nənəm mənə nağıl eləmişdi ki, Firon qərara gəlib ki, gərək yer üzündə də Allahın behişti kimi bir behişt düzəltsin. Firon həmin behiştin torpağını mirvari, ləl-cəvahirat elətdirir, meyvə ağaclarının yarpaqlarını qızıl elətdirir, abkövsər kimi şirin bulaq düzəltdirir. Bir sözlə, əsl cənnət yaradıb, dünyanın gözəl qızlarından da gətirdib, huri elətdirir. Və bu cənnət Allahın o qədər xoşuna gəlir ki, əmr edib onu göyə çəkdirir.

Mən də nənəmə sual verirdim:

– Nə üçün Allah qoymurdu o cənnət də bu dünyadakı insanların olsun?

Nənəm dedi:

– Allah-taala bilirdi ki, o cənnət yerdə qalsa, ora getməkdən ötrü adamlar dava salıb bir-birini qıracaq.

– Nə üçün Allah qoyur adamlar bir-birini qırsın?

Burada nənəm hirslənib deyirdi:

– Qələtini elə, Allahın işinə əl aparma!

Mən də nənəmə dedim:

– Sən həmişə söz tapmayanda deyirsən “Allahın işinə əl aparmaq olmaz”... Niyə olmur?

Nənəm özündən çıxıb dedi:

– Ay irtməkli sünnünün oğlu, olmaz! Günahdı!

Amma mən Fironun cənnətini xəyalımda yerə endirib, özüm də ora daxil olurdum və orda mənim üçün əfsanəli bir həyat başlayırdı. Orada daim yaz idi. Nə qış olurdu, nə sis-duman, eyzən günəşli idi. (Mən qışı, sis-dumanlı payız günlərini sevmirdim. Elə bil ki, mənim, səbəbini heç özüm də aydın dərk eləyə bilmədiyim, dərdimi-kədərimi soyuq, sisli-dumanlı günlər daha da artırırdı.) Mənim cənnətimdə isə,

həmişə tabaq boyda ağ, qırmızı çəhrayı qızılgüllər, ağ, qırmızı qərənfillər günəşin sevincli parlaq ziyası içində parıldayırdı. Ancaq mənim cənnətimdə sarı gül, sarı çiçək olmurdu, çünki mən sarı rəngi sevmirdim. Sarı rəng daim mənə anamın xəstəliyini, atamın danlaqlarını xatırladırdı. Gözəl nərgizgülü, bənövşə mənə kədərli təsir bağışlayırdı. Çünki onlar hələ qış tamam qurtarmamış qarın içindən baş qaldırırdılar və mənə elə gəlirdi ki, onlar da mənim kimi üşüyürlər. (Mən çox üşüyən olduğum üçün soyuğu, qarı, buzu sevmirdim.)

Mənim cənnətimdə gözəl, şən oğlanlar olurdular. Mənim cənnətimdə hər şey gözəl idi.

Mən o cənnətdən çıxıb, evimizdəki adi həyata qayıdıb atamı qaşqabaqlı və yenə nə üstündəsə anamla küsülü görəndə, sonra bazardan alınmış, çovdarqarışıq, pis bişmiş çörəklə əvəlik dadı verən dişləmə çay içəndə özümü son dərəcə məyus hiss edirdim. Bununla belə, mən, həyatımızın indi xeyli yoxsul keçməsinə anamdan, atamdan tez alışmışdım. Yemək-içməyimizin, paltarlarımızın indi xeyli yoxsul olması, mənim köhnə paltoda, yamaqlı ayaqqabıda məktəbə getməyim gözümə görünmürdü. Anam həmişə mənim haqqımda deyərdi:

– Murad gözütox uşaqdı.

Məktəbə gedəndə atamgil mənə iyirmi qəpik verə bilmirdilər ki, mən də yoldaşlarım kimi, tənəffüslərdə həmşəri Əlinin məktəbimizin yanındakı dükanından meyvədən-zaddan alım. Bu da mənə pis təsir eləmirdi. Məni həmişə içində dolaşdığım mühit, adamların bir-birilə və mənimlə rəftarı sıxırdı. Hiss edirdim ki, atam, Fatma nənəmin bizə köçməsindən razı qalmayıb. Hər dəfə atamı görəndə, Fatma nənəmin üzündə yaranan çəkingən, bir növ, günahkar ifadə, atamın nənəmlə kəlmə kəsib danışmamağı, soyuq rəftarı ağır bir qüssə kimi ürəyimə çökürdü. Hiss edirdim ki, nənəm bizdə çox sıxıntı çəkir və bununla belə, yenə də hər gecə oğlu Nuruya dua edirdi.

Mən gecələr yatağıma girəndə gözümü pəncərədən bayırdakı qaranlığa zilləyərək Fatma nənəmi öz cənnətimdə, qızıl taxt-rəvan üstündə əyləşdirib, qabağına qızılgül ətri verən çay və qızıl qutuda, Bayram babamın vaxtilə çəkdiyi zəfəran kimi sapsarı, ipək kimi saçaqlı tütün qoyurdum, nənəm də indiki kimi qarğı müştükdə deyil, qızıl müştükdə bu tütündən çəkib nəşə ilə güllərə, çiçəklərə tamaşa edirdi. Mənim cənnətimdə bütün hurilər, mələklər, adamlar və mən özüm həmişə bir sevinc içindəydik. Xoşbəxt idik...

Vəziyyətimiz çətin keçirdi. Ancaq xüsusi ticarətə hökumət icazə verdikdə atam anamın üstündəki qızıl şeylərdən satıb əlində maya eləyərək yenə də xırda dəmir-dümür alverinə başladı. (Mən sonradan bildim ki, bu ticarətə-filana da icazə verilməsi yeni iqtisadi siyasətin nəticəsində imiş...)

Vəziyyətimiz bir ara babatlaşdı. Mən dördüncü sinfə keçdiyim ilin yayı bərk isti olduğundan atam bizi Şuşa qalasına apardı. Fatma nənəm isə evimizdə qaldı. Biz, anamın xalası Bəyaz xanımgilə düşdük.

Bəyaz xanımgilin evi, əvvəl təsvir elədiyim kimi, Şuşanın "Cıdır düzü" adlanan ən hündür və səfalı yerindəydi. Evin qabağında böyük bağ var idi. Bu bağı Bəyaz xalanın xalq arasında "Hacı Axund" adı ilə məşhur olan mərhum əri öz əlilə salmışdı. Axund rəhmətə gedəndə yaşı yüzə yaxın olub. Onun özünün də, qızının da, Əhmədin öldürdüyü arvadı Yasəmənin də məzarı bağın içində idi. Ətrafında cürbəcür güllər, çiçəklər əkilmişdi. Deyirdilər, Axund hələ sağlam, qıvraq olduğu zaman bağın içində öz məzarını özü hazırlayıbmış... Bağın Cıdır düzünə açılan darvazasının yanında böyük bir qoz ağacı var idi, bu ağacı da o biriləri kimi Axund özü əkmişdi. Ağacın, deyilənə görə, indi yetmiş yaşı var idi. O qədər qollu-budaqlı idi ki, kölgəsində yüz adam otura bilərdi. Gövdəsi sağlam, yarpaqları yamyaşıl idi. Onun ümumi görünüşündə mən qeyri-adi bir gümrahlıq hiss edirdim və bu hiss bir an məndə elə bir təsir yaradırdı ki, elə bil bunu əkib gedən rəhmətlik Hacı Axund heç ölməmişdi. O da, hardasa, bu ağac kimi sağlam və gümrahdır. Hündür gilas ağaclarının üstü kəhrəba kimi sarı gilasla dolu idi. Almalar, armudlar hələ yetişməmişdi. Ağacların arası yasəmənlə, qızılgüllə dolu idi. Bu güllər ipək kimi yumşaq dağ otlarının arasından qalxıb, elə bil ki, mənə sevinclə baxırdılar. Ancaq mənə hamıdan xoş gələn Mirzə Məhəmməd dayının böyük qızı Səriyyə idi. Qara, çatmaqaş, qaragöz, gözəl, zərif bir qız idi. Məni görəndə gülümsədi. Mən də onun dümağ sədəf kimi dişlərini, təbəssümünü görüb indiyə qədər heç bir zaman özümdə hiss eləmədiyim qəribə bir sevinc duydum. Mənə elə gəldi ki, indiyə qədər üzərimdə ağır bir bulud varmış və bu bulud bütün bağların, çöllərin üzərinə tutqun, kədərli bir kölgə salırmış, indi elə bil ki, bu qızın mənə baxıb gülümsəməsilə o bulud çəkilib getdi. Bütün dünya işığa, sevincə qərq oldu. Elə bil ki, indiyə qədər mənim bədənimdə ağır bir kəsafət varmış və bu qızı görməyimlə o kəsafət yox

oldu. Mən özümü təəccüblü dərəcədə yüngül, şad hiss edirdim. Mən həyəcanla düşünürdüm ki, bu dünyada necə gözəl hisslər varmış...

Sonra mənim fikrimdən keçən ilk şey o oldu ki, "Əlibaba və qırx quldur" kitabımı ona bağışlayım. Çünki mənim yeganə qiymətli şeyim o kitab idi. Yaxşı oxuduğum üçün onu mənə müəllimim bağışlamışdı. Mən ondan soruşdum:

– Sən də üçüncüdən dördüncüyə keçmisən?

O, pərişan bir təbəssümlə dedi:

– Mən oxumuram.

– Nə üçün?

– Atam qoymur. Deyir, qız uşağısan.

Mən dedim:

– Nə olsun qız uşağısan?! Bizim sinifdə neçə qız oxuyur.

O dedi:

– Amma mən çox oxumaq istəyirəm.

Mən onun səsində bir həsrət hiss elədim və bu, mənə toxundu.

Sonra mən anamdan soruşdum:

– Nə üçün Mirzə Məhəmməd dayı Səriyyəni qoymur məktəbə getsin? Bizim şəhərdə qızların hamısı oxuyur.

Anam dedi:

– Xalaoğlu belə adamdır də... Özü gimnaziya qurtarıb, amma qızlarını qoymur oxusun.

Mən soruşdum:

– Axı niyə?

Anam dedi:

– Şəhərdə Mirzənin düşməni çoxdur. Ona görə də, qızını məktəbə buraxmır.

Mən soruşdum:

– Axı, qız uşağına nə olacaq ki?

Anam qaşlarını çatıb dedi:

– Fikir eləyir ki, düşmənləri qızı oğurlayarlar.

Mirzə Məhəmməd dayı ortaboylu, əsmərbənizli, qısa vurdurduğu saçları çallaşmış bir adam idi. Qıçının birinə güllə dəydiyindən azca axsayırdı, Qarabağda adlı-sanlı qoçulardan hesab olunurmuş. Atası nə qədər xeyirxah, camaat dərdinə qalan imişsə, Mirzə Məhəmməd dayı o qədər amansızmış, sözünün qabağına söz demək olmazmış. İndi də yanında gizlin tapança gəzdirirdi. Danışırdılar ki, Nikolay vaxtı Kür-

düstan tərəfdə çar naçalniki olanda, bir dəfə bir neçə strajniklə atlı gəlirmiş. Görür ki, yolda bir kəndli ayaq üstə pəşov eləyir. Mirzə Məhəmməd dayı atının başını çəkib soruşur ki:

– Niyə ayaq üstə pəşov eləyirsən? Müsəlman deyilsən?

Kəndli də qabağındanyeməz adam imiş, deyir:

– Sənə nə var, yaxşı eləyirəm.

Mirzə Məhəmməd dayı da, eləmə tənbəllik, tapançanı çıxarıb kişini vurub öldürür.

Biz özümüzlə Misir adlı nökərimizi də aparmışdıq. Bu, gödək, yumru, özü də pəltək bir oğlan idi. Hər kəlmənin ancaq birinci hissəsini deyə bilirdi.

Bir dəfə armud salmaq üçün Misirin ağaca selbə atmağını Mirzə Məhəmməd dayı gördü, gözlənilməz bir cəldliklə Misiri tutub yerə yıxaraq acıqlı-acıqlı dedi:

– Bıçağı gətirin, bu köpəkoğlunun başını kəsəcəyəm.

Misir də "və..." deyə əcaib bir səslə bağırdı.

Sonra mən anamdan soruşdum:

– Bağın meyvələrini eyzən qonşulara paylayırlar. Bəs, niyə Mirzə Məhəmməd dayı Misirin başını kəsmək istəyirdi?

Anam gülüb dedi:

– Ona görə ki, Mirzənin ağacına daş atmaq olmaz!

Mirzə Məhəmməd dayı, deyilənə görə, çox igid adam idi, amma boydan çox gödək görünürdü. Onun nahaq yerə kəndlini o cür vurmağı, Səriyyəni məktəbə buraxmamağı məni dəhşətə gətirirdi.

Biz Səriyyə ilə bütün günü bağda oynayırdıq. Hətta gecələr də, bir-birimizdən ayrılmaq istəmirdik. Bir dəfə də biz onunla əl-ələ tutub bağda gəzdiyimiz zaman anası Yasəmən xala görüb qıza acıqlandı:

– Qız uşağı oğlanla əl-ələ gəzməz!

Mən utandım, ancaq nə üçün utandığımı bilmədim. Sonra biz, yalnız heç kəs görməyəndə, yəni, ətrafımızda adam olmayanda əl-ələ tutub gəzirdik. Biz ikimiz də bundan hədsiz bir zövq alırdıq. Xəzinə qayasına yüyürərək sarp qayalı uçurumun dibində qarğa kimi qaralan adamlara, qıjıltı ilə axan Daşaltı çayına, onun o biri sahilindəki Topxana meşəsinin altındakı daş divarları, barıları görünən xaraba Xan Sarayına tamaşa edirdik.

Fatma nənəm mənə nağıl eləmişdi ki, Xan bu qalanı ona görə tikdirib ki, başqa padşah Şuşaya hücum eləyəndə qaçıb orada daldalansın.

Mən də fikirləşirdim ki, vaxta ki, xan bərkə düşəndə öz adamlarını qoyub, bu qalada gizlənirmiş, demək, qorxaqmış. Əlbəttə, mən bu düşüncələrimi Səriyyəyə demirdim. Mən ona yaxşı şeylər haqqında danışmaq istəyirdim. Mən ona "Əlibaba və qırx quldur"u nağıl edirdim, Zümrüd quşunun Məlikməmmədi öz belində zülmət dünyasından işıqlı dünyaya necə gətirib çıxardığını danışırdım. Uçurumun o tərəfindəki meşələrdən gələn xəfif yel Cıdır düzünün yumşaq otları ilə bərabər, onun da ağ alnında qıvrılan xurmayı saçlarını tərpədib oynadırdı və bu hal mənə heyrətli dərəcədə gözəl görünürdü. Bəzi anlarda mənə elə gəlirdi ki, Səriyyə ilə mən tamam başqa aləmdəyik. İndiyə qədər mənə məlum olmayan nağıl kimi gözəl bir aləmdə...

Mən Robinzon Kruzonun macərasını böyük bir həvəslə ona nağıl eləyəndən sonra onu da demək istəyirdim ki, biz də, yəni, Səriyyə ilə mən də heylə bir adada olsaydıq nə gözəl olardı... Amma demədim. Çünki mən danışıb qurtarandan sonra o dedi:

– Yazıq Robinzon tək-tənha o adada necə yaşayırmış, darıxmaqdan adamın bağrı çatlar...

Nəhayət, avqustun axırları gəldi və mən Səriyyədən də, o əfsanəli aləmdən də ayrılmalı oldum.

Atamın bacısı oğlunun ailəsi də Şuşada yaylaqlanırdı. Atamın bacısının əri Əbdüləziz də on gün olardı ki, atamla gəlmişdi Şuşaya.

Atam mənə dedi:

– Əbdüləziz, Molla Nəsrəddin yolu ilə atlı gedir Qarabulağa, sən də bizim atı minib onunla gedərsən, biz faytonla Ağdam yolu ilə gedəcəyik.

Mən başı çiyinlərinin arasına girmiş gödək Əbdüləzizi sevmirdimsə də, dinmədim.

Anam dedi:

– Uzun, narahat yoldu, uşaq yorulub əldən düşər.

Atam acıqlanıb anama dedi:

– Sən bunu gülməşəkər eləmə, qoy bərkə-boşa düşüb öyrənsin.

Mən qaşqabaqla dedim:

– Yorulmaram.

Səhər atam bizim atımızı yəhərləyib tapqırlarını möhkəm çəkdi, anamın mənim üçün yemək qoyduğu keçə xurcunu bağladı atın tərkinə. Səriyyə içəridə, pəncərənin qabağında dayanıb tamaşa edirdi.

Sonra atam cilovu yəhərin üstünə qaytararaq mənə dedi:

– Min görək.

Mən ayağımı üzəngiyə qoyub atın üstünə qalxaraq qanrılıb Səriyyəyə baxdım. O da mənə baxıb gülümsədi. (Sonralar da... Lap sonralar da mən dünyada o qədər riqqətli təbəssüm görmədim.) Mən də gülümsədim. Ancaq bilmirəm ki, necə gülümsədim. Onu bildim ki, ayrılıq çox kədərli şeydir. Yəni, mən, bu böyük dünyada birinci dəfə ayrılıq acısının nə demək olduğunu dərindən hiss elədim. Bir an mənə elə gəldi ki, bütün vücudum və bu böyük dünya ancaq kədərdən ibarətdir. Mən Hacı Axundun bağındakı sarı gülləri xatırladım. Bir dəfə Səriyyə qara gözləri ilə gülümsəyib mənə dedi:

– Bax, bu sarı güllərdən qırmayasan...

Mən soruşdum:

– Nə üçün?

– Ona görə ki, sarı gül ayrılıqdır.

Mən də dedim:

– Qırmaram. Mənim sarı rəngdən xoşum gəlmir.

Və mən heç bir zaman sarı gülü üzmədim, amma yenə də biz ayrıldıq.

Qabaqda atamın fasıq yeznəsi, arxasınca da mən Şuşa qalasının böyük qapısından çıxıb kəsmə yolla uzun yoxuşu enməyə başladıq. Fikirləşdim ki, görəsən, mən həyətdən çıxandan sonra Səriyyə hara getdi? Neylədi? Kiminlə danışdı?

Şuşa qalasından Qarabulağa gedən əlli verstlik yol daim üzü enişə idi. Nə üçün bu yola "Molla Nəsrəddin" yolu deyirdilər? Bilmirdim. Biz eyzən uçurumlu dağların, qalın meşələrin arası ilə gedirdik. Mən tək qalmaq istədiyim üçün kişini irəli buraxıb özüm ondan xeyli aralı, arxasınca gedirdim. Mənə elə gəlirdi ki, yalnız Səriyyədən deyil, yanlarından keçdiyim bu palıd ağaclarından da, yarpaqların arasından başlarını çıxarıb ürkək nəzərlərlə bizə baxan quşlardan da, meyvələri qaralan böyürtkən kollarından da həmişəlik ayrılıram. Biz alaçığa çatanda mən qanrılıb Şuşa qalasına baxdım. Elə bil ki, indi üstünə duman çökən dərin uçurumlu, sıldırımlı qayaların üstündəki o qədim qala nağıllarda deyilən tamam başqa bir dünyadır. Sonralar da eyzən mənim xəyalımda həmin o dumanlı qala, bir də onun içində ancaq Səriyyə canlanırdı. Amma mən son dəfə onun üzündə gördüyüm təbəssümü daha görmürdüm. Mənə elə gəlirdi ki, indi Səriyyə o duman içində hara isə məchul bir aləmə baxır və heç bir zaman gülümsəmir və elə bil, mən bunu yuxuda görürəm.

Biz Qəcər deyilən kəndin bağlarının yanından keçəndə Əbdüləziz kişi atının başını çəkərək dayandı, yol gəldiyimiz bu neçə saatdan bəri birinci dəfə mənə müraciətlə dedi:

– Düşək burda bir az çörək yeyək.

Biz düşüb, atları qolbənd eləyib buraxdıq otlamağa.

Əbdüləziz kişi bağbanı çağırıb, pul verib dedi:

– Bizə bir az üzüm dər, gətir.

Sonra öz xurcunundan pendir-çörək, mən də anamın qoyduğu kotletləri, çörəyi çıxardım. Otun üstündə oturub bağbanın gətirdiyi təzə üzümlə yeməyə başladıq. Mənim heç iştaham yox idi. Bir balaca salxım üzümlə bir tikə pendir-çörək yeyib qalxdım.

Əbdüləziz kişi xoş ifadə ilə mənə baxıb soruşdu:

– Niyə yemirsən?

Mən dedim:

– Ürəyim istəmir.

Mən onun yanında özümü daha yalqız, daha kədərli hiss edirdim. Ona görə də qalxıb atımın yanına getdim.

Biz Qarabulağa çatanda gün batmışdı. Mən atamın yeznəsindən ayrılaraq anamın tapşırığı ilə onun rəfiqəsi Bilqeyis xalagilə getdim. Bilqeyis xalanın əri Abdulla bəy Qarğabazar məktəbində atamın rus dili müəllimi olmuşdu. Bu, anasının məzarı haqqında mənə qəmli şeylər danışan həmin Abbas bəyin atası idi. Abbasın anası rəhmətə gedəndən sonra Abdulla bəy öz baldızı Bilqeyis xanımla evlənmişdi. Mən atı onların tövləsinə bağlayıb, Abbasla birlikdə yəhərini götürüb, axuruna arpa-saman tökəndən sonra çıxdıq ikinci mərtəbədə olan evlərinə. Bilqeyis xala da, Abdulla bəy də məni çox mehribanlıqla qarşıladılar. Anamgildən hal-əhval tutdular. Sonra biz şüşəbənddə oturub günorta yeməyindən qalmış boyat sousla, qarpızla şam elədik. Şamdan sonra Abdulla bəylə Abbas bəy başladılar qarpız dənələrini çırtlamağa. Bu da məni lap dilxor elədi. Çünki həmişə biri yanımda qarpız dənəsi çırtlayanda ətim ürpəşirdi. Abdulla bəy qarpız dənələrini çırtlaya-çırtlaya atamın uşaq vaxtı öz kəndlərindən Qarğabazara səkkiz kilometr yol gəldiyinə baxmayaraq, bir dəfə də olsun dərsə gecikməməyindən, Bilqeyis xala da Nuru dayımın öz yerimizdəki bu qədər gözəl qızlardan heç biri ilə evlənməməyindən danışırdı. Burada mənim üçün maraqlı olan və eyni zamanda təəccüblü olan Abbasın öz atası ilə qabaq-qabağa oturub qarpız dənəsi çırtlatmağı və onun söh-

bətinə tamam sərbəstliklə müdaxilə eləməsi idi. Bir dəfə atam mənim günəbaxan dənəsi çırtladığımı görüb o ki var, danlamışdı. Mən də bir daha onun yanında günəbaxan dənəsi çırtlamamışdım. Mən heç bir zaman atamla belə sərbəst söhbət eləməmişdim. Ona görə də mən Abbasın öz atası ilə bu cür açıq-saçıq rəftarına qibtə eləyirdim. Mənə elə gəlirdi ki, əgər, atam da mənimlə belə rəftar eləsəydi, mən özümü bəlkə bu qədər yalqız hiss eləməzdim. Mən bunu düşünüb kədərlənirdim. Atamın mənimlə rəftarında heç bir ataya oxşamadığını hiss elədiyim kimi, özümün də heç bir yaşıdıma bənzəmədiyimi duyurdum. Bu ayrılıq heç də mənim izzəti-nəfsimi oxşamırdı. Əksinə, bu, mənim özümə, öz bacarığıma inamımı getdikcə azaldırdı, mənim daxili aləmimdə bir bədbinlik yaradırdı. Sinifdə hamıdan yaxşı oxumağım da, anamın rəfiqələrinin mənim haqqımda dedikləri təriflər də artıq məni şad eləmirdi. Mən həyətimizdəki böyük tut ağacının altında saatlarla oturub öz haqqımda, özümün bu dünyada lazımsızlığım haqqında düşünürdüm. Və mən gözlərimi tut ağacının enli yarpaqları arasından görünən mavi göylərə dikərək tez-tez Allahdan soruşurdum: “Məni nə üçün yaratmısan?!”

Yəqin məsələdir ki, mən heç bir cavab almırdım. Və o zaman dərin bir ümidsizliklə gözümü göylərdən çəkib, tut ağacına baxırdım və mənə elə gəlirdi ki, tut ağacı mənim nə soruşduğumu eşidir və dərdimə şərik olur, amma cavab verə bilməyərək mehribanlıqla sükut edir.

## MƏN VƏ YENİ HƏYAT

Mən görürdüm ki, şəhərimizin cavanlarından bir hissəsi qırmızı komandirlər kimi ot rəngli parçadan köynək-şalvar geyinib, enli kəmər bağlayırlar. Dəstə-dəstə gəzərək bərkdən danışıb-gülürlər. Hələ desən, tüfəng götürüb milislərlə birlikdə dağlara, meşələrə qaçaq-quldur dalınca da gedirlər. İclas eləyib bəylərin, kapitalistlərin əleyhinə qəzəbli nitqlər söyləyirlər. Bu cavanlara “komsomol” deyirdilər. Elə bil ki, mənim özümdə də bəylərə, kapitalistlərə qarşı gizli bir kin varmış və bu kin indi zahirə çıxırdı. Komsomollarda hiss etdiyim mübariz ruh məni həvəsləndirirdi, sanki məni o axına qoşulmağa çağırırdı. Elə bil ki, məndə həyata potensial halında olan fəal müdaxilə qüvvəsi birdənbirə hərəkətə gəlib özünü göstərmək istəyirdi. Bir gün mən də cəsarətlə atama dedim:

– Komsomol olmaq istəyirəm.

Gözləyirdim ki, atamın acığı tutacaq, amma belə olmadı. O gülümsəyib anama dedi:

– Deyəsən, bu elə anadangəlmə kommunistmiş...

Sonra atam məni, Qəza Partiya Komitəsində hansı böyük vəzifədəsə olan həmkəndlisinin yanına aparıb gülə-gülə dedi:

– Bizim oğlan da komsomol olmaq istəyir.

Cavan, xoşsifət bir adam olan həmin vəzifəli şəxs gülümsəyib zarafatyana dedi:

– Görünür, bu qəşəng oğlan atası kimi burjuy olmaq istəmir. Ancaq komsomola keçməsi hələ tezdir. Yaşı düşməz. – Və o, yəqin ki, mənim pərt olduğumu görüb, elə xoş əhvalla əlavə etdi: – Qoy hələlik pioner olsun, sonra keçər komsomola.

Ordan çıxandan sonra atam mənə ürək-dirək verib dedi:

– Eybi yoxdur, sonra keçərsən. Görünür, komsomolun qaydası belədi.

...Mənim pioner olmağım atamın da, anamın da xoşuna gəlirdi, elə bil ki, bununla onlar özlərinin də yeni həyat tərəfindən rədd edilmədiklərini hiss edib, sevinirdilər. Pioner təşkilatından bizə göy qədəhdən qısa tuman, ağ köynək və qırmızı qalstuk vermişdilər. Ancaq anam mənə özü qırmızı ipək parçadan qalstuk tikdi. Mən də hər gün dərsdən sonra böyük bir həvəslə bu paltarı geyib, qırmızı qalstuku da bağlayıb gedirdim dəstəmizin məşğələsinə. Həmin ipək qalstukumun yaz vaxtı bizim çölləri bürüyən lalə tək qıpqırmızı olmağı, parçasının lalə yarpağıtək zərifliyi məndə qəribə, təravətli bir ruh yüksəkliyi yaradırdı.

Bizim dəstəmizə bir komsomol oğlan rəhbərlik edirdi. O, bizə ən çox sovet hökumətinin düşmənlərindən danışırdı. O deyirdi:

– Atası, qardaşı da sovet hökumətinin düşməni olsa, pioner gərək onu bağışlamasın. O saat gedib çekaya xəbər versin. Bəylər, kapitalistlər istəmirlər ki, biz sosializm quraq, istəmirlər ki, hamı varlı yaşasın.

Mən soruşdum:

– Nə üçün istəmirlər? Hamının varlı olmağının onlara nə ziyanı var?

Dəstə rəhbəri dedi:

– Onlar kasıbların əməyi ilə varlanırlar, fəhlələri, kasıb kəndliləri istismar eləyə-eləyə dövlətlənirlər.

Mən soruşdum:

– Nə üçün fəhlələr, kəndlilər özləri də pul qazanıb dövlətli olmurlar ki, o biri dövlətlilər də onları istismar eləyə bilməsinlər?

Mən bu sualı səmimi verirdim. Kasıb, yoxsul insanlara acıdığım üçün verirdim. Mən özümü onların tərəfində hiss eləyirdim. Ancaq pinəçi bir kişinin oğlu olan həmin dəstə rəhbərimiz qırmızı Fətiş (onun üzü qıpqırmızı olduğu üçün uşaqlar ona "Qırmızı Fətiş" deyirdilər) mənə qəzəblə baxıb acıqlı-acıqlı dedi:

– Sənin baban kimi, atan kimi bəylər, əfəndilər, burjuylar fəhlələrin, kəndlilərin qazancını tutub əlindən almasalar, əlbəttə ki, onlar da dövlətli olarlar.

– Düzdür!.. Düzdür!.. – deyə bir neçə uşaq yerindən səsləndi.

Muzdur Şirinin oğlu Fərəc ayağa durub, məni göstərərək dedi:

– Bunun babası nəçərnik olanda mənim əmimi tutub dustaq eləmişdi.

Qonşumuz Sənəm xalanın oğlu da ona bağırıb dedi:

– Sənin əmin oğrunun bir idi.

Fərəc də ona hücum eləyib:

– Oğru sənin atandı!

Fərəclə Əyyub tutaşdılar. Dəstə rəhbərimiz Qırmızı Fətiş onları güclə aralaşdırdı. Mən babalarımın zülmkar olmadıqlarını, atamın da kapitalist olmadığını bilirdim. Bilsəm də, özümü bu uşaqların yanında suçlu hiss elədim. O gündən sonra mən bu pioner yoldaşlarımın məşğələlərində ürəklə, daxili sərbəstliklə iştirak eləyə bilmədim. Elə bil ki, onların yanında bir günahım vardı.

Həmin bu vaxtlar atamın ticarət işləri tamam iflasa uğramışdı. Tikinti materialları mağazası üçün lazım olan şeyləri keçmişdə atam gedib Moskva, Petroqrad, Xarkov, daha bilmirəm, hansı böyük şəhərlərdənsə alıb gətirirmiş. Amma indi o şəhərlərdə bütün fabrik-zavodlar milliləşdirildiyindən xüsusi alverçilərə heç nə satılmırdı. Ona görə də atam öz mağazasında satmağa bir şey tapmırdı. O biri tərəfdən də atam anama deyirdi ki:

– Xüsusi tacirlərə o qədər vergi qoyurlar ki, altından çıxmaq olmur.

Qərəz, bütün bunlara görə də atam mağazadakı olub-qalan şeyləri dəyər-dəyməzinə satdı, ticarəti yığışdırıb başladı özünə bab bir qulluq axtarmağa.

Atamın ticarətdən əlini çəkməyi məni sevindirirdi. Fikirləşirdim ki, daha pioner yığıncaqlarında Muzdur Şirinin oğlu Fərəc, "alverçi oğlu" deyib mənə sataşmayacaq. Qırmızı Fətiş də "tacir oğlu" deyib məni hədələməyəcək.

Amma atama heç yerdə iş vermirdilər. Ona görə də bizim dolanacağımız çox çətinləşirdi. Mən ibtidai məktəbin üçüncü-dördüncü sinfində oxuyanda Əvəz adlı oğlanla dostlaşmışdım. Onun da atası tacir idi. Özləri də bizim kimi varlı-hallı idilər. Amma Əzizin atası bic tərpənib Şura hökuməti qurulandan iki-üç il sonra ticarəti yığışdırıb, girmişdi dərzi artelinə. (Onun əvvəli də dərzi imiş, elə dərzilikdən də dövlətlənib tacir olmuşdu.)

Dərsdən sonra Əvəzlə bir yerdə gəzib dolanırdıq. Yaz-yay vaxtı gedib Quruçayda, Köndələnçayın üstündəki Şırranda çimirdik. Bizim şəhərimizdə olan malakanlar Quruçayın qırağında böyük bostanlar əkib-becərirdilər. Əvəz bu bostanlardan tər xiyar alardı. (Məndə heç bir zaman pul olmazdı, məni belə şeylərə həmişə Əvəz qonaq eləyərdi.) Biz ucsuz-bucaqsız çəmənliklərdə xiyar yeyə-yeyə gəzib söhbət edərdik, bəzən bu geniş düzənliklərin ortasında ən uca zirvə olan Qarı dağına çıxıb, ta Arazın o tayındakı başı qarlı Savalan dağınadək uzanıb gedən mənzərələrə tamaşa edərdik. Dünyanın genişliyi, buludsuz mavi göy altındakı çöllərin intəhasız görünüşü, gələcək haqqındakı xəyallarımız bizim qəlbimizdə xoş hisslər oyadırdı. Bu hisslər sanki bizim ürəklərimizi birləşdirirdi. Biz əvvəl komsomola, sonra kommunist partiyasına keçib böyük adamlar olacağımız barədə, bizim Qəza Partiya Komitəsinin katibi kimi ot rəngli parçadan qalife şalvar, boynuqatlama köynək, uzunboğaz çəkmə geyib komandirlər kimi enli kəmər bağlayacağımız haqqında qəribə sevincli söhbətlər edirdik.Bizim ikimizin də bəy oğlanlarından, Məşədi Qara kimi böyük dövlətlilərin oğlanlarından zəhləmiz gedirdi. Onlar bizə həddindən artıq lovğa görünürdülər. Mən təbiətən nə qədər bədbin idimsə, Əvəz bir o qədər nikbin idi. Ancaq, bununla belə, gələcək haqqında xəyallarımız birləşirdi. İkimiz də yaxşı oxuyurduq. Əxlaq barədə, dərsləri mənimsəmək barədə müəllimlər həmişə bizi nümunə göstərirdilər. Biz ikimiz də riyaziyyatçı hesab olunurduq. Üstəlik mən çoxlu kitab oxumağımla da məşhur idim. Əvəzgil bizə nisbətən indi yaxşı yaşayırdılar. Həftələrlə evimizdə ət xörəyi bişmirdi. Amma yoxsulluq mənim gözümə görünmürdü, mənim arzu-xəyal aləmimə təsir eləmirdi. Mənim qapalı da-

xili aləmimə ancaq tanıdığım və ya haqqında eşitdiyim insanların ağır taleyi daxil olub, onu sarsıdırdı. Məsələn, bir gün anam atama nağıl elədi ki, hamamçı Məşədi Həbibin o vaxt türk zabitinə qoşulub gedən qızı Məhbub xanım İstambulda vərəm xəstəliyinə tutulub vəfat etmişdir. Özündən bir neçə vaxt sonra da əri vəfat etmişdir. Məhbub xanımın üç uşağı, burdan qulluqçu apardığı qızın ümidinə qalmışdır və bütün bu kədərli əhvalatı da Məhbub xanımın anası Xurşud xanıma həmin qulluqçu qız yazmışdır. Mən heç kəsə bu barədə bir söz demədən, hiss etdirmədən qərib ölkədə o cür vəfat eləyən gözəl Məhbub xanım haqqında, onun qərib ölkədə anasız-atasız qalmış balaları haqqında dərin bir hüznlə düşünürdüm. Halbuki Məhbub xanımın mənimlə yaşıd qardaşları, deyəsən, o ağır dərdi heç veclərinə də almırdılar.

Məhbub xanımın anası da dərdli qadına oxşamırdı. Mənsə insanların dərdinə biganə qala bilmirdim. Ancaq heç bir zaman nəyə acıdığımı, kimin dərdinə biganə qaldığımı büruzə vermirdim. Mən adamlara bu qədər yaxın ikən onları özümdən uzaq hiss edirdim.

Mən pioner təşkilatına daxil olduğum ilk vaxtlarda elə bilirdim ki, səmimi, hərarətli yoldaşlar tapmışam. Elə bilirdim ki, indiyə qədər mənə məlum olmayan yeni sevincli bir aləmə daxil oluram. Amma Qırmızı Fətiş atamı, babalarımı, "burjuy" adlandırıb mənə qəzəblənəndə, Muzdur Şirinin oğlu da ona dəm tutanda, elə bildim, məni döşümdən vurub, geri itələyib dedilər:

– Sən bizdən deyilsən!

Mənsə geri durmaq istəmirdim. İstəyirdim ki, mən də bu pioner yoldaşlarımla qaynayıb-qarışım... Mən sevincə, dostluq hərarətinə qarşı özümdə bir aclıq hiss edirdim. Ona görə də Qırmızı Fətişin, Muzdur Şirinin oğlu Fərəcin sözlərini yaddan çıxarmağa çalışaraq, pioner dəstəmizdə fəal iştirak edirdim. Dəstəmizdə divar qəzeti çıxarmağa başlamışdıq. Tezliklə məlum oldu ki, mən pioner həyatımız barədə məktəbdə özümüzü aparmağımız barədə, gözəl məqalələr yazmağı bacarıram. Hətta, Qəza Pioner Təşkilatının sədri Cəbrayılov yoldaş özü məqalələrimi tərifləyib məsləhət gördü ki, məni divar qəzetimizə redaktor seçsinlər. Ancaq dəstə rəhbərimiz komsomol Fətiş etiraz eləyib dedi:

– Yoldaş Cəbrayılov, o, burjuy balasıdır!

Muzdur Şirinin oğlu Fərəc də yerindən təsdiq etdi.

Nazik, cavan, xoşsifət bir oğlan olan Cəbrayılov gülümsəyib dedi:

– Yaxşı, bəs kimi redaktor seçmək istəyirsiniz?

Qırmızı Fətiş məndən bir-iki yaş böyük olan Savalanı göstərib dedi:

– Bax bunu! Atası da kasıb qəssabdı.

Muzdur Şirinin oğlu Fərəc yenə də etiraz eləyib dedi:

– Onun atasının qəssab dükanı var.

Yoldaş Cəbrayılov bu sözə də gülümsəyib dedi:

– Yaxşı! Savalan olsun redaktor, Murad da olsun məsul katib.

Fərəc soruşdu:

– Yoldaş Cəbrayılov, burjuy oğlundan məsul katib olar?

Cəbrayılov eyni xoş sifətlə dedi:

– Olar. Siz çalışın burjuy balalarını öz tərəfinizə çəkin.

Doğrusu, bu anlarda "burjuy" sözü özü əsl mənasından çıxıb mənim təsəvvürümdə az qala əcaib bir divə çevrilmişdi. Muzdur Şirinin oğlu Fərəc də məni çox yandırmışdı. Ona görə də bir gün girəvələyib küçədə o ki var əzişdirib ağzının, burnunun qanını qatdım bir-birinə.

Sonra atası Muzdur Şirin əlində yaba, axşam bizim evə hücum eləyib bağıra-bağıra deyirdi:

– Burjuy köpəkuşağı! Bu da keçmiş vaxtdır?!

Atam pilləkənləri düşüb sakit səslə ona dedi:

– Yaxşı, Muzdur Şirin, uşaqlar dalaşıblar, yenə də barışarlar. Söyüş söymə.

Muzdur Şirin daha bərkdən bağıraraq:

– Qışqıraram da, canınızı da alaram! – deyib yabanı atama endirəndə atam havada yabanı tutub, onun əlindən aldı. (Mən atamın bu qədər qüvvətli olduğunu bilməzdim.) Sonra itələyib darvazadan çıxardaraq, yabanı da ardınca tulladı.

Mən fikir elədim ki, Muzdur Şirin yabanı götürüb təzədən atama hücum eləyəcək. Ancaq belə olmadı. Muzdur Şirin yabanı götürüb, iti addımlarla getdi və bir az aralanandan sonra geri dönüb dedi:

– Köhnə iyiniz burnunuzdadı! Qəzəmətdə ağlın başına gələr!

Ancaq Muzdur Şirin şikayət eləmədi. Atam da mənə heç nə demədi. Anam o qədər qəzəblənmişdi ki, üzündə bir damcı qan qalmamışdı. Dalbadal papiros çəkərək atama deyirdi:

– Gərək yabanı alıb soxaydın o köpəkoğlunun qarnına, hücum çəkib evin üstünə gəlir!

Mən aydın dərk edirdim ki, Muzdur Şirin kimi adamlar bizi düşmən hesab edirlər. Bəlkə ona görə də atam hökumət idarələrində qulluq tapa bilmir. Mən onu da fikirləşirdim ki, əgər, bizim təqsirimiz atamın bir zaman varlı olmasıdırsa, artıq bu var-dövlət çıxıb gedib işinə. İndi Muzdur Şirinin külfəti bizdən yaxşı dolanır. Qırmızı Fərəc hər gün tənəffüsdə otaylı Rəhimin dükanından alma-armud, qoz alıb yeyir. Amma mənim dəftər almağa da pulum olmur. Evdə də, demək olar ki, həmişə yarıac oluruq. Bir dəfə atam anama dedi:

– O vaxt adam bilsəydi ki, tacirləri də bu cür düşmən hesab eləyəcəklər, cütün dəstəsindən əl çəkməzdi.

Mən görürdüm ki, bu saat atamın çörəkpulu qazanıb bizi babat dolandırmaqdan başqa bir fikri yoxdur. Ona görə də Muzdur Şirinin, komsomol Fətişin bizi düşmən hesab eləmələri məni ağrıdırdı. “Axı, bizim nəyimiz “burjuy”dur?! – deyə mən qəzəblə düşünürdüm.

Bir dəfə atamgilin kənddəki keçmiş düşmənləri şeytanlıq eləmişdilər ki, guya, bizdə bir pud qızıl var. Bakıdan gəlmiş sarıbəniz cavan bir çeka işçisi iki nəfərlə gecənin yarısı gəlib mülayim tərzdə anama (atam kəndə getmişdi) dedi:

– Xanım, deyirlər, sizdə çoxlu qızıl var. Xahiş eləyirəm, gətirin görək nədir onlar...

Yəqin məsələdir ki, bizdə “çoxlu qızıl” yox idi. Anam boyunbağılarını, iki-üç üzüyünü, qızıl qol saatını, balaca bir medalyonunu, bir neçə xırda-xuruş arvad zinətini gətirib tökdü çeka işçisinin qabağına.

O yenə mülayim səslə soruşdu:

– Bəlkə yenə var?

Anam acıqlı cavab verdi:

– Olanı budur! İnanmırsız, axtarın.

Mən fikirləşdim ki, anamın sərt cavabına çeka işçisinin acığı tutacaq.

Ancaq acığı tutmadı. O, eyni mülayim ifadə ilə anama dedi:

– Bu zinətləri nə üçün gizləyirsiniz? Niyə özünüz, qızınız taxmırsınız?

Anam dinmədi. O zaman həmin oğlanla gələn və bizim yerli adamlardan olan Dəllək Əmrah:

– Yoldaş Cəmilov, – dedi, – bu arvad yalan deyir, icazə verin, evi axtaraq.

– Lazım deyil axtarmaq! – deyə çeka işçisi ona sərt cavab verdi. – Özü də qadın barədə bu nə cür danışıqdır?!

Anam bunu gözləyirmiş kimi rəngi qaçmış halda dəlləyə işarə ilə dedi:

– Buna bizlərdə "mərdimazar keçəl Əmrah" deyərlər, peşəsi eyzən ondan-bundan danos verməkdir.

Çeka işçisi bu söhbətin üstündən keçərək anamdan soruşdu:

– Əriniz nə iş görür?

Anam dedi:

– Heç bir iş. Qulluq vermirlər.

– Niyə?

– Niyəsini bundan soruşun, – deyə anam qəzəblə keçəl Əmrahı göstərdi.

Çeka işçisi yenə soruşdu:

– Özünüzün savadınız var?

Anam dedi:

– Bəli, var.

Çeka işçisi ciddi ifadə ilə dedi:

– Əriniz də, siz də işləyə bilərsiniz. Bəs, indi nə ilə dolanırsınız?

Anam acıqlı dedi:

– Heç nə ilə. Nəyimiz vardı, hamısı bu hökumət gələndə, kənddə oğurlandı.

– İşləmək lazımdır! – deyə çeka işçisi təkrar etdi. Bizim dövlətdə hər bir düz adam üçün iş var.

Onlar gedəndən sonra anam papiros çəkib, nə barədə isə xeyli düşündü. Sonra öz-özü ilə danışırmış kimi dedi:

– Görürsünüz, o Bakıdan gələn oğlan necə insaniyyətli adamdı?

O adam mənim də heç bir zaman yadımdan çıxmadı.

Mən keçəl Əmrahın bir zaman dəllək olduğunu bilirdim.

Neçə dəfə atam saçlarımı düzəltdirmək üçün məni onun dükanına aparmışdı. Dəllək Əmrah da həmişə atamı böyük hörmətlə qarşılayardı.

Mən heç başa düşə bilmirdim ki, həmin o Dəllək Əmrah indi şəhər sovetinin üzvü olandan sonra nə üçün bizimlə düşmən kimi rəftar edir? Bizdən nəyin qisasını alır? Niyə birdən-birə belə amansız adam olub?

...Biz ibtidai məktəbin beşinci sinfini bitirəndən sonra Əvəzi atası apardı Bakıya ki, təhsilini orda davam etdirsin. Mən də çox istəyirdim ki, atam məni də Bakıya aparsın, mən də Əvəz kimi orda oxuyum, bizim bu balaca şəhərdə kimin imkanı vardısa, uşağını ibtidai məktəbi bitirəndən sonra aparıb Bakıda oxumağa qoyurdu. Ancaq atam məni aparmadı. Başa düşdüm ki, məni Bakıda oxutmağa atamın gücü çatmır. Ona görə də çox məyus olub dinmədim. Əvəzdən ayrılmağım da mənə yaman təsir elədi. Biz söz verdik ki, bir-birimizə məktub yazaq.

...Mən şəhərimizdəki iki dərəcəli məktəbə daxil oldum.

*1980*

# KİTABDAKILAR

## ROMANLAR

| | |
| --- | --- |
| Buraxılışa məsul: | *Umud Rəhimoğlu* |
| Texniki redaktor: | *Mübariz Piriyev* |
| Kompyuter səhifələyicisi: | *Allahverdi Kərimov* |
| Korrektor: | *Rəhilə Quliyeva* |

Yığılmağa verilib 26.09.2004. Çapa imzalanıb 25.03.2005.
Formatı 60x90 $^{1}/_{16}$. Fiziki çap vərəqi 28. Ofset çap üsulu.
Tirajı 25000. Sifariş 57.

Kitab "PROMAT" mətbəəsində çap olunmuşdur.